# Sələfin imana dair etiqadı

## onun əməl ilə bağlılığı və müasir şübhələrin ifşası



müəllif

Muhəmməd bin Mahmud Ali Xudeyr

II hissə

Kitaba müqəddimə yazanlar

Şeyx Abdullah bin Abdil-Aziz ibn Aqil

Şeyx Ulvi bin Abdil-Qadir əs-Səqqaf

Şeyx Abdul-Aziz bin Muhəmməd Ali Abdil-Lətif

Şeyx Abdur-Rahmən bin Saleh Ali Mahmud

Sələfin imana dair etiqadı

# Sələfin imana dair etiqadı

## onun əməl ilə bağlılığı

## və müasir şübhələrin ifşası

**Müəllif:**

**Muhəmməd bin Mahmud Ali Xudeyr**

Kitabı gözdən keçirib ona təqdimat verən fəzilətli şeyxlər

Şeyx Abdullah bin Abdul-Aziz bin Aqil

Yüksək qazilik məclisində daimi təşkilatın sabiq başçısı

Şeyx Abdur-Rahmən bin Salih Ali Mahmud

İmam Muhammməd bin Saud universitetinin tədris şöbəsinin üzvü

Şeyx Abdul-Aziz bin Muhəmməd Ali Abdul-Lətif

İmam Muhammməd bin Saud universitetinin tədris şöbəsinin üzvü

Şeyx Ulvi bin Abdul-Qadir əs-Səqqaf

əd-Durar əs-Səniyyə saytının rəhbəri

## İKİNCİ HİSSƏ

kitab ərəb dilindən tərcümə edilmişdir

Burada məqsəd əməlin imandan olmasına dair sələfin və imamların sözlərini nəql etmək deyil.Çünki bu, açıq-aydın bir məsələdir.Burada məqsəd yalnız sözün əməl ilə bağlılığını və sözün əməlsiz doğru olmayacağını, fayda verməyəcəyini və qəbul edilməyəcəyini ifadə edən sözlərini və qəlb əməlinin bədən əməlləri ilə olan bağlılığını və zahiri əməlin yoxluğu ilə bərabər daxili imanın mövcud olmasının təsəvvür edilməzliyini və bundan daha aydın olan bütövlüklə əməli tərk edənin təkfir ediləcəyini və onun mürtəd olub doğru imandan kənar qalacağını ifadə edən sözlərini nəql etməkdir.

Həmçinin məqsədlərdən biri: Bütövlüklə bədən əməlləri tərk ediləcəyi zaman imanın doğru olmayacağına dair sözün, sələf və sonraki imamların bəyan etdiyi kimi Əhli sunnədə bərqərar olan məsələ olduğunu açıqlamaqdır.Onların arasında bu mövzuya dair heç bir çəkişmə baş verməmişdir. Nəhayət murciələrin şübhələrinə düşən şəxslər peydə olub əməlin imanın kamilliyi üçün olduğunu iddia etmiş və bütövlüklə əməli tərk edəni Allahın istəyi altında olan müsəlman olduğunu bildirmişlər.Onlar bu fikri əşarilər və digər kəlam əhlindən qapıb savadsız şəkildə və böhtan olaraq həmin fikri sələfin və Əhli sunnənin məzhəbinə aid etmişlər.Onlardan bəziləri ifratçılıqda daha da irəli gedərək iddia etmişdir ki, bütün əməli tərk edənin küfrünü deyən söz, Əhli sunnənin deyil xəvaric və mötəzililərin sözüdür. Məhz bu amil səbəbilə mən səhabə, tabiinlər və günü-müzəcən onlara gözəl şəkildə tabe olanlardan olan imamların sözlərini nəql etməyi özümə borc bildim.Bu-

nunla mən ümmətə nəsihətimi əsirgəməmək, Əhli sunnədən olan gənclərdən fitnəni dəf etmək, cahilin maariflənməsi və alimin sabit-qədəm olması məqsədini güdmüşəm.Heç şübhəsiz ki, mənim müvəffəqiyyətim yalnız Allahdandır.Ona təvəkkül etdim və Ona tövbə etdim.

1-Əli bin Əbu Talib (r.a, hic. 40-cı ildə v.e) demişdir: "Əməlsiz söz, sözsüz əməl, niyyətsiz söz və əməl, habelə sunnəyə müvafiqlik olmadan niyyət fayda verməz."[1]

2-Abdullah bin Məsud (r.a, hic. 32-ci v.e)

Əli bin Əbu Talibdən (r.a) nəql edilən söz eynilə ibn Məsuddan (r.a) nəql edilmişdir.[2]

3-Ömərin köləsi Zeyd bin Əsləm (rahiməhullah, hic. 36-cı ildə v.e) demişdir: "Bu dində dörd şeyin olması gərəklidir: İslamın dəvətinə girmək, Allaha, ilkindən tutmuş sonuncuya qədər elçilərə, cənnətə, cəhənnəmə, ölümdən sonraki dirilişə iman gətirib bunları təsdiq etmək, imanını təsdiq edəcəyin saleh əməl etmək və əməlini yararlı edəcəyin elmə yiyələnmək.Daha sonra bu ayələri oxudu: *"Şübhəsiz ki, Mən həm də tövbə edib iman gətirəni yaxşı işlər görüb, sonra da doğru yolu tutanı çox bağışlayanam!"*.[3] [4]

4-Səid bin Cubeyr (rahiməhullah, hic. 95-ci ildə v.e) demişdir: "Söz yalnız əməl ilə, əməl yalnız söz ilə, söz və əməl isə

---

[1]İbn Batta "əl-İbənə:2/803,1089-cu rəqəm."Sunnəyə müvafiqlik sözündə gələn mənanı bilmək üçün birinci hissəyə müraciət et.
[2] əl-İbənə:1089-cu rəqəm.
[3] Ta-hə:82.
[4]İbn Əbu Şeybə "kitəbul imən: 136-cı rəqəm, 49 səh." Şeyx Albani bu hədisi səhih saymışdır.

yalnız niyyət ilə qəbul olunur. Söz, əməl və niyyət isə yalnız sunnəyə müvafiqlik niyyəti ilə qəbul olunur."[5]

5-Həsən əl-Bəsri (rahiməhullah, hic. 110-ci ildə v.e) demişdir: "İman sözdür.Söz isə yalnız əməl ilə olur.Söz və əməl isə yalnız niyyət ilə olur.Söz, əməl və niyyət isə yalnız sunnə ilə olur."[6]

6-İbn Ömərin köləsi Nəfi` (rahiməhullah, hic. 117-ci ildə v.e)

"Muaqqəl bin Ubeydullah əl-Abəsi demişdir: "Yanımıza Səlim əl-Əftas[7] irca fikri ilə gəlib onu bizə ərz etmişdir. Bizim əshabımız isə buna çox sərt şəkildə narazıçılıq etmişlər.Daha sonra mən Mədinəyə gəldikdə Nəfi`in hüzurunda əyləşdim.Mən dedim: Onlar deyirlər ki, biz namazın fərz olduğunu etiraf edir lakin namaz qılmırıq,

---

[5]Ləlakai: 1/64, 20-ci rəqəm.

[6]İbn Batta:2/803,1090-cı rəqəm.Ləlakai:1/64,18-ci rəqəm.

[7] Səlim əl-Əftas: İmam Əhməd onun haqqında demişdir: "Etibarlıdır.Habelə o, Xasıf adlı şəxsdən daha möhkəmdir.Digər yerdə demişdir ki, Abdul-Kərim əl-Cəzri, Xasıf, Səlim əl-Əftas, Əli bin Bəzimə adlı şəxslərin hamısı Harran əhlindəndirlər.Dedi: Biz Xasıfı sevirdik.Ancaq Səlim hədis elmində ondan möhkəm idi.Səlim irca məzmunlu sözlər deyirdi." (təhzibul kəməl: 10/166).Habelə Şeyxul-İslam demişdir (7/180): "İbn Batta isnadı ilə Mübarək bin Hassəndən belə dediyini rəvayət edir: Mən Səlim əl-Əftasa dedim: Bir kişi Allaha itaət edib Ona asi olmur.Bir kişi isə Allaha asi olub Ona itaət etmir.İtaətkar Allahın hüzuruna gəldiyi zaman cənnətə girir.Asikar Allahın hüzuruna gəldiyi zaman isə cəhənnəmə girir.Onlar imanda bir-birindən fərqlənirlərmi? O, dedi: Xeyir! Dedi: Mən bunu Atəyə danışdığım zaman o, belə dedi: Onlardan soruş iman gözəldir yoxsa çirkindir?...".Bu və irəlidə qeyd ediləcək şeylər onun fəqih murciələrdən olduğunu və onun asikarın təhdidə məruz qalacağını, habelə bəzən insanın günah səbəbilə cəhənnəmə girəcəyini iqrar etdiyini göstərir.O, bunu qəbul edir.O, yalnız nemət içində olacaq şəxslə əzaba düçar olacaq şəxsin imanı arasında fərqliliyi inkar edirdi.Çünki o, iman adını söz və təsdiqə şamil edirdi.Bu ikisi isə, imanda fərqliliyi inkar edən murciələrin məşhur dəlilinə əsasən həm itaətkar həm də, asikar müsəlmanda mövcuddur.

habelə şərabın haram olduğunu iqrar edir lakin onu içirik, analar ilə evlənməyin haram olduğunu iqrar edir lakin bunu istəyirik.Nəfi` bunu eşitdikdə əlini əlimdən çəkib: Bunu edən kafirdir!-dedi."[8]

---

[8]Abdullah bin Əhməd "əs-sunnə:1/382_831-ci rəqəm".Xalləl "əs-sunnə: 4/29". Lələkəi: 5/1024_1732-ci rəqəm. Bu rəvayəti həmçinin Şeyxul-İslam nəql etmişdir: 7/294.İbn Rəcəb "fəthul bəri:1/22" kitabında dörd dayağı tərk edənə dair ixtilafı qeyd etdiyi əsnada demişdir: "əl-Atə və ibn Ömərin köləsi Nəfi`dən rəvayət edilir ki, onlar namazın fərz olduğunu qəbul edirəm lakin qılmıram deyən şəxs haqqında soruşulduqda: O, kafirdir!-deyə cavab vermişlər.İmam Əhməd həmçinin belə demişdir."Bu rəvayət hər cür ehtimalları kənarlaşdırır və Nəfi`dən gələn həmin əsərin imtina və təkəbbürlüyə yaxud bunun halal saymağa dəlalət etdiyini deyənlərin sözünü heçə çıxarır.Çünki qeyd edilən imtina və təkəbbürlük bütün alimlərin yekdiliyi ilə küfrdür.Əgər məsələ onların dediyi kimi olsaydı, ibn Rəcəbin bunu, dörd dayağı tərk edənə dair ixtilafı bəyan etdiyi əsnada nəql etməsində heç bir məna olmazdı.Habelə Nəfi`dən halları soruşulan şəxslər fəqih murciələr idilər "murciətu əl-fuqaha", Səlim əl-Əftas və əshabı.Artıq Muaqqəl əl-Abəsi onlardan buna dəlalət edən sözlərini rəvayət etmişdir: "Onlar demişlər: Namaz və zəkat dindən deyil…Onlar deyirlər: İmanda artma yoxdur…Mənə xəbər çatmışdır ki, ibn Zərr əshabı arasında sənin hüzuruna gəlmiş (xitab əl-Atəyə ünvanlanır) və onlar sözlərini sənə ərz etmişlər.Sən isə onu qəbul etmisən…Onlar deyirlər: Biz namazın fərz olduğunu etiraf edirik lakin namaz qılmırıq…"Sonra onların cariyə hədisini dəlil gətirdiklərini qeyd etdi.İbn Zərr: Ömər bin Zərr bin Abdullah əl-Həmdənidir.İbn Sə`d "ət-Tabaqat:6/362" kitabında dedi: Ömər bin Zərr 153-cü ildə, Əbu Cəfərin xilafəti zamanı vəfat etmişdir.O, murciə olmuşdur və öldüyü zaman Sufyən əs-Səuri və Həsən bin Salih onun cənazəsində iştirak etməmişlər.Bununla belə o, inşallah etibarlı və çox hədis rəvayət edən birisi olmuşdur."Qabağda qeyd ediləcəyi kimi o, təqva və xeyir əhlindən olmuşdur.

Onun atası Zərr bin Abdullah həmçinin murciəlikdə ittiham edilmişdir.Bu üzdən Səid bin Cubeyr ona belə demişdir: Ondan daha böyük (yaşlı) olduğun görüşdən utanmırsanmı? (məcmu`əl-fətava:7/395) İshaq bin İbrahim bin Həni imam Əhməddən soruşmuşdu: "İman haqqında ilk söz açan kim olmuşdur? İmam dedi: Deyirlər ki, onun haqqında ilk danışan Zərr olmuşdur." (Xalləl "əs-sunnə:3/563") Həmin kitabda qeyd edilmişdir ki,İbrahim Zərrə murciəlik sözünü irad tuturdu.(3/564)

Böyük ehtimal var ki, o tövbə etmişdir.Artıq o, belə demişdir: Mən, din ediləcəyindən qorxduğum bir çox şeyi, yəni bidət görüşləri, artıq buraxdım.(Buxari"ət-tərixul kəbir:3/267").

Dedim: Müxalif bu məsələni şübhə altına qoyub demişdir: “Şərabın haramlığını etiraf edib onu içən şəxs günahkar müsəlmandır və beləsini yalnız xəvariclər və onların quyruğları təkfir etmişlər.Onun bu yerdə qeyd edilməsinə cavab nədir? Habelə ona aid olan hökm müstəqildir yoxsa ardıcıl?

Digəri demişdir: “Bu sözlər, bütövlüklə bu cür halda olana, yəni namaz qılmayana, şərab icənə və analar ilə evlənənə aiddir.Çünki şərabı halal saymadan içmək Əhli sunnənin mötəbər görüşünə əsasən küfr deyil.

Bu cox gözəl sözdür.Ondan daha dolğun olması üçün deyiləcək: “Həmin misallar özü-özlüyündə qəsd edilmir. Burada qəsd edilən yalnız iqrar ilə bərabər bütün vaciblərin tərk edilməsi və halallaşdırma olmadan haramların işlədilməsidir. Məsələmizdə çəkişmə mövzusu da məhz budur. Müxalif, Səlim əl-Əftas və onunla olanlar kimi deyir ki, əgər biri söz və etiqada sahib olub vacibliyini iqrar etməsi ilə bərabər bütün vacibləri tərk edər və haramlığını etiqad

---

Göründüyü kimi onlar: “Biz namazın fərz olduğunu etiraf edirik lakin namaz qılmırıq…”,- sözlərini yalnız mübahisə və məzhəbin bəyan edilməsi misalında demişlər.Çünki onlar təqva və ibadətdə yüksək mərtəbə sahibləri idilər.İmam Mizzi Ömər bin Zərr haqqında demişdir: “Əbu Ubeyd əl-Əcurri Əbu Davud haqqında demişdir: Murciələrin öndəri olmuşdur. Artıq gözləri kor olmuşdu…Habelə Əbu Hatim demişdir: Doğru danışan olsa da hədisi hüccət olmayan murciə idi.O, Yunus bin Əbu İshaq mislindədir.” Başqa yerdə dedi: “Sadiqlik vəsfinə malik saleh bir kişi idi…”.Abdur-Rəhman bin Yusuf bin Xarraş demişdir: Küfəlidir, doğru danışandır və xeyirli insanlardan biridir. Murciə olmuşdu.”(Təhzibul kəməl:21/336) Şeyxul-İslam qeyd etmişdir ki, Kufə fəqihləri və abidlərindən bir tayfa insanlar murciə olmuşlar.(məcmu`əl-fətava:7/194) İmam Əhmədə sual vermişlər: Nə üçün murciələr ibadətlərdə canfəşanlıq etdikləri halda bu sözü deyirlər? İmam Əhməd: Bəladır!-deyə cavab verdi.(Xalləl “əs-sunnə:3/571)

etməsi ilə bərabər istədiyi haramları işlədərsə kafir olmayacaq.

Müasirlərdən irca şübhəsinə düşənlər həmçinin bu sözü deyirlər.Bəziləri əlavə edib deyirlər: Əgər insan bütün zahiri əməlləri, fərzləri və nafilələri tərk edib bütün ömrünü bunlardan heç bir şeyi etməzsə o, müsəlmandır!

İki firqə arasında ən böyük fərq ondadır ki, birinci firqə onu mömin adlandırır və bəzən həmin şəxsin imanda Cəbrayılın imanı səviyyəsində olduğunu söyləyirlər.Digəri isə deyir: Xeyir! O, fasiqdir yaxud imanı ilə mömin günahı ilə fasiqdir.

Nəfi` isə bu halda olan şəxsin, yəni murciənin deyil əməli tərk edənin kafir olduğuna hökm verib demişdir: “Bunu edən kafirdir.”

Şeyxul-İslam Nəfi`in kəlamını nəql edib ardından Humeydi və Əhmədin Nəfi`in dediyi sözünə bənzər, iqrar ilə bərabər fərzləri tərk edənin təkfir olunmasına dair sözlərini qeyd etmişdir.[9]Sonra ibn Teymiyyə (tayyəbəllahu sərahu) murciələrin şübhəsinə cavab verib bir qədər münafiqin hökmünü bəyan edən sözlər söylədikdən sonra demişdir: “İmamlar bunun küfrünü ancaq bu cür fərziyyənin gerçəkdə baş vermədiyi səbəbilə demişlər. İnsanın əmr olunmuş işlərdən heç bir şeyi, namazı, zəkatı, orucu, həcci yerinə yetirməməsi və dəstəmazsız qibləyə tərəf namaz qılmaq və analar ilə evlənmək kimi haramlardan

[9] Bu araşdırmada gələcək imam Əhmədin və Humeydinin sözlərinə bax.

bacardığını etməsi ilə bərabər daxildə mömin olması ağılasığmazdır.Əksinə, insan bunu yalnız qəlbində imana sahib olmadığı üçün edəcək.Bu səbəbdən Əbu Hanifənin ardıcılları bu kimi sözlər deyən müxtəlif şəxsləri təkfir etmişlər.Çünki bu, sayğısızlığı gərəkdirən amildir.Habelə onun ardıcılları ilə cumhur alimlərin arasında əməlin iman adına daxil olub olmamasına dair ləfzi çəkişmənin olmasına rəğmən onlar bu növ günahlardan bəzisini edənləri mürtədlərin sırasına qatmışlar.

Bu səbəbdən sonraki fəqihlər gerçəkdə baş verməsi mümkün olmayan bir məsələni fərziyyə şəklində irəli sürmüşlər.Bu məsələ: İnsan namazın vacibliyini iqrar etdiyi halda ona çağırıldığı zaman ondan imtina edərsə və ölüm ilə təhdid edilməsi ilə bərabər üç dəfə tövbə etməyə dəvət edilərsə lakin edam edilənə qədər namaz qılmazsa, belə bir şəxs kafir yoxsa fasiq olacaq? Buna dair iki görüş vardır.

Bu fərziyyə batildir.Çünki bir insanın Allahın ona bu şeyləri fərz etdiyini və onun həmin fərzləri tərk edəcəyi səbəbilə cəzalandırılacağını etiqad edərək və edam edilməyə dözüm göstərərək heç bir üzürü olmadan Allah üçün bir səcdə belə etməməsi fitrətdə qeyri-mümkün olan bir şeydir.Bəşər övladlarından heç vaxtı bunu edən olmayıb…”[10]

Dedim: Şeyxul-İslam, imamların iqrar edən şəxsin təkfir edilməsinə dair yanaşmanı bəyan edərək bunu zahir ilə daxil arasında olan bağlılığa aid etmiş və bu kimi tərk ilə bərabər daxildə imanın olmasını qeyri-mümkün saymışdır.

[10] Məcmu`əl-fətava:7/218-219,7/205.O, Nəfi`in sözlərini burada gətirmişdir: 7/205.

Qeyd edildiyi və ediləcəyi kimi Şeyxul-İslam bunu bir sıra yerlərdə təsbit edir.Bizim araşdırdığımız mövzuya dair Şeyxul-İslamın növbəti sözləri həmçinin münasib gəlir: "Bu məsələ iki tərəflidir: Birinci: Zahiri küfrün isbatına dair. İkinci: Daxili küfrün isbatı dair.

Məsələnin ikinci tərəfi qeyd edildiyi kimi imanın söz və əməl olması məsələsi üzərində qurulur.Bir insanın, Allahın ona namazı, zəkatı, orucu və həcci vacib buyurduğuna dair qəlbində sabit imana sahib olduğu bir halda Allah üçün ömründə bir dəfə olsun səcdə etməməsi, Ramazan orucunu tutmaması, Allah üçün zəkat verməməsi və Allahın evinə həcc etməməsi ağılasığmazdır.Bu qeyri-mümkündür.Bunu doğru iman sahibindən deyil, yalnız qəlbində zındığlıq və nifaq olan şəxsdən gözləmək olar."[11]

Bu, Nəfi`, Humeydi və Əhməd kimi imamların üslubudur.Hənəfilərə gəldikdə isə, onlar buna bənzər sözlər deyən müxtəlif şəxsləri təkfir edirlər.Misal üçün: İqrar edirəm lakin əməl etmirəm, haram olduğunu etiqad edirəm lakin etmirəm kimi sözləri deyənləri, bu işlərin dəyəri kiçildildiyi səbəbilə təkfir edirlər.

Sonra isə müasirlərdən bu şübhələrə düçar olan bəziləri gəlib bu əməlləri tərk edənlərin müsəlman olduqlarına hökm vermişlər. Belə adamlar nə imamların əsaslarına nə də ki, hənəfilərin üslubuna müvafiq gəlmirlər.

---

[11]Əl-İmanul əusat, məcmu`əl-fətava:7/616.

Bir sözlə, Nəfi`, Humeydi və Əhmədin sözləri bütün vacibləri tərk edib bacardığı haramları edənə aid edilir. Onlar belə insanın daxildə mömin olacağını mümkünsüz saydıqları üçün həmin şəxsə kafir hökmünü çıxarmışlar.

7-Muhamməd bin Muslim Şihab əz-Zuhri (rahiməhullah, hic. 124-ci ildə v.e) demişdir: "Biz belə deyərdik: "İslam iqrar ilə, iman isə əməl ilə olur. İman söz və əməldir.Onlar bir-biri ilə sıx bağlıdır və biri digərsiz fayda vermir.Elə bir şəxs olmayacaq ki, onun sözü və əməli tərəziyə qoyulmasın.Əgər onun əməli sözündən daha ağır gələrsə Allaha tərəf qalxar.Onun sözü əməlindən daha ağır gələrsə Allaha tərəf qalxmaz."[12]

8- İmam Əuzai (rahiməhullah, hic. 157-ci ildə v.e) demişdir: "Bu ümmətin ilk nəsil insanları ilə rastlaşdım.Onlardan heç biri iman ilə əməl arasında fərq qoymaz və günahları küfr və şirk saymazdılar.

Habelə imam: "İman ilə əməl belədir,- deyib iki barmağına işarə etdi və davam edərək dedi: Əməlsiz iman, imansız isə əməl yoxdur."[13]

---

[12]Şeyxul-İslam bu sözləri nəql edib demişdir "7/295": Mə`mər Zuhridən belə rəvayət etmişdir.Habelə Əbu Ömər ət-Talmənki məşhur isnadı ilə rəvayət etmişdir.Zuhrinin: "İslam iqrar ilə",- sözü, "İslam kəlmədir" sözü kimidir.Yəni, insan onunla İslama daxil olur və bu kəlmə ilə yəhudi və nəsranilərdən fərqlənir.Artıq Şeyxul-İslam bunu izah etmişdir.Şeyxul-İslam Zuhrinin sözünü Həsənin, Səid ibn Cubeyrin, Hassən bin Atiyyənin və Əuzainin sözləri ilə birgə nəql edib demişdir: "Sələf və onlardan sonra gələnlərdən bir çoxu əməli sözü təsdiq edən etmişlər və bu onlardan məşhur olan bir məsələdir."

[13]Harb əl-Kirməni: "məsəil imam Əhməd və İshaq bin Rahuyə:368-ci səh".

Həmçinin demişdir: "İman yalnız söz ilə doğru olur. İman və söz isə yalnız əməl ilə doğru olur.İman, söz və əməl isə yalnız sunnəyə müvafiqlik niyyəti ilə doğru olar.Bizdən öncəki sələfimiz iman ilə əməl arasında fərq qoymaz və əməli imandan, imanı isə əməldən ayırmazdılar.İman ancaq bütün bunları toplayan bir addır.Əməl isə onu təsdiq edəndir.Əgər biri dili ilə iman gətirər qəlbi ilə bilər və bunu əməli ilə təsdiq edərsə məhz bu, qırılmaq bilməyən bir dəstək olar.Ancaq əgəri biri dili ilə deyib gəlbi ilə bilməz və əməli ilə bunu təsdiq etməzsə həmin şey ondan qəbul edilməz və həmin şəxs axirətdə ziyana uğrayanlardan olar".[14]

Valid bin Muslim dedi: "Mən Əuzai, Malik bin Ənəs, Səid bin Abdul-Əziz kimi adamlardan imanın əməlsiz söz olduğunu deyənlərin sözünü pislədiklərini eşitdim.Onlar deyərdilər: "İman yalnız əməl ilə, əməl isə yalnız iman ilə olur."[15]

9-Sufyan əs-Səuri (rahiməhullah, hic. 161-ci ildə v.e) demişdir: "Əhli sunnə özlərini təmizə çıxarmalarından qorxaraq belə deyirlər: İman, söz və əməldir.Əməl yalnız iman ilə caiz olur.İman isə yalnız əməl ilə olur.Biri sənə: Bu sözdə sənin imamın kimdir?-deyərsə, de: Sufyan əs-Səuri."[16]

---

[14]İbn Batta:2/807_1097-ci rəqəm.Şeyxul-İslam bu sözləri "məcmu`əl-fətava: 7/296" kitabında nəql edib həmin sözlərə əlavə etmişdir:"Sələf və onlardan sonra gələnlərdən bir çoxu əməli sözü təsdiq edən etmişlər və bu onlardan məşhur bir məsələdir."

[15]Ləlakəi: 4/931_1586-cı rəqəm.

[16]Ləlakəi: 5/1052_1792-ci rəqəm.

Həmçinin demişdir: "Fəqihlər deyərdilər: "Söz yalnız əməl ilə doğru olur.Söz və əməl isə yalnız niyyət ilə doğru olur.Söz, əməl və niyyət isə yalnız sunnəyə müvafiqlik ilə doğru olur."[17]

Həmçinin demişdir: "Söz yalnız əməl ilə yararlı olur".[18]

10-Muhamməd bin Muslim ət-Taifi (rahiməhullah, hic. 177-ci ildə v.e) demişdir: "Söz yalnız əməl ilə yararlı olur".[19]

11, 12- Səid bin Abdul-Əziz əd-Diməşqi [20] (rahiməhullah, hic. 167-ci ildə v.e) və Məlik bin Ənəs (rahiməhullah, hic. 179-cu ildə v.e)

Valid bin Muslim dedi: "Mən Əuzai, Malik bin Ənəs, Səid bin Abdul-Əziz kimi adamlardan imanın əməlsiz söz olduğunu deyənlərin sözünü pislədiklərini eşitdim.Onlar deyərdilər: "İman yalnız əməl ilə, əməl isə yalnız iman ilə olur."[21]

13- Fudeyl bin İyad (rahiməhullah, hic. 187-ci ildə v.e) demişdir: "Söz yalnız əməl ilə yararlı olur".[22]

14-Sufyan bin Uyeynə (rahiməhullah, hic. 198-ci ildə v.e) demişdir: "İman, söz və əməldir.Biz bunu və sözün yalnız əməl ilə

---

[17]İbn Batta "əl-ibənə:1/333_190-cı rəqəm."
[18]Abdullah bin Əhməd "əs-sunnə:1/337_703-ci rəqəm.
[19]Abdullah bin Əhməd "əs-sunnə:1/337_ 702-ci rəqəm.
[20] Dəməşqin muftisi və Şam diyarının fəqihi.Abdullah bin Əhməd atasından rəvayət etmişdir: Şamda Səid bin Abdul-Əzizdən hədisi daha səhih olan kişi yoxdur.O və Əuzai mənə görə birdir.Hakim Əbu Abdullah demişdir: O, öndə olmaqda, fəzilət, fiqh və əmanətdə Şam əhli üçün sanki Malikin Mədinə əhli üçün olduğu kimidir. (təhzibu-t-təhzib:4/53)
[21]Ləlakai: 4/931_1586-cı rəqəm.
[22]Abdullah bin Əhməd "əs-sunnə:1/337_ 702-ci rəqəm."

olacağını bizdən öncəkilərdən almışıq.Ona: Artır və azalır?-deyə sual verlidikdə o: Bəs necə!-deyə söylədi."[23]

İmam irca haqqında soruşulduğu zaman belə demişdir: "Onlar deyirlər ki, iman sözdür.Biz isə deyirik ki, iman söz və əməldir.

Murciələr "lə iləhə illəllah" kəlməsinə şahidlik edib qəlbi ilə fərzlərin tərk edilməsində israrlı olan şəxsə cənnətin vacib olduğunu demiş və fərzlərin tərk edilməsini haramların işlədilməsi səviyyəsində olan günahlar adlandırmışlar.Əslində isə onlar eyni ola bilməz.Çünki haramları halallaşdırmadan işlətmək asilikdir.Fərzləri isə cahillik və üzr olmadan tərk etmək küfrdür.

Bunu Adəmin, iblisin və yəhudi alimlərinin timsalında göstərmək olar.Adəmə gəldikdə, Uca Allah ona ağacdan olan bəhrəni dadmağı qadağan və haram etmişdir.Adəm mələk olmaq yaxud ölməz olmaq üçün ondan qəsdən yedikdə küfrsüz asikər adlandırılmışdır.

İblisə (ləanəhullah) gəldikdə isə, ona bir səcdə etmək fərz edildikdə qəsdən onu etməkdən boyun qaçırmış və kafir olmuşdur.

Yəhudi alimləri isə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) vəsfini və onun Allahdan gələn Peyğəmbər olduğunu

[23] əl-Əcurri "əş-şəria:239-cu rəqəm".İbn Batta "əl-ibanə:2/855_1157-ci rəqəm".Bu səhih isnadlı rəvayətdir."Əqualu-t-təbiin fi məsəili-t-təuhid vəl imən: 3/1123_1332-ci rəqəm".Müəllif işarə etmişdir ki, onun bu sözləri, onun tabiinlərdən imanın söz və əməl olduğuna dair icma hekayət etdiyini hiss etdirir.Bu, heç şübhəsiz ki, haqqdır.Dedim: Zuhrinin keçən sözü həmçinin onun mislindədir.

övladlarını tanıdıqları kimi tanıyır və bunu dil ilə iqrar edirdilər.Lakin onun şəriətinə tabe olmadıqları zaman Uca Allah onları kafir adlandırmışdır.

Haramların işlədilməsi Adəmin və başqa peyğəmbərlərin günahları mislindədir.Fərzləri danaraq tərk etmək isə, iblisin küfrü kimi küfrdür.Ona dair bilgiyə sahib olub danmadan tərk etmək yəhudi alimlərinin küfrü mislindədir."[24]

15-Əbu Bəkr Abdullah bin Zubeyr əl-Humeydi (rahiməhullah, hic. 219-cu ildə v.e) demişdir: Bizə görə sunnə: … "İmanın söz və əməl olması və artıb azalmasıdır.Habelə söz yalnız əməl ilə, əməl və söz yalnız niyyət ilə, söz, əməl və niyyət isə yalnız sunnə ilə faydalı olur."[25]

16-İshaq bin Rahuyə (rahiməhullah, hic. 238-ci ildə v.e) demişdir: "Murciələrin həddi aşması onların belə bir söz demələrinə gətirib çıxarmışdır: " Əgər biri fərz namazları, Ramazan orucunu, zəkatı, həcci və bütün fərzləri[26] danmadan tərk

---

[24]Abdullah bin Əhməd "əs-sunnə:1/347." İbn Rəcəb "fəthul bəri:1/25", "cəmiul ulum vəl hikəm:44-cü səh".

[25]Humeydi "usulus sunnə: 36 səh."

[26]Müxaliflərdən biri İshaqın sözünü şübhə altına qoymaq üçün Əhmədin "əl-məbəni əl-ərbəa" dörd dayağdan bir şeyi tərk edəni təkfir etmədiyinə dair rəvayət gətirib dedi: "Məgər imam Əhməd, mən hələ alimlərdən digərlərini demirəm, murciə idilər? Çünki onlar dörd dayaqdan hər hansı bir şeyi, onun vacibliyini iqrar edərək tərk edəni təkfir etmirdilər?! Subhanəkəllahummə."

Dedim: "Bu, açıq-aydın yanlış naticədir.Belə ki, İshaqın sözü sadəcə dörd dayağın tərk edilməsi haqqında deyil üstəlik bütün fərzlər tərk edilməklə bərabər onun tərk edilməsi haqqında bəhs edir.Artıq İshaq bəyan etmişdir ki, murciələr belə deyirlər: "Əgər biri dörd dayağı və bütün fərzləri, onların vacibliyini iqrar edərək tərk edərsə biz onu təkfir etməyəcəyik və onun işi Allah yanında ümidvericidir".Bu sözlər, günümüzdə bəzi insanların dediyi sözlərin

edərsə biz onu təkfir etməyəcəyik və onun işini Allaha buraxacağıq.Çünki o, bunları iqrar edir.Bunu deyən adamlar heç şübhəsiz ki, murciələrdir."[27]

İshaqın (rahiməhullah) sözlərindən iki fayda çıxır:

*Birinci*: Bütün fərzləri tərk edənin təkfir edilməsi.Bu, öncə Sufyan bin Uyeynədən nəql edilənə tamamilə uyğun gəlir.Habelə bu sözlər Şeyxul-İslamın qeyd etdiyi sözlər mislindədir.Sadəcə Şeyxul-İslam: Vacibləri,-deyə ifadə edir. Bu işdə isə heç bir fərq yoxdur.

*İkinci*: Bu məsələdə müxalif gələn şəxsin murciə olduğuna dair çıxarılan hökm.

17-Əbu Səur İbrahim bin Xalid əl-Kəlbi (rahiməhullah, hic. 240-cı ildə v.e) demişdir: "Əməlin imandan olmadığını iddia edən tayfaya gəldikdə isə, onlara deyiləcək: "Uca Allah növbəti sözləri deyərkən qullarından nəyi istəmişdir: *"Namaz qılın, zəkat verin və rüku edənlərlə birlikdə rüku edin!".*[28]Bunu iqrar etmələrini yoxsa iqrar və əməl etmələ-

---

eynilə özüdür.Onlar deyirlər: "Bütün fərzləri və bütün nafilələri tərk edən, yəni, bədən əzaları ilə heç vaxt xeyir əməl etməyən şəxsi təkfir etmirik və onun Allahın istəyi altında olan müsəlman olduğunu deyirik.Daha sonra müxalif iddia etmişdir ki, İshaq bu şəxsləri onların; "onun işini Allaha buraxırıq "nurciu",-sözlərinə görə murciə olaraq vəsf etmişdir.Bu, həmçinin səhv fikirdir.Belə ki, İshaqın onlara irad tutması, onların fərzləri tərk edəni təkfir etmədiklərinə və buna iqrarın olmasını və danmanın olmamasını səbəb göstərmələrinə görə olmuşdur.Onların: "onun işini Allaha buraxırıq" sözləri, onların həmin adamın təhdidə məruz qalmayacağını hesab etdikləri kimi başa düşülməməlidir.Əksinə onların sözü müxalifin sözü mislindədir və heç bir fərq yoxdur: Allahın istəyi altında olan müsəlmandır.

[27]Harb əl-Kirməni "məsəilul imam Əhməd və İshaq bin Rahuyə:377-ci səh."İbn Rəcəb həmçinin bu rəvayət nəql etmişdir "fəthul bəri:1/25".

[28] əl-Bəqərə:43.

rini? Əgər onlar: Əməli deyil yalnız iqrar etmələrini istəmişdir,-desələr elm əhlinə görə kafir olacaqlar.Əgər biri, Allahın Öz qullarından namaz qılmalarını və zəkat vermələrini istəmədiyini deyərsə kafir olar.

Əgər onlar: Onlardan iqrarı və əməli istəmişdir,-desələr, onlara deyiləcək: Əgər Allah onlardan hər ikisini birlikdə istəmişsə, belə olan halda nə üçün siz insanın bu ikisindən biri olmadan sadəcə biri ilə mömin olacağını iddia edirsiniz. Artıq Uca Allah hər ikisini birlikdə istəmişdir?!

Əgər bir adam: Mən Allahın bütün əmr etdiklərini edirəm ancaq onları iqrar etmirəm,-deyərsə, sizcə o, mömin olacaqmı? Əgər onlar: Xeyir!-desələr, onlara deyiləcək: Əgər bir adam: Allahın əmr etdikləri bütün şeyləri iqrar edib onlardan heç birinə əməl etmirəm,-deyərsə, sizcə o, mömin olacaqmı? Əgər onlar: Bəli!-desələr, onlara deyiləcək: Siz, Allahın hər ikisini istədiyini deyirsiniz.Belə olan halda bu ikisi arasında fərq nədir? Əgər insanın birini tərk edib digəri ilə mömin olması caizdirsə, həmçinin digərini tərk edib biri ilə, əməl edib iqrar etmədiyi zaman mömin olması caiz olacaq və bu ikisi arasında heç bir fərq yoxdur.

Əgər o, etiraz edərək: Əgər bir kişi İslamı qəbul edib Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gətirdiyi bütün şeyləri iqrar edərsə əməlin vaxtı yetişməmişdən öncə həmin bu iqrarla  mömin olacaqmı?-deyərsə, ona deyiləcək: Biz ancaq əməlin ona vacib olduğunu və vaxtı gələcəyi zaman onun əməl edəcəyini onun öz sözü ilə təsdiq edəcəyi vaxt həmin adı ona şamil eəcəyik.Həmin anda isə ona, onu mömin

edəcək bütün şeyləri iqrar etməsi vacib deyil.Əgər həmin şəxs: İqrar edir lakin əməl etmirəm,-deyərsə, bu halda biz ona iman adını şamil etməyəcəyik.Bu məsələyə dair bəyan etdiklərimiz yetərlidir. Allahdan müvəffəqiyyət arzulayırıq!”.[29]

18-Əhməd bin Hənbəl (rahiməhullah, hic. 241-ci ildə v.e)

Muhamməd bin Musa əl-Bəğdadi rəvayət edir ki, imam Əhməd demişdir: “İman söz və əməldir, artır və azalır.Yaxşı iş gördüyün zaman artır, səhlənkarlıq etdiyin zaman isə azalır.Habelə iman yalnız əməl ilə olur.”[30]

19-Əl-Muzəni (rahiməhullah, hic. 264-cü ildə v.e) demişdir: “İman daxili etiqad ilə bərabər söz və əməldir.Dil ilə söz və bədən əzaları ilə əməldir.Onlarin hər ikisi eynidir, taydır və bərabərdir.Onların arasında heç bir fərq qoymuruq.İman yalnız əməl ilə, əməl isə yalnız iman ilə olur.”[31]

20-Səhl bin Abdullah Təstəri (rahiməhullah, hic. 283-cü ildə v.e)

Səhl (rahiməhullah) imanın mahiyyəti haqqında soruşulduqda belə cavab vermişdir: “O, söz, niyyət, əməl və sunnədir.Çünki iman əməlsiz söz olacağı zaman küfr olacaq.

---

[29]Ləlakəi: 4/931-933_1950.Şeyxul-İslam bunu “məcmu`əl-fətava:7/387”da olduğu kimi “kitəbul iman”da nəql etmişdir.
[30]Əbu Yə`lə “əl-İman:153-cü səh”.
[31]əl-Muzəni “şərhus sunnə:77-ci səh”.İbnul-Qayyim bu rəvayəti “ictimaul cuyuş əl-isləmiyyə:167-ci səh” kitabında nəql etmişdir.`

Niyyətsiz söz və əməl olacağı zaman nifaq olacaq.Sunnəsiz söz, əməl və niyyət olacağı zaman isə bidət olacaq."[32]

Əbu Bəkr əl-Əcurri (rahiməhullah, hic. 360-cı ildə v.e) demişdir: Bədən əzaları ilə edilən əməllər qəlb və dil ilə olan imanı təsdiq edir.

"Əgər biri təharət, namaz, zəkat, oruc, həcc, cihad və bu kimi bədən əzaları ilə edilən əməllərlə imanını təsdiq etmədən sadəcə bilgi və sözlə qane olarsa mömin olmaz və həmin bilgi və söz ona heç bir fayda verməz.Onun əməli tərk etməsi öz imanını təkzib etməsini ifadə edəcək.Əməl isə, qeyd etdiyimiz kimi onun imanını təsdiq edəcək. Müvəffəq edən Allahdır."[33]

Həmçinin demişdir: "Bu, ağıl sahibi üçün bir açıqlamadır.Məlumdur ki, din yalnız qəlb ilə təsdiq, dil ilə iqrar və namaz, zəkat, oruc, həcc, cihad və buna bənzər olan bədən əməli ilə səhih olur".[34]

Həmçinin demişdir: "Uca Allah buyurur: *"Gözəl söz Ona tərəf yüksəlir və onu ucaldan yaxşı əməldir."*[35] Uca Allah gözəl sözün həqiqətdə yaxşı əməl ilə Allaha tərəf ucaldığını

---

[32]İbn Batta "əl-ibanə:2/814_1116".Şeyxul-İslam bu rəvayəti məcmu`əl-fətava:7/171"da olduğu kimi "əl-imən" kitabında qeyd etmişdir."Əl-istiqamə:1/158" kitabında olduğu kimi Səhl haqqında demişdir: Səhl bin Abdullahın sunnə və etiqadın əsasları haqqında dediyi sözlər digərlərin sözlərindən daha dəqiq və doğrudur.Həmçinin Fudeyl bin İyad və başqaları.Hədis və sunnəni daha yaxşı bilən və ona daha çox tabe olan şeyxlər bu məsələdə digərlərindən elm və imanda daha böyük və qədir-qiyməti daha yüksək olan insanlardır."

[33]əş-Şəria:2/614.

[34]əş-Şəria:2/563.

[35] Fətır:10.

xəbər vermişdir.Əgər əməl olmasaydı insanın sözü batil olub özünə qayıdardı.Tövhiddən isə gözəl və şəni uca olan kəlam və söz yoxdur.Habelə fərzlərin yerinə yetirilməsindən daha yaxşı əməl yoxdur.Daha sonra Uca Allah hər bir sözə onu təsdiq yaxud təkzib edən əməldən bir dəlil etmişdir. İnsan gözəl söz deyib gözəl əməl edəcəyi zaman Allah onun sözünü əməli ilə ucaldır.Lakin insan gözəl söz deyib pis əməl etdiyi zaman Allah sözü əmələ qaytarar.Bu, Allahın kitabındadır: *"Gözəl söz Ona tərəf yüksəlir və onu ucaldan yaxşı əməldir."*[36]

22-Əbu Talib əl-Məkki (rahiməhullah, hic. 386-cı ildə v.e) demişdir: "İslamın imandan olması misalı, məna və hökmdə iki şəhadətin birinin digərindən olması mislindədir.Belə ki, Peyğəmbərə (salləllahu aleyhi və salləm) şahidlik etmək tövhidə şahidlik deyil.Onlar özlüyündə iki şeydir.Lakin biri digəri ilə sıx bağlı olduğu zaman onlar sanki bir şeyə dönmüşlər. İslamı olmayanın imanı, imanı olmayanın isə islamı yoxdur. Çünki elə bir müsəlman yoxdur ki, onun islamını doğru edən imanı olmasın.Habelə elə bir mömin yoxdur ki, onu imanını gerçəkləşdirən islamı olmasın.Uca Allah saleh əməllər üçün imanı, iman üçün isə saleh əməlləri şərt etmişdir.Uca Allah buna dair buyurur: *"Kim mömin olduğu halda yaxşı işlər görsə, onun əziyyəti inkar olunmaz."*[37] Habelə imanın əməl ilə gerçəkləşdiyinə dair buyurur: *"Kim*

[36] əş-Şəria:2/632.
[37] əl-Ənbiya:94.

*(Onun hüzuruna) yaxşı əməllər etmiş bir mömin kimi gələrsə, onlara ən yüksək dərəcələr nəsib olar".*[38]

Əgər birinin zahiri, islam əməlləri olduğu halda o, qeybə iman etiqadına sahib olmazsa, həmin şəxs islamdan çıxan münafiq olar.Əgər biri qeybə iman etiqadına sahib olub imanın əhkamları və islamın buyuruğlarına əməl etməzsə, həmin şəxs tövhidi sabit olmayan kafir olar.Lakin əgər biri Peyğəmbərin (salləllahu aleyhi və səlləm) Allahdan xəbər verdiyi qeybə iman gətirib əmr olunduğu şeyləri yerinə yetirərsə, həmin şəxs mömin və müsəlman olar."[39]

Həmçinin demişdir: "İslam, imanın əməlləri, iman isə islamın etiqadıdır.Elə isə iman yalnız əməl ilə, əməl isə yalnız etiqad ilə olur.Bunun məsəli zahiri və daxili əməlin məsəlidir.Onlardan biri digəri ilə qəlb əməlləri və bədən əməlləri etibarı ilə bağlıdır.Habelə Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Əməllər yalnız niyyətə görədir".Yəni, əməllər yalnız niyyət və qəsd ilə olur.Çünki hədisdəki "إنما : yalnız" sözü bir şeyin isbat digərinin isə inkar edilməsi üçün işlənir.Bununla da, Peyğəmbər (salləllahu aleyhi və səlləm) əməllərdən olan bədən əməllərini və niyyətlərdən olan qəlb əməllərini isbat etmişdir.Əməlin imandan olması dodaqların dildən olması mislindədir.Dodaq və dilsiz sözün tələffüzü mümkün deyil.Çünki dodaqlar sözləri toplayır dil isə sözü aşkara çıxarır.Onlardan birinin yoxluğu sözü puça

[38] Ta-hə:75.

[39]Qutul-qulub:2/250.Şeyxul-İslam bu rəvayəti "məcmu`əl-fətava"da nəql etmişdir: 7/333.

çıxarır.Habelə əməlin yoxluğu imanın getməsini qaçılmaz edir."[40]

Həmçinin demişdir: "İmanın və islamın məsəli yerə sancılmış, üz hissəsi geniş olan, habelə kəndirləri və daxilində dirəkləri olan çadır misalındadır.Çadır, dayağları bədən əzaları ilə edilən aşkar əməllərdən ibarət olan islam mislindədir.Həmin əməllər çadırın qırağlarını saxlayan kəndirlərdir.Çadırın daxilində olan dirəklər isə iman mislindədir.Belə ki, çadır onsuz ayaq tuta bilməz.Çadırda onlardan hər birinin olması gərəklidir.Çünki o, onlarsız duruş gətirmək gücündə deyil.Bədən əzaları ilə əməllərdən ibarət olan islam həmçinin belədir.Çünki o, imansız duruş gətirə bilməz.Qəlb əməllərindən ibarət iman isə yalnız saleh əməllər olan islam ilə, faydalı olur."[41]

Həmçinin demişdir: "Buna uyğun şəkildə Peyğəmbər (salləllahu aleyhi və səlləm) iman və islam haqqında bir vəsf olaraq xəbər vermişdir.Peyğəmbər (salləllahu aleyhi və səlləm) ibn Ömərin (r.a) rəvayət etdiyi hədisdə demişdir: "İslam beş (dayaq) üzərində qurulmuşdur; Allahdan başqa (ibadətə haqqı olan) ilahın olmadığına və Muhammədin onun elçisi olduğuna şahidlik etmək, namaz qılmaq, zəkat vermək, Ramazan ayı oruc tutmaq və həcc etmək." İbn Abbasın (r.a) rəvayət etdiyi hədisdə qeyd edilir ki, abdul-Qeys qəbiləsinin heyəti gəlib iman barəsində soruşduqları zaman Peyğəmbər (salləllahu aleyhi və səlləm) həmin vəsfləri sadalamışdır.Bu isə, daxili

---

[40]Qutul-qulub:2/251. Məcmu`əl-fətava : 7/334.
[41]Qutul-qulub:2/251.

imanın yalnız zahiri islam ilə, habelə aşkar islamın yalnız gizli iman ilə olduğuna dəlalət edir.Habelə iman və əməl bir-birinə sıx bağlıdır və biri digərsiz faydasızdır.Onlardan biri yalnız digəri ilə doğru olur.Habelə bu iki şey, yalnız onlara zidd olan küfrün rədd edilməsi ilə birlikdə doğru və mövcud ola bilər."[42]

Həmçinin demişdir: "Uca Allah iman üçün islamı şərt qoyduğu kimi həmçinin iman üçün saleh əməli şərt qoymuş və əməl olmayacağı halda imanın faydasız olacağını qeyd etmişdir.

Əgər bir insan bütün saleh əməlləri edərsə bu, iman olmayacağı halda ona fayda verməyəcək.Həmçinin əgər o, bütövlüklə hər tələb olunana iman edərsə, əməl olmayacağı halda bu, ona fayda verməyəcək."[43]

22-İbn Batta əl-Ukbari (rahiməhullah, hic. 387-ci ildə v.e) demişdir: "Artıq mən, imanın söz və əməl olduğuna, habelə söz ilə təsdiq edib əməli tərk edənin təkzib edən və imandan çıxan

---

[42]Qutul-qulub:2/252.Şeyxul-İslam, bizim məsələmizdən kənar iki yer istisna olmaqla bu sözləri bütövlüklə nəql edib həmin sözləri təripləmiş və bu sözlərin dürüstlüyünü etiraf etmişdir:O, demişdir: "Onun dedikləri sözlər bir çox insanların dediyindən daha yaxşıdır.Lakin iki şey mübahisə doğurur: Birinci: Savab almağa layiq olan müsəlmanın Cəbrayılın hədisindəki vacib və ətraflı izah edilmiş imana sahib olması labüddür.İkinci: Peyğəmbər (salləllahu aleyhi və səlləm) müsəlman deyil mömin adını işlətmişdir.Hədisdə gəlmişdir: "Yaxud müsəlman".Çünki həmin şəxs sayılıb seçilən və ən şərəfli möminlərdən deyildi.Sanki o, deyir: Həmin şəxs xeyir işlərdə öndə olan ən yaxın möminlərdən deyil və sadəcə mötədil xeyir əhlindən biridir."Sözləri bitdi. Şeyxul-İslam bu sözə geniş rəddiyə verdikdən sonra demişdir: "Lakin şəriət sahibinin bu sözü deməsi bilinmir.Habelə onun imanı inkar etməsi harada olmasından asılı olmayaraq pislənməni tələb edir.Bu səbəbdən, iman yalnız günaha sahib olandan inkar edilir."

[43]Qutul-qulub:2/252.

olduğuna və Allahın sözü yalnız əməl ilə və əməli yalnız söz ilə qəbul edəcəyinə dair möminlərdən ağıl sahiblərini yönəldən dəlilləri Allahın kitabından oxumuşam.”[44]

Həmçinin demişdir: “Əgər biri agah olduğu halda fərzləri iqrar edib onları yerinə yetirmədiyini, fahiş və çirkin şeyləri haram sayıb lakin onlardan yan durmadığını və onları tərk etmədiyini, bununla bərabər mömin olduğunu iddia edərsə, Quranı və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gətirdiyini təkzib etmiş olacaq.Onun məsəli növbəti sözləri deyən münafiqlərin misalındadır: *“Qəlblərində iman gətirmədikləri halda, dildə (ağızları ilə): “İman etdik”, deyənlər”.*[45] Uca Allah onları yalançı çıxarmış, onların dedikləri sözü rədd etmiş və onları münafiq adlandıraraq qalacaqları yerin atəşin ən alt təbəqəsi olduğunu bildirmişdir.Bununla belə, münafiqlərin halı murciələrin halından daha yaxşıdır.Çünki münafiqlər əməli dandıqları halda əməl etmişlər.Murciələr isə sözdə əməli iqrar etdilər lakin əməli tərk etməklə onu dandılar.Bir şeyi danıb onu dili ilə iqrar edən və əzaları ilə əməl edən, dili ilə iqrar edib bədəni ilə onu etməkdən imtina edəndən daha yaxşı durumdadır.Murciələr isə söz ilə əməli iqrar edib onu, əməli tərk etməklə danmışlar.Əgər biri hər hansı bir şeyi danıb onu dili ilə iqrar edər və bədəni ilə əməl edərsə, həmin şəxs dili ilə iqrar edib bədəni ilə əməl etməkdən imtina edən şəxsdən durum etibarı ilə daha yaxşı olar. Murciələr iqrar

[44]“əl-İbənə:2/795.
[45] əl-Maidə:41.

etdikləri şeyləri danır, təsdiq etdikləri şeyləri təkzib edirlər.Onlar münafiqlərdən daha acınacaqlı haldadırlar."[46]

24-İbn Əbu Zəmənеyn (rahiməhullah, hic. 399-cu ildə v.e) demişdir: "Allaha iman, dil və qəlb ilə olur və bunun təsdiqi əməl ilə olur.Söz və əməl bir-birinə sıx bağlıdırlar.Onlardan biri yalnız digər birisi ilə sabit olur."[47]

25-İbn əl-Hənbəli Abdul-Vahhəb bin Abdul-Vahid əl-Ənsari (rahiməhullah, hic. 536-cı ildə v.e) demişdir: "Həmçinin imanın söz və əməl olmasına dəlalət edən amil Uca Allahın növbəti ayəsidir: *"Gözəl söz Ona tərəf yüksəlir və onu ucaldan yaxşı əməldir."*[48] Uca Allah, sözün yalnız əməl ilə ucaldığını xəbər vermişdir.Çünki onu ucaldan əməldir.Bu isə əməl ilə sıx bağlı olmayan sözün ucalmadığını göstərir.

Uca Allah buyurur: *"İman gətirib yaxşı işlər görənlərin mənzili isə Firdovs cənnətləri olacaqdır!"*.[49] Uca Allah əməlini sözlə və hər hansı bir əməllə bir arada cəm etməyən şəxsin cənnətdən heç bir paya sahib olmayacağını xəbər vermişdir.

Habelə Uca Allah buyurur: *"Şübhəsiz ki, Mən həm də tövbə edib iman gətirəni yaxşı işlər görüb, sonra da doğru yolu*

---

[46]əl-İbənə:2/789.Bu sözlər, əməli tərk edənin təkfir edilcəyinə və onun münafiqlərdən daha acınacaqlı durumda olacağına dair açıq-aydındır.Lakin bu sözlərdən murciələrin mütləq şəkildə təkfir ediləcəyi anlamı çıxmır.Bu sözlər, iqrar ilə bərabər əməli tərk etmiş murciələrə aid edilir.Onun tərk etməni danmaya aid etməsinə dair qeyd etdiyi sözlər, Mərvəzinin hədis əhlindən olan bir toplum alimdən nəql etdiyi sözə uyğundur.Onlar dedilər: Əgər biri iqrar etdikdən sonra onu yerinə yetirməzsə yerinə yetirmə və tərk etmə eyni olacağı zaman məna etibarı ilə sanki onu danmış kimi olacaq.(tə`zımu qadrı-s-saləh:2/517)

[47]Usulus sunnə libni əbi zəməneyn:207-ci səh.

[48] Fətır:10.

[49] əl-Kəhf:107.

*tutanı çox bağışlayanam!".*[50] Uca Allah yalnız söz və əməli bir arada cəm edən şəxsi bağışlayacağını xəbər vermişdir. Çünki onlardan biri digərsiz fayda verməyəcək.

Uca Allah buyurur: *"İman gətirib yaxşı əməllər edənlər isə yaradılmışların ən xeyirli olanlarıdır."*[51]Allah imanı söz və əməl olaraq vəsf etmiş və əməlin yalnız söz ilə fayda verdiyi kimi sözün həmçinin yalnız əməl ilə fayda verəcəyini bəyan etmişdir."[52]

Həmçinin demişdir: "Uca Allah buyurur: *"Bu sizin (dünyada) etdiyiniz (yaxşı) əməllər müqabilində varis olduğunuz cənnətdir!"*[53] Habelə buyurur: *"Beləlari cənnət-likdirlər, onlar (dünyada) etdikləri (yaxşı) əməllərin əvəzi olaraq orada əbədi qalacaqlar!"*[54] Bu ayələr, onlardan birinin digərsiz faydasız olacağını göstərir.

Bu isə bizi, murciələrin sözləri, onların məsləki və gö-rüşlərindən törəyən şeylərdən uzaq durmağa sövq edir."[55]

26-Şeyxul-İslam ibn Teymiyyə (rahiməhullah, hic. 728-ci ildə v.e)

Aşağıda Şeyxul-İslamın bu məsələni bir neçə cəhətdən əsaslandırdığı qeyd edilir:

(1)- Şeyxul-İslam əməl etməyənin kafir olduğunu bildirir:

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Həmçinin Əhli sunnə vəl cəmaata görə iman söz və əməldir. Buna Quran,

---

[50] Ta-hə:82.
[51] əl-Beyyinə:7.
[52]ər-Risələtul vadıhə fi-r-raddi aləl əşairə:2/802.
[53] əz-Zuxruf:72.
[54] əl-Əhqaf:14.
[55]ər-Risələtul vadıhə:2/808.

sunnə, sələfin icması və yerində qeyd edilən şeylər dəlalət edir.Söz, Peyğəmbəri (salləllahu aleyhi və səlləm) təsdiq etmək, əməl isə sözü təsdiq etməkdir.Bu səbəbdən insan bütövlüklə əməldən kənar qalacağı zaman mömin olmaz.

Onu mömin edən söz isə xüsusi sözdür.Həmin söz, şəhadət kəlməsidir.Əməl isə namazdır.

Habelə dinin gerçəyi itaət və tabeçilikdir.Bu isə yalnız sözlə deyil həmçinin əməl ilə tamamlanır.Əgər biri Allah üçün heç bir şey etməzsə Allahın dininə boyun əymiş olmaz. Dini olmayan isə kafirdir."[56]

(2)-Şeyxul-İslam, imkan və elm olan yerdə əməllərin yoxluğunun doğru iman ilə deyil yalnız qəlbdə olan nifaq və zındığlıq ilə olacağını bildirir.

Şeyxul-İslam demişdir: "Bu məsələnin iki tərəfi vardır: Birinci: Zahiri küfrün isbatına dair.İkinci: Daxili küfrün isbatına dair.

Məsələnin ikinci tərəfi qeyd edildiyi kimi imanın söz və əməl olması məsələsi üzərində qurulur.Bir insanın, Allahın ona namazı, zəkatı, orucu və həcci vacib buyurduğuna dair qəlbində sabit imana sahib olub Allah üçün ömründə bir dəfə olsun səcdə etməməsi və Allahın zəkat və həcc kimi ibadətləri yerinə yetirməməsi ağılasığmazdır.Bu qeyri-müm-

[56] Şərhul umda:2/86.

kündür.Bu, doğru iman ilə deyil, yalnız qəlbdə olan zındığlıq və nifaq ilə baş verir."[57]

(3)-Şeyxul-İslamın, Peyğəmbərə (salləllahu aleyhi və səlləm) xas olan vaciblərdən heç bir şey etməyəcəyi təqdirdə insanın Allaha və Elçisinə iman gətirmiş olmayacağını bildirməsi.

Şeyxul-İslam (qaddəsəllahu ruhahu) demişdir: "Artıq bəlli olmuşdur ki, dində söz və əməlin olması labüddür və insanın namaz, zəkat, oruc və başqa vaciblərdən olan zahiri vacibləri yerinə yetirməyəcəyi halda dili yaxud dili və qəlbi ilə Allaha və Elçisinə iman gətirməsi qeyri-mümkündür. Əgər fərz edilərsə ki, insan əmanəti əda etmək, doğru danışmaq, bölgü və qərarlarda ədalətli olmaq kimi vacibləri

[57]Əl-İmanul əusat, məcmu`əl-fətava:7/616.Müxaliflər Şeyxul-İslamın sözlərinin daxildə küfrün isbatı ilə əlaqəli olduğunu iddia etmişlər.Bizim sözümüz isə zahirdə küfr hökmünün verilməsi ilə əlaqəlidir.Şeyxul-İslamın sözlərinin tamamı namaz ilə əlaqədardır.Bu səbəbdən, biz məsələnin kökünə qayıtdıq.Habelə Şeyxul-İsam "məcmu`əl-fətəva:7/405" kitabında qeyd etmişdir ki, qeyri-mümkün olan işlərin fərziyyə şəklində irəli sürülməsi yalnız zehində olur.Müxalif isə bu üç yerin, onu dəlil gətirən şəxslərin qavramadıqları önəmli məqamlar olduğunu iddia etmişdir.

Dedim: Birinciyə verilən cavab: Deyiləcək: Bu məsələdə daxildə küfrün hasil olmasını qəbul edirsənmi? Yoxsa bu, sadəcə həmin açıq-aydın məqama cavab təəssüratı yaratmaq cəhdidir? Əgər sən daxildə küfrün hasil olacağını qəbul etsən şəfaət hədisinə dair dəlil olaraq gətirdiyin əsas, habelə əməlin yalnız mütləq imanla bağlı olduğuna dair iddian puç olacaq.İkinci: Məsələnin namazı tərk edənin hökmünə qayıtmasıdır.Şeyxul-İslamın sözlərini oxuyan şəxsə bu sözlərin batilliyi gizli deyil.Çünki belə olan halda, zəkat, oruc və həccin qeyd edilməsinə səbəb nədir? Habelə növbəti sözlərdə fayda nədir: O, imanın söz və əməl olması üzərində qurulmuşdur."?! Üçüncü yer isə öncəkilərdən daha təəccüblüdür. Həmin yer, ona veriləbiləcək ən dolğun cavabdır.Belə ki burada qeyri-mümkün olan, namaz, zəkat, oruc və həccin tərk edilməsi ilə birgə qəlbdə küfr və zındıqlığa zidd gələn sabit və səhih imanın varlığıdır.Burada imanın varlığının təsəvvür edilməsi yalnız xəyal və zehində mövcud olan qeyri-mümkün bir işin təsəvvür edilməsidir.Müxalif isə bu cür tərk etmə ilə birgə imsanı əbədi atəşdən qurtaracaq sabit, səhih imanın olacağına qəti əminlik ifadə edir.

Allahın bunu vacib buyurduğu səbəbilə deyil və Allaha və Elçisinə iman gətirmədən bu işləri edərsə bununla küfrdən çıxmış olmayacaq.Çünki müşriklər və kitab əhli bu işlərin vacib olduğunu hesab edirlər.Lakin insan Muhammədə (salləllahu aleyhi və səlləm) xas olan vaciblərdən heç bir şeyi yerinə yetirməzsə, Allaha və Elçisinə iman gətirmiş olmaz.Əgər biri vaciblərdən heç bir şey edilmədən, istər bu vaciblər onun zəruri amili yaxud bir hissəsi olsun, vacib imanın[58] hasil olduğunu deyərsə açıq-aşkar yanlışlıq etmiş olurlar.Bu, sələfin və imamların həmin sözün sahiblərini sərt şəkildə

---

[58] Bu, Şeyxul-İslamın "vacib iman" deyərək imanın özəyini qəsd etdiyi yerlərdən biridir.Buna iki məsələ dəlalət edir: Birinci: Cümlənin məzmunu.Orada gəlmişdir: "Bununla küfrdən çıxmamışdır." İkinci: Bu və ondan öncəki sözlər namazı tərk edənin gerçək olaraq (yəni, daxildə olan) küfrünü bəyan etmək üçün Şeyxul-İslamın mövzudan kənar olaraq qeyd etdikləridir.Bu səbəbdən sonda demişdir: Namaz isə onun ən əzəmətlisi, ümumi olanı, öndə olanı və şəni uca olanıdır."Namazı tərk edənin daxilən küfrü ilə əlaqəli olan bu araşdırma Şeyxul-İslamın növbəti sözlərindən başlayır: "Bu məsələ iki tərəflidir.Birinci: Zahiri küfrün isbatına dair.İkinci: Daxili küfrün isbatına dair." (7/616)

Şeyxul-İslamın "vacib iman" istilahını səhih iman yaxud küfrə müqabil olan imanın özəyi mənasında işlətdiyi yerlərdən biri (7/188): "İnsan bacardığı bir halda iman sözünü dilə gətirməyəcəyi zaman bu, onun qəlbində Allahın insana fərz buyurduğu vacib imanın olmayacağına dəlalət edəcək." Əgər bu sözlər "imanın özəyinə əlavə olan"a aid edilsəydi qəti şəkildə batil olardı.Çünki bu, bacardığı halda şəhadəti dilə gətirməyənin səhih imana sahib olacağını ifadə edəcək.Bu isə, birinci hissədə qeyd edildiyi kimi Əhli sunnənin icmasına müxalifdir.

Habelə Şeyxul-İslam demişdir (18/53): "Bəzən onlardan bir çoxu üçün ondan vacib imana fayda qatacaq şeylər hasil olmur.Buna görə də o, kafir, zındığ, münafiq, cahil, azmış, azdıran, zülmkar, nankör olur və peyğəmbərlərin ən böyük düşmənlərindən və dinin ən böyük münafiqlərindən olur.Uca Allah belələri haqqında buyurur: *"Beləliklə də, biz hər bir peyğəmbər üçün günahkarlardan düşmən etdik."* Bu, gördüyün kimi açıq-aydın və bəllidir."(7/584)

Bəzən Şeyxul-İslam "vacib iman" ifadəsini imanın özəyinə əlavə gələn yaxud küfrə deyil fasiqlik və asiliyə müqabil gələn iman mənasında işlədir.Bu isə onun dediyi sözlərin məzmunundan aydın olur.İrəlidə bizim məsələ ilə əlaqəli bu iki istifadə qaydası arasında heç bir ziddiyətin olmadığı bəyan ediləcək.

pislədikləri murciəlik bidətidir.Məlum olduğu kimi, onlar bu bidət haqqında çox sərt sözlər söyləmişlər.Namaz isə onların içində ən əzəmətli, ümumi, öndə gedən və dəyərli bir vacibdir."[59]

(4)-Şeyxul-İslam bədən əməllərinin olmayacağı zaman qəlbdə imanın qalmayacağını bildirmişdir.

Şeyxul-İslam demişdir: ""Burada, Əbul Həsənin "əl-mucəz" kitabında qeyd etdiyi cəhmilərin sualı vardır.Belə ki, Qurani Kərim aşağıda qeyd edilən şəxslərdən savayı insanlardan imanı inkar edib demişdir: *"Möminlər ancaq o kəslərdir ki, Allah anıldığı zaman onların qəlbi qorxuya düşər".*[60] Uca Allah bu əməllərin imandan olduğunu deməmişdir.Onlar demişlər: Biz deyirik: Əgər biri bu əməlləri etməzsə mömin olmaz.Çünki onun yoxluğu qəlbdə olan elmin yoxluğuna dəlildir.Buna bir neçə yöndən cavab veriləcək:

*Birinci*: Siz həmin əməllərin qəlb imanının zəruri amili olduğunu qəbul etdiniz.Belə olan halda onun yoxa çıxması qəlbdə imanın qalmayacağını ifadə edir.Məqsəd məhz budur.Bundan sonra onun zəruri amil yaxud onun bir hissəsi olması məsələsi ləfzi ixtilafdır."[61]

Şeyxul-İslamın növbəti sözlərinə diqqət yetir: "Siz həmin əməllərin qəlb imanının zəruri amili olduğunu qəbul etdiniz.Belə olan halda onun yoxa çıxması qəlbdə imanın

[59]Əl-İmanul əusat, məcmu`əl-fətava:7/621.
[60] əl-Ənfəl:2.
[61]Əl-İmanul əusat, məcmu`əl-fətava:7/202.

qalmayacağını ifadə edir.Məqsəd məhz budur."Beləliklə də, bunun, Şeyxul-İslama görə tələzumu ifadə edən amil olması aydın olur.

(5)-Şeyxul-İslam, zahiri əməllərin "ləzim"in yoxluğunun daxili əməllərin "məlzum"un yoxluğuna dəlalət etdiyini bildirmişdir.

Şeyxul-İslam demişdir: "Murciələr zahiri əməli imandan çıxartmışlar.Onlardan qəlb əməllərini həmçinin imandan çıxartmaq istəyib onu adi təsdiq edənlərin sözü açıq-aydın zəlalətdir.Zahiri əməli çıxartmaq istəyənlərə deyiləcək: Zahiri əməl daxili əməlin zəruri amilidir və ondan ayrılmazdır.Zahirin yoxluğu isə daxilin yoxluğuna dəlalət edir.Yerdə qalan çəkişmə isə zahiri əməlin tədammun[62]yolu ilə iman anlamının bir hissəsi olması yaxud iman anlamının zəruri amil olması ətrafındadır."[63]

Həmçinin demişdir: "Zahiri əməllərin iman adına daxil olması məcazdır, deyənə deyilmişdir: Sənin çəkişmən ləfzi çəkişmədir.Belə ki, sən bunların qəlbdə olan vacib imanın zəruri amilləri və gərəkli ünsürləri olduğunu qəbul edəcəyin zaman "ləzim"in yoxluğu "məlzum"un yoxluğunu qaçılmaz edəcək.Bu zahirin yoxluğu daxili yoxluğu qaçılmaz edir. Bunu etiraf edəcəyin zaman çəkişmə ləfzi olacaq.Yox, əgər sən Cəhm və onun ardıcılları kimi, küfr olan şeyləri aşkar etmək və bütün zahiri əməlləri tərk etməklə bərabər tam,

[62]Diləlatu ət-tədammun: Ləfzin bir hissəsinə dəlalət etməsidir.Misal olaraq: Evin tavana yaxud divara yaxud döşəməyə dəlalət etməsidir.
[63]Əl-İmanul əusat, məcmu`əl-fətava:7/554.

vacib imanın qəlbdə qərar tutacağını desən, sənə belə deyiləcək: "Sənin bu sözün, zahirin daxil üçün zəruri amil və gərəkli ünsür olduğuna dair sözünlə ziddiyyət təşkil edəcək. Üstəlik deyiləcək: "Sənin sözünün gerçəyi, bəzən zahirin daxil ilə bağlı bəzən isə ayrı olmasıdır.Bu isə onun, daxilin zəruri amili, gərəkli ünsürü və nəticəsi olmadığını ifadə edəcək.Lakin o, olacağı zaman daxilin olacağına dəlalət edən, olmayacağı zaman isə yoxluğu ilə yoxluğa dəlalət etməyən dəlildir.Bu, sənin sözünün gerçəyidir."[64]

Həmçinin demişdir: "O, demişdir: "İman boş xülyalar ilə deyil", yəni sözlər ilə.Habelə: "xoşlanma ilə deyil" yəni, qəlbindən gəlmədiyi halda onu aşkara çıxarıb zahiri bəzəyə çevrilməklə.Bunun mənası: O (iman), dildə zahir olan və zahiri təmtərah deyil, lakin o, qəlbə düşən və əməlin təsdiq etdiyi bir şeydir.Əməl qəlbdə imanın olduğunu təsdiq edir.Əməl olmayacağı zaman onun qəlbində imanın olduğunu deməsi yalan olacaq.Çünki qəlbdə olan, zahiri əməli tələb edir. Zahiri əməlin "ləzim"in yoxluğu isə daxili əməlin "məlzum"un yoxluğuna dəlalət edir."[65]

Həmçinin demişdir: "Zahiri əməl imanın gərəkli ünsürü və tələbidir.Belə ki, qəlb imanı hasil olacağı zaman zəruri surətdə bədən əzalarının imanı hasil olacaq.Qəlb imanında qəlbin təsdiqi və tabeçiliyi labüddür.Çünki əgər insan Peyğəmbərə nifrət və kin-küdurət bəslədiyi və ona tabe olmağı özünə sığışdırmadığı halda qəlbi ilə Muhammədin (salləllahu

[64] Əl-İmanul əusat, məcmu`əl-fətava:7/579.
[65] Məcmu`əl-fətava:7/294.

aleyhi və səlləm) Allahın Elçisi olduğunu təsdiq edərsə, ona qəlbi ilə iman gətirmiş olmaz”.[66]

(6)-Şeyxul-İslam, bədən hərəkəti olmadan qəlbdə imanın yer almasının qeyri-mümkün olduğunu bildirir:

Şeyxul-İslam (rahiməhullah) demişdir: “Həmçinin onların əməli (imandan) çıxartmaları onların qəlb əməllərini həmçinin ondan çıxartdıqlarını hiss etdirir.Bu isə, şübəhsiz ki, batildir.Çünki Peyğəmbəri (salləllahu aleyhi və səlləm) təsdiq edib ona qəlbi və bədən əzaları ilə nifrət edən və ona ədavət bəsləyən şəxs, zəruri və kəsin olaraq kafir olur.

Ancaq əgər onlar qəlb əməllərini imana daxil etsələr yenə də xəta etmiş olacaqlar.Çünki bədən hərəkəti olmadan qəlbdə imanın yer alması mümkünsüzdür.Burada məqsəd, müəyyən əməli qeyd etmək  deyil.Allaha və Elçisinə qəlbi ilə iman gətirən şəxsin Peyğəmbərin düşmənləri ilə savaşdığını gördüyü zaman onların qarşısını almağa və ona toxuna biləcək zərəri dəf etmək üçün səy göstərməyə qadir olduğu halda Peyğəmbərə zəfər gətirəcək hərəkəti etməməsi adətən qeyri-mümkündür.Bunun ağılasığmaz olması məlumdur.”[67]

(7)- Şeyxul-İslam, sələfin və Əhli sunnənin məzhəbinə uyğun olaraq daxili iman olacağı zaman itaətlərin həmçinin olacağını bildirmişdir:

---

[66] Məcmu`əl-fətava:10/269.Muxtəsər əl-fətəva əl-misriyyə:123-səh.
[67] Əl-İmanul əusat, məcmu`əl-fətava:7/556.

Şeyxul-İslam (rahiməhullah) demişdir: "İnsanın: İtaət, daxili təsdiqin səmərəsidir,-deməsi iki şeyi ifadə edir:

İtaətlərin, imanın zəruri amilləri olmasıdır.Daxili iman olduğu zaman o da, olur.Bu, sələfin və Əhli sunnənin məzhəbidir."[68]

(8)-Şeyxul-İslam bildirmişdir ki, zahiri əməllərdən heç bir şey olmadan qəlbdə tam imanın olması qeyri-mümkündür:

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Hər kim zahir ilə daxilin bağlılığını bilərsə, bu mövzuya dair olan şübhədən azad olar və insan onun vacibliyini iqrar edib yerinə yetirməkdən imtina edəcəyi halda öldürülməyəcəyini yaxud müsəlman olaraq öldürüləcəyini deyən bəzi fəqihlərin murciə və cəhmiyyənin düşdüyü, həmçinin heç bir əməl olmadan qəti iradə ilə dolğun qüdrətin olduğunu deyənlərin düşdüyü şübhəyə düşdüklərini bilər.Bu səbəbdən, bu cür şəxsi öldürməkdən imtina edən bəzi fəqihlər bunu iman məsələsinə dair deyilən sözün və əməllərin imandan olmadığını ifadə edən sözün üzərinə qurmuşlar.

Artıq qeyd edilmişdir ki, əməllərin cinsi "cinsul aməl" qəlb imanının zəruri amilləridir.Zahiri əməllərdən heç bir şey olmadan qəlbdə tam imanın olması isə qeyri-müm-

[68] Məcmu`əl-fətava:7/363.İbn Salahın sözləri izah ediləcəyi zaman həmin sözlər dolğun gələcək.

kündür.İzah edildiyi kimi, zahirin, imanın zəruri amili yaxud imanın bir hissəsi olması gerçəyi dəyişmir."[69]

*Bildiriş*:

Şeyxul-İslam demişdir: "Qəlbdə tam iman : إيمان القلب التام".
İbn Teymiyyə (rahiməhullah) burada, bəzilərinin yanlış anladığı kimi kamil imanı deyil səhih və yetərli imanı qəsd edir. Qeyd edildiyi kimi Şeyxul-İslamın əminliklə "ləzim" olmayacağı zaman "məlzum"un həmçinin olmayacağını, qəlbdə imanın qalmayacağını, habelə zahiri əməllərin yoxluğunun doğru iman ilə deyil yalnız qəlbdə olan nifaq və zındığlıqla bərabər olacağını və heç bir yozum qəbul etməyən digər açıq-aydın sözləri qeyd etməsi buna dəlildir. Üstəlik buna həmin yerdə gələn cümlənin məzmunu dəlalət edir.Belə ki, şeyx namazı tərk edənin küfrünü qeyd etdiyi və namazın tərkində qətlə yetirilənəcən israrla duranı təkfir etməyənlərə cavab verdiyi bir əsnada, öncə iki misal çəkmişdir: Birinci: Quran yazısını ayağ yoluna atıb: Şahidlik edirəm ki, onun içindəkilər Allah kəlamıdır,- deyən şəxs. İkinci: Peyğəmbərlərdən birini öldürüb: Şahidlik edirəm ki, o, Allahın elçisidir,-deyən şəxs.Habelə qəlb imanına zidd olan digər əməllər.Əgər həmin şəxs: Buna rəğmən mən qəlbən mömინəm,-deyərsə, dilə gətirdiyi sözdə yalançı olar. Bu məqama son dərəcə diqqət yetirmək lazımdır.Hər kim zahir ilə daxilin bağlılığını bilərsə bu mövzuya dair olan şübhədən azad olar…"

[69] Məcmu`əl-fətava:7/616.

Bu sözlər imanın naqisliyi haqqında deyil, yalnız yox olması haqqında bəhs edir.Buna diqqət yetir!

Artıq Şeyxul-İslam "Qəlbdə tam iman : إيمان القلب التام" sözlərini küfrə əks olan səhih yaxud yetərli iman mənasında aşağıdaki yerlərdə istifadə etmişdir:

1-Şeyxul-İslam (rahiməhullah) demişdir: "Əgər iman islam ilə bir arada qeyd edilərsə iman qəlbdə olanı islam isə zahirdə olanı ifadə edəcək.Müsnəddə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) belə deməsi rəvayət edilir: "İslam aşkarda olan iman isə qəlbdə olandır.İman, Allaha, mələklərinə, kitab-larına, elçilərinə, ölümdən sonra dirilişə və qədərin xeyiri və şərinə iman gətirməyindir."İnsanda bu iman hasil olacağı zaman şəhadət, namaz, zəkat, oruc və həcc olan islamın hasil olması zəruri surətdə vacib olacaq.Çünki onun Allaha, mələklərinə, kitablarına və elçilərinə imanı, Allaha təslim-çiliyi və tabeçiliyi tələb edir.Çünki məqsəd olmadan qəti iradə ilə birgə qüdrətin olması mümkünsüz olduğu kimi imkanla birgə zahirdə bunun baş verməməsi daxildə iqrar, sevgi və boyun əymənin hasil olmasını qeyri-mümkün edir.Bununla da, sənə bəlli olur ki, qəlbi ilə qəti şəkildə iman gətirən şəxsin imkan olan yerdə şəhadəti dilə gətirməməsi qeyri-mümkündür.İmkan olan yerdə şəhadətin yoxluğu qəlbdə tam imanın yoxluğunu qaçılmaz edir.Bu-nunla da, zahiri imansız adi imanın axirətdə fayda verəcəyini iddia edən Cəhmin və onun ardıcıllarının yanlışlığı üzə çıxır.Bu, qeyri-mümkündür.Çünki qəlbdə tam iman hasil olacağı zaman mütləq imkan çərçivəsində zahirdə

onun gərəkli ünsürü hasil olacaq.Belə ki, insanın başqasını dərin sevməsi və ona qovuşmaq iqtidarında olması lakin bu yolda heç bir zahiri hərəkət etməməsi qeyri-mümkündür."[70]

Şeyxul-İslamın sözlərinə diqqət yetir: "İmkan olan yerdə şəhadətin yoxluğu qəlbdə tam imanın yoxluğunu qaçılmaz edir".Daha sonra bunu kamil imana aid etməyin nə dərəcədə doğru olduğu haqqında düşün!

Çünki əgər belə olsaydı bu, imkan olan yerdə şəhadəti tərk edənin doğru imana sahib olacağını ifadə edəcəkdi. Artıq Əhli sunnənin, imkan olan yerdə şəhadəti tərk edənin kafir olduğuna dair icması qeyd edilmişdir.

2-Şeyxul-İslamın yuxarıda qeyd etdiyi sözlərə bənzər sözləri mövcuddur.Belə ki, ibn Teymiyyə (rahiməhullah) demişdir: "Habelə qəlb, təsdiq və iradəni şamil edən tam sevgini gerçəkləşdirəcəyi zaman zəruri surətdə zahiri əməllərin mövcudluğu labüd olacaq.Çünki qəti iradə tam qüdrət ilə bir arada gələcəyi zaman mütləq şəkildə məqsədin olması labüd olacaq.Felin yoxluğu isə ancaq qüdrətin yaxud iradənin kamil olmaması səbəbilə olur. Çünki onun kamil olması ixtiyarı felin olmasını vacib edir.

Qəlb tam surətdə Muhammədin Allahın Elçisi olduğunu iqrar edəcəyi və onu tam bir sevgi ilə sevəcəyi zaman bunu etməyə imkanı olduğu halda bunu dilə gətirməməsi qeyri-mümkün olacaq.Lakin əgər o, lallıq yaxud qorxu və

[70]Əl-İmanul əusat, məcmu`əl-fətava:7/553.

başqa səbəbdən ötrü bunu etməyə aciz olarsa bunu dilə gətirmək gücündə olmayan sayılacaq."[71]

Dedim: Burada " : التام : tam" sözü, doğru və səhih mənasını ifadə edir.Bu sözün "kamil" olaraq izah edilməsi heç bir vəchlə doğru deyil.Çünki belə olan halda, imkan olan yerdə şəhadətin dilə gətirilməməsi ilə birgə qəlbin iqrarının və sevginin doğru olması gərəkli olacaq.

3-Habelə Şeyxul-İslam imanın fərqlilik yönlərini bəyan edərkən demişdir: "Birinci: Zahiri əməllər.İnsanlar bu işdə bir-birindən fərqlənir və həmin əməllər bəzi insanlarda çox bəzilərində isə az olur.Bu kimi şeylərə artma və azalmanın daxil olmasına dair insanlar arasında yekdillik vardır.Onların çəkişməsi bunun iman anlamına girməsi ətrafındadır. İnkar edənlər bunun imanın səmərəsi və tələbi olduğunu deyirlər.Onlara görə o, məhz bu etibar ilə ora daxil edilmişdir.Bu etibar ilə əməl imana məcazi formada girmiş olur. Bu, onlara görə imanın artıb azalmasıdır.Yəni, səmərəsinin artması və azalmasıdır.Belə deyiləcək: Artıq qeyd edilmişdir ki, bu, imanın zəruri amilləri və gərəkli ünsürləridir.Zahiri söz və əməlsiz qəlbdə tam imanın olması qeyri-mümkündür.Onun imanın zəruri amili yaxud bir hissəsi olmasına gəldikdə isə artıq deyildiyi kimi bu məsələ, iman sözünün fərdi şəkildə yaxud islam və əməl sözü ilə birləşik istifadəsi etibarı ilə fərqlənir."[72]

---

[71] Məcmu`əl-fətava:10/272.
[72] Məcmu`əl-fətava:7/562.

Burada varid olan “tam iman” sözü heç şübhəsiz ki, doğru iman mənasını ifadə edir.Çünki əgər o, kamil olaraq izah edilsəydi, belə olan təqdirdə sözün yoxluğu ilə bərabər imanın doğru olması məfhumu ortaya çıxacaqdı.Əhli sunnədən isə bunu ümumiyyətlə deyən olmayıb.

4-Habelə Şeyxul-İslam (rahiməhullah) demişdir: “İblis, firon, yəhudi və onlar mislində olanların canında küfr, habelə ucalıq və həsəd istəyinin olması onlara Allahı sevməyə və imanı tamamlayan qəlb ibadətinə sahib olmağa mane olmuşdur.Bu üzdən elmi faydasız edən, Allahın razılığına nifrət etmə və Onu qəzəbləndirən şeylərə uyma kimi küfr qəlbdə yer almışdır.”[73] Heç şübhəsiz ki, burada qeyd edilən tamamlıq, səhihliyi ifadə edir.[74]

5-Habelə demişdir: “O, yalnız onunla tam olacaq özəydən və olmayacağı təqdirdə insanı cəzaya məruz qoyacaq surətdə nöqsana uğrayan vacibdən ibarətir.”[75]

Burada qeyd edilən “tam” sözü, heç şübhəsiz ki, səhihliyi ifadə edir.Müxalif isə həmin sözlərdə gələn mənaya diqqət yetirmədən həmin sözləri dəfələrlə öz lehinə dəlil olaraq gətirmişdir.

Bu və digər sözlər, Şeyxul-İslamın “التام : tam” sözünu istifadə etdiyi zaman səhih yaxud yetərli imanı yaxud imanın özəyini qəsd etdiyini isbat edir. Bu, Şeyxul-İslamın sözlərində əsasən istifadə etdiyi mənadır.Şeyxul-İslam de-

[73] Məcmu`əl-fətava:7/562.

[74] Bu araşdırmanın birinci hissəsinə bax.Orada ondan digər iki nəql gəlmişdir.

[75] Məcmu`əl-fətəva:7/637.Bu sözlər kitabın axırıncı fəsilində izah ediləcək.

mişdir: “Hər hansı sözü dilə gətirən şəxsin sözlərini digər sözləri ilə izah etmək və onun sözlərini bir neçə yerdən götürmək gərəkdir.Belə olan halda onun, danışdığı zaman ifadələrdə adət etdiyi üslubu və həmin söz ilə nəyi qəsd etdiyi bilinəcək.Habelə digər yerdə məhz həmin mənanı qəsd etməsi bilinən mənalar bilinəcək.Onun məna və ifadələrdə adəti və vərdişi bilinəcəyi zaman bu, həmin şəxsin məqsədini bilmək üçün sanki bir yardımçı olacaq. Ancaq əgər onun sözü onun adət etmədiyi mənada istifadə edilərsə və istifadədə adət etdiyi mənanın istifadəsi tərk edilərsə, üstəlik onun sözlərini ziddiyətli etmək və həmin sözləri ona münasib gələn digər sözlərə aid edilməsini tərk etməklə həmin sözlər, qəsdi olması bilinən mənaya zidd olan surətdə yozularsa bu, onun sözlərinin təhrif edilməsi, məqsədinin dəyişdirilməsi və adından deyilən yalan hesab ediləcək.”[76]

(9)-Şeyxul-İslamın, bütün bədən əməllərinin yoxluğu ilə bərabər qəlbdə vacib imanın olmasının təsəvvür edilməz olduğunu bildirməsi:

Şeyxul-İslam (rahiməhullah) demişdir: “Bu ona görədir ki, imanın özəyi qəlbdə olandır.Zahiri əməllər isə bunun zəruri amilidir.Bütün bədən əməllərinin yoxluğu ilə birgə qəlbdə vacib imanın olması təsəvvür edilməzdir.Üstəlik zahiri əməllərin nöqsanlı olması qəlbdə olan imanın nöqsanlı

[76]əl-Cəvabu-s-sahih:4/44.

olması səbəbilə olur.İmanın özəyi qəlbdə olsa belə o, daxili və zahiri əməlləri (məlzum və ləzimi) özündə cəm edir."[77]

Dedim: Bədən əməlləri bütövlüklə mövcud olmayacağı zaman qəlbdə vacib imanın olması təsəvvür edilməz olacaq.

Hətta əgər fərz edilərsə ki, Şeyxul-İslam burada vacib iman dedikdə doğru və yetərli imanın özəyinə əlavə olanı qəsd edirsə, belə olan təqdirdə bu sözü dəlil gətirmək əsassız olacaq.Lakin bu söz, qəlbdə imanın deyil yalnız küfr və zındığlığın qalacağına dair öncə bildirdiyi ifadələr ilə heç bir ziddiyyət təşkil etmir.Çünki biz deyirik: Bütövlüklə zahiri əməlin tərk edilməsi qəlbdə doğru imanın olmamasına dəlildir.Bu isə, doğru imanın özəyinə əlavə olanın yoxluğuna daha qabarıq dəlalət edir.

(10)-Şeyxul-İslam bildirmişdir ki, zahiri vaciblərin tərk edilməsi qəlbdə vacib imanın yoxluğuna dəlildir:

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Sələf demişlər: Zahiri vaciblərin tərk edilməsi qəlbdə vacib imanın yoxluğuna dəlildir.Lakin bəzən bu, Allahı və Elçisini sevmək, Allahdan qorxmaq və buna bənzər qəlb əməlinin yoxa çıxması ilə baş verir.Bu isə qəlbdə təsdiqdən hər hansı bir şeyin yoxluğunu gərəkli etmir.

Bunlara[78]görə əgər şəriət hər hansı bir şəxsin imansız olduğunu qeyd edirsə deməli bu, ümumiyyətlə onun

---

[77]əl-İman, məcmu`əl-fətava:7/198.

[78]Şeyx burada Əşari, Bəqilləni və onlardan öncə iman məsələsində Cəhmin sözünü müdafiə edənləri nəzərdə tutur.

qəlbində təsdiqdən heç bir şeyin olmadığını göstərir.Bu, əksər ağıl sahiblərinə görə cəfəngiyyatdır."[79]

Dedim: Burada gələn vacib iman, doğru və yetərli imandır.Buna dəlil onun növbəti sözləridir: "Lakin bəzən bu, Allahı və Elçisini sevmək, Allahdan qorxmaq və buna bənzər qəlb əməlinin yoxa çıxması ilə baş verir. Bu isə qəlbdə təsdiqdən hər hansı bir şeyin yoxluğunu gərəkli etmir.

Cümlənin məzmunundan məlum olur ki, Şeyxul-İslam qəlb imanının getməsi və yox olması məsələsində müxaliflə razılaşır, lakin bunun ancaq təsdiqin getməsi ilə olmayacağını, həmçinin bəzən qəlb əməlinin getməsi ilə olacağını deyir.Bu isə qəlbdə vacib imanın yoxluğu deyildiyi zaman qəlb əməlinin yoxa çıxması ilə nəticələnən doğru və yetərli imanın yoxa çıxmasının qəsd edildiyini göstərir.

(11)-Şeyxul-İslam bildirmişdir ki, zahirdə itaətin özəyini gerçəkləşdirmək İslam dinində labüd bir məsələdir:

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Əgər mömin olmayan həmin bilən və danan şəxslərdən biri, yəhudi və başqalarının dediyi kimi: Muhammədd Allahın Elçisidir!- deyərsə, bu, onların biliyinə uyğun gələn adi xəbər verməni ifadə edəcək.Uca Allah onlar haqqında buyurur: *"Kitab verdiyimiz şəxslər onu öz oğullarını tanıdıqları kimi tanıyırlar. Həqiqətən də, onlardan bir dəstə haqqı bilə-bilə gizlədir."*[80] Lakin adi elm onlara fayda vermədiyi kimi həm-

---

[79] Məcmu`əl-fətava:7/148.

[80] əl-Bəqərə:146.

çinin adi xəbər vermə onlara fayda vermir.Daxildə olan elm ilə onun tələbi olan sevgi, təzim, tabeçilik və buna bənzər əməllərin bir arada gəlməsi gərəkdir.Həmçinin zahiri xəbər ilə onun tələbi olan təslimçilik, tabeçilik və itaətin özəyinin bir arada gəlməsi gərəkdir."[81]

Gördüyün kimi, bunun dörd işdə şərt olması açıq-aydındır.Bunlar gerçəyin mürəkkəb dayağlarıdır: Qəlbin sözü və əməli, dilin sözü və bədən əməlinin özəyi.Şeyxul-İslam onu burada itaətin özəyi adlandırmış və təsdiq daxili əməl ilə, habelə dil sözü zahiri əməl ilə bir arada gəlməyincə adicə dil sözü ilə təsdiqin kafirə fayda verməyəcəyini bəyan etmişdir.Şeyxin bu sözlərində, zahirlə daxil arasında olan bağlılığın imanın özəyində deyil yalnız mütləq imanda yaxud kamil imanda olduğunu iddia edənlərə tutarlı cavab vardır.

27-İmam ibnul-Qayyim (rahiməhullah, hic. 751-ci ildə v.e)

(1)-İmam, zahiri əməlin yoxluğunun daxilin fəsada uğramasına dəlil olduğunu bildirmişdir:

İmam (rahiməhullah) demişdir: "İmanın zahiri və daxili vardır.Onun zahiri, dil sözü və bədən əməli, daxili isə qəlb təsdiqi, tabeçiliyi və sevgisidir.Daxili olmayan zahir, qanların tökülməməsini və mal-mülk və zürriyətin qorunmasını təmin etsə belə, heç bir fayda vermir.

Həmçinin zahiri olmayan daxil, acizlik, məcburiyyət və həlak olma qorxusu olmadığı təqdirdə yetərli olmur.Heç bir

[81]ət-Tis`iniyyə:2/673.

maneə olmadan zahirdə əməlin yoxluğu daxilin fəsada uğramasına və imandan kənar düşməsinə dəlildir.Onun naqısliyi isə imanın naqisliyinə dəlildir.Onun güclü olması isə imanın gücünə dəlildir.İman, islamın qəlbi və beyinidir. Yəqinlik isə, imanın qəlbi və beyinidir.İmanı və yəqinliyi artırmayan hər bir elm və əməl saxtadır.Habelə əmələ təşviq etməyən hər bir iman həmçinin saxtadır."[82]

Həmçinin (rahiməhullah) demişdir: "Sahibini daxili imanın həqiqətinə çatdırmayan hər zahiri islam, daxili imandan olan şeylərə yiyələnməyincə faydasız olur.

İslamın zahiri ayinlərini yerinə yetirməyənin hər daxili həqiqəti, necəliyindən asılı olmayaraq faydasızdır.Əgər qəlb sevgi və qorxu səbəbilə parça-parça olar lakin əmrlər və şəriətin zahiri ilə ibadət etməzsə bu, onu atəşdən qurtarmayacaq.Həmçinin əgər o, İslamın zahiri əməllərini yerinə yetirər lakin daxilində imanın həqiqətinə sahib olmazsa bu, həmçinin onu atəşdən qurtarmayacaq."[83]

(2)-İmam bildirmişdir ki, insanın qəlbində, itaətlərin yerinə yetirilməsini və günahların tərk edilməsini tələb etməyən qəti imanın yerləşməsi ən ağılasığmaz işlərdəndir:

İmam (rahiməhullah) demişdir: "Biz deyirik: Əslində Allahın namazı əmr etdiyini təsdiq edən şəxs namazın tərk edilməsində davamiyyətli şəkildə israr etməz.Çünki adət üzərə və təbii hal olaraq bilinir ki, insanın, Allahın ona hər gün və gecə beş namazı fərz buyurduğunu və onu tərk

[82]əl-Fəvaid:85-ci səh.
[83]əl-Fəvaid:142-ci səh.

etdiyinə görə ən ağır cəza ilə cəzalandırılacağını qəti şəkildə təsdiqlədiyi bir arada onu tərk etməkdə israrla durması ağılasığmazdır.Bu, tamamılə ağılasığmaz haldır.Onun fərz olduğunu təsdiq edən şəxs heç vaxt onu tərk etməkdə davamiyyətli şəkildə durmaz.Çünki iman yiyəsinə bunu əmr edir.Onun qəlbində bunu əmr edən amilin yoxluğu isə qəlbdə ümumiyyətlə imanın yoxluğunu göstərir. Habelə sən, qəlb əhkamlarına və əməllərinə dair heç bir bilgi və elmə sahib olmayanın sözünə qulaq asma! İnsanın qəlbində müjdə və təhdidə, cənnətə və cəhənnəmə və Allahın ona namazı vacib buyurduğuna və onu tərk edəcəyinə görə cəzalanacağına dair imanın olması, eyni zamanda həmin şəxsin sağlam və salamat, habelə əməl etməyə heç bir maneə ilə üzləşmədiyi bir halda namazın tərk edilməsində davamiyyətli durmasi haqqında təbii hal olaraq bir düşün! Vacib əməlin edilməsi və haramın tərk edilməsi olmayacağı halda belə imanı adicə təsdiq edənlərə gizli qalan incəlik məhz budur.İnsanın qəlbində, itaətlərin yerinə yetirilməsini və günahların tərk edilməsini tələb etməyən qəti imanın yerləşməsi ən ağılasığmaz işlərdən biridir."[84]

(3)-İmam bildirmişdir ki, təsdiq yalnız əməl ilə doğru və səhih olur:

İmam (rahiməhullah) demişdir: "Təsdiq yalnız iki şey ilə tamamlanır: Birinci: Doğrunu etiqad etmək.İkinci: Qəlbin sevgisi və tabeçiliyi.Məhz bu səbəbdən Uca Allah İbrahimə belə demişdir: *"Biz ona belə xitab etdik: "Ya İbrahim! Artıq*

[84]əs-Salətu və hukmu tərikihə:35-ci səh.

*sən röyanın doğru olduğunu təsdiq etdin!".*[85] İbrahim röyanı gördüyü zaman onun doğru olduğunu etiqad etmişdir.Çünki peyğəmbərlərin röyası vəhydir.O, yalnız bunu, İbrahim ona əmr olunanı etdikdən sonra bir təsdiq olaraq etmişdir. Həmçinin Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir "cinsiyyət üzvü onu ya təsdiq edir ya da ki, təkzib edir".O, burada qəlbin arzuladığına təsdiqin cinsiyyət üzvünün əməlini, təkzibin isə onun tərk edilməsini etmişdir.Bu, təsdiqin yalnız əməl ilə doğru olacağını aydın göstərir.Həsən (rahiməhullah) demişdir: İman boş xülyalar və xoşlanma deyil. Lakin o, qəlbə düşən və əməlin təsdiq etdiyi bir şeydir.

Artıq bu, mərfu`rəvayət olaraq nəql edilmişdir.Bu sözlərdə əsas məqsəd, namazın vacibliyini və onu yerinə yetirənə müjdənin, tərk edənə isə cəzanın hasil olacağını qəti şəkildə təsdiq edən şəxsin onu tərk etməsinin qeyri-mümkün hal olmasıdır.Müvəffəq edən Allahdır!".[86]

Həmçinin (rahiməhullah) demişdir: "İman, qəlb əməlinin yoxa çıxması ilə yoxa çıxdığı zaman, onun ən əzəmətli bədən əməli ilə, xüsusən də əgər daxildə qəti təsdiqin yoxluğu olan daxili qəlb sevgisi və tabeçiliyi yoxdursa, yoxa çıxması heç də qəribə deyil.Artıq bu qeyd edilmişdir.Çünki qəlb itaətinin yoxluğu bədən itaətinin yoxluğunu gərəkli edir. Çünki əgər qəlb itaət edib tabe olsaydı bədən əzaları həmçinin itaət edib tabe olardı.İtaətin və tabeçiliyin yoxluğu həqiqi iman olan itaəti tələb edən təsdiqin yoxluğunu gərəkli edir.Qeyd edildiyi kimi iman adi təsdiq deyil.İman ancaq itaəti və tabeçiliyi tələb edən təsdiqdir.Doğru yol həmçinin

[85] əs-Saffət:104-105.

[86] əs-Salətu və hukmu tərikihə:37.

belədir.O, sadəcə haqqa dair bilgi deyil, həmçinin ona tabe olmağı və tələblərinə əməl etməyi tələb edən bilgidir.Birinci doğru yol adlansa da belə o, hidayəti tələb edən dolğun yol deyil. Həmçinin təsdiqin etiqad edilməsi təsdiq adlansa belə o, imanı tələb edən təsdiq deyil.Sənin bu əsasa müraciət edib ona riayət etməyin gərəkdir!”[87]

28- İmam Muhamməd bin Abdul-Vahhəb (rahiməhullah, hic. 1206-ci ildə v.e)

Şeyx demişdir: “Bil ki,-Allah sənə rəhm etsin-Allahın dini, qəlbdə etiqad ilə, habelə sevgi və nifrət ilə, dildə isə tələffüz ilə və küfr sözü tərk etməklə, bədən əzalarında isə İslamın dayağlarını etməklə və küfrə aparan əməlləri tərk etməklə olur.Bu üçündən biri pozularsa insan kafir olub İslamdan çıxar.”[88]

29-Şeyx Muhamməd bin Abdul-Vahhəbin övladları şeyx Hüseyn (rahiməhullah, hic. 1224-ci ildə v.e) və şeyx Abdullah (rahiməhullah, hic. 1242-ci ildə v.e) demişlər:

“İnsan yalnız tövhidi bilib onu etiqad edəcəyi və onun tələblərinə uyğun əməl edəcəyi, habelə Peyğəmbəri, (salləllahu aleyhi və səlləm) gətirdiyi hər bir şeydə təsdiq edəcəyi, onun əmr və qadağan etdiyi işlərdə ona itaət edəcəyi və ona və onun gətirdiyinə iman gətirəcəyi zaman müsəlman olacaq. ”[89]

30-Şeyx Süleyman bin Abdullah bin Muhamməd bin Abdul-Vahhəb (rahiməhullah, hic. 1233-ci ildə v.e) demişdir:

---

[87] əs-Salətu və hukmu tərikihə:46.
[88] əd-Durar əs-səniyyə:10/87.
[89] əd-Durar əs-səniyyə:10/139.

“Əgər biri bu kəlməni, şirkin inkar edilməsi və Allahın təkliyinin isbat edilməsi kimi onun mənasını bilərək və tələblərinə əməl edərək deyərsə və eyni zamanda həmin kəlmənin şamil etdiyi mənaya qəti etiqad edib əməl edərsə, həqiqi mömin olar.Əgər həmin kəlməni etiqad etmədən ona zahirdə əməl edərsə, münafiq olar.Onu dilə gətirəcəyi halda belə, ona şirk kimi zidd əməl edərsə kafir olar.”[90]

31-Şeyx Abdur-Rəhman bin Həsən bin Muhamməd bin Abdul-Vahhəb (rahiməhullah, hic. 1285-ci ildə v.e) demişdir:

Belə ki, “Lə iləhə illəllah” kəlməsi, yalnız onun inkar və isbat mənasını bilənə, onu etiqad edənə, qəbul edənə və ona əməl edənə fayda verəcək.”[91]

Həmçinin (rahiməhullah) demişdir: “Artıq “Lə iləhə illəllah” kəlməsi səhih hədislərdə möhkəm tellər ilə bərkidilmişdir.Bu səbəbdən bunların hər birini, söz, etiqad və əməl olaraq etmək labüddür.Bu hədislərdən biri, səhih kitabda gələn Utbənin (r.a) hədisidir: “Həqiqətən, Allah “Lə iləhə illəllah” sözünü deyib bununla Allahın vəchini istəyəni atəşə haram etmişdir”.[92]

Başqa hədislərdə belə gəlmişdir: “Sidqi ürəklə”[93], “Xalis qəlblə”[94], “Qəlbində yəqin olaraq”[95], “Şübhə etmədən”[96].

---

[90] Teysirul azizil hamid, şərh kitəbi-t-təuhid:79-cu səh.
[91] Fəthul məcid şərh kitəbi-t-təuhid:1/128.
[92] Buxari:5401.Muslim:33.
[93] Buxari:128.Muazın (r.a) hədisidir.Hədisin ləfzi: Allahdan başqa (ibadətə haqqı olan) ilahın olmadığına və Muhammədin Allahın Elçisi olduğuna sidqi ürəklə şahidlik edən elə bir kimsə yoxdur ki, Allah onu atəşə haram etməsin.Dedi: Ey Allahın Elçisi! İnsanlar sevinsinlər deyə bunu onlara xəbər verməyimmi? O, dedi:

İnsan həmin kəlmənin mənasına və məzmununa dair bilgiyə sahib olacağı zaman həmin kəlmə məhz bu qeydlərlə onu dilə gətirənə fayda verəcək.İnsanın, bu kəlməni deyib onun mənasını bilməyənlərin əksinə olaraq, cəhaləti aradan qaldıracaq surətdə həmin kəlmənin həqiqi mənasını bilməsi labüddür.

Şeyx yəqinliyi, ixlası, sidqi, qəbulu və sevgini qeyd etdikdən sonra demişdir: "Ona və "mutəbəqa", "tədammun" və "iltizəm" olaraq ona dəlalət edən şeylərə əməl ilə tabeçilik göstərmək lazımdır.Allahın ondan savayı qəbul etməyəcəyi İslam dini məhz budur."[97]

Həmçinin (rahiməhullah) demişdir: "Lə iləhə illəllah", İslam kəlməsidir.İnsanın İslamı, yalnız həmin kəlmənin qoyuluşuna uyğun gələn anlamı və dəlalət etdiyi mənanı bilməsi, onu qəbul etməsi və ona əməl etmək üçün tabe olması ilə doğru olur.O, şirkə zidd gələn ixlas kəlməsi və onu dilə gətirəni Allaha şərik qoşmaqdan qoruyan təqva kəlməsidir.Bu kəlmə yalnız yeddi şərt olacağı təqdirdə

---

Belə etsən, arxayın olarlar.Nəhayət Muaz günah altına girməkdən qorxaraq bunu ölüm zamanı xəbər vermişdir."

[94] Buxari:99.Əbu Hureyranın (r.a) hədisidir.Hədisin ləfzi: Qiyamət günü insanlardan şəfaətim sayəsində səadətə qovuşan şəxs xalis qəlblə yaxud ixlasla "lə iləhə illəllah" kəlməsini deyəndir."

[95] Muslim:31.Əbu Hureyranın (r.a) hədisidir.Hədisin ləfzi: "Bu ayaqqabılarımı al və bu divarın arxasında yəqin qəlblə Allahdan başqa (ibadətə haqqı olan) ilahın olmadığına şahidlik edənlə qarşılaşsan onu cənnətlə müjdələ!".

[96] Muslim:31.Əbu Hureyranın (r.a) hədisidir.Hədisin ləfzi: "Şahidlik edirəm ki, Allahdan başqa (ibadətə haqqı olan) ilah yoxdur və mən Allahın elçisiyəm.Bu iki şeydə şübhə etmədən Allah ilə qarşılaşan elə bir insan yoxdur ki, cənnətə girməsin."

[97] əd-Durar əs-səniyyə:2/243.Məcmuatu-r-rasəil vəl məsəili-n-nəcdiyyə:2/2/28.

insana fayda verir: Birinci: İnkar və isbat olaraq elm.İkinci: Yəqinlik.Bu isə, həmin kəlmə haqqında şəkk-şübhəyə zidd olan dolğun elmi ifadə edir.Üçüncü: Şirkə zidd olan ixlasdır. Dördüncü: Nifaqa əngəl olan sidqdir.Beşinci: Bu kəlməni və ona dəlalət edən mənanı sevmək və bununla fərəhlənmək-dir.Altıncı: Rədd etməyə zidd olan qəbul etmədir.Bəzən onu bilən şəxslər həmin kəlməni dilə gətirir lakin həmin kəlmə-nin tələb etdiyi şeyləri təəssübkeşlik və lovğalıq səbəbilə qəbul etmirlər.Bu, bir çox insanlarda olmuşdur.Yeddinci: Onun haqqlarına tabe olmaqdır.Bu isə, xalis Allah üçün və Onun rizasını güdərək edilən vacib əməllərdir."[98]

32-Şeyx Abdul-Lətif bin Abdur-Rahmən bin Həsən (rahi-məhullah, hic. 1292-ci ildə v.e)

Artıq onun "kəşfu-ş-şubuhat" kitabında şeyx Muhamməd bin Abdul-Vahhəbi müdafiə etməsi və məsələyə dair icmanı vurğulaması qeyd edilmişdir.Şeyx demişdir: "Şübhə yoxdur ki, elm, söz və əməl dilə gətirilən şəhadətin doğru olması üçün şərtdir."[99]

Habelə (rahiməhullah) demişdir: "Bizim şeyximizin, İslamın ayinlərini ona daxil olmaq üçün şərtli etdiyini iddia etməsi batil sözdür.O, İslama daxil olmaq üçün deyil sadəcə İslamın səhih olması üçün İslamın dayağlarını və bu kimi şeyləri şərt qoyur."[100]

---

[98] əd-Durar əs-səniyyə:2/246.Məcmuatu-r-rasəil vəl məsəili-n-nəcdiyyə:2/2/87.
[99] Araşdırmanın birinci hissəsinə bax.
[100] Misbahu-z-zaləm:358-ci səh.

**33-Şeyx Haməd ət-Tuveyciri, Əhməd bin Osman və qardaşı Muhamməd (rahiməhumullah).**

Onlar şeyx Süleyman bin Abdul-Vahhabə, onun tövbə edib haqqa dönməsindən sonra məktub göndərib demişlər: "Habelə biz deyirik: Tövhidin qəlb, dil və əməl ilə olmasının labüdlüyündə heç bir ixtilaf yoxdur.Bundan bir şey pozularsa insan müsəlman olmayacaq.Əgər insan tövhidi bilib ona əməl etməzsə firon, iblis və onlara bənzər kafir və inadkar olacaq.Əgər anlamadığı və qəlbi ilə etiqad etmədiyi halda zahirdə tövhidə əməl edərsə kafirdən daha şərli münafiq olacaq."[101]

**34-Şeyx Süleyman bin Sahmən (rahiməhullah, hic. 1349-ci ildə v.e)**

Şeyx demişdir: "Bil ki, "lə iləhə illəllah" kəlməsi onu dilə gətirənə yalnız onun mənasını biləcəyi və onun tələbinə uyğun əməl edəcəyi zaman ona fayda verəcək.Habelə həmin kəlmə yalnız sidq, ixlas və yəqinlikdən sonra fayda verəcək. Çünki onu dilə gətirənlərin bir çoxu cəhənnəmin ən alt təbəsində olacaqlar.

Bu səbəbdən, "lə iləhə illəllah" şəhadət kəlməsində daxili etiqadın, dil ilə tələffüzün və bədən əzaları ilə əməlin olması labüddür.Əgər bu növlərdən biri pozularsa insan müsəlman olmayacaq."[102]

Habelə demişdir: "Belə ki, "lə iləhə illəllah" kəlməsi yalnız isbat və inkar olaraq onun mənasını bilənə, onu

[101] Şeyx Abdul-Lətif bunu "misbahu-z-zaləm fi-r-raddi alə mən kəzzəbə alə-ş-şeyx əl-iməm:111" kitabında nəql etmişdir.

[102] əd-Duraru-s-səniyyə:2/350.

etiqad edənə, onu qəbul edənə və ona əməl edənə fayda verir."[103]

Habelə Sələb tayfasının və çöllükdə yaşayan kafirlərin kəsdiyi ətin halal olduğuna və namazı, zəkatı, orucu və həcci tərk edib bütün haramları işlətmələri ilə bigə adicə şəhadəti dilə gətirdiklərinə əsasən onlara müsəlman hökmü verən şəxsə rəddiyəsində demişdir: Bu fətvanı verənə rəddiyə verməkdə məqsəd bir neçə məsələdir: Birinci: Bu fətvanı verən iddia etmişdir ki, əgər biri namaz qılmasa, zəkat verməsə, oruc tutmasa, həcc etməsə və bununla bərabər bütün böyük günahları işlətsə belə şəhadəti tələffüz etməklə müsəlman olar və onun kəsdiyi ət yeyilər.Artıq sənə bəlli olmuşdur ki, "lə iləhə illəllah" kəlməsini bilmək və dörd dayağın yerinə yetirilməsi kimi onun tələbinə uyğun əməl etmək labüddür.Kəsdikləri ətin halal olduğu deyilən və müsəlman olaraq təqdim edilən həmin bu Sələb tayfası[104] "lə iləhə illəllah" kəlməsinin mənasını bilmir və onun tələbinə uyğun əməl etmirlər.Həmin şəxs onlara Allahın və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) əmr etmədikləri hökmü çıxarmışdır." [105]

Nəhayət demişdir: "Yeddinci məsələ: Həmin şəxs öz cavabında namaz qılmayan, zəkat verməyən, oruc tutmayan və həcc etməyən Sələb tayfasının müsəlman olmalarına

[103] Öncəki mənbə:2/358.

[104] Çoxlu köç etmələri ilə seçilən çöl ərəblərindən aşağı təbəqəli bir tayfadır. Həmin insanlar alçaq işlərlə məşğul olurlar.Habelə onların çox qəribə adətləri vardır. əd-Duraru-s-səniyyə:7/485 kitabına bax.

[105] əd-Duraru-s-səniyyə:10/492.

onların "lə iləhə illəllah Muhammədun rasulullah" şəhadətini dilə gətirdiklərini və onların özlərini İslama nisbət etmələrini dəlil gətirmişdir.Belə ki, Buxari və Muslimin səhih əsərlərində gələn hədisdə Peyğəmbər (salləl-lahu aleyhi və səlləm) demişdir: "Mən insanlarla onlar "lə iləhə illəllah" və "Muhammədun rasulullah" şəhadətini dilə gətirənə qədər savaşmağa əmr olundum.Onlar onu deyəcəkləri zaman məndən qanlarını və mallarını qorumuş olacaqlar.Onun haqqı isə istisnadır.Onun sorğu-sualı isə Allaha aiddir."[106] Belə ki, şəhadətin adicə tələffüzü, malların və qanların qorunması üçün yetərlidir və insan, namaz qılmasa, zəkat verməsə və həcc etməsə belə bunu edəcəyi zaman müsəlman olur.

Bu məsələ Ömər bin Xəttaba (r.a) müəmmalı qaldığı zaman o, demişdir: "Ey Peyğəmbərin xəlifəsi! Sənin insanlarla savaşmağın nə dərəcədə doğrudur...hədis.Əbu Bəkr cavab olaraq demişdir: "Məgər Peyğəmbər "onun haqqı istisna" deməmişdir? Zəkat həmçinin onun haqqıdır.Allaha and olsun ki, əgər onlar Peyğəmbərə ödədikləri davar heyvanını mənə ödəməkdən imtina etsələr, onlarla onu verməkdən ötrü imtina etdiklərinə görə savaşacağam.Ömər dedi: Vallahi mən Allahın Əbu Bəkrin köksünü döyüş üçün geniş etdiyini gördüm və onun doğru olduğunu anladım."[107] Beləliklə Ömər Əbu Bəkrə müvafiq gəlmiş və bütün səhabələr bunun üzərinə yekdil olmuşlar.Onlar zəkatı verməkdən imtina edənlərlə savaşıb onları mürtədlərin

---

[106] Buxari:2946.Muslim:21.Hədisi Əbu Hureyra (r.a) rəvayət etmişdir.

[107] Buxari:1400.Muslim:20. Hədisi Əbu Hureyra (r.a) rəvayət etmişdir.

sırasına qatmışlar.Üstəlik buna namazı, orucu və həcci daxil edən şəxsin halı necə olsun? Beləsi küfr və mürtədlikdə yalnız zəkatı tərk edəndən daha öndədir.Bu şəxs, həmin insanların təkfir edilməsi məsələsində Peyğəmbərin səhabələrinin icmasını pozub onları, adicə şəhadəti tələffüz etdiklərinə görə müsəlman etmişdir."[108]

35-Şeyx Abdur-Rahmən bin Nasir əs-Sə`di (rahiməhullah, hic. 1376-cı ildə v.e)

Şeyx (rahiməhullah) demişdir: " (Otuz ikinci fayda: İman, dinin etiqadlarını, habelə qəlb və bədən əməllərini şamil edir.)Quran, sunnə və saleh-sələfin yekdilliyinin dəlalət etdiyi kimi imanın dini etiqadları, habelə qəlb və bədən əməllərini şamil etməsinə dair açıqlama və onlardan birinin digərinə bağlı olmasına dair izah: İnsan, isbat və inkar olaraq Allahın sifətlərinə, habelə Peyğəmbərin doğru olduğuna, bütün qeybi məsələlər haqqında xəbər verdiyinə, xeyiri əmr etdiyinə və pislikdən çəkindirdiyinə dəlalət edən Quran və sunnənin dəlillərini dinləyəcəyi zaman ilk olaraq onu anlayacaq.İnsan onu anlayıb biləcəyi zaman qəlb bunu etiraf edəcək və şübhə yeri qoymadan, Allaha və Peyğəmbərə təsdiq olaraq bunu qəti şəkildə təsdiq edəcək.Bu isə öz növbəsində onu sevməyi, ona dəlalət edən mənanı etiqad etməklə Allaha yaxınlaşmağı və bunun faydalı haqq olduğuna qəti əmin olmağı tələb edir.İnsan Allahı və Peyğəmbəri tanıyıb onları sevəcəyi zaman Allaha yaxınlaşdıran hər bir şeyi sevəcək və Allahın bəyənmədiyi

[108] əd-Duraru-s-səniyyə:10/495.

və sevmədiyi hər bir şeyə nifrət edəcək. Məhz bu anda qəlb, Allaha və Peyğəmbərə itaət olaraq qəti şəkildə tabeçilik göstərəcək və Allahın sevdiyi vacib və müstəhəb şeylərdən bacardığını etməyə qəti istək göstərəcək.Bunun nəticəsində onun qəsd edib istədiyi şeylər ortaya çıxacaq.Habelə Allahın və Peyğəmbərin qadağan etdiyi şeylərdən kənar durmağı qəti şəkildə qəsd edəcək və bu, tərk etmə ilə bir arada gələcək.Növbəti ayə bu mənanı kəsb edir: *"Ey Rəbbimiz! Həqiqətən, biz: "Rəbbinizə iman gətirin!"- deyə imana çağıran bir kimsəni eşidən kimi imana gəldik."*[109] Habelə möminlər belə demişlər: *"Eşidib itaət etdik!"*[110] Habelə Uca Allah Öz qullarına lütvünü qeyd edib demişdir: *"Lakin Allah sizə imanı sevdirmiş, onu ürəklərinizdə süsləmiş, küfrə, itaətdən çıxmağa və (Allaha) asi olmağa qarşı sizdə nifrət oyatmışdır."*[111] Bəlli olmuşdur ki, bu işlər; təsdiq, etiraf, sevgi, tabeçilik və bu tabeçiliyin tələb etdikləri, bir-birinə sıx bağlıdır.Onlardan biri tamamlanıb kamilləşəcəyi zaman bəlli olacaq ki, onların hər biri kamilləşmişdir.Onlardan biri bütövlüklə yoxa çıxacağı zaman bəlli olacaq ki, onların hamısı yoxa çıxmışdır.Onlardan biri azalacağı zaman isə bu, yerdə qalanların naqisliyi səbəbilə olacaq.İmanın bəyan edilməsinə dair bu açıqlamanı anla! Məhz bu səbəbdən, qeyd etdiyimiz vəsfə uyğun olaraq Uca Allah imanın var-

[109] Ali İmran:193.
[110] əl-Bəqərə:285.
[111] əl-Hucurat:7.

lığını, kamilliyini və nöqsanını ağaca bənzətmişdir.Doğrusunu Allah bilir."[112]

Bu sözlər, imanın hissələri arasında olan tələzum və bağlılığı, habelə bədən əməlləri bütövlüklə yoxa çıxacağı zaman digər hissələrin yoxluğunun bilinəcəyini açıq-aşkar isbat edir.Habelə əgər təsdiq yaxud qəlb əməli yoxa çıxarsa həmçinin belə olacaq.

Habelə şeyx (rahiməhullah) növbəti ayənin təfsirində demişdir: *"Sizə verilən hər hansı bir şey fani dünya malıdır. Allah yanında olan isə daha yaxşı və daha baqidir. O kəslər üçün ki, iman gətirib öz Rəbbinə təvəkkül edərlər".*[113] Yəni, imanın zahiri və daxili əməllərini gərəkdirən doğru iman ilə hər bir əməlin aləti olan təvəkkül arasında cəm edənlər.Təvəkkül ilə bir arada gəlməyən hər bir əməl natamamdır."[114]

Habelə (rahiməhullah) demişdir: "Uca Allah, bəzən qeyd edilməsinə ehtiyacın olması səbəbilə saleh əməlləri yaxud təqvanı yaxud səbiri imana birləşdirir.Bu isə, imanın qəlbdə olanla məhdudlaşması təəssüratı yaratmaması üçündür. Uca Allah Quranın bir çox yerində belə buyurur: "*İman gətirib saleh əməllər edənlər*".Daha sonra onlar haqqında xəbəri qeyd edir.Saleh əməllər imandan, imanın zəruri amillərindəndir.İman məhz onunla gerçəkləşir.Əgər biri Allahın və Peyğəmbərin əmr etdikləri vacib əməlləri etmədən və ha-

---

[112] Məcmu` əl-fəvaid va-qtinasul əvabid:49.

[113] əş-Şura:36.

[114] Teysirul kərimi-r-rahmən:705-ci səh.

ramları tərk etmədən özünün mömin olduğunu iddia edərsə, həmin şəxs imanında sadiq olmaz."[115]

36-Şeyx Hafiz bin Əhmməd əl-Hakəmi (rahiməhullah, hic. 1377-ci ildə v.e)

Şeyx demişdir: ""Qəlb əməli sabit olduğu halda bədən əzalarının zahiri əməllər ilə boyun əyməməsi ağılasığmazdır.Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Ağah olun ki, bədəndə bir ət parçası vardır ki, o, düzələcəyi zaman bütün bədən düzəlir, o, pozulacağı zaman isə bütün bədən pozulur.Agah olun ki o, qəlbdir." Buradan sənə aydın olur ki, Əhli sunnədən imana dair, ərəb dilində üstün görüşə əsasən onun təsdiq olduğunu deyən şəxslər heç şübhəsiz ki, bununla adi təsdiqi deyil yalnız zahiri və daxili boyun əyməni gərəkdirən təslimiyyət məzmunlu təsdiqi qəsd etmişlər."[116]

37-Şeyx Muhamməd bin İbrahim Ali-ş-Şeyx (rahiməhullah, hic. 1369-cu ildə v.e)

Şeyx (rahiməhullah) demişdir: "Bu onu göstərir ki, adicə "lə iləhə illəllah" kəlməsi təkfirə mane olmur.Çünki bir çox insanlar onu dilə gətirir bununla belə onu bilmədikləri yaxud ona əməl etmədikləri yaxud ona zidd amillərin mövcudluğu səbəbilə kafir olurlar.Bu səbəbdən, onun tələffüz edilməsi ilə birgə digər şeylərin olması gərəkdir.Həmin şeylərin ən

[115] ət-Təudıh vəl bəyən lişəcəratil imən:93-cü səh.
[116] Məaricul qabul:2/594.

böyüyü isə bu kəlmənin mənasını bilmək və ona əməl etməkdir."[117]

37-Şeyx Abdul-Əziz bin Abdullah bin Bəz (rahiməhullah, hic. 1420-ci ildə v.e)

Bəziləri iddia etmişlər ki, şeyx bütün əməllərin tərk edilməsi məsələsinin Əhli sunnə arasında ixtilaflı məsələ olduğunu hesab edir.Bu iddia, batildir.Çünki şeyx əməlin imanda dayağ olduğunu və əməlin kamillik şərti olduğuna dair sözün Əhli sunnənin sözü deyil murciələrin sözü olduğunu qətiyyətlə ifadə edir.Habelə şeyx, bütün əməllərin tərk edilməsi ilə birgə imanın mövcudluğunu təsəvvür edilməz hesab edir.Məhz bu səbəbdən şeyx, bütövlüklə əməlləri tərk edənin müsəlman olduğunu deyən müxalif sözdən çəkindirmiş və bütün əməlləri tərk etməyin küfr olduğunu bildirən sözləri iqrar edib onu müsbət qarşılamışdır.Bunun izahı səkkiz yöndən oxucuya təqdim olunur[118]:

*Birinci*: Şeyx "əl-mişkət" jurnalına verdiyi müsahibədə əməlin kamillik şərti olduğunu deyən sözün murciələrin sözü olduğunu açıq bildirmişdir.Həmin müsahibə sizə təqdim olunur:

"Əl-Mişkət: Hafiz bin Həcər "fəthul-bəri" kitabında iman və əməl məsələsi, habelə əməlin iman anlamına daxil

---

[117] Şərhu kəşfi-ş-şubuhat.Toplayan: Muhamməd bin Abdur-Rahmən bin Qasim:111-ci səh.

[118] Artıq mən, 1422-ci ildə nəşr edilmiş həmin bu məsələni bəyan etdiyim atlı yönü qeyd etmişəm.Burada daha iki yönü əlavə edəcəm.Artıq İsam bin Abdullah əs-Sinəni qeyd edilən yönləri nəşr edib həmçinin ona qeyriləri əlavə etmişdir.Bax: "Əqualu zəvil irfən fi ənnə ə`məlel cəvarih dəxilətun fi musəmməl imən:144-cü səh."

olub olmaması haqqında söz açdığı zaman qeyd etmişdir ki, əməl kamillik şərtidir.Hafiz demişdir "Sələf demişlər...".

Şeyx ibn Bəz: Xeyir! O, şərt deyil.Çünki o, imanın bir hissəsidir.İman söz, əməl və əqidə, yəni təsdiqdir.Əhli sunnə vəl cəmaata görə iman söz, əməl və təsdiqdən ibarətdir.

Əl-Mişkət: Lakin bəzi insanlar deyirlər ki, əməl imana daxildir ancaq o, kamillik şərtidir?

Şeyx ibn Bəz: Xeyir, xeyir! O, kamillik şərti deyil.O, hissədir, imanın bir hissəsidir.Bu, murciələrin sözüdür.Murciələr imanın yalnız söz və təsdiq olduğunu hesab edirlər. Digərləri isə deyirlər ki, iman, bilgidir.Bəziləri isə deyirlər: İman, təsdiqdir.Bütün bu sözlər, yanlışdır.

Doğru olan söz, Əhli sunnənin sözüdür: İman söz, əməl və etiqaddır və o, itaətlə artır və asiliklə azalır."Əl-Vasitiyyə"də həmçinin belə gəlmişdir.

Əl-Mişkət: Əməl deyildikdə əməlin cinsi qəsd edilir?

Şeyx ibn Bəz: Namaz, oruc və digər əməllər. Habelə qorxu və ümid kimi qəlb əməlləri.

Əl-Mişkət: Deyirlər ki, siz "əl-fəth" kitabının əvvəlində bu sözə əlavə etməmisiniz?

Şeyx ibn Bəz: Bilmirəm.Bizim kitaba verdiyimiz izah (tə`liq) qırx il öncə, Mədinəyə gəlməmişdən oncə olmuşdur. Biz Mədinəyə 1381-ci ildə getmişik.Lakin "əl-fəth" kitabına düzəlişləri, düşünürəm ki, 1377-ci ildə yaxud 1387-ci ildə

qeydə almışıq.Yəni bu, təqribən qırx il öncə olub.Bu səbəbdən xatırlamıram.Ola bilsin ki, bu sözlər fikrimdən yayınmış yaxud ona diqqət yetirməmişəm."[119]

*İkinci*: Şeyx "dabtu-d-davabit fil imən va nəvaqidih" kitabından çəkindirmiş və həmin kitabın yaramaz murciələrin məzhəbinə və zahiri əməllərin imanın gerçəyində mötəbər olmadığına çağırdığını hesab etmişdir.

Həmin kitab bədən əməllərinin imanda kamillik şərti olduğunu, bütövlüklə əməlləri tərk edənin asikər və cəzaya məruz qalan müsəlman olduğunu hesab edir.Əgər şeyx həmin məsələnin ixtilaflı olduğunu hesab etsəydi həmin kitabdan çəkindirməz və onu irca fikri ilə vəsf etməzdi."[120]

*Üçüncü*: Habelə şeyx, Əli bin Abdul-Əziz əş-Şiblin Hafiz bin Həcərin sözlərinə düzəlişini dəstəkləmişdir.Bu sözlər onun "ət-tənbih aləl muxaləfətil aqadiyyə fil fəth: 28-ci səh" kitabındadır.

---

[119] Məcəllətul mişkət, əl-mucəllədu-s-səni, əl-cuz`u-s-səni:279-280-ci səh.

[120] Şeyx ibn Bəzin rəhbərliyi altında olan daimi komətinən fətvasına kitabın ikinci əlavəsinə bax. Qeyd olunan kitabın müəllifi kitabının 1-4-cü səhifələrində həmin kitabın təlif etmə səbəbini vurğulayıb demişdir: "Əslində məni bu sətirləri yazmağa vadar edən amil, dəlilə zədd olaraq bəzi yazılarda iman və təkfir məsələlərinə dair qaydalar qoymaq cəhdlərini görməyim olmuşdur.Habelə mən bəzi şəxslərin dəlilsiz təkfirə cürətli olduqlarını və bunun Əhli sunnənin mənhəcinə nisbət edilməsini gördüm.Ancaq bunun arxasında bəzi alimlərə tənələr və onların ircalıqda ittiham edilməsi durur.Onların başında isə əsrin muhaddisi şeyx, fəqih, sunnəni dirçəldən və bidətçilərin gözlərində tikana çevrilən Nəsiruddin Albani durur.Onları bu ittihamı irəli sürməyə sövq edən amil, şeyxin Əhli sunnənin mənhəcinə görə zahiri əməlin imanın səhihlik şərti deyil kamillik şərti olduğunu və namazı tərk edənin kafir olmayacağını açıq bildirməsidir.Bəzilərinin xoşuna gəlməsə belə zahiri əməlin imanın kamillik şərti olduğuna dair onun qeyd etdiyi sözlər doğrudur." Həmin şəxs isə öz kitabında imanın söz və əməl, habelə artıb azaldığını deyir.

Müəllif demişdir: "Doğru olan, saleh sələfə görə əməllərin bəzən imanın səhihliyi üçün şərt olmasıdır, yəni əməllər imanın gerçəyinə daxildir.Bəzən namaz kimi əməllərin yoxluğu zaman iman yoxa çıxır.Bəzən isə əməllər imanın vacib kamilliyi üçün şərt olur və tərk edilməsi küfr deyil.Günah və asilik olan digər əməllərdə olduğu kimi həmin əməllərin yoxluğu imanı zəiflədir.Sələfin sözünü anlamaq və onların sözünü "vaidiyyə"nin sözü ilə qarışıq salmamaq üçün bu təfsilatın olması labüddür.Bununla bərabər Əhli sunnə vəl cəmaata görə əməl imanın üç dayağından biridir: Söz, əməl və etiqad. Xəvaric və mötəzililərə əks olaraq onlara görə iman, artır və azalır. Müvəffəq edən Allahdır."[121]

*Dördüncü*: Şeyx, ibn Həcərin sözlərini tənqid etmək və Əhli sunnənin etiqadını bəyan etmək məsələsində bu sözlərdən daha dolğun və aşkar sözləri dəstəkləmişdir. Belə ki, şeyx ibn Bəz şeyx Ulvi bin Abdul-Qadir əs-Səqqafın yazdığı "ət-təvassut val iqtisad fi ənnəl kufra yəkunu bil qauli val fi`li val i`tiqad" kitabına müsbət rəy bildirmişdir. Müəllif həmin kitabın qırağında əlavə edib demişdir: "Onun bu sözləri irad doğurur.Həmin yerlərdən ən önəmlisi: Onun sələfə görə əməllərin iman üçün kamillik şərti olduğunu deməsidir.Bu, ümumi şəkildə doğru görüş deyil. Bu məsələnin təfsilatına varmaq gərəkdir:

İnsanı kafirə çevirən əməllər, əməlin cinsinin yaxud şəhadət kəlməsinin yaxud namazın tərk edilməsi kimi tərk

[121] ət-Tənbihat aləl muxaləfətil aqadiyyə fi fəthil bəri:28-ci səh.

etmə ilə olsun yaxud bütə səcdə etmək yaxud Allahdan qeyrisinə qurban kəsmək kimi fe`l ilə olsun eynidir.Bu əməllər, imanın səhih olması üçün şərtdir.Küfrdən aşağı olan günahlar isə kamillik şərtidir.Bu sözləri gətirməkdə məqsədim, onun bütə səcdə etmək kimi küfr əməllər edənə küfr hökmünü etiqada bağlamadan sadəcə həmin əməlin küfrə dəlalət etməsi səbəbilə verməsidir. Lakin həmin ifadə həmçinin mübahisəlidir.Çünki bütə səcdə etmək küfrə dəlalət edən fe`l deyil və yalnız öz-özlüyündə küfrdür."[122]

Artıq şeyx həmin kitabı tərifləyərək demişdir: "Mən bu risalənin dəyərli və faydalı olduğunu gördüm.Habelə müsəlmanlar faydalansın deyə mən həmin risalənin çap edilib yayılmasını tövsiyə edirəm."

*Beşinci*: Habelə şeyx, şeyx Bəkr bin Abdullah Əbu Zeydin müəllifi olduğu "dər`ul fitnə an əhli-s-sunnə" kitabına tərif yazmışdır.Həmin kitabda gəlmişdir: "Ey müsəlman! Bəzi insanların imanın gerçəyinə dair bu beş əsasdan birini kiçiltmələrini ifadə edən sözlərinə aldanmaqdan həzər sonra yenə həzər et! Xüsusən də, cəhmiyyə və murciələrin sözlərini qapıb; "əməl" imanın gerçəyində onun bir hissəsi deyil kamilliyidir,- deyənlərin sözündən həzər et! Şübhəsiz ki bu, Uca Allahın kitabında təqribən altmış yerdə açıq-aydın gələn dəlillərdən üz çevirməkdir.Misal olaraq Uca Allah buyurur: *"Onlara: "Etdiyiniz əməllərə görə varisi olduğunuz Cənnət budur!" -deyə müraciət ediləcəkdir."*[123] Bu kimi dəlillər sunnədə həmçinin çoxdur.Habelə bu məsələdə

[122] ət-Təvassut val iqtisad:71-ci səh.
[123] əl-Ə`raf:43.

müxalif olmaq səhabələrin və onlara gözəl şəkildə tabe olanların icmasını pozmaqdır."[124]

Qeyd edilən beş əsas, imanın qəlb ilə etiqad, dil ilə söz, bədən əzaları ilə əməl və onun itaətlə artıb asiliklə azalmasıdır.

Şeyx ibn Bəz həmin kitaba müqəddimə yazaraq demişdir: "Artıq mən qardaşımız alləmə Bəkr bin Abdullah Əbu Zeydin yazdığı kitablardan biri olan "əhli sunnənin üzərindən fitnənin dəf edilməsi" adlı risaləsi ilə tanış olmuşam.Həmin risalənin çox dəyərli, faydalı və nəşr edilməyə layiq olduğunu düşünürəm.Allah onun müəllifinə xeyirli mükafat versin, onun savabını artırsın və həmin risalə vasitəsi ilə haqqa zəfər bəxş etsin.Həqiqətən O, comərddir, kərəm sahibidir.Allahın salavatı və salamı Peyğəmbərin, onun ailəsinin və əshabının üzərinə olsun."[125]

*Altıncı*: Şeyx bütövlüklə bədən əməllərini tərk edənin kafir olduğunu hesab edir.Bu isə onun, namazı tərk edənin küfrünə dair sözlərində açıq-aydındır.Şeyxə görə namazı və onunla birgə digər bədən əməllərini tərk edənin küfründə heç bir şübhə yoxdur.

Bu, namaz məsələsinə qayıdan bir iş deyil.Bu səbəbdən, namazı tərk edənin hökmünə dair məşhur ixtilafa əsaslanaraq onun ixtilaflı məsələ olduğunu iddia etmək doğru deyil.Çünki bütün Əhli sunnə əməlin dayağ olduğunu və imanın səhih olması üçün onun zəruri olduğunu hesab edirlər.Onların namazı tərk edənin kafir olmasını demələri yaxud bu məsələdə çəkişmə aparmaları gerçəyi dəyişmir. Bunu aşağıdaki sözlər izah edir:

---

[124] Dər`ul fitnə an əhli-s-sunnə:34-cü səh.

[125] Öncəki mənbə:11-ci səh.

*Yeddinci*: Şeyx bu məsələyə dair tələbələrdən birinin cavabına ətraflı izah verib ayrı-ayrı əməllərin tərk edilməsilə bütün əməllərin tərki edilməsi arasında fərqi və Əhli sunnənin, imanın səhih olması üçün əməlin cinsinin olmasının labüdlüyünə yekdil olduğunu bəyan etmişdir.

Abdul-Əziz bin Feysal ər-Racihi qardaş (hafizahullah) demişdir: "Şeyxin dərslərinin birində olarkən şeyximiz imam ibn Bəzdən (1415-ci ildə) əməllər və onun imanın səhihlik şərti yaxud kamillik şərti olduğu haqqında soruşdum:

Şeyx cavab olaraq demişdir: "Əməllərdən bir qismi imanın səhihlik şərtidir.Belə ki, namaz kimi əməllər olmadan iman səhih olmur.Onu tərk edən şəxs kafir olur.Əməllərdən bir qismi isə onun kamillik şərtidir və həmin əməllər olmayacağı təqdirdə, onu tərk edən şəxsin günahkar olmasına rəğmən iman səhih olur.[126]

Mən ona dedim: Sələfdən namazı tərk edəni təkfir etməyən şəxslərə görə əməl kamillik şərtidir yoxsa səhihlik şərtidir?

Şeyx cavab olaraq dedi: "Xeyir! Əməl hamıya görə səhihlik şərtidir.Lakin onlar imanın hansı əməllərlə səhih olacağı məsələsində ixtilaf etmişlər.Bəzi insanlar demişlər: O, namazdır.Buna dair, Abdullah bin Şəqiqin xəbər verdiyi kimi səhabələrin icması mövcuddur.Digərləri isə başqa əməlləri göstərmişlər.Hər bir halda, bütün sələf alimlərinə görə imanın səhih olması üşün əməlin cinsinin olması labüddür. Bu səbəbdən, onlara görə iman; söz, əməl və

[126] Şeyx Salih əl-Fəuzan bu yerə əlavə edərək demişdir: "Lakin əməlin cinsi imanın yalnız şərt deyil həmçinin onun gerçəyindəndir. " Əqualu zəvil irfan:146-cı səh."

etiqaddır və iman yalnız bu üçü bir arada gələcəyi təqdirdə səhih olur."[127]

*Səkkizinci*: Şeyx ibn Bəzə (rahiməhullah) belə bir sual verilmişdir: Əgər biri "lə iləhə illəllah" şəhadətini dilə gətirib qəlbi ilə bunu etiqad edərsə lakin bütün əməlləri tərk edərsə müsəlman olacaqmı?

Şeyx cavab verib demişdir: "Xeyir! Həmin şəxs Allahı əməl ilə təkləşdirməyənə qədər, Allahı qorxu, ümid, sevgi və namazla təkləşdirməyənə qədər müsəlman olmaz.Bir müsəlmanın bütün əməlləri tərk etdiyi halda Allaha iman etməsi təsəvvür edilmir.Bu, heç bir əsasa dayanmayan fərziyyədir. Bunun hər hansı bir insandan sadir olması təsəvvür edilməzdir.Çünki insanın imanı, sadiq imanı onu əmələ təşviq edir."[128]

*Əlavə*: Şeyxin bu məsələyə dair sözlərinin açıq-aydın olmasına rəğmən müxalif bu sözləri qulaq ardına vurmuş və şeyxin, namazı tərk edənin yaxud dord dayağı tərk edənin hökmünə dair Əhli sunnənin ixtilaf etdiklərini xəbər verməsindən yapışmışdır.Əslində isə bu, çəkişmə mövzusundan kənar bir məsələdir.Bizim söhbətimiz, bəzi əməlləri tərk edən deyil bütövlüklə zahiri əməli tərk edən şəxs haqqındadır.

Onların dəlil olaraq gətirdikləri sözlərdən, şeyxin "əl-furqan" jurnalına verdiyi müsahibədə dediyi sözlərdir. Şeyxə sual verib demişlər: Şəhadəti dilə gətirməsi və qəlbdə

---

[127] "ər-Riyad" jurnalından nəql edilir: 12506-cı say, 13/7/1423.İrəlidə onların növbəti şübhəsinə cavab gələcək: Məsələ namazı tərk edənin təkfir edilməsinə qayıdır.

[128] Əşritatu fəthil məcid şərh kitəbi-t-təuhid.İsdaru təscilət əl-bərdeyn, əş-şəritul əvval, raqam 2, əl-vachu-s-səni.

imanın özəyinə sahib olması ilə bərabər bədən əməllərini tərk edəni təkfir etməyən alimlər murciələrdirmi?

Şeyx cavab verib demişdir: Bu, Əhli sunnə vəl cəmaat-dandır.Əgər biri, orucu yaxud zəkatı yaxud həcci tərk edərsə, bu, heç şübhəsiz ki, alimlərə görə böyük günah sayılacaq. Lakin doğru görüşə əsasən həmin şəxs İslamdan çıxaran küfrə düşmüş olmayacaq.Namazın tərk edilməsi məsələsinə gəldikdə isə, üstün görüşə əsasən insan onu qəsdən tərk edəcəyi zaman böyük küfrə düşüb kafir olacaq.Zəkatı, orucu və həcci tərk edən isə kiçik küfr etmiş olur.

Sual verən: Bədən əməlləri imanın kamillik şərtidir yox-sa səhihlik şərtidir?

Şeyx: Oruc, sədəqə və zəkat kimi bədən əməlləri imanın kamilliyindəndir.Onun tərk edilməsi isə qəlbdə imanın zəif olması səbəbilədir.Namaza gəldikdə isə doğru olan, onun tərk edilməsinin küfr olmasıdır.İnsan saleh əməllər edəcəyi zaman bu, onun imanının kamilliyindən irəli gələcək." Şeyxin sözləri burada bitir.

Dedim: Şeyxin bu sözləri, onların həmin məsələyə dair şeyxin sözlərindən dəlil olaraq gətirdikləri ən böyük sözlər-dir.Əslində isə bu sözlərlə ondan nəql etdiyim digər sözlər arasında heç bir ziddiyyət yoxdur.Çünki şeyx burada oruc yaxud zəkat yaxud həcc yaxud namaz kimi ayrı-ayrı əməlləri tərk edəndən söhbət edir.Əhli sunnənin isə öz aralarında bu məsələyə dair ixtilafı mötəbərdir.Ancaq sual verən şəxsin bunu qəsd etdiyinə rağmən şeyx burada bütün əməllərin tərk edilməsi haqqında söz açmır.Çünki (bədən əməllərinin tərk edilməsi) külli tərk etmə ehtimalını, habelə bəzi əməllərin tərk edilməsi ehtimalını saxlayır. Şeyx isə hər bir

ehtimala rəğmən bəzi əməllərin tərk edilməsinə dair cavab vermişdir.

Mənim şeyxdən nəql etdiklərim isə külli tərk etməyə və buna müxalif sözün murciələrin sözü olması hökmünü verməsinə dair açıq-aydındır.Haqqı istəyən və onu axtaran şəxs isə bunu tərk edib çəkişmə mövzusundan kənar şeylərdən yapışmaz.Müvəffəq olan, Allahın müvəffəq etdiyi şəxsdir.

39-Şeyx Muhamməd bin Nəsiruddin əl-Albani (rahiməhullah, hic. 1420-ci ildə v.e)

Şeyx (rahiməhullah) demişdir: "Həqiqətən də, əməlsiz iman fayda vermir.Uca Allah imanı qeyd etdiyi zaman onu saleh əməl ilə birləşik qeyd edir.Çünki biz, saleh əməl olmadan imanın olduğunu təsəvvür edə bilmirik.Bunu yalnız xəyalımıza gətirə bilərik. Belə ki, bir şəxsin iman gətirib Allahdan başqa (ibadətə haqqı olan) ilahın olmadığına və Muhammədin Allahın Elçisi olduğuna şahidlik etməsi və dərhal ölməsi, bizim təsəvvür edə biləcəyimiz məsələdir. Lakin insanın: "lə iləhə illəllah Muhammədun rasulullah",- şəhadətini gətirib Allahın istədiyi qədər ömür sürməsi və heç bir saleh əməl etməməsi fərqlidir.Çünki saleh əməlin yoxluğu həmin şəxsin şəhadəti dili ilə deməsinə, imanın isə onun qəlbinə daxil olmamasına dəlildir.Onun imandan sonra saleh əməlləri qeyd etməsinə səbəb, faydalı imanın məhz saleh əməl ilə birləşik olduğunu göstərməsi üçündür."[129]

---

[129] Şərhul ədəbil mufrad, əş-şəritu-s-sədis, əl-vachul əvval.Əməlin kamillik şərti olmasına dair şeyxdən varid olan sözlərin ayrı-ayrı əməllərə aid edilməsi mümkündür.Hafiz ibn Həcərin sələfə nisbət etdiyi sözlərə cavablardan bir yanaşma məhz belədir.Habelə şeyximiz Abdulllah bin İbrahim əz-Zəhim buna belə cavab vermişdir.

**40-Şeyx Muhamməd bin Salih bin Useymin** (rahiməhullah, hic. 1421-ci ildə v.e)

Şeyxin bu məsələyə dair ətraflı kəlamları vardır.Onun buna dair məzhəbi açıq-aydındır.Şeyxdən bu məsələyə dair on iki yerdə varid olan sözlərini nəql edirəm:

(1)-Şeyx (rahiməhullah) "kəşfu-ş-şubuhat" kitabının şərhində demişdir: "Müəllif bu şübhələri əzəmətli bir məsələ ilə bitirmişdir: İnsanın qəlbi, sözü və əməli ilə Allahı təkləşdirməsi labüddür.Əgər insan Allahı qəlbi ilə təkləşdirib Onu sözü yaxud əməli ilə[130] təkləşdirməzsə, iddiasında sadiq olmaz.Çünki qəlb tövhidinin ardınca söz və əməl tövhidi gəlir.Məhz bu səbəbdən Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: Ağah olun ki, bədəndə bir ət parçası vardır ki, o, düzələcəyi zaman bütün bədən düzəlir, o, pozulacağı zaman isə bütün bədən pozulur.Agah olun ki o, qəlbdir." İnsan, iddia etdiyi kimi Allahı qəlbi ilə təkləşdirib Onu sözü yaxud əməli ilə təkləşdirməyəcəyi zaman haqqı bilib ona yəqin olan lakin israr və inadkarlıq edən və rəbb iddiasında qalan firon mislində olacaq."[131]

(2)-Şeyxə belə bir sual verilmişdir: Bəzi sələfdən varid olmuşdur ki, tövhid şahidliyi edənin cənnətə girməsi hədisi fərzlər haqqında bəhs edən hədislər ilə nəsx olunmuşdur. Bu söz, doğrudurmu?

Şeyx cavab verib demişdir: "Doğru olan, həmin hədisin bununla nəsx olunmamasıdır.Lakin bilinməlidir ki, xalis

---

[130] Şeyxin, sözü əməl ilə bərabər tutmasına və əməli ilə təkləşdirmədən qəlbi ilə təkləşdirən şəxsin sözü ilə təkləşdirmədən yalnız qəlbi ilə təkləşdirən mislində etməsinə nəzər yetir! Daha sonra şeyx söz və əməli qəlb tövhidinə tabe olan və onu təsdiq edən amillər etmişdir.

[131] Şərhu kəşfi-ş-şubuhat, dımnə məcmu`əl-fətəva va rasəili-ş-şeyx ibn Useymin:7/100.

qəlb ilə tövhidə şahidlik edən şəxsin fərzləri buraxması mümkün deyil.Çünki onun sahib olduğu ixlası onu həmin əməlləri etməyə sövq edir.Allahdan başqa (ibadətə haqqı olan) ilahın olmadığına şahidlik edib: Mən bununla Allahın rizasını güdürəm,-deməyin daha sonra Allaha çatdıran əməli etməməyin nə dərəcədə doğrudur? Bu, mümkün deyil.Bu səbəbdən, namazı davamiyyətli şəkildə tərk edib heç vaxt namaz qılmayan şəxs kafirdir.Əgər həmin insan: Şahidlik edirəm ki, Allahdan başqa (ibadətə haqqı olan) ilah yoxdur və mən Onun mələklərinə, kitablarına, peyğəmbərlərinə və axirət gününə iman edirəm lakin namaz qılmıram,-deyərsə, biz ona deyəcəyik: Sən kafirsən! Səninlə bütə səcdə edən şəxs arasında heç bir fərq yoxdur.Bu üzdən Muslimdə gələn Cabirin (r.a) hədisində varid olmuşdur: "İnsan ilə küfr və şirk arasında namazın tərk edilməsi durur."[132]

(3)-Habelə şeyx (rahiməhullah) Utbən bin Malikin (r.a) hədisini şərh edərkən demişdir: "Həqiqətən də, Allah "lə iləhə illəllah" sözlərini deyib bununla Allahın vəchini diləyən şəxsi atəşə haram etmişdir."[133] (O, demişdir: "lə iləhə illəllah" sözlərini deyib", yəni ixlasın olması şərtdir.Buna dəlil növbəti sözlərdir: "bununla Allahın vəchini diləyən", yəni Allahın vəchini istəyən.Allahın vəchini istəyənin isə Ona yetişdirəcək şeylərdən bacardığını etməsi labüddür. Çünki bir şeyi istəyən ona qovuşmaq üçün səy göstərir.Bu üzdən biz, Muslimin səhih kitabında gəldiyi kimi hədisi qeyd edib daha sonra əlavə gətirən Zuhrinin sözlərinə ehtiyac duymuruq: "Habelə bunun ardından işlər vacib olmuş digər işlər isə haram olmuşdur.Bu səbəbdən heç kəs bununla qürrələnməsin!". Həmin hədis "lə iləhə illəllah" deyən şəxs üçün əməlin şərt olmasına açıq-aydın dəlalət

---

[132] Liqaətul bəbil məftuh:2/470, 1124 saylı sual.

[133] Yuxarıda qeyd edilmişdir.

edir.Çünki Peyğəmbər (səlləllahu aleyhi və səlləm) demişdir: "Bununla Allahın vəchini diləyən". Bu səbəbdən bəzi sələf Peyğəmbərin: (səlləllahu aleyhi və səlləm) "Lə iləhə illəllah sözləri cənnətin açarıdır",[134]-sözləri haqqında demişlər: Ancaq əgər biri dişsiz açarla gələrsə o, onun üzünə açılmaz."[135]

(4)-Şeyx (rahiməhullah) demişdir: "Habelə insan namazı tərk edib onu qılmayacağı zaman namazın tərk edilməsi İslamdan çıxaran küfr olacaq.Buna Quran və sunnədən bir çox dəlillər vardır.Bəzi elm əhli buna dair səhabələrin icmasını xəbər vermişlər.Şübhəsiz ki, namaz qılmayan şəxsin qəlbində imanı yoxdur.Çünki iman, itaətin yerinə yetirilməsini tələb edir.Ən əzəmətli bədən itaəti isə namazdır.İnsan özünün mömin olduğunu iddia etsə belə onu tərk edəcəyi zaman bu, onun qəlbində imanın olmadığına dəlalət edəcək.Çünki mömin olan şəxs, qəlbində olan imanın tələbinə uyğun olaraq həmin əzəmətli namazı yerinə yetirir."[136]

(5)-Şeyxə, Peyğəmbərin növbəti hədisi haqqında sual verilmişdir: "Uca Allah deyəcək: Mələklər şəfaət etdi. Peyğəmbərlər şəfaət etdi.Möminlər şəfaət etdi.Yalnız rəhimlilər Rəhimlisi qaldı.Daha sonra atəşdən heç vaxtı

---

[134] Hafiz bunu (əl-fəth:3/109) "əs-sira"da ibn İshaqa aid etmişdir.Orada gəlmişdir ki, "Peyğəmbər (səlləllahu aleyhi və səlləm) Alə bin Hadramini yolladığı zaman ona demişdir: Sən cənnətin açarı haqqında soruşulsan de ki, onun açarı "lə iləhə illəllah"dır."Hafiz demişdir: Muaz bin Cəbəldən buna bənzər mərfu` rəvayət vardır.Beyhaqi bunu "əş-şuab" da təxric edib əlavə etmişdir: "Lakin bəzən açar olur.Əgər sən dişi olan açar gətirsən o, sənin üzünə açılar.Əks halda isə açılmaz." Habelə Buxari səhih əsərində demişdir: "Cənazələr və son sözü "lə iləhə illəllah" olan şəxs haqqında bölüm.Vahb bin Munəbbəhə deyilmişdir: Məgər "lə iləhə illəllah" cənnətin açarı deyil? O, dedi: Elədir! Lakin hər açarın dişləri vardır.Əgər sən dişləri olan açarla gəlsən o, sənin üzünə açılar.Əks halda açılmaz." Hafiz dedi: "Vahbın əsərini müəllif "ət-tərix" kitabında və Əbu Nueym "əl-hilyə"də həmin rəvayəti (məvsul) etmişdir".

[135] əl-Qaulul mufid şərhu kitəbi-t-təuhid:1/74.

[136] Məcmu`u fətəva va rasəili-ş-şeyx ibn Useymin:12/39.

xeyir etməyən bir dəstə insanı çıxardacaq." Hədisi Muslim rəvayət etmişdir.[137] Hədisdə gələn "heç vaxtı xeyir etməyən" sözlərinin mənası nədir?

Şeyx cavab olaraq demişdir: "Peyğəmbərin "heç vaxtı xeyir etməyən" sözlərində olan məna, həmin şəxslərin saleh əməllər etməməsi lakin imanın onların qəlblərinə daxil olmasıdır.Həmin şəxslər əməl etmək imkanı qazanmamış-dan öncə ölmüş, yəni iman gətirib əməl etmək imkanı qa-zanmamışdan öncə ölmüşlər.Belə olan halda həmin şəxslər haqqında "heç vaxtı xeyir etməyən" sözləri doğru səslənə-cək.Yaxud həmin hədis namaz kimi tərki küfr olan bəzi saleh əməllərə dəlalət edən hədislərlə çərçivəyə salınır.Çün-ki insan, Allaha və Peyğəmbərə iman gətirdiyini iddia etsə belə namazı tərk edəcəyi təqdirdə kafir olur.Kafirə isə qiyamət günü şəfatəçilərin şəfaəti fayda verməyəcək və həmin şəxs əbədi cəhənnəmlik olacaq.Hər bir halda önəmli olan, həmin hədisin iman gətirib əməl etmək imkanı qazan-mamışdan öncə dərhal ölən və heç vaxtı xeyir etməyən şəxslər haqqında bəhs etməsidir yaxud həmin hədis ümumi gəlmişdir.Lakin həmin hədisdən namaz kimi edilməsi labüd olan əməllərə dair şər`i nassların dəlalət etdiyi şeylər istisna edilir.Çünki əgər biri namaz qılmaza kafir olar.Həmin şəxsə şəfaət fayda verməz və o, atəşdən çıxmaz."[138]

(6)-Şeyxə sual verilmişdir: "Peyğəmbərin, (salləllahu aleyhi və səlləm) Allaha bir səcdə belə etməyən insanların cənnətə girməsi hədisi ilə namazı tərk edənin küfrünü ifadə edən hədislər arasında necə cəm aparıla bilər?

Şeyx cavab olaraq demişdir: "Peyğəmbərin (salləllahu aleyhi və səlləm) bu sözlərində, Allaha bir səcdə belə etmədən

[137] Muslim:183.Hədisi Əbu Səid əl-Xudri (r.a) rəvayət etmişdir.

[138] Məcmu`u fətəva va rasəili-ş-şeyx ibn Useymin:2/2.

cənnətə daxil olan insanlar, namazın vacibliyini bilməyən insanlar kimi qəbul edilməlidir.İslamdan uzaq yerlərdə yaşayan insanlar yaxud çöllükdə yaşayıb namaz haqqında heç bir şey eşitməyən şəxslər buna misaldır.Habelə bu hədis, İslama girdikdən dərhal sonra ölüb Allah üçün bir səcdə belə etməyə imkan qazanmayan şəxslərə aid edilməlidir.

Bizim bunu deməyimizə əsas, həmin qeyd etdiyin hədisin mutəşabih hədislərdən olmasıdır.Namazı tərk edənin küfrünə dair gələn hədislər möhkəm və açıq-aydın hədislərdir.Mömin, Quran yaxud sunnəni dəlil gətirdiyi zaman mütəşabihi möhkəmə qaytarmalıdır.Mütəşabihə tabe olub möhkəmi kənara qoymaq qəlblərində əyrilik olanların üslubudur.Uca Allah buyurur: *“Sənə Kitabı (Quranı) nazil edən Odur. Onun (Kitabın) bir hissəsi möhkəm (mənası aydın, hökmü bəlli), digər qismi isə mütəşabih (çətin anlaşılan, dəqiq mənası bilinməyən, məğzi bəlli olmayan) ayələrdir. Ürəklərində əyrilik olanlar fitnə-fəsad salmaq və istədikləri kimi məna vermək məqsədilə mütəşabih ayələrə uyarlar.”*[139] [140]

(7)-Şeyxə sual verilmişdir: “Bəzi alimlər namazı tərk edənin kafir olmayacağına dair Buxari və Muslimin nəql etdikləri uzun şəfaət hədisini dəlil göstərmişlər.Bu barədə nə deyə bilərsiniz?

Şeyx cavab olaraq demişdir: “Namazın tərkini küfr hesab etməyən şəxslərin dəlil olaraq gətirdikləri şəfaət hədisi, heç şübhəsiz ki, ümumi və digər dəlillərlə xüsusiləşdirilən hədisdir.Belə ki, həmin hədis “lə iləhə illəllah” şəhadətini dilə gətirib daha sonra küfr edən şəxslə xüsusiləşdirilir.Məsələn bir insan: “lə iləhə illəllah”

[139] Ali İmran:7.

[140] Liqaətul bəbil məftuh:3/169, 1258 saylı sual.

kəlməsini deyir daha sonra sələmin haramlığını yaxud namazın vacibiyini inkar edir.Belə şəxs istər şəfaət istərsə də digər şey ilə cəhənnəmdən çıxmayacaq.Çünki o, kafirdir.Şəhadəti dilə gətirməklə birgə namazın vacibliyini danıb kafir olan şəxslə şəhadəti dilə gətirməklə birgə namazı tərk edib kafir olan şəxs arasında hansı fərq vardır? Birinci həmin hədisə daxil olmadığı kimi həmçinin ikinci də ora daxil deyil.

Habelə "heç vaxtı xeyir etməyən" sözləri ümumidir və ora namaz qılmayan şəxslər həmçinin daxildir.Çünki namaz, xeyir işlərdəndir.Lakin bu ümumilik, namazı tərk edənin kafir olacağına dəlalət edən dəlillər ilə xüsusiləşmişdir.Bu səbəbdən, həmin ümumilikdən namaz çıxarılıq.Ümumi və xüsusi məsələlərdə məhz bu cür olur."[141]

(8)-Şeyxə sual verilmişdir: "Bizə müqabil tərəfdə olan bəzi insanlar deyirlər: "İman, qəlb etiqadı, dil tələffüzü və qəlb əməlinin özəyidir.[142]

Şeyx (rahiməhullah) qəzəbli şəkildə demişdir: "Allaha sığınıram! Bu, murciələrin sözüdür.Habelə o, qədim və məşhur məsləkdir."[143]

---

[141] Məcmu`u fətəva va rasəili-ş-şeyx ibn Useymin:12/71.

[142] Təəssüf doğuran amillərdən biri, həmin yaramaz sözün bəzi elm tələbələri arasında rəvac tapmasıdır.Bunun nəticəsi olaraq onlar düşünmüşlər ki, sələf imanın söz və əməl olduğunu dediyi zaman bununla kamil imanı qəsd etmişlər. Küfrdən çıxaran imanın özəyində isə bədən əməllərindən hər hansı bir şeyin olması şərt deyil.Heç şübhəsiz ki, bu, bir neçə cəhətdən batildir.Cəhətlərdən: Bunun, bədən əməli olmadan təsdiq və sözün yetərli olmayacağına dair sələfin icma etdiyi məsələyə müxalif olmasıdır.Habelə: Bu, zahir ilə daxil arasında olan bağlılığı rədd edir və təsdiqlə birgə qəlb əməlinin olmasını və bunun nəticəsinin və zəruri amilinin bədəndə üzə çıxmamasını mümkün edir.Buna əqli şübhələrə cavab fəslində geniş izah veriləcək.

[143] Tənbihul ixvan ilə haqiqətil imən, Əli bin Abdul-Əziz Musa:69-cu səh.

(9)-Şeyxə sual verilmişdir: "Sizdən, Şeyxul-İslam ibn Teymiyyənin növbəti sözlərini izah etməyinizi rica edirik: "Lakin (iman) qəlbə düşən və əməlin təsdiq etdiyidir.Əməl qəlbdə imanın olduğunu təsdiq edir.Əməl olmayacağı zaman insan qəlbdə imanın olduğunu deməklə yalançı olacaq.Çünki qəlbdə olan zahiri əməli gərəkdirir."Ləzim"in (zahiri əməllərin) yoxluğu isə "məlzum"un (daxili imanın) yoxluğuna dəlalət edir."

Şeyx cavab olaraq demişdir: "Şeyxin sözləri açıq-aydındır.Bu sözlər, Həsən əl-Bəsridən (rahiməhullah) rəvayət edilir. O, demişdir: "İman boş xülyalar və xoşlanma ilə deyil.Lakin o, qəlbə düşən və əməlin təsdiq etdiyi bir şeydir." Habelə bu sözlər, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) kəlamında rast gəlinir: "Ağah olun ki, bədəndə bir ət parçası vardır ki, o, düzələcəyi zaman bütün bədən düzəlir, o, pozulacağı zaman isə bütün bədən pozulur.Agah olun ki o, qəlbdir." Məlumdur ki, qəlbdə iman olacağı zaman bunun tələbinin bədən əzalarında üzə çıxması labüd olacaq."[144]

(10)-Şeyxə sual vermişlər: "Bir şəxs "lə iləhə illəllah" kəlməsini səmimi qəlbdən, habelə təslim olub boyun əyərək deyir lakin əməl etməyə imkanı olduğu halda əzaları ilə heç vaxt bir xeyir etmir.Belə şəxs Allahın məşiətinə daxildirmi yoxsa o, kafirdir?

Şeyx cavab olaraq demişdir: "Aləmlərin Rəbbi olan Allaha həmd-sənalar etdikdən sonra deyirəm: Əgər həmin şəxs, "lə iləhə illəllah" kəlməsini desə belə namaz qılmırsa o, kafirdir.Çünki əgər həmin insan "lə iləhə illəllah" kəlməsini deməkdə sadiq və səmimi olsaydı, and olsun Allaha ki, namazı tərk etməzdi.Çünki namaz insan ilə Allah arasında

[144] əl-Əsilətul qatariyə, liqaun hətifiyy.

bir rabitədir.Artıq Quran, sunnə, səhih görüş və səhabələrin icmasından nəql edilən dəlillərdə namazı tərk edənin kafir və əbədi cəhənnəmlik olması gəlmişdir.Həmin şəxs əsla Allahın məşiəti altına daxil deyil.

Biz bunu dediyimiz zaman bunu boş yerdən demirik.Bizim bu sözləri deməyimizə əsas, Allahın və Peyğəmbərin (salləllahu aleyhi və salləm) sözlərində gələn mənalar, habelə icma olaraq xəbər verilən səhabələrin sözləridir.Abdullah bin Şəqiq demişdir: "Peyğəmbərin (salləllahu aleyhi və salləm) səhabələri namazdan savayı əməllərdən heç bir şeyin tərkini küfr hesab etməzdilər." Habelə namazı tərk edənin kafir olacağına dair icmanı nəql edənlərdən biri də, məşhur imam hafiz ibn Rahuyədir.

Digər əməllərə gəldikdə isə, insan həmin əməlləri tərk edəcəyi zaman məşiət altında olacaq, yəni əgər sən məsələn zəkat verməsən məşiət altında olacaqsan.Çünki Peyğəmbər (salləllahu aleyhi və salləm) zəkatı verməkdən imtina edənlərin cəzasını qeyd etdiyi zaman belə demişdir: "Daha sonra həmin şəxs ya cənnətə yaxud da ki, cəhənnəmə aparan yolunu görəcəkdir."[145] Məlumdur ki, əgər həmin insan kafir olsaydı onun yolu cənnətə olmazdı.Habelə orucu və həcci tərk edən şəxs kafir olmur.Həmin şəxs məşiət altında olsa da belə o, Allahın ən günahkar qullarından olur."[146]

Dedim: Şeyxin sözlərinə diqqət yetir: "Çünki əgər həmin insan "lə iləhə illəllah" kəlməsini deməkdə sadiq və səmimi olsaydı, and olsun Allaha ki, namazı tərk etməzdi."Burada zahir ilə daxil arasında olan bağlılıq "tələzum" isbat edilir və ümumiyyətlə heç bir zahiri əməl olmadan qəlbdə imanın hasil olacağını yanlış düşünən şəxslərə cavab verilir.Məhz

[145] Muslim:987.

[146] əl-Əsilətul qatariyyə:987.

bu səbəbdən, həmin bu yanlış fikir insanların beynində qərar tutduğu zaman onlar baş verməsi mümkün olmayan məsələləri fərziyyə şəklində irəli sürməyə girişmişlər.Onlar demişlər: Bir şəxs "lə iləhə illəllah" kəlməsini səmimi qəlbdən, habelə təslim olub boyun əyərək dilə gətirir lakin əməl etməyə imkanı olduğu halda heç vaxt bədən əzaları ilə bir xeyir etmir.Məlumdur ki, əgər qəlb təslim olub tabe olsaydı bədən əzalarının həmçinin tabeçilik göstərməsi labüd olardı.Zahir ilə daxil arasında olan bağlılığı dərk etməmək, Şeyxul-İslamın dediyi kimi yanlış fikirlərin ortaya gəlməsinə yol açmışdır." [147]

(11)-Şeyxə sual verilmişdir: "Muslimin kitabında varid olan Əbu Səid əl-Xudrinin (r.a) hədisini necə anlamalıyıq: "Allah oradan heç vaxt xeyir etməyən insanları çıxaracaq"[148]?

Şeyx cavab olaraq demişdir: "Onun ümumi olduğunu, namazı tərk edənin kafir olacağına dair dəlillərin isə xüsusi olduğunu anlayırıq.Alimlərin məlum qaydasına əsasən, ümumi, xüsusi ilə xüsusiləşdirilir (yaxud ümumi xüsusi ilə ziddiyyət təşkil etmir).Çünki həmin hədisdə: Namaz qılmadılar",-sözləri gəlmir.Bu səbəbdən biz, həmin hədisin namazı tərk edənin küfrünü ifadə edən digər dəlillər ilə ziddiyət təşkil etdiyini demirik.Həmin hədisdə demişdir: "Heç vaxt xeyir etməyən".Orada namaza işarə edilmir və sacədə ümumiləşdirilir.Namazı tərk edənin kafir olmasına dair gələn nasslar isə xüsusidir."[149]

(12)-Şeyxə sual verilmişdir: "Bəzi insanlar deyirlər: İnsan bütövlüklə bədən əməllərini tərk edəcəyi zaman imandan çıxacaq lakin bu onun, imanın özəyindən və şəhadət

---

[147] Bu araşdırmanın birinci hissəsinə bax.

[148] Yuxarıda qeyd olunmuşdur.

[149] əl-Əsilətul qatariyyə.

kəlməsindən fayda görməyəcəyini tələb etməyəcək və həmin şəxs adı çəkilən şeylərdən fayda görəcək.Buna misal, həcc etmək istəyən lakin həccin dayağı olan Arafata yetişməyən şəxsdir. Həmin şəxs digər dayağlardan yararlanacaq.[150]Bu barədə nə deyə bilərsiniz?

Şeyx cavab olaraq demişdir: "Deyirik ki, bu, doğru deyil. İnsan namazı tərk etməsi ilə birgə imanından fayda görə bilməz.Çünki dəlillər namazı tərk edənin kafir olduğunu göstərir.Habelə əgər bir şəxs Arafatda duruşu tərk edərsə, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) sunnəsində gəldiyi kimi onun həcci səhih olmayacaq.Qurban günü sübhdən öncə Arafata yetişən şəxs isə həccə yetişmiş olacaq.Əks halda yetişmiş olmayacaq.Hətta əgər həmin şəxs bunun ardından daş atma, Minada gecələmə, təvaf və sə`y kimi ayinləri yerinə yetirərsə həcc etmiş olmayacaq."[151]

## *Əlavə*:

Şeyxin sözlərinə diqqət yetirən şəxs görəcək ki, şeyx bir minvalla hərəkət etməkdədir.Belə ki, o, bədən əməllərinin imandan olduğunu, onu bütövlüklə tərk edənin kafir olduğunu və qəlbdə iman olacağı təqdirdə bunun tələbinin bədən əzalarında üzə çıxacağını isbat edir.Habelə şeyx, zahiri əməli tərk edənin müsəlman olacağını deyənlərin ən güclü dəlili olan "heç vaxt xeyir etməyən" hədisi haqqında, onun ümumi hədis olduğunu deyir və onun namazı tərk edənin kafir olması haqqında bəhs edən dəlillərlə xüsusiləşdirildiyini yaxud əməl etmək imkanı qazanmayan şəxsin halına aid edildiyini söyləyir.

---

[150] Bu şübhə yaxud batil əsaslandırmanı "haqiqatul imən beynə ğuluvvil xəvaric va təfritıl murciə" kitabının müəllifi gətirmişdir.Artıq daimi komitə-Allah onları müvəffəq etsin-bu kitabdan çəkindirmişdir.

[151] Əl-əsilətul qatariyyə.

Bununla da, aydın olur ki, şeyx ilə əsrimizdə irca fikrinə çağıran kitablardan çəkindirən alimlər arasında heç bir ixtilaf yoxdur.Ən uzağı şeyxin növbəti ifadəni qəbul etmədi-yi deyilə bilər; "cinsul aməl".Belə ki, şeyxə: Əməlin cinsini tərk edən kafirdir, ayrı-ayrı əməlləri tərk edən isə kafir deyil. Sizin buna fikriniz nədir?-sualı verildiyi zaman şeyx demişdir: "Bu qaydanı kim demişdir? Bunu deyən kimdir? Bunu, Allahın Elçisi Muhamməd demişdir? Bu, mənasız sözdür.Biz deyirik: Allahın və Peyğəmbərin təkfir etdikləri şəxs kafirdir.Allahın və Peyğəmbərin təkfir etmədikləri şəxs isə kafir deyil.Doğru olan məhz budur.O ki qaldı, əməlin cinsi yaxud əməlin növü yaxud ayrı-ayrı əməlləri məsələsi-nə, bütün bunlar faydasız, boş sözlərdir."[152]

Bu, qeyd edildiyi kimi məsələnin məzmununa müvafiq olma ilə birgə həmin terminin qəbul edilməməsidir.Qeyd et-mək lazımdır ki, bu, çəkişməni aradan qaldırıb ixtilafı azaltmaq üçün şeyxin etdiyi ictihaddır.Şeyx bu görüşdə həmin məsələyə son qoymaq üçün dəvət edilmiş və ixtilafın həmin məsələ ətrafında cərəyan etdiyi barədə xəbər almış-dır.Şeyx çəkişən tərəfləri yığcam ifadələrdən döndərməyi və dayaq rolunu oynayacaq açıq-aydın əsaslara etimad etməyi məsləhət görmüşdür.Bütövlüklə əməli tərk edənə kafir hökmü çıxarılacaq.Çünki o, namazı tərk edir.Bu isə, şeyxin vurğuladığı kimi səhabələr arasında icma olan məsələdir. Bu səbəbdən, onların icmasından çıxmaq yolverilməzdir.Habelə şeyx, bədən əzaları ilə edilən əməlin tərk edilməsi ilə birgə qəlbdə imanın mümkünsüz olduğunu qeyd edir.

Həmçinin: Şeyxə ünvanlanan sual həmin termin barədə bilgisizliyi üzə çıxarır.Sual verən demişdir: "Əməlin cinsini

---

[152] əl-Əsilətul qatariyyə.

tərk edən kafirdir?".Buna dair deyiləcək: Hansı əməl? Qəlb əməli yoxsa bədən əməli yoxsa hər ikisi?! Habelə sual verən deyir: "Ayrı-ayrı əməlləri tərk edən kafir deyil".Buna dair deyiləcək: Hansı əməli qəsd edirsən? Namazı yoxsa zəkatı yoxsa valideyinlərə yaxşılığı yoxsa qorxu və sevgi kimi qəlb əməlini?

Şübhə yoxdur ki, bu sual, boş sözdür, üstəlik cahillik və savadsızlıqdır.

Şeyxdən sonra isə insanlar "cinsul aməl" sözündə gələn mənaya dair ixtilaf etmişlər.Onlardan bəzisi demişdir: Burada bütün zahiri əməlin tərk edilməsi qəsd edilir.Bəzisi demişdir: Burada hər bir əməlin cinsinin (növünün) tərk edilməsi qəsd edilir.Yəni, namazın cinsinin tərk edilməsi, zəkatın cinsinin tərk edilməsi, valideyinlərə yaxşılığın cinsinin tərk edilməsi! Sunnə üzərində olan şəxsin bunu deyəcəyini hesab etmirəm.Lakin bu, müxalifin müxalif olduğu şəxsə qarşı haqsızlığıdır.

Artıq "cinsul aməl" və "cinsu-t-təsdiq" ifadələri Şeyxul-İslamın (rahiməhullah) sözlərində varid olmuşdur.Lakin həmin ifadələr, müəmmalı tərəflər buraxmayan sözlərlə əhatəli şəkildə gəlmişdir.Bu məsələnin əvvəlində qeyd etmişdim ki, mən həmin terminin istifadəsini tərk edib müəmmalı olmayan ifadələrə üstünlük verəcəyəm.Misal üçün: Bütün yaxud bütövlüklə bədən əməllərini tərk edən,-sözləri.

41-Şeyx Muqbil bin Hədi əl-Vadi`i (rahiməhullah, hic. 1422-ci ildə v.e)

Şeyx (rahiməhullah), Saud bin Salih əs-Sa`dinin müəllifi olduğu "ictiməul umməti alə nusrati liməzhəbi əhli-s-sunnə" adlı kitabına müsbət rəy bildirmişdir.Müəllif həmin kitabda imanın səhih olması üçün zahiri əməlin labüdlüyü-

nə dair Əhli sunnənin məzhəbini müdafiə etmişdir.Şeyx Muqbil həmin kitaba müsbət rəy bildirərək demişdir: "Mən, fəzilətli şeyx Saud bin Salih əs-Sa`dinin müəllifi olduğu "ictiməul umməti alə nusrati liməzhəbi əhli-s-sunnə" adlı kitabını oxudum və həmin kitabın əqidə ilə bağlı olub çox dəyərli faydaları şamil etdiyini gördüm.Həmin kitabda bəzi müasirlərin düşdükləri yanlışlıqlara diqqət çəkilir.Allah onu xeyirlə mükafatlandırsın."

42-Şeyx Abdullah əl-Ğudeyyən (hafizahullah)[153]

Şeyxə sual verilmişdir: Əməllərin imanda kamillik şərti olduğunu deyən şəxsin bu sözü Əhli sunnənin sözüdürmü?

Şeyx cavab verib demişdir: "Xeyir! Əməllər səhihlik şərtidir."

Daha sonra şeyx demişdir: "Əgər insanlar məsələn bütün əmrləri tərk edib bütün qadağaları etsələr məgər iman səhih olacaq? Yəni, həmin insanlar namaz qılmayacaq, oruc tutmayacaq, ümrə və həcc etməyəcək, zəkat verməyəcək, sələmçiliklə məşqul olacaq, zina və oğurluq edəcəklər, bununla bərabər mömin olacaqlar? Onlar əməllər kamillik şərtidir dedikləri zaman bunu qəsd edirlər.

Sual verən: Bu, murciələrin sözüdürmü?

Şeyx: Murciələrin sözüdür."[154]

43-Şeyx Abdur-Rahmən əl-Bərrak (hafizahullah)

(1)-Şeyxə sual verilmişdir: Peyğəmbərin (salləllahu aleyhi və səlləm) "Allah cəhənnəmdən heç vaxt xeyir etməyən insanları

---

[153] Şeyxlərdən gələn nəqllər onların yaş tərtibinə uyğun aparılmışdır.Allahdan onları mübarək etməsini və onların elmini faydalı etməsini diləyirəm.
[154] 8/5/1426-cı il tarixində şeyxlə aparılan telefon danışığı.

çıxardacaq" sözləri ilə əməlin imanda dayaq olduğu haqqında dediyimiz söz arasında necə cəm aparmalıyıq?

Şeyx cavab olaraq demişdir: "Doğrusunu Allah bilir, lakin mən həmin hədisin, əməlin labüdlüyünü ifadə edən möhkəm dəlillərə qaytarılması gərəkli olan mütəşabih hədis olduğunu deyirəm."Heç vaxt xeyir etməyən": Bu, mütəşabih nasslardır.Hədislər, müjdə və təhdid hədisləri bir-biri ilə calaşdırılmalıdır.Doğrusunu Allah bilir."[155]

(2)-Şeyx (hafizahullah) bəyan etmişdir ki, müxalifin fərziyyə şəklində irəli sürdüyü forma, insanın şəhadəti dilə gətirməsi daha sonra İslam dinindən olan heç bir şey etməməsi şeyx Muhamməd bin Abdul-Vahhəbin (rahiməhullah) söz açdığı və İslamı pozan amillərdən etdiyi üz çevirmə küfrüdür.Şeyx əl-Bərrak demişdir:

"Əməlin bu surətdə olduğunu, əməlin kamillik şərti olduğunu mütləq şəkildə demək doğru deyil.Çünki bunun mütləq şəkildə deyilişi insanın şəhadəti gətirib: "şahidlik edirəm ki, Allahdan başqa (ibadətə haqqı olan) ilah yoxdur və Muhamməd Onun Elçisidir",-sözünü deməsini daha sonra heç vaxt İslam dinindən bir şey belə etməməsini ifadə edir.Şeyx Muhamməd bin Abdul-Vahhəb "nəvaqidul islam" risaləsində buna diqqət çəkmiş və həmin məsələni İslamı pozan onuncu amilə daxil etmişdir: İslam dinindən üz çevirmək, onu öyrənməmək və ona əməl etməmək."[156]

(3)-Şeyx (hafizahullah) demişdir: "İnsan əmələ, qəlb əməlinə sahib olmayınca adicə qəlb təsdiqi ilə yaxud adicə dil təsdiqi ilə mömin olmur.Bütün bədən əməlləri, namaz,

---

[155] Əşritatu şərh ət-tahaviyyə.İntəc mərkəzi-n-nəcaşi lil-bərməciyyət, miləff raqam 24.
[156] Öncəki mənbə.

zəkat, oruc, həcc, cihad, halalın halal sayılması, haramın haram sayılması olmayacağı zaman insanın doğru yaxud sadiq olması mümkün olmur.Artıq İslam dinindən bütöv-lüklə üz çevirmənin İslamı pozan amillərdən biri olduğu vurğulanmışdır.Həmin insan özünü müsəlman adlandırıb şəhadəti dilə gətirsə belə o, Allahın dinindən üz çevirəndir. Həmin şəhadət isə heç bir şeyə dəlalət etməyəcək və əməli gerçəyə dayamayacaq."[157]

(4)- Şeyx (hafizahullah) demişdir: "Üçüncü: Şəhadəti zahirdə dilə gətirsə belə insanın daxilən şəhadəti iqrar etmədiyini zahirdə gərəkli edən və ona zahirdə dəlalət edən amillər aşağıda gələn məsələləri şamil edir:

1-İslam dinindən üz çevirmək, onu öyrənməmək və ona əməl etməmək, habelə tərk etdiyi vaciblərə, işlətdiyi haram-lara və bilgisiz olduğu əhkamlara əhəmiyyət verməmək.

Bilmək lazımdır ki, mükəlləf, yaxşılığın hər hansı bir xislətini və imanın hər hansı bir şöbəsini etməklə iqrarın yoxluğunu qaçılmaz edən üz çevirmə küfründən çıxmır. Çünki bu xislətlərdən eləsi vardır ki, bütün insanlar, kafir və möminlər onda müştərək olurlar.Bu xislətlərdən: Yoldan əziyyət verən şeyləri kənar etmək, valideyinlərə yaxşılıq etmək, əmanətə vəfakar olmaq.Üz çevirmənin yoxluğu yalnız namaz, zəkat, oruc, həcc kimi Peyğəmbərin gətirdiyi İslam dininə xas olan hər hansı bir vacibin imanla olacağı və savabı Allahdan umulacağı zaman yerinə yetirilməsi ilə mümkün olur.

---

[157] Şeyxin şərhlərindən olan yazılı dərslərindən: "mucərradətu ləvami`il ənvar fi aqaidi əhlil əsər", Hafiz Əbul Həsən Əli bin Şukr əş-Şafii. İntəc mərkəzi-n-nəcaşi lil-bərməciyyət, miləff raqam 35.

Şeyxul-İslam ibn Teymiyyə demişdir: "İnsan, xüsusi olaraq Muhammədin (salləllahu aleyhi və səlləm) vacib buyurduğu vaciblərdən hər hansı bir şeyi etməməsi ilə birgə Allaha və Elçisinə iman gətirmiş olmaz." (məcmu`əl-fətəva:7/261)

(5)-Habelə şeyx (hafizahullah) "fəthul bəri" kitabına verdiyi izahda demişdir: "Sələfə görə bədən əməli qəlb əməlinə tabedir.Qəlb əməlinin cinsi isə imanın səhih olması üçün şərtdir.Bədən əməlinin cinsi isə qəlb əməlinə tabedir yaxud onun zəruri amilidir."Ləzim"in yoxluğu isə "məlzum"un yoxluğunu gərəkli edir.Çünki bütün əməllərdən üz çevirmək qəlbdə tabeçiliyin yoxluğuna bir dəlildir."[158]

44-Şeyx Abdullah bin Muhamməd əl-Ğuneyman (hafizahullah)

Şeyxə sual verilmişdir: "Əməl imanın kamillik şərtidir yoxsa səhihlik şərtidir? Habelə bu məsələdə olan ixtilaf növlü ixtilafa (ixtiləfu-t-tənəvvu`) daxildirmi?

Şeyx cavab verib demişdir: "Əməl imanın dayağıdır. Əməlsiz imanın mövcud olması mümkün deyil.

Habelə şeyxə sual verilmişdir: Cinsul aməl yaxud cinsul aməli tərk edən termini bidət sözlərdəndirmi yoxsa bu sələfin dediyi sözdür.Habelə bu termini işlədən şəxsin bidətçi olduğunu demək olarmı?

Şeyx cavab verib demişdir: "Cins sözü, hər hansı bir ismə aid olan bütün fərdləri şamil edir.Məsələn sən: "Kişi",-deyəcəyin zaman bunun, kişi adlanan hər bir şəxsə şamil edlməsi doğru olacaq.Habelə qadın, ağac, xurma və digər sözlər.Bu, ərəb dilinin əsaslarındandır."[159]

---

[158] Fəthul bəri məa tə`liqati-ş-şeyx əl-Bərrak:1/46.Sonuncu fəsildə Hafizin sözləri izah edildiyi əsnada şeyxin sözləri dolğun şəkildə qeyd ediləcək.

[159] Min əsiləti ruvvadi multəqa əhlil hadis.27/12/2005.

Şeyxə növbəti sual verilmişdir: "Bismilləhir rahmənir rahim.Fəzilətli şeyx Abdullah bin Ğuneymana Küveytdən oğlunuz Hamid Abdullah Əli tərəfindən ünvanlanan sual. Əs-Sələmu aleykum va rahmətullahi va bərakətuh.Bəzi insanlar Əhli sunnəyə nisbət edib iddia edirlər ki, insan bədən əməlləri ilə şəhadətə tabe olmaqdan külli şəkildə üz çevirəcəyi halda belə qəlbi ilə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gətirdiyi dini təsdiq edər və bir dəfə olsun şəhadəti dilə gətirib buna heç bir əlavə etməzsə həmin şəxs əbədi cəhənnəmdən qurtulmuş müsəlman olacaq.Həmin şəxs heç vaxt vaciblərdən birini etmir və nəfsinin çəkmədiyi yaxud edə bilmədiyi istisna heç bir haramdan əl çəkmir.Eyni zamanda həmin şəxs əməl etmək imkanına malik olur və Allahın ona vacib etdiyi əməlləri bilir.

Onlara: Belə şəxsin mömin olması qeyri-mümkündür. Çünki bu surətdə bədən əməlləri ilə hasil olan tabeçiliyi tərk etmək yalnız imanın səhihliyini aparan qəlb əməlinin getməsi ilə olur,-deyildiyi zaman onlar demişlər: Onun, ömründə bir dəfə olsa belə şəhadəti dilə gətirməyə sövq edən qəlb əməlinə, habelə təsdiqə və bir dəfə olsa belə şəhadətin tələffüzünə yiyələnməsi kifayətdir.Bununla da, onun imanı səhih olur və həmin şəxs müsəlmana çevrilir.Hətta əgər həmin şəxs: İslamın fərz buyurduğu heç bir şeyi etmirəm lakin onun tərk edilməsini halal saymıram, habelə heç bir haramı buraxmıram lakin onu halal saymıram,-deyərsə, onlara görə onun imanı pozulmayacaq.Həmin insan sadəcə naqis imanlı müsəlman və böyük günah sahibidir.

Onlara: Bu, murciələrin etiqadıdır.Bu söz, imanı söz və əməl edən, habelə biliyə və imkana sahib olması ilə birgə bütün bədən əməllərini tərk edənin mömin olmayacağını

deyən Əhli sunnənin mövqeyi ilə bir araya sığmır.Əksinə həmin şəxs, şəhadəti dilə gətirsə belə kafirdir.Böyük günah sahibləri isə etinasız yanaşma sahibləri olsalar belə ümumi şəkildə zahiri əməllər ilə tabe olan insanlardır.Onlar sadəcə böyük günahlar edib bundan tövbə etməyiblər,-deyildiyi zaman onlar belə deyirlər: Xeyir, bizim dediyimiz Əhli sunnənin etiqadıdır.Bəziləri deyirlər ki bu, Əhli sunnədən olan bir qism insanların etiqadıdır və biz həmin etiqad üzərəyik.

Sizdən bu məsələni izah etməyinizi və Əhli sunnənin bu mövzuya dair mövqeyini bəyan etməyinizi xahiş edirəm. Vaxtınızın sıx olması səbəbilə ətraflı izaf vermək imkanı olmasa belə mümkün qədər tez cavab verməyinizi rica edirəm.Çünki bu, çox önəmli və izah edilməsi gərəkli olan məsələdir.

Şeyx (hafizahullah) cavab olaraq demişdir: “Abdullah bin Muhammməd əl-Ğuneymandan möhtərəm Hamid bin Abdullah Əli qardaşa.Əs-sələmu aleykum va rahmətullahi va bərakətuh.Artıq sizin dəyərli yazınız və mənim halım ilə marağlanmağınız mənə çatmışdır.Allah sizi xeyirlə mükafatlandırsın.Sizə xəbər verirəm ki, biz,-Allaha həmd olsun-salamatlıq üzərəyik.

Sizin sualınıza cavab olaraq isə deyirəm: “Sizə heç də gizli deyil ki, insanın: Əgər biri, bədən əməlləri ilə şəhadətə tabe olmaqdan külli şəkildə üz çevirəcəyi halda belə qəlbi ilə təsdiq edib bir dəfə olsa belə şəhadəti dilə gətirərsə əbədi cəhənnəmdən qurtulmuş müsəlman olacaq və.s,- sözləri deməsi, batil və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gətirdiyi dinə zidd gələn sözdür.Əslində bu, azmış murciələrin sözüdür.Dində zəruri surətdə bilinən məsələlərdən, Peyğəmbərin iman və əməl ilə göndərilməsi, habelə əməldən üz

çevirən şəxsin Allahın Elçisinə (salləllahu aleyhi və səlləm) tabe olmuş hesab edilməməsidir.

İman isə, Allaha, mələklərinə, kitablarına, peyğəmbərlərinə, ölümdən sonra dirilişə, haqq-hesaba və qədərin xeyirinə və şərinə iman etməkdir.İnsan bu imana sahib olacağı zaman zəruri şəkildə şəhadət, namaz, zəkat, Ramazan orucu və həcc kimi itaətlə Allaha təslim olmağı ifadə edən İslamın hasil olması vacib olacaq.Çünki Allaha, Onun mələklərinə, kitablarına və peyğəmbərlərinə iman, sevgi və itaətlə birgə Allaha təslim olmağı və ona boyun əyməyi tələb edir.Məqsəd hasil olmadığı halda qüdrət ilə birgə qəti iradənin varlığı qeyri-mümkün olduğu kimi insanın qəlbdə imana, habelə daxilində sevgi və tabeçiliyə sahib olduğu halda imkanla birgə bədən əzalarında öz əksini tapan zahirə sahib olmaması qeyri-mümkündür.İmanla birgə əməllərin yoxluğunu təsəvvür etmək gerçəyə dayanmayan fərziyyədir.Buradan bəlli olur ki, əgər biri qəlbi ilə qəti şəkildə iman gətirərsə imkan sahibi olacağı təqdirdə şəhadəti dilə gətirməməsi və şəriətin vacib buyurduğu əməlləri etməməsi qeyri-mümkün olacaq.Əməlin yoxluğu qəlb imanının yoxluğunu qaçılmaz edir.Bununla da, bədən əməlləri olmadan adicə qəlbdə olan imanın fayda verəcəyini iddia edən cəhmilərdən olan murciələrin və onlara bənzər insanların xətası bəlli olur.Çünki bu, baş verməsi mümkün olmayan bir şeydir.Çünki qəlbdə qəti iman olacağı zaman mütləq zahiri əməl olacaq.Məhz bu səbəbdən, Peyğəmbər (salləllahu aleyhi və səlləm) insanlarla savaşın tərk edilməsini əməlin yerinə yetirilməsi ilə bağlamışdır.Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "İnsanlarla, onlar "lə iləhə

illəllah" sözünü deməyincə, habelə namaz qılıb zəkat verməyincə saavşmağa əmr olundum."[160]

Habelə imtina, təkzib etmə ilə bir arada gəlir.Çünki imtina, əməlin tərk edilməsidir.Bunun əksi isə saleh əməlin iman ilə bir arada gəlməsidir.Çünki iman, onu gərəkdirir.Şeyxul-İslam demişdir: "Allahın və Peyğəmbərin kəlamlarında iman adı istifadə edildiyi zaman vaciblərin yerinə yetirilməsini və haramların tərk edilməsini ifadə edir." (məcmu`əl-fətəva:7/42)

Habelə demişdir: "Əhməd, Vəki` və qeyriləri Cəhmin imana dair sözünü deyənləri təkfir etmişlər.O, deyirdi ki, iman qəlb bilgisi və təsdiqidir."Habelə demişdir: "Müsəlmanlar, şəhadəti dilə gətirməyənin kafir olacağına yekdil olmuşlar.Lakin onlar namazı, zəkatı, orucu və həcci tərk edənin təkfir ediləcəyinə dair ixtilaf etmişlər.Biz, insanın günah səbəbilə kafir olmayacağına dair Əhli sunnənin yekdil olduğunu dediyimiz zaman bununla zina və şərab içmək kimi asilikləri qəsd edirik.Bu dayağlara gəldikdə isə, onu tərk edənin təkfir ediləcəyinə dair məşhur ixtilaf mövcuddur." (məcmu`əl-fətəva:7/302)

Habelə demişdir: "Qəlbdə olan iman, qəlb əməli və onun nəticəsi olan Allahı və Peyğəmbəri sevmək və digər şeylər olmadan adicə təsdiq ilə hasil olmur." (məcmu`əl-fətəva:7/529)

Yəni, iman ilə əməlin olması labüddür.Buna Qurani Kərimin bir çox yerində varid olan ayələr dələlət edir.Uca Allah buyurur: "*And olsun axşam çağına! Həqiqətən, insan ziyan içərisindədir. Yalnız iman gətirib yaxşı işlər görənlər,*

[160] Hədis yuxarıda qeyd edilmişdir.

*bir-birinə haqqı məsləhət görənlər və bir-birinə səbrli olmağı məsləhət edənlərdən başqa."*[161]

Uca Allah burada insan növünün davamiyyətli ziyan içərisində olduğuna and içir və yalnız iman gətirib yaxşı işlər görən şəxsi istisna edir.Məhz belə şəxslər bir-birinə haqqı və səbiri tövsiyə edirlər.Habelə Uca Allah buyurur: *"And olsun ki, Biz insanı ən gözəl biçimdə yaratdıq! Sonra da onu ən rəzil yerə qaytardıq! Yalnız iman gətirib yaxşı əməllər edənlərdən başqa! Onları minnətsiz mükafat gözləyir."*[162] Uca Allah iman gətirib yaxşı işlər görməyənin, ən rəzil yerə qaytarılacağını bəyan etmişdir.Ən rəzil yer isə cəhənnəmdir.

Qurani Kərimdə buna dair dəlillər həddindən artıq çoxdur.Misal üçün Uca Allah buyurur: *"Bizim ayələrimizə ancaq ayələrimizlə öyüd-nəsihət olunduqları zaman səcdəyə qapananlar və təkəbbür göstərməyərək Rəbbini həmd-səna ilə təqdis edənlər iman gətirərlər."*[163] Uca Allah bu ayədə həmin şəxslərdən olmayanlardan imanı inkar etmişdir.Quran oxunduğu zaman Allahın fərz etdiyi səcdəni etməyən şəxs möminlərdən deyil.

İman adı bəzən qəlbdə olan qəlb sözləri və əməlləridən olan təsdiq, sevgi, təzim və.s üçün istifadə olunur.Belə olan halda zahiri sözlər və əməllər onun zəruri amilləri, tələbləri və əlamətləri olur.Bəzən isə o, imanın gərəkli ünsürü və tələbi edilərək və onun anlamına daxil olaraq bədəndə olan üçün istifadə edilir.Bununla da, zahiri əməllərin islam adlanması və onun iman anlamına daxil olması bəlli olur. Məhz bu cür (məcmu\`əl-fətəva:7/551) kitabında qeyd edilmişdir.

---

[161] əl-Asr:1-3.
[162] ət-Tin:3-6.
[163] əs-Səcdə:15.

Bununla da, bəlli olur ki, qəlbdə iman olacağı zaman insanın imkan olan yerdə şəhadəti dilə gətirməməsi yaxud əməl etməməsi qeyri-mümkün olacaq.Əməlin yoxluğu imanın yoxluğuna dəlalət edir.Bir insanın digərini ürəkdən sevməsi daha sonra onunla qovuşmaq üçün heç bir zahiri hərəkət etməməsi qeyri-mümkün bir işdir.Bu səbəbdən, qəlbdə iman olacağı zaman əməlin yoxluğunu mümkün saymaq yanlış fikir olmuşdur.

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Bu məqamda ortaya çıxmış yanlışlıq bir neçə yöndən olmuşdur.Birinci: Onlar əməlin və təsdiqin imanın bütün dərəcələrini gərəkli etdiyini düşünmüşlər.İkinci: Onlar, insanların qəlblərdə olan şeylərdə bir-birindən üstün olmadığını düşünmüşlər. Üçüncü: Onlar qəlbdə olan məqbul imanın zahiri söz və zahiri əməlsiz mümkün olacağını düşünmüşlər.Dördüncü: Onlar, qəlbdə yalnız təsdiqin olduğunu və zahirin yalnız bədən əməlləri olduğunu düşünmüşlər.Əslində isə qəlbin təsdiqlə birgə əməli vardır.Həmçinin zahir, zahiri söz və zahiri əməldir.Onların hər ikisidə daxili gərəkdirir.(məcmu`əl-fətəva:7/554)

Uca Allahdan, bu mövzuya dair geniş və ətraflı yazının ərsəyə gətirilməsini müyəssər etməsini diləyirik."[164]

45-Şeyx Salih bin Fəuzan əl-Fəuzan (hafizahullah)

Şeyxin bu məsələnin açıqlanmasına dair geniş izahları mövcuddur.Həmin sözlərdən bir qismi:

(1)-Şeyxə sual verilmişdir: "Fəzilətli şeyx Salih əl-Fəuzan-Allah onu sevib razı qaldığı şeylərə müvəffəq etsin.

[164] Bəyənu haqiqətil imən va-r-raddu alə murciətil asr fimə xaləfu fihi muhkəməl qurən, şeyx Hamid bin Abdullah əl-Aliyy.Kitabının sonuna bax.

Əs-sələmu aleykum va rahmətullahi va bərakətuh.Son zamanlar elm tələbələri arasında dinin əsası ilə əlaqəli olan çox önəmli bir məsələ ətrafında söz-söhbətlər çoxalmışdır. Şeyxdən bəyan etməsini dilədiyim bəzi sözləri qeyd edəcəyəm və həmin sözlərin Əhli sunnə vəl cəmaatın əqidəsinə uyğun gəldiyini yaxud orada xələlin olduğunu öyrənməyə çalışacağam:

Bəzi insanlar deyirlər: "Əhli sunnə vəl cəmaatın əqidəsinə əsasən əməl imanda kamillik şərtidir və heç də imanın səhihlik şərti deyil." Ancaq bir şeydə məlumdur ki, Əhli sunnəyə görə iman söz və əməldir və bəzi sələf imamlarının bildirdiyi kimi iman yalnız əməl ilə olur.

Şeyx (hafizahullah) cavab olaraq demişdir: "Birinci söz, Əhli sunnə murciələrinin[165] sözüdür və bu, yanlış sözdür. Doğru olan isə əməllərin imanın gerçəyinə daxil olmasıdır.Belə ki, o, etiqad, söz və əməldir, habelə iman itaətlə artıb asiliklə azalır.Bu, Əhli sunnənin cumhurunun sözüdür.Çünki Uca Allah əməlləri iman adlandırmışdır.Belə ki, Uca Allah buyurur: *"Möminlər yalnız o kəslərdir ki, Allah adı çəkiləndə ürəkləri qorxudan titrəyər, Allahın ayələri oxunduğu zaman həmin ayələr onların imanlarını daha da artırar, onlar ancaq öz Rəbbinə təvəkkül edər, namaz qılar və verdiyimiz ruzidən (Allah yolunda) sərf edərlər."*[166] Habelə Peyğəmbər (salləllahu

[165] Bəzi insanlara bu sözlər müəmmalı qalmışdır.Onlar demişlər: Məgər Əhli sunnənin içində murciələr var? Əslində isə şeyx və bu sözü deyən digərləri bunu dedikləri zaman: İrca ilə digər məşhur bidətləri bir arada cəm etməyən xalis murciələri qəsd edirlər.Çünki məzhəb və firqələri araşdıranlara görə murciələr dörd qismdir: Xəvaric murciələr, qədəri murciələr, cəbri murciələr və xalis murciələr.Burada qəsd edilən məhz axırıncıdır: (şərhul məvaqif:4/429).Habelə Muhamməd Muhyiddin Abdul-Hamidin "məqalətul isləmiyyin:1/213" kitabına izahı. Habelə "firaqun muasıra təntəsibu iləl isləm:2/761".

[166] əl-Ənfəl:2-3.

aleyhi və səlləm) demişdir: "İman, yetmiş və bir neçə şöbədən ibarətdir."[167]

(2)-Şeyxə sual verilmişdir: "Bütövlüklə zahiri əməli tərk edənin hökmü nədir.Həmin şəxs şəhadəti dilə gətirir və fərzləri iqrar edir lakin ümumiyyətlə heç bir əməl etmir. Həmin insan müsəlmandır yoxsa yox? Habelə həmin insanın fərzləri yerinə yetirməyə mane olan heç bir şər`i üzürü yoxdur."

Şeyx cavab olaraq demişdir: "Belə şəxs mömin olmur. Əgər biri qəlbi ilə etiqad edər, dili ilə iqrar edərsə lakin bədən əzaları ilə əməl etməzsə və heç bir üzr olmadan bütün əməlləri kənara atarsa mömin olmaz.Çünki qeyd etdiyimiz və Əhli sunnə vəl cəmaatın açıqladığı kimi iman: Dil ilə söz, qəlb ilə etiqad və bədən əzaları ilə əməldir.İman yalnız bu üçünün bir arada gəlməsi ilə hasil olur.Əgər insan bunlardan birini tərk edərsə mömin olmaz."[168]

(3)-Şeyxə sual verilmişdir: "Bu söz, doğrudurmu: Əgər biri imanın söz, əməl və etiqad olduğunu və onun artıb azaldığını deyərsə, hətta əgər həmin şəxs küfrün yalnız etiqad və danma ilə olduğunu deyərsə bütövlüklə ircadan qurtulmuş olacaq?

Şeyx cavab olaraq demişdir: "Bu, ziddiyyətdir.Əgər bir şəxs küfr yalnız etiqad və danma ilə olur deyərsə bu onun,

---

[167] əl-Muntəqa min fətəva şeyx Salih əl-Fəuzan:2/9.

[168] Məsəilu fil imən.Əcəbə anhə fədılətu-ş-şeyx Salih əl-Fəuzan:21-ci səh.Şeyx demişdir: "Belə şəxs mömin olmur".Onun bu cavabı "O, müsəlmandırmı?" sualına tamamilə uyğun gəlir.Çünki əgər biri dil sözünü yaxud qəlb etiqadını tərk edərsə heç şübhəsiz ki, kafir olacaq.Habelə əgər biri bədən əməllərini tərk edərsə, belə şəxs və digərləri haqqında şeyx belə ifadə işlətmişdir: "Əgər biri onlardan birini tərk edərsə belə şəxs mömin olmaz." Bunun açıq-aydın olmasına rəğmən bunu vurğulamağıma səbəb açıq-aydın ifadələrdə mübahisə aparan şəxslərlə mübtəla olmağımızdır.

iman dil ilə söz, qəlb ilə etiqad və bədən əzaları ilə əməldir sözü ilə ziddiyyət təşkil edəcək.Bu, aşkar ziddiyyətdir.Çünki əgər iman dil ilə söz, qəlb ilə etiqad və bədən əzaları ilə əməldir və iman itaət ilə artıb günahla azalırsa, bu, birdəfəlik əməlləri tərk edənin mömin olmayacağını ifadə edəcək. Çünki iman bütün bu şeylərin toplusundan ibarətdir və onlardan bir qisminin olması kifayət etmir. Habelə küfr danma çərçivəsinə salınmır.Danma yalnız küfrün növlərindən biridir.Çünki alimlər dediyi kimi küfr həm söz ilə, həm əməl ilə, həm etiqad ilə, həm də şəkk-şübhə ilə hasil olur.Buna dair fiqh kitablarında gələn mürtədin əhkamları bölümünə baxa bilərsən."[169]

(4)-Şeyxə sual verilmişdir: "Müəyyən insanlar külli şəkildə bütün əməlləri tərk edənin naqis imanlı mömin olacağına dair mövcud olan bəzi hədisləri dəlil göstərirlər. Bu hədislərdən məsələn: "Heç vaxt xeyir etməyən", habelə "vərəq" və digər hədislərdir.Buna necə cavab verilməlidir?

Şeyx cavab olaraq demişdir: "Bu, mütəşabihdən yapışmaqdır.[170] Habelə bu, qəlblərində əyrilik olanların üslubudur.Uca Allah buyurur: "*"Sənə Kitabı (Quranı) nazil edən Odur. Onun (Kitabın) bir hissəsi möhkəm (mənası aydın, hökmü bəlli), digər qismi isə mütəşabih (çətin anlaşılan, dəqiq mənası bilinməyən, məğzi bəlli olmayan) ayələrdir. Ürəklərində əyrilik olanlar fitnə-fəsad salmaq və istədikləri kimi məna vermək məqsədilə mütəşabih ayələrə uyarlar."*[171] Onlar mütəşabih dəlilləri götürüb onu açıqlayan və izah

---

[169] Məsəil fil imən:23-cü səh.

[170] Şeyxlərdən: İbn Useymin, şeyx əl-Bərrak, şeyx Salih əl-Fəuzanın bunu, möhkəmə qaytarılması vacib olan mütəşabihdən yapışma etmələrinə dair yekdilliyinə diqqət yetir.Bu, qəlblərində əyrilik olanlara əks olaraq elmdə möhkəm olanların üslubudur.

[171] Ali İmran:7.

edən möhkəm dəlilləri tərk edirlər.Bu səbəbdən, mütəşabihi möhkəmə qaytarmaq gərəkdir.Belə deyiləcək: Əgər biri şər`i üzr səbəbilə əməli tərk edib ölənə qədər onu etmək imkanı qazanmazsa, həmin şəxs üzürlü hesab ediləcək.Həmin hədislərdə məhz bu cür insanlara aid edilir.Habelə deyləcək: Bu insan, etiqad edərək xalis Allah üçün şəhadəti dilə gətirmiş və əməl etməyə imkan qazanmayaraq dərhal ölmüşdür.Lakin həmin şəxs ixlasla və tövhidlə birgə şəhadəti dilə gətirmişdir.Peyğəmbərin (salləllahu aleyhi və səlləm) dediyi kimi: "Kim "lə iləhə illəllah" deyib Allahdan başqa ibadət olunanları inkar edərsə onun malı və qanı haram olar.Onun sorğu-sualı isə Allaha aiddir."[172] Habelə (salləllahu aleyhi və səlləm) demişdir: "Həqiqətən də, Uca Allah "lə iləhə illəllah" deyib bununla Allahın vəchini diləyən şəxsi atəşə haram etmişdir."[173] Bu şəxs, şəhadəti dilə gətirib onun mənasını etiqad etməsi ilə birgə əməl etmək imkanı tapmamışdır.Həmin şəxs Allaha ixlaslı olmuş lakin ölənə qədər əməl etmək fürsəti əldə etməmişdir.Məhz belə insan şəhadət ilə cənnətə daxil olacaq."Vərəq" hədisi və eyni mənada gələn digər hədislər həmçinin bu hala aid edilir.Həmçinin heç vaxt xeyir etməyən şəxslərin atəşdən çıxacağı haqqında bəhs edən hədis, həmin şəxslərin şəhadəti dilə gətirib İslama girmələri ilə bərabər əməl etmək imkanı qazanmadıqları səbəbilədir və hədis məhz buna aid edilir.Ancaq əgər biri əməl etmək imkanına sahib olması ilə birgə ixtiyarı surətdə bütün əməlləri tərk edərsə mömin olmaz.Hədislərin arasında cəm məhz bu cür aparılır."[174]

(5)-Şeyxə sual verilmişdir: "Bütövlüklə zahiri əməli tərk edənin, bəzi elm əhlinin təbirincə desək əməlin cinsini tərk

---

[172] Yuxarıda qeyd olunub.

[173] Yxarıda qeyd olunub.

[174] Məsəil fil imən:28-ci səh.

edənin mömin olacağını deyən şəxslərin hökmü nədir. Deyilənə görə murciələrin bəzi firqələri bunu demişdir?

Şeyx cavab verib demişdir: Öncə qeyd edildiyi kimi əməl imandandır.Əgər biri onu tərk edərsə imanı tərk etmiş olacaq.Onun bütün əməlləri birdəfəlik tərk edib heç vaxt əməl etməməsi yaxud imandan görmədiyi və imana daxil olduğunu hesab etmədiyi səbəbilə bəzi əməlləri tərk etməsi eynidir.Bu şəxs, murciələrə daxildir.İman, namaz kimi bəzi əməllərin yoxluğu ilə yoxa çıxır.Digər əməllərdə olduğu kimi bəzi əməllərin yoxluğu ilə iman, əməlin növü etibarı ilə böyük nöqsana yaxud kiçik nöqsana uğrayır."[175]

(6)-Şeyx (hafizahullah) demişdir: "Murciələr imanı dil iqrarı və qəlb təsdiqi çərçivəsinə salmışlar.Doğru söz isə: İmanın dil sözü, qəlb etiqadı və bədən əməlləri olmasıdır.Əməllər həmçinin imanın gerçəyinə daxildir və imana əlavə edilmiş bir şey deyil.Bu səbəbdən, əgər biri əməli kənara qoyub dil sözü və qəlb təsdiqi ilə kifayətlənərsə doğru iman sahiblərindən olmaz."[176]

(7)-Şeyx (hafizahullah) demişdir: "İnsan "lə iləhə illəllah" kəlməsinin tələbinə uyğun əməl etməyib adicə tələffüzlə kifayətlənəcəyi yaxud onun əksini edəcəyi zaman həmin şəxsə mürtəd hökmü çıxarılacaq və ona mürətdlərə olan rəftar göstəriləcək.Lakin əgər insan həmin kəlmənin tələbinə uyğun olan bəzi şeyləri edərsə, belə olan halda onun əməlinə baxılacaq: Əgər onun tərk etdiyi şey, məsələn namazın qəsdən tərk edilməsi yaxud ibadətin hər hansı bir növünün Allahdan qeyrisinə yönəldilməsi kimi mürtədliyi tələb edərsə ona riddə hökmü çıxarılacaq.Əgər onun tərk etdiyi şey, şirkdən kiçik günahlar kimi mürtədliyi tələb

---

[175] Öncəki mənbə:34-cü səh.

[176] ət-Tə`liqatul muxtəsara alə mətnil aqidəti-t-tahaviyyə:145-ci səh.

etməzsə həmin insan tərk etdiyi şey etibarlı ilə naqis imanlı mömin sayılacaq."[177]

(8)-Habelə Şeyx (hafizahullah), şeyx Bəkr bin Abdullah Əbu Zeydin müəllifi olduğu "dər`ul fitnə an əhli-s-sunnə" kitabına təqdimat vermişdir.Artıq bizim məsələ ilə əlaqəli olan nəql yuxarıda qeyd edilmişdir.[178]

(9)-Habelə şeyx (hafizahullah) "dabtu-d-davabit fil imən va nəvaqidih", "haqiqətul imən beynə ğuluvvil xəvaric va təfritil murciə", habelə "ət-təhzir min fitnəti-t-təkfir" və "sayhətu nəzir" kitablarından çəkindirənlərdən biri olmuşdur.Adı çəkilən kitablar isə bu sözü müdafiə edir: Əməllər imanın kamillik şərtidir və bütövlüklə əməlləri tərk edən şəxs Allahın məşiəti altında olan müsəlmandır.[179]

(10)-Habelə şeyx (hafizahullah), şeyx Muhamməd bin Səlim əd-Dəusərinin müəllifi olduğu "raf`u-l-ləimə an fətva-l-ləcnəti-d-dəimə" kitabına müsbət rəy bildirmişdir.Həmin kitab, əməllərin imanın kamillik şərti olduğunu iddia edən Hələbiyə rəddiyə məzmununda yazılıb.Habelə həmin kitabda əməlin cinsinin imanın səhih olması üçün labüdlüyü vurğulanır.

(11)-Habelə şeyx (hafizahullah), İsam bin Abdullah əs-Sinəninin müəllifi olduğu "əqualu zəvil irfən fi ənnəl ə`məlel cəvarihi dəxilətun fi musəmməl imən va fihi bəyənu ənnəl ə`mələ cuz`un min haqiqətil imən va leysət şərtan fi kəməlihi" kitabına müsbət rəy bildirmişdir.Həmin kitabın müəllifi orada, əməlin dayağ olduğuna və onu bütövlüklə

---

[177] əl-Muntəqa min fətəva şeyx Salih əl-Fəuzan:1/9.
[178] Yuxarıda keçmişdir.
[179] ən-nassu-t-təhziri-s-sadir ani-l-ləcnəti-d-dəimə fi həzihil kutub.Əlavələr:2,3,4.

tərk edənin kafir olacağına dair Əhli sunnənin məzhəbini müdafiə etmişdir.

Həmin kitabda gəlmişdir: Altıncı müddəa: Əhli sunnə alimlərinin qəbul etdiyi qaydaya əsasən Allahın Öz kitabında yaxud Peyğəmbərin (salləllahu aleyhi və sələm) sunnəsində əmr etdikləri bədən əməllərini, aləxsus fərz əməlləri külli şəkildə tərk edənin təkfir edilməsidir.Bu, elm əhlinin kitablarında qəbul edilmiş qaydadır."[180]

Şeyx Salihin adı çəkilən kitaba verdiyi təqdimatda deyilir: "Lakin əməlin cinsi yalnız şərt deyil həmçinin imanın gerçəyindən sayılır."[181]

(12)-Şeyxə sual verilmişdir: "Möhtərəm şeyx-Allah sizi müvəffəq etsin-, bəzi insanlar deyirlər: Bütövlüklə əməlin cinsini tərk edən şəxs kafir olmur.Habelə bu, sələfin ikinci sözüdür və buna irad tutmaq və bu üzdən insanları bidətdə ittiham etmək doğru deyil.Bu deyilənlər nə dərəcədə doğrudur?

Şeyx: Bu, yalançıdır.Bu sözləri deyən şəxs yalançıdır.O, sələfin adından yalan danışır.

Sələf, əməlin cinsini tərk edib heç bir əməl etməyənin mömin olduğunu deməmişlər.

Əgər biri heç bir üzr olmadan birdəfəlik əməli tərk edərək namaz qılmazsa, oruc tutmazsa və heç bir şey etməzsə və eyni zamanda: Mən mömінəm,-deyərsə yalançı olacaq.

Hər hansı bir üzr səbəbilə əməli tərk edib əməl etməyə imkan qazanmayan bununla bərabər sidqi ürəklə şəhadəti dilə gətirib ardından ölən yaxud öldürülən insanın mömin

[180] Əqualu zəvil irfan:111-ci səh.
[181] Öncəki mənbə:146-cı səh.

olmasında heç bir şübhə yoxdur.Çünki həmin şəxs əməl etməyə imkan qazanmır və əməli tərk etmək arzusunda olmur.

Ancaq əməli tərk edib namaz qılmayan, oruc tutmayan, zəkat verməyən, haramlardan və fahiş işlərdən kənar durmayan şəxs mömin deyil.Bunun mömin olduğunu isə yalnız murcilər demişlər."[182]

(15)-Şeyxə sual verilmişdir: "Bizim ölkəmizdə bu sözləri deyən insanlar çoxalmışlar: Bədən əməllərinin tərk edilməsi Əhli sunnə vəl cəmaatın arasında ixtilaflı olan məsələdir. Bu söz, doğrudurmu?

Şeyx cavab olaraq demişdir: "Bunu deyən yalançıdır. Əhli sunnə vəl cəmaat arasında əməllərin imandan olmasına dair heç bir ixtilaf yoxdur.İmansız əməl səhih olmadığı kimi həmçinin əməlsiz iman səhih deyil.Onlar bir-birinə sıx bağlıdırlar.Bu, Əhli sunnə vəl cəmaatın sözüdür: İman, dil ilə söz, qəlb ilə etiqad və bədən əzaları ilə əməldir.Habelə o, itaətlə artıb asiliklə azalır.Hətta əgər Əhli sunnədən bəzi insanların bu məsələdə müxalif olması fərz edilsəydi, yenə də mötəbər görüş, dəlillər və Əhli sunnənin çoxunun tutduğu yol olacaq.Həmin söz isə etibarsız, dəlil olaraq yararsız və müxalif bir söz hesab ediləcək."[183]

46-Şeyx Abdul-Əziz bin Abdullah ər-Racihi (hafizahullah)

(1)-Şeyxə növbəti sözləri deyən şəxs haqqında sual verilmişdir: "İman söz, əməl və etiqaddır, lakin əməl onun kamillik şərtidir."Habelə həmin şəxs deyir: "Küfr yalnız etiqad ilə olur".Bu söz, Əhli sunnənin sözlərindədirmi yoxsa yox?

---

[182] Min şərit şərhil aqidətil həməviyyə:22/2/1426.

[183] Min şərhi-ş-şeyx alə "şərhi-s-sunnə" lil-bərbahəri:14/1/1427.

Şeyx cavab olaraq demişdir: "Bu sözlər, Əhli sunnənin sözlərindən deyil.Əhli sunnə deyirlər: İman, dil və qəlb ilə söz, habelə bədən əzaları və qəlb ilə əməldir.

Habelə onlardan bəziləri deyirlər: İman söz, əməl və niyyətdir.İmanda bu dörd şeyin olması labüddür: (1)Dilin sözü: Bu isə, dilin tələffüz etməsidir.(2)Qəlb sözü: Bu isə, iqrar və təsdiqdir.(3)Qəlb əməli: Bu isə, niyyət və ixlasdır.(4)Bədən əməli: Əməl, imanın dörd hissəsindən biridir.Bu səbəbdən onun haqqında: Əməl kamillik şərtidir yaxud o, onu gərəkdirir,-deyilməz.Çünki bu, murciələrin sözləridir. Biz isə Əhli sunnənin əməlin kamillik şərti olduğunu deməl追 bilmirik.

Habelə "küfr yalnız etiqad ilə olur" deyənin sözü.Bu, murciələrin sözüdür.Onların sözlərindən: "Əməllər və sözlər qəlbdə olan etiqada dəlalət edir." Bu, batildir.Çünki küfr sözü, öz-özlüyündə küfrdür.Habelə küfr əməl, öz-özlüyündə küfrdür.Qeyd edildiyi kimi Uca Allah buyurmuşdur: "*"Onlardan (nə üçün istehza etdiklərini) soruşsan, deyərlər: "Biz sadəcə boş-boş danışıb zarafatlaşırdıq!" De: Allaha, Onun ayələrinə və Onun Elçisinə istehzamı edirsiniz? Üzrxahlıq etməyin! İman gətirdikdən sonra artıq kafir oldunuz."*[184] Yəni, bu söz ilə kafir oldunuz."[185]

(2)-Şeyxə zahiri əməlin tərki haqqında sual verilmişdir:

Şeyx cavab olaraq demişdir: "Qeyd edildiyi kimi əməlin olması labüddür.Çünki şəhadəti iqrar edən şəxsin əməl etməsi labüddür.Habelə şəhadəti dilə gətirməyi əmr edən və şəhadəti dilə gətirən şəxsin mömin olacağını ifadə edən dəlillər əməlin tərk edilməsini mümkünsüz edən qeydlərə

---

[184] ət-Təubə:65-66.

[185] Şərit: Əsilətun və əcvibətun fil imən val kufr.

bağlıdır.Artıq səhih hədisdə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) belə deməsi sabit olmuşdur: “Kim xalis qəlblə “lə iləhə illəllah” deyərsə cənnətə girər.”[186] Burada gələn “xalis qəlblə” sözü, şirki inkar edir.Çünki ixlas şirkin tam əksidir.Habelə kim əməli tərk edərsə müşrik olar.Çünki o, şeytana ibadət edib Allahın dininsən üz çevirmiş olacaq. Allahın dinindən üz çevirən isə kafir olur.Habelə hədislərdə gəlmişdir: “Kim ixlasla “lə iləhə illəllah” deyərsə”[187], “sidqi ürəklə”[188], “qəlb ilə yəqin olaraq”[189], “habelə Allahdan başqa ibadət olunanı inkar edərək”[190].

Şəhadəti dilə gətirənin mömin olacağını ifadə edən həmin nasslar, əməlin tərk edilməsini mümkünsüz edən qeydlərlə bağlıdır.İnsanın Allahdan başqa ibadət olunanı inkar etməsi labüddür.Əməl etməyən şəxs isə Allahın dinindən üz çevirəndir.Bu, mürtədliyin növlərindən biridir. Ümumiyyətlə heç bir əməl etməyib dindən üz çevirən, Alla-

---

[186] Buxari:99.Hədisi Əbu Hureyra (r.a) rəvayət etmişdir.Hədisin ləfzi: “Qiyamət günü insanlar içində şəfaətim sayəsində ən xoşbəxt olacaq şəxs xalis qəlb ilə yaxud ixlasla “lə iləhə illəlah” kəlməsini deyəndir.” Muslim:385.Hədisi Ömər rəvayət etmişdir: “Müəzzin “Allahu Əkbər, Allahu Əkbər” dediyi zaman biriniz “Allahu Əkbər” dediyiniz.” Axırda gəlmişdi: “Ürəkdən “lə iləhə illəllah” deyərsə cənnətə girər.” Bu hədisdə “xalis” sözü yoxdur.Albani qeyd etmişdir ki, bu rəvayət nə Muslim nə də ki, qeyrisində yoxdur: İrvaul ğalil:1/258_240-cı rəqəm.

[187] Bəzzar Əbu Səidin hədisindən rəvayət etmişdir.Şeyx Albani həmin hədisi “sahihul cəmi`:6433” kitabında səhih saymışdır.Əhməd:8056.Əbu Hureyra rəvayət etmişdir.Hədisin ləfzi: “Mənim şəfaətim xalis olaraq, qəlbi dilini dili isə qəlbini təsdiq etdiyi halda “lə iləhə illəllah” şəhadətini deyən üçündür.”Bu rəvayəti şeyx Arnaut “əl-musnəd”in təhqiqində səhih saymışdır.

[188] Əhməd:22056.Hədisi Muaz (r.a) rəvayət etmişdir.Hədisin ləfzi: “Allahdan başqa (ibadətə haqqı olan) ilahın olmadığına və Muhamməddin Allahın Elçisi olduğuna sidqi ürəklə şahidlik etdiyi halda ölən şəxs cənnətə girəcək.”Şueyb Arnaut “əl-musnəd”in təhqiqində bu hədisi səhih saymışdır.Habelə şeyx Albanı “əs-silsilə-tu-s-sahiha:2278-ci rəqəm.

[189] Muslim:31.

[190] Muslim:23.

hın dinini öyrənməyən və Allaha ibadət etməyən şəxsin İslamı pozulmuş olur.Uca Allah buyurur: *“Kafirlər qorxuduldudqları şeylərdən üz döndərdilər.”*[191] İnsanın əməl etməsi labüddür.İnsan qəlbən yəqin olaraq və ixlasla, habelə bir rəvayətdə “şübhə etmədən”[192]: “lə iləhə illəllah” sözünü deyəcəyi zaman əməl etməsi labüd olacaq.İnsanın sidqi ürəklə və ixlasla tövhid kəlməsini dilə gətirib qadir olduğu halda heç vaxt namaz qılmaması mümkün deyil.Çünki insanın namazı tərk etməsi onun ixlasdan, sidqdən, habelə qəlb yəqinliyindən məhrum olmasının göstəricisidir.Əgər onun qəlbində yəqinlik, ixlas və sidq olsaydı həmin şəxs mütləq əməl edərdi.Onun əməl etməməsi isə imanın, yəqinliyin, ixlasın və sidqin yoxluğunu, habelə qəlbdə şəkk-şübhənin olduğunu göstərir.Dəlillər bunu açıq-aydın göstərir.”[193]

47-Səudiyyə ərəbistanı məmləkətinin muftisi Şeyx Abdul-Əziz Abdullah Ali-ş-Şeyx (hafizahullah)

(1)-Şeyx “haqiqətul imən beynəl ğuluvvul xəvaric va təfritil murciə” kitabından çəkindirən şəxslərdən biri olmuşdur.Həmin kitabın müəllifi bütövlüklə bədən əməllərini tərk edən şəxsə müsəlman hökmü vermiş və həmin şəxsin Allahın məşiəti altında olduğunu iddia etmişdir.Üstəlik müəllif bunu Əhli sunnənin cumhuruna nisbət etmişdir.Şeyxin rəhbərliyi altında olan daimi komitənin fətvasında gəlmişdir ki, adı çəkilən kitab əməli iman anlamından və gerçəyindən çıxaran və onu imanın kamillik

---

[191] əl-Əhqaf:2.

[192] Muslim:31.Hədisi Əbu Hureyra (r.a) rəvayət etmişdir.Hədisin ləfzi: Şahidlik edirəm ki, Allahdan başqa (ibadətə haqqı olan) ilah yoxdur və mən Allahın Elçisiyəm.Buna şübhə etmədən Allah ilə qarşılaşacaq elə bir kimsə yoxdur ki, cənnətə girməsin.

[193] Şərhu-t-tahaviyyə.əs-Sual əs-səbi` aşər, məuqiu-ş-şeyx aləl intərnət.

şərti edən murciələrin məzhəbini müdafiə edir.Habelə kitabın müəllifi bu batil məzhəbi dəstəkləmək üçün elm əhlinin sözlərini yarımçıq, hissə-hissə, sözləri bölərək və yersiz qeyd edərək nəql etmişdir."[194]

(2)-Habelə şeyx, "ət-təhzir min fitnəti-t-təkfir" və "sayhətu-n-nəzir" kitablarından çəkindirən şəxslərdən biri olmuşdur.Həmin kitabların müəllifi adı çəkilən kitablarda, əməlin imanın səhihlik şərti olmadığını qeyd edib bunun Əhli sunnənin görüşü olduğunu iddia etmişdir.Şeyx Abdul-Əzizin rəhbərliyi altında olan daimi komətinən fətvasında gəlmişdir: "Müəllif həmin kitabı, küfrü danma, təkzib etmə və qəlb halallaşdırması çərçivəsinə salan azmış murciələrin bidət məzhəbi üzərində qurmuşdur."[195]

(3)-Habelə şeyx irca fikrindən çəkindirməyə dair gələn ətraflı fətvanın iştirakçılarından biri olmuşdur.Həmin fətvada gəlmişdir: "Qeyd edilən bu söz, əməlləri iman anlamından çıxarıb: O, qəlb ilə təsdiqdir yaxud qəlb ilə təsdiq və dil ilə tələffüzdür,-deyən mürciələrin sözüdür.Habelə onlara görə əməllər imanın kamillik şərtidir və ondan deyil."

Habelə orada gəlmişdir: "Cənnətə heç vaxt xeyir etməyən insanların girəcəyi haqqında bəhs edən hədis, ümumi deyil və əməl etməyə qadir olduğu halda əməli tərk edənə aid deyil.Həmin hədis, yalnız əməl etməyə mane olan üzr səbəbilə onu tərk edən şəxslərə aid edilir.Yaxud həmin hədis möhkəm nasslara və sələfin bu mövzuya dair icma etdikləri şeylərə uyğun gələn mənalara aid edilir."[196]

---

[194] Bax: əl-Mulhaq:3-cü rərəm.

[195] Bax: əl-Mulhaq:4-cü rəqəm.

[196] Bax: əl-Mulhaq:5-ci rəqəm.

(4)-Habelə şeyx (hafizahullah), şeyx Bəkr Əbu Zeydin müəllifi olduğu "dər`ul fitnə an əhli-s-sunnə" kitabına müsbət rəy bildirmişdir.Onun kitaba verdiyi təqdimatında gəlmişdir: "Artıq müəllif Uca Allahın əhli sunnə vəl camaatı bu məsələdə haqqa və orta yola müvəffəq etdiyini bəyan etmişdir.Bunun nəticəsi olaraq onlar öz imanını Quran və sunnədən alınan beş dayağ üzərində qurmuşlar.Haqq məhz budur və digər bir şeyə meyl edib buna müxalif çıxmaq qətiyyən icazəli deyil."

(5)-Habelə şeyxə "nurun alə-d-dərb" verilişində belə bir sual verilmişdir: "Bəzi insanlar deyirlər ki, əməl imanın kamillik şərtidir və namazı yaxud zəkatı yaxud həcci və digər əməlləri tərk edən şəxs İslamdan çıxmış olmur.Şeyx cavabında demişdir: "Bu, murciələrin sözüdür.Bu, yanlış sözdür.Habelə bu, azğın murciələrin sözüdür.Əməl imanın səhihlik şərtidir və o, imandandır."

Şeyx bu sözü çox sərt şəkildə rədd etmiş və bu kimi azdırıcı fikirlərin arxasınca düşməkdən çəkindirmişdir.[197]

(6)-Habelə şeyxə sual verilmişdir: "Son zamanlarda internet şəbəkəsində bir məqalə yayılmışdır.Həmin məqalənin sahibi əməlin imanda kamillik şərti olduğunu vurğulamışdır.Sizin buna dair nəsihətinizi eşitmək istəyərdik?

Şeyx cavab olaraq demişdir: "Bütün bunlar cəfəngiyyatdır.Əməl imandan bir hissədir.Əməli imandan ayrımaq mümkün deyil."

[197] Bu sözləri 24/10/1420-ci il tarixli gündə dinləmişəm.Həmin sualı verilişdə Liviyadan olan bir dinləyici qadın vermişdir.

Habelə şeyxə sual verilmişdir: "Əməlin cinsini tərk edən şəxsin naqis imanlı mömin olduğunu deyən şəxs murciədirmi?

Şeyx cavab olaraq demişdir: "Qardaşlar! Əməllər imandan bir hissədir.Əməl imandan ayrılmazdır.İman və əməllər bir şeydir.Əməlləri tərk edən şəxs imanı tərk edir. Heç bir əməl etmədiyi, namaz qılmadığı, zəkat vermədiyi, oruc tutmadığı, həc bir şey etmədiyi, heç bir vacibi yerinə yetirmədiyi, heç bir haramdan əl çəkmədiyi və heç bir vacibə məhəl qoymadığı halda özünün mömin olduğunu iddia edən şəxsə deyiləcək: Haradadır iman? İman və əməl bir şeydir.Əməl imandan ayrılmazdır.Çünki əməllər imandan bir hissədir.Uca Allah imanı saleh əməl ilə bir arada qeyd etmişdir."[198]

48-Şeyx Bəkr bin Abdullah Əbu Zeyd (hafizahullah)

Şeyx "dər`ul fitnə an əhli-s-sunnə" kitabında demişdir: "Ey müsəlman! Bəzi insanların imanın gerçəyinə dair bu beş əsasdan birini kiçiltmələrini ifadə edən sözlərinə aldanmaqdan həzər sonra yenə həzər et! Xüsusən də, cəhmiyyə və murciələrin sözlərini qapıb; "əməl" imanın gerçəyində onun bir hissəsi deyil kamilliyidir,- deyənlərin sözündən həzər et! Şübhəsiz ki, bu, Uca Allahın kitabında təqribən altmış yerdə açıq-aydın gələn dəlillərdən üz çevirməkdir.Misal olaraq Uca Allah buyurur:

*"Onlara: "Etdiyiniz əməllərə görə varisi olduğunuz Cənnət budur!" -deyə müraciət ediləcəkdir."*[199]

---

[198] Bu, şeyx Raşid əz-Zəhraninin Əmir Turki bin Abdullah adına məsciddə cümə gecəsi 3/4/1426-cı il tarixində mühazirədən sonra şeyxin cavablandırdığı suallardan biridir.

[199] əl-Ə`raf:43.

Bu kimi dəlillər sünnədə həmçinin çoxdur.Habelə bu məsələdə müxalif olmaq səhabələrin və onlara gözəl şəkildə tabe olanların icmasını pozmaqdır."[200]

Qeyd edilən beş əsas imanın; qəlb ilə etiqad, dil ilə söz, bədən əzaları ilə əməl olması, habelə onun artması və azalmasıdır.

Habelə şeyx daimi komitə ilə birlikdə irca fikrinə çağıran, əməlin imanda kamillik şərti olduğunu və onu bütövlüklə tərk edənin müsəlman olacağını iddia edən kitablardan çəkindirən şəxslərdən biri olmuşdur.[201]

(49)-Şeyx Salih bin Abdul-Əziz Ali-ş-Şeyx (hafizahullah)

Şeyxin bu məsələyə dair bir çox sözləri vardır.Onlardan bəzisi:

(1)-Şeyx "lum`atul i`tiqad" kitabında demişdir: "Habelə bilmək lazımdır ki, biz: Əməl, iman anlamına daxildir və o, imanı sabit edən dayağdır,-dediyimiz zaman bununla ayrı-ayrı əməlləri deyil əməlin cinsini qəsd edirik.Çünki bəzən mömin bir çox fərz edilmiş saleh əməlləri tərk edir, buna rəğmən mömin qalır.Ancaq insan bütün əməli tərk edəcəyi zaman mömin adlanmayacaq və onun imanı səhih olmaya-caq.Bunun mənası: İnsan şəhadəti gətirib: Mən bunu deyir və qəlbim ilə etiqad edirəm lakin bütün əməlləri tərk etməyimə rəğmən mən möminəm,-deyən şəxsə cavab olaraq deyiləcək: Həmin şəxs mömin deyil.Çünki onun tərki əməlin özəyini aparır.Yəni, əməlin cinsini tərk etmək imanın özəyini aparır.Əhli sunnə vəl cəmaata görə səhih imana sahib olan elə bir mömin yoxdur ki, həmin şəxs şəhadət ilə

[200] Dər`ul fitnə an əhli-s-sunnə:34-cu səh.

[201] Əlavələrə bax.

birgə saleh əməlin cinsinə sahib olmasın.Yəni, əmrlərə boyun əymənin və qadağalardan çəkinmənin cinsi olmalıdır.

Habelə iman dinin mərtəbələrindən biridir.İslam həmçinin dinin mərtəbələrindən biridir.İslam zahiri əməllər olaraq açıqlanmışdır.Musnəddə gələn hədisdə Peyğəmbər (səlləllahu aleyhi və səlləm) demişdir: "İman qəlbdə islam isə aşkardadır." Yəni, iman etiqadlara, qəlb əməllərinə qayıdır.İslam isə bədən əməllərində aşkara çıxandır.Bilmək lazımdır ki, insanın islamı yalnız onun imanını doğru edəcək bəzi imana sahib olması ilə doğru olur.Habelə onun imanı yalnız onun imanını doğru edəcək bəzi islama sahib olması ilə doğru olur.Ümumiyyətlə mömin olmayan müsəlmanın, habelə müsəlman olmayan möminin mövcudluğu təsəvvür olunmazdır.

Əhli sunnə deyir: Hər bir mömin müsəlmandır, hər bir müsəlman isə mömin deyil.Onlar bu sözü dedikləri zaman müsəlmanın ümumiyyətlə imandan heç bir şeyə sahib olmadığını qəsd etmirlər.Əksinə insanın, onun islamını doğru edəcək imanın mütləqinə (özəyinə) sahib olması labüddür. Habelə möminin, onun imanını doğru edəcək islamın mütləqinə sahib olması labüddür.İslamın mütləqi deyildiyi zaman isə əməlin cinsi qəsd edilir.Bununla da, onların imanın tərifinə dair hər bir möminin müsəlman, əksinin isə fərqli olduğunu qayda olaraq qeyd etmələri bir-birinə müvafiq gəlir ."[202]

(2)-Şeyxə növbəti sual verilmişdir: "Bütövlüklə əməli tərk edən müsəlmandırmı? İnsan dayağları və digər vacib və müstəhəbləri, habelə bədən əzaları ilə edilən zahiri əməli tərk edərsə müsəlman olacaqmı?

[202] Şərhu lum`atil i`tiqad, əş-şəritu-s-səni, əl-vachu-s-səni.Habelə: Şərhu-ş-şeyx alə-t-tahaviyyə, əş-şərit raqam 30, əl-vachul əvval.

Şeyx cavab olaraq demişdir: "Əhli sunnə vəl cəmaata görə əməl imanın anlamına daxildir.Yəni, iman bir sıra şeylərin bir arada gəlməsidir.Bunlar; etiqad, söz və əməldir. Bu səbəbdən, əməlin cinsini tərk edən şəxs kafirdir.Çünki əməl olmadan islam və iman səhih olmur.

Sual: "Bədən əzalarında aşkara çıxmadığı halda qəlbdə tabeçiliyin mütləqinin mövcudluğu təsəvvür edilə bilərmi?

Cavab: Bu, öncəki məsələdən şaxələnən bir şeydir.Belə ki, tabeçiliyin özəyi, vacibin etiqad edilməsidir.Bu isə qəlb əməllərinə daxildir.Bədən əzalarında tabeçilik aşkara çıxmayınca, yəni insan əməl etməyincə onun imanı doğru olmayacaq."[203]

(3)-Habelə demişdir: "Əhli sunnənin məzhəbi ilə xəvariclərin və mötəzililərin məzhəbi arasında olan fərq, həmin adamların hər hansı bir vacib əməlin tərkini yaxud hər hansı bir haram işin edilməsini iman adını aparan amil etmələridir.Əhli sunnə isə deyir: Əməl dayağdır və onun mahiyyətinin bir hissəsidir.Lakin bu əməl fərqli hissələrdən ibarətdir. Bu əməllərdən bir qismi olmayacağı yaxud bir hissəsi gedəcəyi zaman o, bütövlüklə getmir.Aydın olur ki, əməlin şərt olduğu deyildiyi zaman; əməlin cinsi qəsd edilir.Yəni, insanın daxili təsdiqə və qəlb əməlinə sahib olmasına və onun zahirdə təslim olmasına dəlil olan bədən əzaları ilə ediləcək xeyirli zahiri əmələ sahib olmasıdır.Bu, iman və islam məsələsi ilə bağlı olan şeydir.Belə ki, Uca Allaha zahirdə itaət şəklində tabeçilik göstərmək üçün bir növ təslimçilik olmadan daxili imanın varlığı təsəvvür edilməz

---

[203] Şərhu-t-tahaviyyə, əş-şəritu-s-sədis.

olduğu kimi həmçinin imansız zahiri islamın varlığı təsəvvür edilmir."[204]

(4)-Habelə şeyx demişdir: "Burada məqsəd, məsələnin əsasını müəyyən etməkdir.Belə ki, Əhli sunnə vəl cəmaata görə küfr:

-Etiqad ilə olur; qəlbin iman etiqadından məhrum olması yaxud ona zidd olan şeyin, imanın özəyinə zidd olan şeyin etiqad edilməsi.

-Əməl ilə olur.; İnsanın ümumiyyətlə əmələ sahib olmaması və heç vaxt xeyir etməməsi.Həmin şəxs əməlin cinsinə sahib olmamış və heç bir əməl etməmişdir.O, yalnız söz və etiqad olaraq şəhadət ilə kifayətlənmiş və əməlin cinsini etməmiş yaxud imanın özəyinə zidd gələn əməl etmişdir.Beləsi imana sahib olmur.

-Habelə söz ilə olur; (küfr söz) deməsi yaxud (vacib) sözü tərk etməsi.

Heç şübhəsiz ki, bu çox önəmli məsələdir.Şeyxul-İslam ibn Teymiyyə və ibnul-Qayyim kimi imamlar bunu izah edib bəyan etmişlər.Habelə şeyx Muhamməd bin Abdul-Vahhəb və onun şagirdləri və övladlarından olan dəvət imamlarının bu məsələyə dair sözləri yetərli və dolğundur. Çünki onlar uzun müddət ərzində, yüz ildən çox zaman kəsiyində bu məsələ ilə üz-üzə gəlmiş və bu məsələni geniş və dolğun şəkildə araşdırmışlar."[205]

50-Şeyx Abdullah bin Abdur-Rahmən Ali-s-Sa`d (hafizahullah)

---

[204] Şərhu-t-tahaviyyə, əş-şərit raqam 30, əl-vachul əvval.

[205] Şərit: Əsilətun fil imən val kufr.

Şeyx "raf`u-l-ləimə an fətva-l-ləcnəti-d-dəimə" kitabına verdiyi təqdimatda demişdir: "Artıq mən şeyx Muhamməd bin Səlim əd-Dəusərinin "raf`u-l-ləimə an fət-va-l-ləcnəti-d-dəimə" adlı kitabı ilə tanış olmuşam və deyə bilərəm ki, şeyx həmin kitabda bir sıra məsələlər haqqında söz açmışdır. Onlardan ən önəmlisi aşağıdakilərdir:

1-Əməlin imanda olması labüddür və iman onsuz səhih olmur.

2-Küfr -Allah bizi ondan qorusun- danma və təkziblə xüsusiləşmir və icra və tərk etmə baxımından söz və əməl ilə həmçinin olur.

3-Əməli küfr səbəbilə təkfir məsələsini buraxmaq murciəlikdir.

4-Elm əhlindən birinin sözü nəql edildiyi zaman mütləq onun məzhəbi araşdırılmalıdır.Bu isə həmin məsələyə dair nəql edilən sözün dolğun şəkildə çatdırılması və alimin digər sözlərinin tədqiq edilməsi ilə mümkündür.

Birinci məsələyə, əməlin mütləq imanda olmasına və imanın yalnız onunla səhih olması məsələsinə gəldikdə isə, artıq Qurani Kərim, peyğəmbərin (salləllahu aleyhi və səlləm) sunnəsi və sələfin icması buna dəlalət etməkdədir.

Quran və sunnədə buna dair müxtəlif dəlillər varid olmuşdur.Həmin dəlilləri dörd növə bölmək olar:

Birinci növ:

Quran və sunnədə imanın əməl adlanması varid olmuşdur.Bu isə əməlin imanın başlıca hissəsi olduğuna və imanın onsuz səhih olmayacağına açıq-aydın dəlalət edir...

İkinci növ:

Həmçinin buna dair gələn dəlillərdən, bir çox ayələrdə iman ilə saleh əməlin bir arada gəlməsidir.Bu isə saleh əməlin imandan ayrılmaz olduğunu və imanın onsuz səhih olmayacağını göstərir...

Üçüncü növ:

Həmçinin dində qardaşlığın yalnız şirkdən tövbə etməklə, namaz qılmaqla və zəkat verməklə hasil olacağını və Uca Allahın əzabından qurtuluşun və cənnətə daxil olmağın yalnız əməl ilə olacağını açıqlayan dəlillər vardır...

Dödüncü növ:

Quran və sunnədə ümumiyyətlə heç bir əməl etməyənin ("cinsul aməl" kimi ifadə olunur) təkfir ediləcəyinə dair dəlillər varid olmuşdur.Buna dair irəlidə söz açılacaq."[206]

51-Bu məsələdə ixtisaslaşmış bir sıra şeyxlər:

Bunlardan bir qismi əməl məsələsinə və onun iman ilə olan əlaqəsinə dair geniş araşdırmalar aparmışlar.Bir qismi isə Əhli sunnənin bu sözünü, təqdimatlar və müsbət rəylər vasitəsilə dəstəkləyib müdafiə etmişlər.Onlardan bəziləri:

[206] Təqrizu-ş-şeyx Abdullah əs-Sa`d alə raf`i-l-ləimə:17-60.

1-Şeyx Səfər bin Abdur-Rahmən əl-Havəli "zahiratul irca fil fikril isləmiy" kitabını təlif etmişdir.[207]

2-Şeyx Abdullah bin Muhamməd əl-Qarni "davabitu-t-təkfir ində əhli-s-sunnə vəl cəmaat" kitabını təlif etmişdir.[208] Habelə şeyx "ət-tibyən lialəqatil aməl bimusəmməl imən" kitabına təqdimat vermişdir.

3-Şeyx Abdul-Əziz bin Muhamməd bin Əli Abdul-Lətif "nəvaqidul imənil qauliyyə val aməliyyə" kitabını təlif etmişdir.[209]

4-Şeyx Muhamməd bin Abdullah bin Əli əl-Vuheybi "nəvaqidul imənil i`tiqadiyyə" kitabını təlif etmişdir.[210]

5-Şeyx Abdullah bin İbrahim əz-Zahim "ət-tibyən lialəqatil aməl bimusəmməl imən" kitabına təqdimat vermişdir.

6-Şeyx Ğalib bin Əli əl-Avəci " ət-tibyən lialəqatil aməl bimusəmməl imən" kitabına təqdimat vermişdir.

7-Şeyx Sa`d bin Nəsir əş-Şisri "haqiqətul imən va bidəul irca fil qadim val hadis" kitabını təlif etmişdir. [211]

---

[207] Zahiratul irca fil fikril isləmiyy:2/625-767.
[208] Davabitu-t-təkfir ində Əhli-s-sunnə val cəmaa:197-205.
[209] Nəvaqidul imənil qauliyyə val aməliyyə:27,344,357-ci səh.
[210] Nəvaqidul imənil i`tiqadiyyə:2/132-139.
[211] Əslində bu, şeyxin Riyaddaki böyük məsciddə 5/6/1422-ci il tarixli gündə verdiyi faydalı mühazirədir. Hörmətli mufti şeyx Abdul-Əziz bin Abdullah Ali-ş-şeyx ona əlavələr etmişdir.

8-Şeyx İsam bin Abdullah əs-Sinəni “əqvalu zəvil irfan fi ənnə ə`mələl cəvarih dəxilətun fi musəmməl imən” kitabını təlif etmişdir.

9-Adil bin Muhamməd bin Əli əş-Şeyxani qardaş “qavaidu fi bəyəni haqiqatil imən ində əhli-s-sunnə vəl cəmaat” kitabını təlif etmişdir. [212]

10-Muhaməd bin Səid bin Abdullah əl-Kuseyri “bəraətu əhlil hadis va-s-sunnə min bidətil murciə” kitabını təlif etmişdir. [213]

[212] Yəmən universitetinə təqdim olunan elmi işdir.
[213] Umm Dərmən əl-İsləmiyyə universiteti tərəfindən müsbət rəy almış maqistr işidir.

# Dördüncü bölüm

## Müasir şübhələrin ifşası

**Ora daxil olan fəsillər:**

***Birinci fəsil*: Müxaliflərin nəqli dəlillərinə cavab**

***İkinci fəsil*: Əqli şübhələrin ifşası**

***Üçüncü fəsil*: Elm əhlinin sözlərində müxalifə qaranlıq qalan sözlərin açıqlanması**

Bu məsələyə dair yazılan təliflərin çoxu ilə tanışlığım və bu məsələ ətrafında yazılan məqalə və rəddiyələri izləməyim vasitəsilə mənə bəlli olmuşdur ki, müxaliflərin bu məsələdə etimad etdikləri üç şeydən kənar çıxmır:

Birinci: Bədən əməllərindən heç vaxt bir xeyir etməyən şəxslərin axirətdə xilas olacaqları anlaşılan bəzi hədislər.Məsələn: Cəhənnəmlilər hədisi, vərəq hədisi və ümumi surətdə şəfaət hədisləri.Buna dair söhbət bu fəslin əsas mövzusudur.

İkinci: Əhli sunnənin bütövlüklə zahiri əməli tərk edəni təkfir etməsinə və müxalifi irca fikrinə nisbət etməsinə dair görüşü şübhə altına salmaq məqsədilə istifadə edilən bəzi əqli şübhələr.Belə ki, müxalif demişdir: Əməlin kamillik şərti olduğunu deyənin murciələrə nisbət edilməsi nə dərəcədə doğrudur? Axı murciələr kamillik və nöqsan haqqında söz açmırlar.Habelə deyir: Tələb olunan əməlin həddi nədir? Onu tərk edən nə vaxt kafir olur, bir gündən sonra yoxsa bir saatdan sonra yoxsa daha az müddətdə? Habelə deyir: Əhli sunnə əməl dediyi zaman qəlb əməlini qəsd edir yaxud zahir ilə daxil arasında olan bağlılıq imanın özəyi deyil yalnız kamil imanda olur yaxud zahir deyildiyi zaman söz və əməl birlikdə qəsd edilir.Habelə növbəti fəsildə qeyd ediləcək digər şeylər.

Üçüncü: Elm əhlindən gətirilən nəqllər.Müxalif həmin nəqllərin Əhli sunnədən xəbər verdiyimiz sözlərlə ziddiyyət təşkil etdiyini düşünmüşdür.Buna dair kitabın sonuncu fəsilinidə söhbət açılacaq.Beləliklə mövzuya keçmək vaxtı gəlib

çatmışdır.İlk olaraq müxalifin əlində dəlil olaraq tutduğu **bəzi nəqli dəlillərə cavab veriləcək.**

# BİRİNCİ FƏSİL

## Müxaliflərin nəqli dəlillərinə cavab

Altı araşdırmadan ibarətdir:

1-Yığcam cavab.

2-“Vərəq” hədisini dəlil gətirmələri və bunun cavabı.

3-“Heç vaxt xeyir etmədilər” hədisini dəlil gətirmələri və bunun cavabı.

4-“Tövhiddən başqa heç vaxt xeyir etmədilər” hədisini dəlil gətirmələri və bunun cavabı.

5-“İslamın yoxa çıxması” hədisini dəlil gətirmələri və bunun cavabı.

6-Peyğəmbərin Muazı Yəmənə göndərməsi haqqında hədisi dəlil gətirmələri və bunun cavabı.

# Birinci araşdırma:

## Yığcam cavab

**Cavab iki cəhətdən veriləcək:**

*Birinci cəhət*: Artıq yerində qeyd edilmişdir ki, dünya salamatlığı və axirət qurtuluşu, sələfin anladığına uyğun şəkildə Quran və sunnəyə tabe olmaqdadır.Bu isə, dəlil olaraq geyd etməyə ehtiyacın olduğunu düşündüyüm açıq-aydn həqiqətlərdən biridir.

Müxalif firqələrin əhvallarını dərindən araşdıran, onların əsaslandırma üslublarını və ümumi şübhələrini nəzərdən keçirən şəxs anlayacaq ki, onlar məhz bu yöndən yanlışlığa düşmüşlər.Belə ki, onlar Quran və sunnənin dəlillərini yanlış anlamış və həmin dəlilləri, onda qəsd edilməyən məcraya yönəltmişlər.Bu, onlar saleh sələfin anlayışından uzaq düşdükləri zaman baş vermişdir.

Bu səbəbdən, əzəmətli hədisləri, ələxsus etiqad məsələləri ilə əlaqəli olan hədisləri dəlil olaraq qeyd edən şəxsin Peyğəmbərin (salləllahu aleyhi və səlləm) əshabının, habelə xeyirli əsirlərdə yaşamış və onlara gözəl şəkildə tabe olmuş müsəlmanların anlayışına nəzər salması gərəkdir.

Lakin mən, insanları saleh sələfin mənhəcindən, anlayışı və yolundan tutunmağa çağırıb daha sonra heç bir səhabənin yaxud tabiinin öncə dəlil olaraq qeyd etmədiyi şeyləri dəlil gətirən, üstəlik səhabə və tabiinlərdən nəql olunan xəbərlərə

müxalif olan şəxsləri gördüyüm zaman təəccübümü gizlədə bilmirəm.

Buna misal olaraq namazı tərk etmə məsələsini göstərmək olar.Artıq insanlar bu məsələdə iki dəstəyə bölünmüşlər:

İnsanlardan bir dəstə, namazı tərk edən şəxsin kafir olacağına dair, Şeyxul-İslamın qeyd etdiyi kimi Peyğəmbərin (salləllahu aleyhi və səlləm) əshabının, sələfin cumhurunun və hədis əhlinin anlayışı ilə dəstəyini tapan açıq-aydın dəlillərdən tutunmuşlar.

Bir dəstə isə ümumi yaxud çəkişmə mövzusundan kənar olan və isbat edilməsi qəsd edilən mənada nə səhabənin nə də ki, tabiinin dəlil olaraq gətirmədiyi dəlillərdən tutunmuşlar.

Hətta bəziləri həmin dəlilləri ilk gətirən şəxslər olduqlarına sevinib böyük nemətə layiq görüldüklərini düşündükləri zaman insanın təəccübü daha da artır.

Təbii ki, biz, Allahın hər hansı bir şəxsi öncələr görünməmiş yeni bir anlayış tərzinə yaxud istinbata müvəffəq etdiyini inkar etmirik.Lakin öncəkilərin anlayış tərzinə müxalif bir anlayışın ortaya çıxması tərifəlayiq hal deyil.Öncəki insanların dayandıqları yerdə dayan!

Daha aydın olması üçün deyirik: Səhabə yaxud tabiinlərdən hansı biri "vərəq" hədisi yaxud "şəfaət" hədisindən namazı tərk edənin müsəlman olacağına dair hökmü anlamışdır?!

Habelə həmin şəxslərdən hansı biri adı çəkilən hədislərdən bütövlüklə bədən əməlini tərk edənin qurtulacağını anlamışdır?!

Həmin hədisləri rəvayət edən, onu çatdıran və anlayan insanlar onların özləridir.Onlar həmin hədisləri anlamaqda və orada qəsd edilən mənaları bilməkdə ən öndə gedən insanlardır.

Həmin hədislərin, Peyğəmbərin əshabı arasında mübahisə doğuran məsələlərdən olmaması, habelə namazı tərk edənin küfrünə hökm verən nasslar ilə heç bir vəchlə ziddiyət təşkil etməməsi onu göstərir ki, onlar həmin hədisləri tamamilə fərqli surətdə, onu səhih və açıq-aydın nassların önünə çəkmək istəyən şəxslərin anlayışına tam əks surətdə anlamışlar.

Sələf imanın söz və əməl olmasına, habelə sözün əməlsiz faydasız olmasına yaxud imanın iqrar, bilik və bədən əməlləri olmasına, habelə bədən əməli olmadan iqrar və bilginin yetərli olmamasına icma etdikləri zaman, məgər bu, onların həmin nassları müxalifin hal-hazırda anladığı kimi anlamadıqlarını ifadə etmir?

Habelə məgər, icmadan kənar çıxması bir kənara hal-hazırda onu dəlil olaraq gətirməyə səy göstərən şəxs növbəti qaydaya riayət edir: Saleh sələfin anlayışına uyğun Quran və sunnə?!

Bu məqamda şeyx Abdullah bin Muhamməd əl-Qarninin (hafizahullah) “davabitu-t-təkfir” kitabının müqəddiməsin-

də yazdığı dəyərli sözləri qeyd etmək istərdim.Şeyx demişdir: Bu qaydalardan:

1-Sələfin icması ilə bir cərgədə olmaq və onu heç bir halda adlamamaq yaxud ona müxalif rəyi qəbul etməmək. Çünki onların icmasına müxaliflik zəruri olaraq onların yanlış yolda olduqlarını tələb edir.Onlar isə yalnız bir çox nasslara əsasən dinin əsaslarını şamil edən məsələlərdə icma etmişlər.Onların icmasının yanlış olması mümkün deyil.Əksinə onlara müxalif olan şəxsin mütləq yanlış yol üzərində olması yaxud dindən olmayan yenilik gətirməsi labüddür.

Əhli sunnə, məsələn, imanın söz və əməl olduğuna icma etdikləri zaman bu, onlara görə bəzən küfrün əməl ilə olduğunu tələb edir.Bu səbəbdən, küfrü sırf etiqada bağlamaq doğru deyil.Habelə bu əsasdan çıxış edərək əməlin cinsini tərk edənin təkfir edilməsi gərəkdir.Həmçinin kafirlərin çəkəcəyi əzabdan yalnız əməl ilə qurtulmaq mümkündür.Artıq alimlər vurğulamışlar ki, bu, həmin mövzuda Əhli sunnə ilə murciələr arasında olan gerçək fərqdir.Daha sonra bəziləri peydə olub belə deyirlər: Əməl iman üçün kamillikdir və kafirlərin əzabından, hər hansı bir əməl olmasa belə adicə iqrar ilə qurtulmaq mümkündür.Habelə bu sözləri deyən şəxs nassların bunu tələb etdiyini iddia edir.Ancaq Əhli sunnənin alimləri yekdil olduqları əsaslara uyğun şəkildə həmin nassların mənalarını bəyan etmişlər və həmin nasslar onlar üçün müəmmalı qalmamışdır.

2-Hər hansı bir məsələ haqqında söz demək üçün həmin məsələyə dair varid olan bütün nassların nəzərdən

keçirilməsi zəruridir.Həmin nasslara isə fiqhin əsaslarını şamil edən elmin qəbul edilmiş qaydalarına əsasən nəzər yetirmək gərəkdir.Bununla da, mütləq ilə muqayyədi, ümumi ilə xüsusini və bu kimi şeyləri ayırmaq mümkün olacaq.Habelə qəti əmin olmaq lazımdır ki, sələfin bu nasslları anlamaqda və onlar arasında cəm aparmaqda tutduqları yol doğrudur.

Məsələn, "cəhənnəmlilər" haqqında varid olan hədisdə heç vaxt xeyir etməyən şəxslərin cənnətə girəcəkləri varid olduğu üçün bunun, əməlin imanda kamillik şərti olduğuna dəlil olduğunu söyləmək doğru deyil.Çünki sələf əməlin imandan olduğuna və onun kafirlərin əzabından qurtulmaq üçün şərt olduğuna icma etmişlər.Onlar bu görüş ilə həmin hədis arasında ziddiyyət görməmiş, üstəlik hədisi qeyd edilən əsasa uyğun şəkildə anlamışlar.

Habelə "vərəq" hədisini və "lə iləhə illəllah" deyən şəxs üçün cənnət müjdəsinin yaxud cəhənnəmdən qurtulmanın hasil olacağını ifadə edən digər hədisləri göstərmək olar.Həmin hədislər sələf üçün müəmmalı qalmamış və onlar həmin hədisləri əməlin imanda dayağ olduğunu və əbədi cəhənnəmdən qurtuluşun yalnız onunla olacağını ifadə edən nasslara uyğun şəkildə anlamışlar."[214]

*İkinci cəhət*: Onların bu məsələdə dəlil olaraq gətirdikləri bütün şeylər, şeyx ibn Useyminin sözlərinə uyğun gələn dörd qismdən kənar çıxmır.Belə ki, şeyx namazı

---

[214] Davabitu-t-təkfir ində əhli-s-sunnə val cəmaa:9-11-ci səh.

tərk edəni təkfir etməyən şəxslərin dəlillərini müzakirə edərək demişdir:

“Birinci qism: Ümumiyyətlə həmin məsələyə dəlil olmayan şeylər.Misal üçün bəziləri növbəti ayəni dəlil olaraq qeyd etmişlər: *“Şübhəsiz ki, Allah Özünə şərik qoşulmasını bağışlamaz, bundan başqa (günahları) isə dilədiyi kimsəyə bağışlayar.”*[215] Belə ki, ayədə gələn “ما دون ذلك : *bundan başqa*” sözlərinin mənası, ondan (şirkdən) savayı hər hansı bir günah deyil daha kiçik olan günahlardır.Çünki İslamdan çıxaran küfr, şirk olmasa belə bağışlanmaz bir günahdır.

İkinci qism: Namazı tərk edənin təkfir ediləcəyini ifadə edən hədislər ilə xüsusiləşdirilmiş ümumi dəlil.Məsələn Muaz bin Cəbəlin Peyğəmbərdən (salləllahu aleyhi və sələm) rəvayət etdiyi hədis: “Elə bir insan yoxdur ki, Allahdan başqa (ibadətə haqqı olan) ilahın olmadığına və Muhammədin Onun qulu və elçisi olduğuna şahidlik etsin Allah da onu atəşə haram etməsin.”[216]

Üçüncü qism: Namazın tərkini mümkünsüz edən muqayyəd ümumi hədislər.Məsələn Utbən bin Məlikin Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) rəvayət etdiyi hədis: “Uca Allah “lə iləhə illəllah” deyib bununla Allahın vəchini

---

[215] ən-Nisə:48.

[216] Muslim:32.Həmin hədis Buxaridə həmçinin var:128.Orada: “Sidqi ürəklə”,-sözləri gəlir.Şeyx bunu üçüncü qismdə qeyd edəcək.

diləyən şəxsi atəşə haram etmişdir." Buxari və Muslim rəvayət etmişlər.[217]

Habelə Muaz bin Cəbəlin hədisi: Elə bir insan yoxdur ki, Allahdan başqa (ibadətə haqqı olan) ilahın olmadığına və Muhammədin Onun qulu və elçisi olduğuna şahidlik etsin Allah da onu atəşə haram etməsin." Şəhadət kəlməsinin ixlas niyyəti və qəlb sadiqliyi ilə bağlanması namazın tərk edilməsinə mane olur.Çünki bu işdə sadiq və ixlaslı olan elə bir şəxs yoxdur ki, onun sidqi və ixlası onu namaz kimi ibadəti yerinə yetirməyə sövq etməsin.Axı namaz İslamın dirəyidir.Habelə o, qul ilə Rəbbi arasında olan bir rabitədir. İnsan Allahın vəchini diləməkdə sadiq olacağı zaman onun buna aparan yol üçün hərəkət etməsi və onunla Rəbbi arasında sədd çəkən şeylərdən yan durması labüd olacaq.Habelə əgər biri "Allahdan başqa (ibadətə haqqı olan) ilahın olmadığına və Muhammədin Onun qulu və elçisi" olduğuna sidqi ürəklə şahidlik edərsə, mütləq onun sidqi onu Uca Allaha ixlasla və Peyğəmbərə (salləllahu aleyhi və sələm) tabe olaraq namazı yerinə yetirməyə sövq edəcək.Çünki bu, onun dilə gətirdiyi şəhadətin tələb etdiyi amilləridir.

Dördüncü qism: Üzr səbəbilə namazın tərk edilməsi halı ilə bağlı olan dəlillər.Şeyx burada Huzeyfənin "İslamın yoxa çıxması" hədisini qeyd edib dedi: Həmin kəlmə ilə atəşdən xilas olacaq bu adamlar İslamın əhkamlarını tərk etməkdə üzürlüdürlər.Çünki onlar həmin əhkamlar haqqında heç bir bilgiyə malik deyillər.Onların etdikləri (dilə gətirdikləri

---

[217] Yuxarıda qeyd olunmuşdur.

şəhadət) bacardıqları ən son nöqtə olmuşdur.Onların durumu şər`i əhkamların fərz edilməsindən öncə ölmüş şəxslərin durumuna yaxud onu etmək imkanı qazanmayan şəxslərin durumuna bənzəyir.Misal üçün: Şəhadəti dilə gətirib şər`i əhkamları etməyə imkan qazanmamışdan öncə ölən insan yaxud küfr diyarında İslama girib şər`i əhkamlar haqqında bilgiyə yiyələnməyə imkan qazanmamışdan öncə ölən şəxs."[218]

[218] əş-Şərhul mumti`:2/30.

# İkinci araşdırma:

## “Vərəq” hədisinə dair verilən cavab

*Hədisin mətni*: Abdullah bin Amr rəvayət edir ki, Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: “Qiyamət günü ümmətimdən biri kişi camaat içində çağırılacaq və onun üçün doxsan doqquz dəftər açılacaq və hər bir dəftər gözün görə biləcəyi ən uzaq nöqtəyəcən uzanacaq.Daha sonra Allah ona deyəcək: Bunlardan bir şeyi danırsanmı? Həmin adam: Xeyir ey Rəbbim!-deyəcək.Allah deyəcək: Yazan və qoruyucu mələklərim sənə haqsızlıq etdilərmi? Daha sonra deyəcək: Sənin bir yaxşılığın varmı? Kişi qorxaraq: Xeyir!-deyə cavab verəcək.Allah deyəcək: Xeyir! Sənin bizim yanımızda yaxşılıqların var və sən bu gün əsla haqsızlıq görməzsən.Sonra onun üçün içində ″Şahidlik edirəm ki, Allahdan başqa (haqq) məbud yoxdur və şahidlik edirəm ki, Muhamməd Allahın qulu və elçisidir″ yazılan vərəq çıxa-rılacaq.Həmin adam: Ey Rəbbim! Bu dəftərlər müqabilində bu vərəq nədir ki?-deyəcək.Allah deyəcək: Sənə bu gün haqsızlıq edilməyəcək. Sonra dəftərlər tərəzinin bir gözünə həmin vərəq isə başqa gözünə qoyulacaq və dəftərlər yüngül vərəq isə ağır gələcək.”[219]

Demişlər: Bu hədis göstərir ki, həmin kişinin şəhadətdən savayı heç bir yaxşı əməli olmayıb.Onun başqa bir şeyi

[219]Tirmizi:2639.İbn Macə:4300.Şeyx Albani bu hədisi “sahih sunən ibn macə “da səhih saymışdır.

deməməsi bunu qəti şəkildə deməyə əsas verir.Həmçinin əgər biri onun başqa əməllərə sahib olduğunu deyərsə həmin adam Allaha tövbə etməlidir, çünki o, bu sözü ilə Peyğəmbərin (salləllahu aleyhi və sələm) sözünə düzəliş vermiş olacaq və.s.[220]

Buna bir neçə yöndən cavab veriləcək:

*Birinci*: Deyiləcək: Həmin vərəqin sahibi bu sözü sidqi ürək, ixlas və yəqinlik ilə deyil sadəcə dil ilə demişdir.Bunu iddia etmək batil söz söyləməkdir.Çünki İbnul-Qayyimin dediyi kimi[221] bu, İslam dinindən olması zərurət ilə bilinən məsələyə müxalif olmaqdır.

Yaxud həmin şəxs bu sözü ixlas, sidq və yəqinliklə tələffüz etmişdir.Belə olan halda onun bütün zahiri əməlləri tərk etməsi qeyri-mümkün olacaq.Bu əməllərdən biridə namazdır.Çünki Əhli sunnənin qoyduğu qaydalardan biri də, zahir ilə daxil arasında olan bağlılığı isbat etməkdir.Belə olan halda həmin hədis şeyx ibn Useyminin (rahiməhullah) qeyd etdiyi üçüncü qismə daxil olacaq: "Namazın tərkini mümkünsüz edən muqayyəd ümumi dəlillər."

*İkinci*: Həmin adamın namaz, zəkat, oruc və həcc kimi əməlləri etməməsinə qəti əmin olmaq doğru deyil.Hədisdə

---

[220] Dabtu-d-davabit:69-səh.MÜəllif həmin şəhadətin sidq və ixlasla birləşik olmasını, habelə Muhamməmədin ümmətindən hər bir şəxsin bunu etmədiyini etiraf etmişdir.O, demişdir: "Onlardan hər biri bu kimi vərəqə sahibdir. Peyğəmbər isə ümmətindən olan hər bir şəxs deyil sadəcə bir kişi haqqında xəbər verir."

Dedim: Məsələ həmin kişiyə xas olacağı zaman bu kimi xüsusi hala istinad edərək Əhli sunnənin möhkəm əsaslarını dağıtmaq nə dərəcədə düzdür?!

[221] Mədəricu-s-səlikin:1/339 kitabına bax.

bunu açıqlayan heç bir amil yoxdur.Əksinə hədisin sözlərindən anlaşılan əməlin olmasıdır.

Öncəki hədisə ibn Macənin rəvayətində gəlmişdir: "Xeyir! Sənin bizim yanımızda yaxşılıqların var və sən bu gün əsla haqsızlıq görməzsən.Sonra onun üçün vərəq çıxarılacaq".Uca Allah burada: "Sənin bizim yanımızda yaxşılıqların var",-deyə buyurur.Bu sözlər isə əməlin olması təəssüratını yaradır.Lakin kişinin etdiyi günahların böyüklüyü və kitabların çoxluğu, habelə bunun müqabilində əməlinin zəifliyi səbəbilə: Sənin üzrün yaxud yaxşılığın varmı?"-sualını eşitdiyi zaman: "Bəli!" deyib Rəbbinə cavab verməkdən qorxmuşdur.Kişi qorxaraq: Xeyir ey Rəbbim!-demişdir.

Hədisdə isbat edilən, günah kitablarının mövcudluğudur.Bu səbəbdən, Şeyxul-İslam bildirmişdir ki, Uca Allah onun böyük günahlarını məhz bu vərəq ilə bağışlamışdır. Bu isə, Şeyxul-İslamın iti fəhmini göstərir.

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Günahların silinməsi və ört-basdır edilməsi, qəbul edilən əməllər ilə hasil olur.İnsanların çoxu yaxşı işlər görməkdə, hətta namazda belə etinasızlıq edirlər.Onlardan xoşbəxt olanı bir çox günahlar etdiyi halda onun yarı savabına nail olandır.Bu səbəbdən qəbul edilən beş namazlar bir şeyi, qəbul edilən cümə namazı bir şeyi, qəbul edilən Ramazan orucu digər bir şeyi silib aparır.Başqa əməllər həmçinin belədir.

Lakin hər yaxşı əməl hər pis əməli silmir və günahların silinməsi bəzən kiçik günahları bəzən isə müvazinət etibarı ilə böyük günahları şamil edir.

Əməllərdən bir növü var ki, insan onu kamil ixlasla və Allaha qulluq şəklində etdiyi səbəbilə Uca Allah onun böyük günahlarını bağışlayır.Belə ki, Tirmizi, ibn Macə və başqaları Abdullah bin Amr bin Aasın Peyğəmbərdən (salləl-lahu aleyhi və səlləm) belə rəvayət etdiyini nəql etmişlər: "Qiyamət günü ümmətimdən bir kişi camaat içində çağırılacaq".Daha sonra hədisi qeyd edib demişdir: "Bu, həmin şəxs dediyi kimi onu ixlas və sidqi ürəklə deyənin durumudur.Çünki böyük günah sahiblərindən atəşə girən-lərin hamısı "Lə iləhə illəllah" deyirdilər. Lakin onların "lə iləhə illəllah" sözləri, həmin vərəqin yiyəsindən fərqli olaraq, etdikləri pis işlərdən üstün gəlməmişdir."[222]

*Üçüncü*: Hədisdə kişinin ixlası yaxud sadiqliyi qeyd edilmir.Müxalifin, vərəq sahibinin sidq və ixlas kimi qəlb əməllərinə sahib olmasını iddia etməsi onun qoyduğu qay-daya əsasən Peyğəmbərin (salləllahu aleyhi və səlləm) sözünə düzəliş gətirməyi ifadə edir.

Əgər onlar desələr ki, şəhadətin yalnız ixlas və sidq ilə faydalı olacağını ifadə edən digər nasslar bu qeydi gərəkli edir, onlara deyiləcək: Həmçinin namazı tərk edənin küfrünü, atəşin səcdə yerlərini yeməyəcəyini və kafirlərin, habelə yəhudi və nəsranilərin atəşdə həlak olacağından

[222] Minhəcu-s-sunnə:6/218.

sonra Allaha ixlasla və nifaqla səcdə edənlərin qalacağını ifadə edən digər nasslar mövcuddur.

Üstəlik sizin isbat etdiyiniz həmin qeyddən “ixlas və sidq”dən namazın varlığı faydası çıxmışdır.Az öncə şeyx ibn Useymin buna dair demişdir: “Şəhadət kəlməsinin ixlas niyyəti və qəlb sadiqliyi ilə bağlanması namazın tərk edilməsinə mane olur.”

*Dördüncü*: Müxalif etiraf edir ki, Muhammədin ümmətindən heç də hər bir adam bu hal ilə üzləşməyəcək.

Onun bu sözü doğrudur.Belə ki, hər bir müsəlman bu cür vərəqə sahibdir.Əgər bu hökm ümumi olsa idi belə olan təqdirdə günahkar müsəlmanlardan heç kəs atəşə girməzdi. Bu isə əsassız və batil sözdür.Çünki dəlillər Muhammədin (salləllahu aleyhi və səlləm) ümmətində bir qism insanların atəşə girəcəklərini daha sonra şəfaət sayəsində yaxud təmizləndikdən sonra oradan çıxacaqlarını ifadə edir.

İbnul-Qayyim (rahiməhullah) demişdir: “Əməllər görünüşü və sayı ilə bir-birini üstələmir.Əməllər yalnız qəlblərdə olan fərqliliyə uyğun bir-birini üstələyir.Bəzən iki əməlin şəkli eyni olur, lakin onların arasında göylə yer arasında fərq olur.Habelə iki kişinin cərgədə yeri bir olur lakin onların namazları arasında göylə yer arasında fərq olur.

Tərəzinin bir gözünə qoyulan vərəq hədisinə diqqət yetir! Onun müqabilində doxsan doqquz kitab var və hər kitab gözün görəcəyi ən uzaq yerəcən uzanır.Bununla belə vərəq ağır gəlir kitablar isə yüngül.Həmin adam əzabdan

xilas olur.Məlumdur ki, hər bir muvahhid belə vərəqə sahibdir.Onlardan bir çoxu isə günahları üzündən atəşə girəcəklər.Lakin bu adamın vərəqinin ağır gəlməsində dəftərlərin isə yüngül gəlməsində olan sirr, başqa vərəq sahibləri üçün hasil olmayan bir amildir.Məhz bu amil səbəbilə həmin şəxsin vərəqi ağırlığı və sabitliyi ilə seçilmişdir."[223]

Bu səbəbdən, heç də hər bir şəxsin üzləşməyəcəyi xüsusi bir haldan ötrü namazı tərk edənin küfrünü ifadə edən açıq-aydın nassların rədd edilməsi, habelə söz və təsdiqin yalnız əməl ilə yetərli olacağını bildirən sələfi icmanın rədd edilməsi nə dərəcədə doğrudur?!

*Beşinci*: Namazı tərk edənin küfrünə dair bir sıra səhabələrin sözləri nəql edilmiş və buna dair onların icması xəbər verilmişdir. Lakin onlara bu hədis qaranlıq qalmamış və bu səbəbdən onlar ona başqa yozumlar gətirməmişlər.

*Altıncı*: Bu hədisin xüsusi bir hala və müəyyən bir məsələyə aid edilməsi mümkündür.Bu səbəbdən isə, imanın söz, əməl və niyyət olduğuna və bu üçündən birinin digər birisiz olacağı halda yetərli olmayacağına və namazı tərk edənin küfrünə dair səhabələrin icması rədd edilə bilməz.

Həmin xüsusi halın izahı aşağıdakı kimidir:

Bu hədisi, öz canına laqeydsiz yanaşıb Rəbbinin haqqına etinasız olan, habelə müxtəlif günahlar edən daha sonra "Lə iləhə illəllah" sözünü sidq, ixlas və yəqinliklə deyib keçmiş

[223] Mədəricu-s-səlikin:1/340.

günahlarından tövbə etmədən ölən şəxsə aid edilə bilər. Vərəq hədisinə verilən bu açıqlama Şeyxul-İslamın görüşü-dür.Həmin şəxsin keçmiş günahlardan tövbə etmədiyini deməyə əsas var.Çünki əgər həmin şəxs tövbə etsəydi onun günahları yaxşılıqlarla əvəzlənərdi.Uca Allah Quranda məhz belə xəbər verir.

Şeyx Süleyman bin Abdullah bin Muhamməd bin Abdul-Vahhəb, Utbən bin Malikin hədisini şərh edərkən Şeyxul-İslamın buna dair sözlərini nəql etmişdir.Həmçinin şeyx Abdur-Rəhman bin Həsən bunu “fəthul məcid” əsərində nəql etmişdir.

Şeyx “teysirul azizil hamid” kitabında şəhadətin fəzilətinə dair hədisləri vurğuladıqdan sonra demişdir: “Bu sözün mənasına dair deyilən ən gözəl söz, Şeyxul-İslamın və digərlərinin sözüdür.Onlar demişlər: Bu hədislər, muqayyəd gəldiyi kimi yalnız onu deyib onun üzərə ölən şəxslər haqqında gəlmişdir.Həmin insan şübhə etmədən, ixlasla və yəqin qəlblə bunu deyir.Bu zaman hədislər arasında heç bir ziddiyyət üzə çıxmır.Çünki əgər insan onu tam ixlas və yəqinliklə deyərsə ümumiyyətlə günah üzərində israrla dur-maz.Onun kamil ixlasa və yəqinliyə sahib olması, Allahın hər bir şeydən ona daha çox sevimli olmasını gərəkli edir. Belə olan halda, onun qəlbində Allahın haram etdiyinə istək və Allahın əmr etdiyinə nifrət qalmaz.

İnsan bundan öncə günahlara sahib olsa belə, məhz bu onu atəşdən qurtaracaq.Çünki bu iman, bu tövbə, bu ixlas,

bu sevgi və bu yəqinlik gecənin gündüzü apardığı kimi onun bütün günahlarını aparır.

İnsan həmin kəlməni, onu böyük və kiçik şirkdən uzaq tutacaq surətdə deyəcəyi zaman ümumiyyətlə günah üzərə israrla durmuş olmaz və həmin şəxsin günahları bağışlanar və o, atəşdən qurtular.

Əgər o, kiçik şirkdən deyil yalnız böyük şirkdən xilas olacaq surətdə onu deyər və daha sonra onu pozacaq heç bir əməl etməzsə, heç bir pislik onun bu yaxşılığının qarşısını almaz və onun yaxşılıq tərəzisi, vərəq hədisində gəldiyi kimi daha üstün gələr və həmin şəxs atəşdən qurtular.Lakin həmin şəxsin cənnətdə olan dərəcəsi günahları nisbətilə azalar.Bu şəxs, pislikləri yaxşılıqlarından daha üstün gələn və bunun üzərə israrla durduğu halda ölən şəxslə tam fərqli durumdadır.Çünki ikinci şəxs “Lə iləhə illəllah” kəlməsini deyib böyük şirkdən xilas olsa belə bu hal üzərə ölməmiş, bu səbəbdən atəş ona vacib olmuşdur.Çünki həmin şəxs bundan sonra  tövhid yaxşılığını üstələyən pis işlər görmüşdür.O, həmin sözləri dediyi zaman ixlaslı olmuş lakin bunun ardından onun tövhidini və ixlasını zəifədən günahlar etmişdir.Nəhayət günahlar atəşi güclənmiş və bunu yandırıb aparmışdır.

İxlas və yəqinə sahib olan şəxsin durumu fərqlidir.Onun yaxşılıqları daimə pisliklərini üstələyir və o, pisliklər üzərə israrla durmur.Əgər o, bu cür ölərsə cənnətə girər.

Bu kəlməni deyənlərdən atəşə girəcək şəxslər bu iki şərtdən birindən məhrumdurlar:

Onlar pisliklərə yaxud pisliklərin üstün gəlməsinə zidd gələn tam sidq və yəqinliklə həmin kəlməni deməmiş yaxud həmin kəlməni demiş daha sonra yaxşılıqları üstələyən pisliklər qazanmışlar.Daha sonra bu səbəbdən onların sidqi və yəqinliyi zəyifləmişdir.Ardından onlar həmin kəlməni tam sidq və yəqinliklə deməmişlər.Çünki günahlar onların qəlbində olan sidqi və yəqinliyi zəyiflətmişdir.Belə şəxslərin onu deməsi pisliklərin silinməsi üçün yetərli deyil, üstəlik onların pislikləri etdikləri yaxşılıqları üstələyir. İxtisar edilmiş surətdə sözləri burada bitir.Artıq buna həmməna sözləri İbnul-Qayyim, ibn Rəcəb, Munziri, Qadi İyad və başqalarından qeyd etmişik."[224]

Burada belə bir anlaşılmazlıq ortaya çıxır: Böyük günahlar ancaq tövbə ilə silinir.Belə olan halda onun tövbə etmədiyini demək nə dərəcədə doğrudur.Çünki həmin şəxs şəhadəti sidq və ixlasla demiş və Allah onu bağışlamışdır.

Cavab: "Əməllər və yaxşılıqlardan" bir qismi səbəbilə, hətta böyük günahlardan ötrü tövbə hasil olmasa belə böyük və kiçik günahlar bağışlanır.

Şeyxul-İslam bunu "əl-imanul əusat" kitabında qeyd edib bunu beş cəhətdən bəyan etmişdir.[225]O, demişdir: "Onlar bu cür sual verib deyə bilərlər: Yaxşılıqlar yalnız

[224]Teysirul azizil hamid:87-90.Fəthul məcid:1/137-143.Şeyx Abdur-Rəhman bin Həsən: "İrşadu-t-talib aləl hudə limə yub`idu ani-r-radə:24-cü səh".
[225] Məcmu`əl-fətəva:7/489-494.

kiçik günahları ört-bastır eləyir.Böyük günahlar isə yalnız tövbə ilə bağışlanır.Buna dair bəzi hədislərdə gəlmişdir: “Böyük günahlardan yan durularsa”.Buna bir neçə yöndən cavab veriləcək:

*Birinci*: Adı çəkilən şərt beş namaz, cümə və Ramazan orucu kimi fərz ibadətlərdə gəlmişdir.Belə ki, Uca Allah buyurur: *“Sizə qadağan olunmuş böyük günahlardan çəkinsəniz, Biz sizin təqsirlərinizin üstünü örtərik”.*[226] Böyük günahların tərk edilməsi ilə birgə fərzlərin yerinə yetirilməsi günahların ört-bastır edilməsinə zəmin yaradır.

Könüllü ibadətlər kimi əlavə əməllərə gəldikdə isə onun başqa savabı gətirməsi labüddür.Belə ki, Uca Allah buyurur: *“Zərrə qədər yaxşılıq edən (əvəzini) alacaqdır. Zərrə qədər pislik edən də(əvəzini) alacaqdır.”* [227]

*İkinci*: Bir çox hədisdə, bəzən böyük günahlarla birgə bağışlanmanın hasil olacağına dair açıqlama gəlir. Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: “Döyüşdən qaçsa belə onun günahları bağışlanar”.[228] “Sunən”də gəlmişdir: “Peyğəmbərin (salləllahu aleyhi və səlləm) yanına qətl səbəbilə atəşi özünə vacib etmiş yoldaşımızdan ötrü gəldik.Peyğəmbər (salləllahu aleyhi və səlləm) dedi: Onun adından qul azad edin ki, (qulun) hər üzvü ilə Allah onun hər üzvünü atəşdən azad et-

---

[226] ən-Nisa:31.

[227] əz-Zəlzələ:7-8.

[228] Əbu Davud:1517.Tirmizi:3577.Hədisi Peyğəmbərin köləsi Zeyd rəvayət etmişdir.Hədisin ləfzi: “kim: “Əstəğfirullahə-l-ləzi ə iləhə illə huval hayyul qayyum va ətubu ileyhi”,-deyərsə döyüşdən qaçmış olarsa belə onun günahları bağışlanar.” Şeyx Albani bu hədisi “sahih əbi dəvud”da səhih saymışdır.

sin."[229] Buxari və Muslimdə Əbu Zərrin (r.a) hədisində gəlmişdir: "Zina edib oğurluq etsə belə?".[230]

*Üçüncü*: Uca Allah qüdsi hədisdə (salləllahu aleyhi və səlləm) Bədr əhli və onlar mislində olan adamlara demişdir: "İstədiyinizi edin! Artıq Mən sizi bağışlamışam".[231] Əgər bu hədis kiçik günahlara yaxud tövbə ilə birgə bağışlanmaya aid edilərsə belə olan halda onlarla digər insanlar arasında heç bir fərq üzə çıxmayacaq.

Küfrün yalnız tövbə ilə bağışlanacağı bilindiyi üçün hədisin küfrə aid edilməsi caiz olmadığı kimi həmçinin onun böyük günahlardan yan durulacağı təqdirdə ört-basdır edilən adi kiçik günahlara aid edilməsi caiz deyil."Sözləri bitir.

Yuxarıda qeyd edilən hədisin günahdan tövbə etməyən kişiyə aid edilməsinə güc qatan digər amil Şeyxul-İslamın bu xüsusda olan sözüdür.Belə ki, Şeyxul-İslam insandan günahın cəzasını aparan və birincisi tövbə ikincisi isə istiğfar olan, təqribən sayı on olan səbəbi bəyan etdikdən sonra demişdir: "Bu haqda deyilə bilər: İstiğfar tövbə ilə olur.Hədisdə gəlmişdir: "İstiğfar edən gündə yüz dəfə (günaha) qayıtsa belə israr etmiş olmaz".[232]

Habelə deyilə bilər: Tövbəsiz istiğfarın hasil olması mümkün və gerçək haldır.Bunun geniş izahı digər yerdə

---

[229] Əhməd.Əbu Davud:3964.Şeyx Albani bu hədisi zəif saymışdır:əl-İrva:7/339, 2309-cu rəvayət.

[230] Buxari:5827.Muslim:94.

[231] Buxari:4890.Muslim:2494.Bu hədisi Əli (r.a) rəvayət etmişdir.

[232] Əbu Davud:1514.Tirmizi:3559.İbn Həcər bu hədisi "əl-fəth:1/112" əsərində həsən saymışdır.

qeyd edilib.Bu istiğfar tövbə ilə birgə olacağı zaman hər tövbə edəni şamil edəcək.

Əgər istiğfar tövbə ilə birgə olmasa, belə olan halda bu, istiğraf zamanı qorxu və peşmançılıq kimi günahları silib aparan amillərə yiyələnən bəzi şəxslərə şamil olunacaq. Vərəq hədisində olduğu kimi "Lə iləhə illəllah" bütün pisliklərdən ağır gəlmişdir.Çünki onu deyən şəxs, həmin kəlməni bir növ günahları silib aparan sidq və ixlasla demişdir.İtə su verən pozğun qadının qəlbində həmin vaxt imanın hasil olması və bu səbəbdən bağışlanması buna bənzərdir.Buna bənzər hallar çoxdur."[233]

*Yeddinci*: Şeyx Salih əl-Fəuzan (hafizahullah) namazı tərk edənin təkfir edilməyəcəyinə dair bu hədisi dəlil gətirənə cavab verərək və bir insanın namaz qılmadığı halda yaxşılıqlara sahib olmasının ağılasığmaz olduğunu qeyd edərək demişdir: "Bu hədis, Uca Allahın İslam dinindən xaric olmanı və mürtədliyi tələb etməyən günahları tövhid sayəsində ört-basdır etdiyini ifadə edir.Mürtədliyi vacib edən əməllərə gəldikdə isə həmin əməllər tövhid kəlməsini pozur və həmin kəlmə mənasız adi bir sözə çevrilir..."[234]

## *Qeyd edilən yeddi yöndən çıxan yekun nəticə:*

Birinci məsələ: Deyiləcək: Bir adam namaz qılır və bütövlüklə bədən əməllərini tərk etmir.Bu dəlil, çəkişmə mövzusundan kənara çıxır.

---

[233] Məcmu`əl-fətava:7/488.Minhəcus sunnə:6/218.

[234] əl-Muntəqa min fətəva şeyx əl-Fovzan:2/10.

İkinci məsələ: Deyiləcək: Bu, günahlardan tövbə etmədən ölüm anında sidq və ixlasla həmin kəlməni deyən şəxs üçün xüsusi haldır.

Dedim: Bu hədisə dair verilən cavablardan mənim seçdiyim yanaşma, həmin vərəq sahibinin namaz əhlindən olmasıdır.Lakin ola bilsin ki, həmin şəxs namazı lazımi qaydada yerinə yetirmirdi.Bu səbəbdən, həmin şəxs bu əzəmətli məqamda Rəbbindən həya edərək bunu dilə gətir-məmişdir.Onun namaz əhlindən olmasına dəlalət edən amillər aşağıdakilərdir:

1-Onun yaxşılıqlara sahib olmasının bildirilməsi.

2-Yuxarıda qeyd edildiyi kimi nassları, sələfin icma etdiyi məsələlər işığında qavramaq və onu heç bir halda adlamamaqdır.

3-Zahir ilə daxil arasında olan bağlılığın isbatına və qəlbdə olan ixlasın, sidqin, təslimçiliyin və tabeçiliyin zəruri olaraq bədənin tabeçiliyini gərəkdirdiyinə dair Əhli sunnə-nin qəbul etdiyi qayda.Bu səbəbdən, əgər biri ixlas, sidq və yəqinliyə yiyələnərsə, onun namazı tərk etməsi təsəvvür edilməyəcək.

4-Nasslar namazı tərk etməyin küfr olduğuna və küfr ilə birgə şəhadət kəlməsinin fayda verməyəcəyinə dəlalət edir. Bu isə, həmin şəxsin namaz əhlindən olduğunu gərəkdirir.

Həmin şəxsin öz yaxşılıqlarını və əməllərini dilə gətir-məməsi, çox güman ki, bu insanın Rəbbindən qorxması ilə

**birgə həmin yaxşılıqlar və əməllərin zəif və qüsurlu olduğuna qayıdır.**

# Üçüncü araşdırma:

## “Heç vaxt xeyir etmədilər” hədisinə dair verilən cavab

*Hədisin mətni*: Muslim səhih kitabında rəvayət edib demişdir: “Suveyd bin Səid mənə təhdis edib dedi: Hafs bin Meysəra Zeyd bin Əsləmdən, o da, Atə bin Yəsərdan, o da, Əbu Səid əl-Xudridən (r.a) təhdis etmişdir ki, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) dönəmində olan insanlardan bəziləri ona demişlər: Ey Allahın Elçisi! Biz Rəbbimizi qiyamət günü görəcəyikmi? Allahın Elçisi: Bəli!-deyib davam etdi: Siz günün günorta çağı aydın və buludsuz səmada günəşi görməkdə çətinlik çəkirsinizmi? Siz bədr gecəsi aydın və buludsuz səmada ayı görməkdə çətinlik çəkirsinizmi? Onlar: Xeyir ey Allahın Elçisi!-dedilər.Peyğəmbər dedi: Siz onlar-dan birini görməkdə çətinlik çəkmədiyiniz kimi qiyamət günü Uca Allahı görməkdə də heç bir çətinlik çəkməyəcək-siniz.Qyamət günü gələcəyi zaman bir carçı hər ümməti ibadət etdiklərinin arxasınca düşməyə səsləyəcək və Allah-dan qeyrisinə, bütlərə və abidələrə ibadət edənlərdən heç kimsə qalmayacaq və hamısı atəşə yuvarlanacaq.Nəhayət Allaha ibadət edən salehlər, yaramazlar və kitab əhlindən qalan şəxslərdən savayı heç kəs qalmadıqda, yəhudilər çağırılacaq və onlara deyiləcək: Siz nəyə ibadət edirdiniz? Onlar: Biz Allahın oğlu Üzeyirə ibadət edirdik!-deyəcək-lər.Onlara deyiləcək: Yalan deyirsiniz! Allah özünə nə bir zövcə nə də ki, övlad seçməmişdir.Sizin istəyiniz nədir? Onlar: Ey Rəbbimiz! Çox susamışıq bizə su ver!-deyəcəklər

və onlara: Sulaqa tərəf gedin!-deyə işarə ediləcək və onlar sanki bir-birini parçalayan ilğıma bənzəyən atəşə toplanacaq sonra isə cəhənnəmə yuvarlanacaqlar.Daha sonra nəsranilər çağırılacaq və onlara belə deyiləcək: Siz nəyə ibadət edirdiniz? Onlar: Biz Allahın oğlu Məsihə ibadət edirdik!-deyə cavab verəcəklər.Onlara deyiləcək: Yalan deyirsiniz! Allah özünə nə bir zövcə nə də ki, övlad seçməmişdir.Sizin istəyiniz nədir? Onlar: Ey Rəbbimiz! Çox susamışıq bizə su ver!-deyəcəklər və onlara: Sulaqa tərəf gedin!-deyə işarə ediləcək və onlar sanki ilğım kimi bir-birini parçalayan atəşə toplanacaq sonra isə cəhənnəmə yuvarlanacaqlar.Nəhayət Allaha ibadət edən saleh və yaramaz insanlardan savayı heç kəs qalmayacağı zaman onların yanına aləmlərin Rəbbi, Onu gördükləri simadan fərqli simada gəlib deyəcək: Siz nəyi gözləyirsiniz? Hər ümmət öz ibadət etdiklərinin arxasınca düşmüşdür.Onlar (dua edib): Ey Rəbbimiz! Biz dünyada daha çox ehtiyac duyduğumuz inslardan ayrılıb onlarla yoldaşlıq etmədik!-deyəcəklər.Uca Allah: Mən sizin Rəbbinizəm!-deyəcək.Onlar: Səndən Allaha pənah aparırıq, Allaha heç bir şeyi şərik qoşmuruq!-sözünü iki yaxud üç dəfə deyəcəklər.Onlardan bəziləri hətta çönmək ərəfəsində ikən Allah deyəcək: Sizinlə Onun arasında Onu tanıyacağınız bir əlamət varmı?-deyə soruşacaq.Onlar: Bəli!-dedikdə, O, baldırı açacaq və Allaha könüllü səcdə edən elə bir şəxs qalmayacaq ki, Allah ona səcdə etməyə imkan verməsin.Ancaq qorunaraq və riyakarlıq edərək səcdə edən elə bir şəxs qalmayacaq ki, Allah onun belini bir qat etməsin.Həmin adam hər səcdə etmək istədiyi zaman boynunun

ardına düşəcək.Onlar başlarını qaldırdıqları zaman Onu ilk dəfə gördükləri simada görəcəklər.O: Mən sizin Rəbbinizəm!-deyəcək.Onlar: Sən bizim Rəbbimizsən!-deyəcəklər. Daha sonra cəhənnəmin üzərində körpü salınacaq və şəfaət icazəli olacaq.Onlar deyəcəklər: Allahım salamat elə, salamat elə! Peyğəmbərə: Ey Allahın Elçisi! Körpü nədir?-deyildi.O, dedi: Qırmaqlar və dəmir tikanlar olan kələ-kötür və sürüşkən yerdir.Onun yuxarı hissəsində Sə`dan deyilən bir tikan var.Möminlər onun üzərindən göz qırpımı kimi, şimşək kimi, quş kimi, sürətli atlar və dəvələr kimi keçəcəklər.Kimisi salamat qurtulacaq, kimisi yaxalanacaq, kimisi buraxılacaq, kimisi cəhənnəm atəşinə yıxılıb düşəcək! Nəfsim əlində Olana and olsun ki, nəhayət möminlər atəşdən qurtulacağı zaman sizdən birinizin haqqını tələb etməkdə Allaha səslənməsi, qiyamət günü möminlərin atəşə düşmüş qardaşları üçün Allaha səslənməsindən heç də artıq olmayacaq.Onlar deyəcəklər: Ey Rəbbimiz! Onlar bizimlə oruc tutar, namaz qılar və həcc edərdilər.Onlara deyiləcək: Tanıdıqlarınızı oradan çıxardın. Sonra onların surəti atəşə haram ediləcək və onlar baldırların yarısınacan və dizlərəcən atəşdə olan bir coxlarını oradan çıxardacaqlar.Daha sonra deyəcəklər: Ey Rəbbimiz! Sənin əmr etdiklərindən daha heç kəs orada qalmamışdır.O, deyəcək: Qayıdın! Qəlbində bir dinər çəkisində xeyir olan şəsxi tapsanız onu oradan çıxardın! Onlar bir çoxlarını oradan çıxartdıqdan sonra deyəcəklər: Ey Rəbbimiz! Bizə əmr etdiklərindən daha heç kəsi orada buraxmadıq.Sonra deyəcək: Qayıdın! Qəlbində dinərin yarısı çəkisində xeyir olan şəxsi tapsanız onu oradan

çıxardın! Onlar bir çoxlarını oradan çıxartdıqdan sonra deyəcəklər: Ey Rəbbimiz! Bizə əmr etdiklərindən daha heç kəsi orada buraxmadıq.Sonra deyəcək: Qayıdın! Qəlbində xeyirdən zərrə qədər olanı tapsanız onu oradan çıxardın! Onlar bir çoxlarını oradan çıxartdıqdan sonra deyəcəklər: Ey Rəbbimiz! Artıq biz orada bir xeyir buraxmadıq.Əbu Səid əl-Xudri belə deyərdi: Əgər bu sözdə mənə inanmırsınızsa belə olan halda istəyən bu ayəni oxusun: *“Həqiqətən, Allah zərrə qədər də olsa zülm etməz. Əgər (qulun gördüyü iş) yaxşı əməl olarsa, (Allah) bunu artırar və Öz tərəfindən böyük mükafat verər.”*.Daha sonra Uca Allah deyəcək: Mələklər şəfaət etdi, peyğəmbərlər şəfaət etdi, möminlər şəfaət etdi və yalnız rəhmlilər Rəhmlisi qaldı.Sonra atəşdən bir ovuc alıb heç vaxtı xeyir etməyən, közə dönmüş bir qism insanları oradan çıxardacaq.Sonra onları cənnətin girəcəyində həyat çayı deyə çağırılan bir çaya atacaq və onlar sel axarında toxum çıxdığı tək çıxacaqlar. Məgər görmürsünüz ki o, daşa yaxud ağaca tərəf günəşin altında sarı və yaşıl, kölgəlikdə isə ağ olur? Onlar: Ey Allahın Elçisi! Sanki sən səhrada çobanlıq etmisən!-dedilər.Dedi: Onlar mirvari tək boyunlarında halqalarla çıxacaqlar.Cənnət əhli onları tanıyıb: Bunlar heç bir əməl etmədən və heç bir xeyir iş görmədən Allahın cənnətə daxil etdiyi Allahın azad edilmişlərdir,-deyəcəklər. Sonra deyəcək: Cənnətə girin! Orada nə görsəniz sizin olacaq.Onlar deyəcəklər: Ey Rəbbimiz! Sən bizə aləmlərdən heç kəsə vermədiyini verdin.O, deyəcək: Mənim yanımda sizin üçün bundan daha yaxşısı var.Onlar: Ey Rəbbimiz! Bundan daha yaxşı nə ola bilər ki?-deyəcəklər.O, deyəcək:

Mənim razılığım.Artıq sizə daha heç vaxtı qəzəblənməyəcəm."[235]

Həmin hədisi imam Buxari rəvayət etmişdir və bu rəvayətdə "heç vaxtı xeyir etmədilər" sözləri yoxdur.

*Onun ləfzi*: "Sizə bəlli olan haqqınızı istəməkdə mənə səslənməyiniz həmin gün möminlərin, xilas olduqlarını gördükdə qardaşları üçün Cəbbar olan Allaha səslənməsindən daha qabarıq deyil.Onlar deyəcəklər: Ey Rəbbimiz! Bizim qardaşlarımız bizimlə namaz qılar, oruc tutar və əməllər edərdilər.Uca Allah deyəcək: Gedin! Qəlbində bir dinar çəkisində imana sahib olanı tapsanız onu oradan çıxardın! Sonra Allah onların surətini atəşə haram edəcək və onlar həmin adamların yanına gəldikdə artıq onlardan bəzilərinin ayaqları və baldırların yarısı atəşdə batacaq.Onlar tanıdıqları şəxsləri oradan çıxardacaq və sonra qayıdacaqlar.O, deyəcək: Gedin! Qəlbində dinarın yarısı çəkisində (imana) sahib olanı tapsanız onu oradan çıxardın! Onlar tanıdıqları şəxsləri oradan çıxardıb qayıdacaqlar.O, deyəcək: Gedin! Qəlbində zərrə qədər imana sahib olanı tapsanız onu oradan çıxardın! Onlar tanıyacaqları şəxsləri oradan çıxardacaqlar. Əbu Səid (r.a) dedi: Əgər bu sözdə mənə inanmırsınızsa belə olan halda istəyən bu ayəni oxusun: *"Həqiqətən, Allah zərrə qədər də olsa zülm etməz. Əgər (qulun gördüyü iş) yaxşı əməl olarsa, (Allah) bunu artırar və Öz tərəfindən böyük mükafat verər."*.Sonra peyğəmbərlər, mələklər və möminlər şəfaət edəcəklər.Daha

[235] Muslim:183.

sonra Cəbbar olan Allah deyəcək: Mənim şəfaətim qaldı.O, atəşdən bir ovuc alıb oradan közə dönmüş insanları çıxardacaq və onlar cənnətin ağzında həyat suyu adlanan çaya atılacaqlar.Onlar onun qırağında sel axınında bitən toxum tək bitəcəklər.Siz onu qayanın ətrafında və ağaçın yanında günəşin altında ikən yaşıl, kölgəlikdə isə ağ olduğunu görmüsünüz.Onlar sanki mirvari tək çıxacaqlar və onların boyunlarına halqalar qoyulacaq. Onlar cənnətə girdikdə cənnət əhli deyəcək: Bunlar Allahın azad etdiyi kimsələrdir.Allah onları, heç bir əməl etmədikləri və heç bir xeyir iş görmədikləri halda cənnətə salmışdır.Onlara belə deyiləcək: Gördükləriniz və onun mislində olanı sizindir."[236]

## *Dəlil olaraq gətirilən məqam:*

Müxalif bütövlüklə bədən əməllərini tərk edənin müsəlman və Allahın istəyi altında olduğunu isbatlamaq üçün bu hədisi dəlil gətirmişlər.Onlardan bəziləri daha da irəli gedərək demişlər: Bu hədis, onların bədən əməllərindən heç bir əməl etmədiklərinə qəti şəkildə dəlalət edir.

Digərləri demişlər: Bu, namazı tərk edənin kafir olmadığına dair qəti nassdır.

Habelə müxalif iddia etmişdir ki, hədisdə gələn pilləlik, namaz, oruc və həcc kimi əməl sahiblərinin çıxarılması daha sonra tövhid kəlməsindən savayı heç bir əməl etməyənlərin çıxarılması həmin hədisdə gələn "cəhənnəmlilərin" namaz əhlindən olmadığını göstərir.Çünki İslamın bu əzəmətli

---

[236]Buxari:7440.

şüarına sahib olan haqqında "heç vaxt bir xeyir etmədi" ifadəsini işlətmək yaramaz.

*Onların gətirdiyi əsaslandırmaya səkkiz yöndən cavab veriləcək:*

*Birinci:* Bu hədisi başqa dəlillər ilə tutuşdurmadan onun zahiri ilə kifayətlənmək düzgün deyil.

Bunun izahı: Hədisdə qeyd edilən pillələlik:

Qəlbində dinar çəkisində xeyir olanı tapsanız oradan çıxardın.

Qəlbində dinarın yarısı çəkisində xeyir olanı tapsanız oradan çıxardın.

Qəlbində zərrə qədər xeyir olanı tapsanız onu oradan çıxardın.

Daha sonra mələklər deyir: Ey Rəbbimiz! Artıq orada bir xeyir buraxmadıq.

Daha sonra Uca Allah deyir: Mələklər şəfaət etdi, peyğəmbərlər şəfaət etdi, möminlər şəfaət etdi və yalnız rəhmlilər Rəhmlisi qaldı.Sonra atəşdən bir ovuc alıb heç vaxt xeyir etməyən, közə dönmüş halda olan bir qism insanları oradan çıxardacaq.

Bu pillələlik zahirdə həmin şəxslərin tövhid əhlindən olmadığını göstərir.Həmin şəxslərin qəlbində ümimiyyətlə iman və zərrə qədər xeyir yoxdur və onlar həmin inkarın

ifadə etdiyi kimi istər bədən əməllərindən istərsə də qəlb əməllərindən olsun heç vaxt xeyir etməyiblər.

Həmçinin hədisdə onların "Lə iləhə illəllah" kəlməsini demələri qeyd edilmir.Bu səbəbdən, bəzi bidət əhli cəhənnəmdən mömin olmayanların çıxmalarının mümkün olduğuna dair bu hədisi dəlil gətirmişlər.

Hafiz ibn Həcər "fəthul bəri" əsərində demişdir: "Bildiriş: Mən Zərkaşinin "ət-tənqih" əsərində növbəti sözləri oxumuşam: Burada Əbu Səidin hədisində gəlmişdir ki, peyğəmbərlərin şəfaətindən sonra Uca Allah deyəcək: Mənim şəfaətim qalıb.Daha sonra heç bir xeyir etməyənləri atəşdən çıxardacaq.

Bəziləri mömin olmayanların atəşdən çıxarılmasının caiz olduğuna dair bu rəvayətdən tutunmuşlar.

Buna iki yönlü cavab verilmişdir: Birinci: Abdul-Haqqın "əl-cəm`" əsərində dediyi kimi bu əlavə bitişik (muttəsıl) olmadığı üçün zəifdir.

İkinci: İnkar şəklində gələn xeyir, digər hədislərin dəla-lət etdiyi kimi şəhadətin iqrar edilməsi özəyinə əlavə gələn xeyirdir.

Məhz belə demişdir.Onun verdiyi birinci cavab yanlışdır.Çünki burada gələn rəvayət bitişikdir.Bu sözün Abdul-Haqqa nisbət edilməsi isə yanlışlıq üzərinə gələn yanlışlıqdır.Çünki o, həmin sözü yalnız başqa rəvayət yolu ilə nəql edilən hədis haqqında demişdir: Qəlbində xardal

dənəsi çəkisində xeyir olanı çıxardın." Hafizin dediyi sözlər bitdi.[237]

Şeyx Albani (ikinci yönü) Hafiz ibn Həcərə nisbət etmiş lakin bunun Zərkaşinin sözü olduğu onun diqqətindən yayınmışdır.Habelə o, bu cavabı bəyənmiş və Zərkaşının sözlərində gələn hadislər üçün Ənəsin şəfaət haqqında gələn uzun hədisini misal göstərmişdir.Həmin hədis irəlidə gələcək.

Onlar demişlər: "İnkar şəklində gələn xeyir deyildikdə şəhadətin iqrar edilməsi özəyinə əlavə gələn xeyir qəsd edilir." Əgər bu, hər hansı bir üzr səbəbilə əməl etməyə imkan qazanmayan şəxslər haqqında gələrsə belə olan halda "iqrarın özəyinin" qəlb əməlini şamil etməsi müşkül məsələ olmayacaq.

Ancaq əgər bu söz, qayda olaraq əməli tərk edənin xilas olacağını ifadə edərsə, belə olan halda bu söz, zahiri əməli imanın dayağı deyil kamilliyi edənlərin məzhəbinə uyğun gələcək.Bəzən onların sözlərindən, qəlb əməlinin şərt olduğu anlaşılır, bəzən isə bu məsələdə çəkişmə yer alır.Bu səbəbdən doğru görüş ibnul-Qayyimin sözləridir: "Uca Allah atəşdən qəlbində cüzi, cüzi, cüzi zərrə qədər xeyir olanı çıxardacaq."Sonra dedi: "Bu hədisdə gələn xeyir, Allaha və peyğəmbərlərə imandır.Belə ki, başqa ləfzdə deyilir: "Cüzi, cüzi, cüzi zərrə qədər iman." Bu isə, elçiləri təsdiq etmək və onlara qəlb və bədən ilə tabe olmaqdır."[238]

---

[237]Fəthul bari:13/438.

[238]Şifaul-alil:2/714.

İbn Xuzeymə (rahiməhullah) murciələrin bu məsələdə azğınlığa düşmə səbəbini vurğulayaraq, onların bəzi müxtəsər rəvayətləri və yığcam sözləri əsas gətirib onları açıqlayan və izah edən şeylərdən üz çevirdiklərini qeyd etmişdir.

İmam (rahiməhullah) demişdir: "İslam əhlindən hər bir alim yəqinliklə bilir ki, Peyğəmbər (salləllahu aleyhi və səlləm) bu xəbərlərdə "Lə iləhə illəllah" deyib yaxud "Lə iləhə illəllah" şəhadətinə "Muhammədun rasulullah" şəhadətini artırıb daha sonra Muhammədən savayı heç bir peyğəmbərə və Allahın kitabından heç bir şeyə, cənnətə, cəhənnəmə, dirilişə və haqq-hesaba inanmayanın cənnət əhlindən olacağını və atəşdə yanmayacağını qəsd etməmişdir.Lakin bu xəbərlər murciələr üçün bir növ dəlil olmuşdur.Ancaq bu xəbərlərin zahiri onların əsaslarına, habelə Allahın kitabı və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) sunnəsinə zidd gəlidiyi bir halda cəhmiyyələr üçün Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) rəvayət edilən xəbərlər, zahiri ilə yozulacağı təqdirdə dəlil olaraq istifadəsi caiz olmuşdur.Bu yanaşma, Allahın Rəbb, Muhammədin isə Onun elçisi olduğunu bilən hər bir şəxsin, dil ilə bunu deməsə belə, cənnətə layiq olduğunu ifadə edir.Hələ də bəzi cahil və inadkar insanların tədqiq edilməmiş müxtəsər xəbərləri və izah edilməmiş yığcam xəbərləri dəlil gətirdiklərini eşitmək mümkündür.Onlar elmin əsaslarını anlamır və tədqiq olunmuş xəbərləri müxtəsər üçün, izah edilmiş xəbəri isə yığcam olanı üçün dəlil gətirilər.Həmin xəbərlər Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) elə bir ləfzlə sabit olmuşdur ki, əgər həmin xəbərlər,

murciələrin "Lə iləhə illəllah" şəhadətinə dair qeyd etdiyimiz xəbərləri zahirinə aid etdikləri kimi zahirinə aid edilərsə, belə olan təqdirdə "Lə iləhə illəllah" kəlməsini qəlbi ilə bilənin, onu dili ilə iqrar etməsə belə, cənnətə layiq olduğunu demək lazım olacaq.Həmin insan Allahın iqrar etməyə əmr etdiyi heç bir şeyi iqrar etmir, Allahın iman gətirməyə əmr etdiyi heç bir şeyə qəlbi ilə iman gətirmir, Allahın əmr etdiyi heç bir bədən əməli etmir, habelə müsəlman qanı axıtmaq, onların yaxınlarını əsir almaq, onların mallarını qəsb etmək və zövcələrini halal saymaq kimi Allahın haram etdiyi heç bir şeydən yan durmur."[239] Daha sonra Peyğəmbərin (salləllahu aleyhi və səlləm) bu hədisini gətirdi: "Kim Allahdan başqa haqq məbudun olmadığını bilərsə cənnətə daxil olar."

Bir sözlə, hədisin zahiri yalnız başqa dəlillər ilə tutuşdurulduqdan sonra ona dair qəti söz demək mümkün olur.

*İkinci*: Əgər müxalif deyərsə ki, heç vaxt xeyir etməyən bu adamlar iqrar, təsdiq və qəlb əməlinə sahib idilər, ona deyiləcək: Bunu haradan götürmüsən.Axı dəlil gətirdiyin və xüsusi olaraq pilləliyi ifadə edən hədisdə buna dair heç bir açıqlama yoxdur?

Əgər o: Mən bunu, qurtulmaq üçün "Lə iləhə illəllah" sözünü sidq, yəqinlik və ixlasla deməyin şərt olduğunu ifadə edən başqa dəlillərdən isbat edirəm,-deyərsə, ona

[239] İbn Xuzeyma: "Kitəbu-t-təuhid:2/815".

cavab olaraq deyiləcək: Biz həmçinin bədən əməlinin, ələxsus namazın varlığını başqa nasslardan isbat edirik.

Həmçinin ona deyiləcək: Əgər sidq, yəqinlik və ixlas olarsa zəruri olaraq əməl olacaq.Əks halda bədən əməllərindən tələb olunanın yoxluğu ilə bərabər sənin qeyd etdiyinin qəlbdə yer alması təxəyyül olacaq.Lakin zahir ilə daxil arasında olan bağlılığı inkar edən azğın murciələr üçün bu, gerçək sayıla bilər.

*Belə ki, müxalif iki seçim qarşısındadır*:

1-Həmin şəxslərin, qəlb əməllərinə sahib olmadan qurtulacağını iddia etməsi.Bu, Cəhmin dediyi sözdür.

2-Qəlb əməlini isbat etməsidir.Belə olan halda onun bədən əməlini isbat etməsi qaçılmaz olacaq.Əks halda o, "tələzum"u, daxil ilə zahir arasında olan bağlılığı inkar etmiş olacaq və bu məsələdə murciələrin məsləkinə müvafiq gələcək.

Yuxarıda qeyd etdiyim iki yönü bilməyin, həmin hədisin, heç bir bədən əməli etməyənlərə dair "qəti dəlil" və "çəkişməyə son qoyan nass" olduğunu iddia etmənin nə dərəcədə yanlış olması üçün sənə kifayət edər!!!

*Üçüncü*: Başqa nasslar üstəlik hədisin özü həmin şəxslərin namaz əhlindən olduqlarına dəlalət edir.Bunun izahı:

Birinci: Əbu Səidin hədisi yalnız səcdə və namaz əhlinin qurtulacağına dəlalət edir.

Ağaclara, daşlara və tağutlara ibadət edənlər cəhənnəmə yuvarlanacağı zaman Allaha ibadət etmiş salehlər, yaramazlar və kitab əhlindən olanlar qalacaq.

Yəhudi və nəsranilər atəşə sürüklənəcəyi zaman yalnız Allaha ixlasla yaxud nifaq və riyakarlıqla səcdə edənlər qalacaq.

"Baldır açılacaq və Allaha könüllü səcdə edən elə bir şəxs qalmayacaq ki, Allah ona səcdə etməyə imkan verməsin.Həmçinin qorunaraq və riyakarlıq edərək səcdə edən elə bir şəxs qalmayacaq ki, Allah onun belini bir qata çevirməsin.Həmin adam hər səcdə etmək istədiyi zaman boynunun ardına düşəcək."

Belə ki, bütün insanlardan yalnız bu iki dəstə insan qalacaq.

Daha sonra münafiqlərin nuru sönəcək və onlar ilə möminlər arasında qapısı olan bir sipər salınacaq, onun daxili rəhmət zahiri tərəfi isə əzab olacaq.Beləliklə də, münafiqlər həlak olacaq və yalnız dünyada könüllü surətdə Allaha səcdə edənlər qalacaq.

Gördüyün kimi yalnız namaz əhli qalacaq.Bunların içərisində atəşə təmizlənmək üçün girəcək səhlənkar və təqsirkarlar olacaq.Daha sonra onlar şəfaət sayəsində yaxud rəhmlilər Rəhmlisinin mərhəməti ilə oradan çıxarılacaqlar.

Bu səbəbdən, hədisin axırını dəlil gətirib onun əvvəlini unudan şəxslərin davranışı təəccüb doğurmaya bilməz.[240]

İkinci: Əbu Hureyranın (r.a) hədisində gəlmişdir ki, Allah qullar arasında hökmünü verdikdən sonra atəşdən çıxacaq sonuncu dəstəni mələklər səcdə izləri ilə tanıyacaqlar.

Buxari və Muslim Səid bin Museyyibdən, Atə bin Yezid əl-Leysidən nəql etmişlər ki, Əbu Hureyra (r.a) belə demişdir: "Bəzi insanlar demişlər: Ey Allahın Elçisi qiyamət günü biz Rəbbimizi görəcəyikmi?...

Həmin hədisdən: "Allah qulları arasında öz hökmünü bitirdikdən sonra O, Allahdan başqa haqq məbudun

---

[240] Bunu mən təqribən beş il öncə yazmışam.Daha sonra mən namazı tərk edənin küfrünə dəlillər içində İbnul-Qayyimin bu dəlili qeyd etməsinə rast gəldim. İmam (rahiməhullah) demişdir: "Qurandan olan dəlillərdən, Uca Allah buyurur: *"Məgər Biz müsəlmanları kafirlərlə eynimi tutacağıq?! Sizə nə olub, necə mühakimə yürüdürsünüz? Yoxsa bir kitabınız vardır ki, orada oxuyursunuz?! Yaxud orada bəyənib seçdiyiniz hər şeyin sizin olacağı yazılmışdır?! Və ya: "Nə hökm etsəniz sizin olacaqdır", -deyə Bizdən qiyamət gününədək davam edəcək əhd almısınız?! Onlardan soruş ki, hansı biri buna zamindir? Yoxsa onların şərikləri vardır?! Əgər doğru deyirlərsə, qoy şəriklərini gətirsinlər! Baldır açılacağı və səcdəyə dəvət olunacaqları gün onlar (səcdə etməyə) qadir olmayacaqlar. Gözləri zəlilcəsinə yerə dikiləcək, özlərini də zillət bürüyəcəkdir. Halbuki onlar (dünyada) sağlam olduqları ikən səcdəyə dəvət olunurdular.* (əl-Qələm:35-43) Ayədə dəlil olaraq göstərilən məqam, Uca Allahın müsəlmanları kafirlər kimi etməyəcəyini və bu işin Onun müdrikliyə və hökmünə layiq olmadığını xəbər verməsidir. Daha sonra müsəlmanlara əks olan kafirlərin əhvallarını qeyd edib demişdir: *"Baldır açılacağı gün"* Onlar həmin gündə Uca Rəbbə səcdə etməyə çağırılacaqlar, lakin onlarla Onun arasında sanki bir sədd çəkiləcək və dünya diyarında namaz qılanlarla səcdəni tərk etdiklərinə görə cəza olaraq onlar müsəlmanlarla birgə səcdə edə bilməyəcəklər.Bu isə onların, belləri inək buynuzu kimi olacaq kafir və münafiqlərlə birgə olacağına dəlalət edir.Çünki əgər bunlar müsəlmanlardan olsaydılar müsəlmanlara izn verildiyi kimi onlara da səcdə etməyə izn verilərdi." (əs-Salətu va hukmu tərikihə:29-səh)

olmadığına şahidlik edənlərin cəhənnəmdən çıxmalarını istədiyi zaman mələklərə onları oradan çıxartmalarını əmr edəcək.Mələklər onları səcdə izindən tanıyacaqlar.Allah atəşə adəm övladının səcdə yerini yaxmağı haram edəcək. Mələklər onları közə dönmüş halda çıxaracaqlar və onların üzərinə həyat suyu adlanan su töküləcək.Onlar toxumun sel axarında bitdiyi kimi bitəcəklər.Onlardan üzü atəşə tərəf olan bir kişi qalacaq.Həmin adam deyəcək: Ey Rəbbim! Artıq onun qoxusu məni zəhərlədi, alovu isə yandırdı, mənim üzümü atəşdən çevir!”[241] Bu, Buxarinin ləfzidir.

Habelə digər rəvayətdə: “Onlardan üzü atəşə tərəf olan bir kişi qalacaq.Həmin şəxs cənnətə girəcək atəş əhlindən sonuncusu olacaq.O, deyəcək: Ey Rəbbim! Üzümü atəşdən çevir!”.[242]

Habelə Muslimin ləfzi: “...Allah qulları arasında öz hökmünü bitirdikdən sonra Öz rəhməti ilə cəhənnəm əhlindən istədiyini çıxartmaq istədiyi zaman mələklərə Allaha heç bir şeyi şərik qoşmayan və “Lə iləhə illəllah” kəlməsini deyənlərdən rəhm etmək istədiyini atəşdən çıxartmalarını əmr edəcək.Mələklər cəhənnəmdə onları tanıyacaqlar.Onları səcdə izləri ilə tanıyacaqlar.Atəş adəm övladının yalnız səcdə yerini yaxmayacaq.Allah atəşə səcdə yerlərini yaxmağı haram etmişdir.Onlar atəşdən közə dönmüş halda çıxarılacaqlar və onların üzərinə həyat suyu töküləcək.Onlar sel axarında toxumun bitdiyi kimi bitəcək-

---

[241]Buxari:6574.
[242]Buxari:7438.

lər.Daha sonra Allah qullar arasında hökmünü bitirəcək və üzü atəşə tərəf bir kişi qalacaq.Həmin adam cənnətə girəcək sonuncu şəxsdir...”

Atə bin Yəzid demişdir: Əbu Səid əl-Xudri Əbu Hureyranın hədisindən heç bir şeyi rədd etmir.Lakin Əbu Hureyra “Uca Allah həmin şəxsə: ...və onunla birgə onun mislində olanı sənindir,-deyə hədisi rəvayət etdiyi zaman Əbu Səid demişdir: Ey Əbu Hureyra, onunla birgə onun on mislidir! Əbu Hureyra dedi: Mən yalnız bu sözləri hifz etdim: Bu və onunla birgə onun mislində olanı sənindir.Əbu Səid dedi: Şahidlik edirəm ki, mən Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) bu sözləri hifz etmişəm: Bu və bunun on misli sənindir. Əbu Hureyra dedi: Həmin adam cənnətə ən son girəcək şəxs olacaq.”[243]

Mələklərin səcdə yerləri ilə tanıyacaqları şəxslərin “cəhənnəmlilər” olduğunu aşağıdaki dəlillər isbat edir:

1-“Allah qullar arasında hökmünü bitirib cəhənnəm əhlindən Öz rəhməti ilə istədiyini çıxartmaq istədikdə...”

Bu rəvayət İmam Əhmədin Cabirdən rəvayət etdiyi hədis mislindədir: “Sonra Allah deyəcək: İndi isə Mən Öz elmim və rəhmətimlə onları çıxardacam.Dedi: Allah onların çıxartdığından qat-qat çoxunu oradan çıxardacaq və onların boyunlarında “Allahın azad etdikləri” sözləri yazıla-

---

[243] Muslim:182.

caq.Daha sonra onlar cənnətə girəcək və orada "cəhənnəmlilər" deyə adlanacaqlar."[244]

Əbu Hureyranın hədisində olduğu kimi Allah həmin cəhənnəmliləri "Öz rəhməti" ilə oradan çıxardacaq.

Cabirin hədisində "elmi və rəhməti ilə" gəlmişdir. Bu, hər hansı bir şəxsin şəfaəti ilə deyil.Əbu Hureyranın hədisi, mələklərin onları səcdə izlərindən tanıyacaqlarını ifadə edir. Bu isə onların namaz əhlindən olduqlarını göstərir.

2-Buna həmçinin[245] onların vəsf və durum eyniliyi dəlalət edir:

Muslimdə gələn Əbu Səidin rəvayətində: "Sonra atəşdən bir ovuc alıb heç vaxtı xeyir etməyən, közə dönmüş halda bir qism insanları oradan çıxardacaq.Sonra onları cənnətin girəcəyində həyat çayı deyə çağırılan çaya atacaq və onlar sel axarında toxum çıxdığı tək çıxacaqlar.Məgər görmürsünüz o, daşa yaxud ağaca tərəf günəşin altında sarı və yaşıl, kölgəlikdə olanda isə ağ olur?

Buxarinin rəvayəti: "O, atəşdən bir ovuc alıb oradan közə dönmüş insanları çıxardacaq və onlar cənnətin ağzında həyat suyu adlanan çaya atılacaqlar.Onlar onun kənarında toxumun sel axarında bitdiyi kimi bitəcəklər.Siz onu qayanın yanında və ağaçın ətrafında günəşin altında olarkən yaşıl, kölgəlikdə olarkən isə ağ olduğunu görmüsünüz."

---

[244]Əhməd "Musnəd:14531". Şueyb Arnaut dedi: Muslimin şərtinə əsasən səhih isnadlı hədisdir.Əbu Zubeyrdən savayı isnadın kişiləri etibarlı və Muslimin raviləridir.

[245] Yəni, mələklərin səcdə izləri ilə tanıyacaqları şəxslər cəhənnəmlilərdir.

Bu, Əbu Hureyranın hədisində gələn eyni vəsflərdir: "Allah qulları arasında öz hökmünü bitirdikdən sonra Öz rəhməti ilə cəhənnəm əhlindən istədiyini çıxartmaq istədiyi zaman mələklərə Allaha heç bir şeyi şərik qoşmayanı və "Lə iləhə illəllah" kəlməsini deyənlərdən rəhm etmək istədiyini atəşdən çıxartmalarını əmr edəcək. Mələklər cəhənnəmdə onları tanıyacaqlar.Onları səcdə izləri ilə tanıyacaqlar.Atəş adəm övladının yalnız səcdə yerini yaxmayacaq.Allah atəşə səcdə yerlərini yaxmağı haram etmişdir.Onlar atəşdən közə dönmüş halda çıxarılacaqlar və onların üzərinə həyat suyu töküləcək.Onlar sel axarında toxumun bitdiyi kimi bitəcəklər."

3-Həmçinin Buxarinin rəvayətində gəlmişdir ki, cəhənnəmdən ən axırıncı çıxan şəxs, mələklərin səcdə izləri ilə tanıdıqları şəxslərdən biridir: "Onlardan bir kişi üzü atəşə tərəf qalacaq.O, atəş əhlindən cənnətə girəcək sonuncu şəxs olacaq.O, deyəcək: Ey Rəbbim! Üzümü atəşdən çevir!".[246]

Atəşdən sonuncu çıxan şəxsin səcdə əhlindən olması bəlli olduğu zaman, həmin "cəhənnəmlilərin" namaz əhlindən olması aydın olur.

*Dördüncü*: "Heç vaxt xeyir etməyən" sözündə gələn məqsəd bütün əməllərin inkar edilməsi deyil.Çünki əməllərin isbat edilməsi ilə birgə bu kimi ifadələr nasslarda varid olmuşdur.Bu, şəfaət və başqa hədislərdə gəlmişdir:

---

[246] Buxari:7438.

1-Qiyamət günü Uca Allahın görünəcəyi və şəfaət haqqında bəhs edən Əbu Bəkrin hədisində gəlmişdir: "Daha sonra: Siddiqləri çağırın!-deyiləcək və onlar şəfaət edəcəklər. Sonra: Peyğəmbərləri çağırın!-deyiləcək.Peyğəmbərlərdən eləsi olacaq ki, onun yanında bir dəstə, eləsi də olacaq ki, yanında beş yaxud altı nəfər, eləsi də olacaq ki, yanında heç kəs gəlməyəcək.Sonra: Şəhidləri çağırın!-deyiləcək və onlar istədikləri şəxslər üçün şəfaət edəcəklər.Şəhidlər bunu etdikdən sonra Uca Allah deyəcək: Mən rəhmlilər Rəhmlisiyəm! Mənə heç bir şərik qoşmayanı cənnətimə salın! Daha sonra onlar cənnətə girəcəklər.

Sonra Uca Allah buyuracaq: Cəhənnəmə baxın görün orada nə vaxtsa xeyir iş görənə rast gəlirsinizmi? Onlar orada bir kişiyə rast gələcəklər.Ona deyəcək: Nə vaxtsa xeyir iş görmüsənmi? Həmin adam deyəcək: Xeyir! Ancaq mən alış-verişdə insanlara güzəştə gedərdim.Allah deyəcək: Mənim qullarıma getdiyi güzəşt müqabilində bu quluma güzəştə gedin! Daha sonra oradan başqa bir adamı çıxardacaqlar.O, deyəcək: Nə vaxtsa xeyir iş gördünmü? Həmin adam deyəcək: Xeyir! Ancaq mən öldüyüm zaman övladlarıma məni odda yandırıb sonra toza döndərmələrini, nəhayət sürmə tozu kimi olacağım vaxt məni dənizə götürüb küləyə səpmələrini əmr etdim.Vallahi Aləmlərin Rəbbi məni heç vaxt yaxalamaz.Uca Allah: Bunu nə üçün etdin?-deyəcək. Həmin adam: Səndən qorxduğum üçün,-deyə cavab verəcək. Uca Allah deyəcək: Ən böyük hökmdarın mülkünə bax! O və onun on mislində olanı səmindir.Həmin adam: Sən Malik

olduğun bir halda nə üçün məni məsxərəyə qoyursan?-deyəcək."[247]

2-Əhməd və ibn Mandəh Ənəsdən rəvayət edirlər ki, həmin "cəhənnəmlilər" dünyada Allaha ibadət edib ona heç bir şeyi şərik qoşmayan insanlardır:

"Mən: Ümmətim! Ümmətim!-deyəcəm.O, deyəcək: Ümmətinin yanına get! Onlardan qəlbində xardal dənəsi çəkisində imanı olan kimsəni tapsan onu cənnətə sal! Mən yollanıb qəlbində bu vəsfdə imanı olan kimsələrdən tapdıqlarımı cənnətə salacam.Nəhayət Uca Allah insanlar ilə haqq-hesabı bitirib ümmətimdən qalanları cəhənnəm əhli ilə birgə cəhənnəmə salacaq.Cəhənnəm əhli onlara: Sizin Allaha ibadət edib Ona heç bir şeyi şərik qoşmamağınız sizin dadınıza çatmadı,-deyəcəklər.Cəbbar olan Allah deyəcək: And olsun izzətimə! Mən onları atəşdən azad edəcəyəm.Daha sonra Allah onların arxasınca yollayacaq. Onlar oradan közə dönmüş halda çıxacaqlar.[248]Onlar həyat çayına girəcək və sel köpüyündə toxumun bitdiyi kimi bitəcəklər.Onların gözləri arasında: Bunlar Allahın azad

---

[247]Əhməd.İbn Əbu Asim "əs-Sunnə:751,812.Şeyx Albani bu hədisin isnadını həsən saymışdır.Habelə demişdir: "Hədisi ibn Xuzeymə, Əbu Avanə, ibn Hibban digər rəvayət yolları ilə Nadrdan təxric etmişlər.İbn Hibban demişdir: İshaq ( ibn Rahuyə) dedi: "Bu, ən şərəfli hədislərdən biridir." Heysəmi "məcməu`-z-zəvaid:10/374-375" kitabında demişdir: Bu hədisi Əhməd, Əbu Yə`lə və Bəzzər rəvayət etmişlər.Ravilər etibarlı kişilərdir." Şeyx Albanin sözləri burada bitir.

[248] Bu hədisdə həmin cəhənnəmlilər ovuc ilə çıxmayacaqlar.Burada qeyd edilir ki, Uca Allaha onların dalınca onları çıxardacaq kimsələri göndərəcək.Bu isə, yaxında qeyd ediləcəyi kimi Əbu Musanın, Əbu Hureyranın və Əbu Bərkin hədisinə tamamilə uyğun gəlir.Lakin son iki nəfərin hədisində "cəhənnəmlilər" sözü açıq qeyd edilmir.Buna dair əlavə izahlar səkkizinci və sonuncu yanaşmada gələcək.

etdiyi kəslərdir!-yazılacaq.Daha sonra onları cənnətə götürəcəklər.Cənnət əhli onlara deyəcək: Bunlar Cəhən-nəmlilərdir! Cəbbar olan Allah deyəcək: Xeyir! Bunlar Cəbbar olan Allahın azad etdiyi kəslərdir!”.[249]

İbn Mandəh demişdir: “Bu, ibnul Həddən məşhur olan səhih hədisdir.”[250]

Hafiz “əl-fəth” kitabında demişdir: “Nəsainin kitabında varid olan Amr bin Amrın Ənəsdən rəvayət etdiyi hədisdə təkallahlıların cəhənnəmdən çıxarılması üçün başqa bir səbəbin qeyd edilməsi gəlmişdir.Rəvayətin ləfzi: Allah sorğu-sualı bitirdikdən sonra ümmətimdən qalanları atəş əhli ilə birgə cəhənnəmə salacaq.Atəş əhli deyəcəklər: Sizin Allaha ibadət edib Ona heç bir şeyi şərik qoşmamağınız sizin dadınıza çatmadı! Cəbbar olan Allah deyəcək: And olsun izzətimə! Mən onları atəşdən azad edəcəyəm.Daha sonra Allah onların arxasınca yollayıb onları oradan çıxaracaq.”

İbn Əbu Asim və əl-Bəzzar Əbu Musanın Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) belə rəvayət etdiyini nəql edirlər: “Cəhənnəm əhli və onlarla birgə qiblə əhlindən Allahın istədiyi kəslər cəhənnəmdə yığılacaqları zaman kafirlər onlara deyəcəklər: Siz müsəlman deyildinizmi? Onlar: Müsəlman idik,-deyəcəklər.Kafirlər deyəcəklər: Sizin İslamınız sizin dadınıza çatmadı və siz bizimlə birgə atəşə düşdünüz. Onlar: Bizim işlətdiyimiz günahlar olmuşdur,-deyəcəklər.

---

[249]Əhməd:12491.Şueyb Arnaut dedi:İsnadı yaxşıdır.Şeyx Albani “əs-sunnə libni əbi asim:393” kitabının təhqiqində bu hədisi səhih isnadlı saymışdır.

[250] əl-İmən:3/826.

Daha sonra Allah qiblə əhlinin oradan çıxarılmasını əmr edəcək.Kafirlər deyəcəklər: Kaş ki, bizdə müsəlman olaydıq,-deyəcəklər." Artıq qeyd edildiyi kimi Cabirin bu mövzuya dair rəvayəti mövcuddur.Habelə ibn Mərdaveyhin kitabında Əbu Səid əl-Xudrinin rəvayəti vardır.[251]

Rəhman olan Allahın azad edəcəyi "cəhənnəmlilər" deyə çağırılan bu şəxslər Allaha ibadət edib qiblə əhlindən olan adamlardır.Onların bədən əməllərindən heç bir şey etmədiklərini düşünmək doğru deyil.

3-Həmçinin "Heç vaxt xeyir etməyən" ifadəsi, əməl etmələri sabit olan şəxslərə aid edilməsi varid olmuşdur:

İmam Əhməd və Nəsai Əbu Hureyranın Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) belə rəvayət etdiyini nəql edirlər: "Heç vaxt xeyir etməyən bir kişi var idi.Həmin kişi insanlara borc verər və xidmətçisinə belə deyərdi: Borcu ödəməyə imkanı olandan onu al çətinlikdə olanı isə burax və borcu onun üçün keç ki, bəlkə Allah da bizim günahlarımızdan keçər. Həmin kişi öldükdən sonra Allah ona belə dedi: Nə vaxtsa bir xeyir etmisənmi? Həmin adam: Xeyir! Ancaq mənim bir xidmətçim var idi və mən insanlara borc verərdim.Mən onu borcu geri almaq üçün göndərdikdə ona belə deyərdim: Borcu ödəməyə imkanı olandan onu al çətinlikdə olanı isə burax və borcu onun üçün keç ki, bəlkə Allah da bizim

[251] Fəthul bəri:11/463.İbn Əbu Asim "əs-Sunnə:843".Şeyx Albani bu hədisi səhih saymışdır.

günahlarımızdan keçər. Uca Allah deyəcək: Artıq sənin günahlarından keçdim!”.[252]

Belə ki, Peyğəmbər (salləllahu aleyhi və səlləm) bu hədisdə ilk öncə həmin şəxsin heç vaxt xeyir etmədiyini xəbər vermiş daha sonra onun xeyirli əməl etdiyini isbat etmişdir.Onun etdiyi xeyir: Borcu qaytarmaqda çətinlik çəkənlərə onu keçməsi və xidmətçisinə bunu əmr etməsidir.

4-Doxsan doqquz nəfəri öldürən kişinin hədisi.Bu hədisi Buxari və Muslim rəvayət etmişlər.

Muslimin rəvayətində gəlmişdir: “...Əzab mələkləri deyəcəklər: O, heç vaxt bir xeyir etməyib.Rəhmət mələkləri deyəcəklər: O, qəlbi ilə Allaha tövbə edən və Ona üz tutan halda gəlmişdir.”

Sözsüz ki, bu hədisdəki bütün mələklər həmin adamın vəsfində doğru olmuşlar.Çünki mələklər heç vaxtı yalan danışmır və Allaha asi olmurlar.

Bununla da, məlum olur ki, bir kişi haqqında: O, heç vaxt xeyir etməyib,-sözü, həmin şəxsin bəzi saleh əməllərə sahib olması ilə bərabər istifadə edilir.Belə olan halda gələn inkar, həmin şəxsin vacib əməli kamil surətdə yerinə yetirmədiyini ifadə edir.

Muslimin ləfzi: Əbu Səid əl-Xudri rəvayət edir ki, Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: “Sizdən

---

[252] Əhməd:8715.Nəsai:4694.Şeyx Albani dedi: Həsən səhih hədisdir.Şuyeb Arnaut dedi: Güclü isnadlı hədisdir.Hədisin raviləri ibn Aclən istisna olmaqla Buxari və Muslimin raviləridir.

öncəkilərdən doxsan doqquz adam öldürmüş bir kişi var idi.Həmin adam yer üzündə ən bilikli insan haqqında soruşduqda ona bir rahib göstərilmişdir.Həmin adam onun yanına gəlib doxsan doqquz adam öldürdüyünü dedi və tövbəsinin qəbul edilib edilməyəcəyini soruşdu.Rahib: Xeyir!-deyə cavab verdi.Həmin adam onu da öldürüb yüzü tamamladı.Sonra o, yenə yer üzünün ən bilikli adamı haqqında soruşduqda ona bir alim kişi göstərildi.Həmin adam yüz nəfəri öldürdüyünü dedi və tövbəsinin qəbul edilib edilməyəcəyini soruşdu. Alim dedi: Bəli! Səninlə tövbə arasında nə əngəl ola bilər ki? Filan əraziyə yollan! Orada Allaha ibadət edən insanlar vardır, sən də onlarla birgə Allaha ibadət et və öz yerinə daha qayıtma, çünki ora pis yerdir.Həmin adam deyilən yerə yollandı.Nəhayət yolun yarısında ölüm onu haqladı.Rəhmət mələkləri ilə əzab mələkləri ona dair mübahisə etdilər.Rəhmət mələkləri dedilər: O, qəlbi ilə Allaha tövbə edən və Ona üz tutan halda gəlmişdir.Əzab mələkləri dedilər: O, heç vaxt xeyir etməyib.Daha sonra onların yanına insan simasında bir mələk gəldi və onlar onu öz aralarında hakim seçdilər.Mələk dedi: İki ərazi arasında olan məsafəni ölçün! Onlardan hansına daha yaxın olarsa, deməli onun yeri oradır.Onlar ölçdülər və onun, getmək istədiyi əraziyə daha yaxın olduğunu gördülər.Daha sonra rəhmət mələkləri onun canını aldılar.

Qatədə demişdir: Həsən belə dedi: Bizə xəbər verilmişdir ki, ölüm gəldiyi an həmin adam sinəsi ilə özünü qabağa çəkmişdir."[253]

Həmin adamın yola düşməsi, sinəsi ilə özünü qabağa çəkməsi bədən əməllərindən olan xeyirli işlər deyilmi?

Bu səbəbdən imam ibn Xuzeymə (rahiməhullah) demişdir: "Heç vaxt xeyir etməyən" kəlməsi, ərəblərin istifadə etdiyi məna qəbilindəndir.Bununla onlar kamillik və dolğunluq-dan uzaq olan bir şeydən onun adını inkar edirlər.Bu qaydaya uyğun olaraq bu sözlərin mənası: Vacib olan və əmr edilən şeylər baxımından deyil sadəcə kamillik və dolğun-luq baxımından heç vaxt xeyir etməyiblər.Artıq mən bu mənanı kitablarımın bir sıra yerində bəyan etmişəm.[254]

İmam Əbu Ubeyd əl-Qasim bin Sələmin bu mövzuya dair qeyd edilməsi faydalı olacaq mühüm bir izahı var.İmam demişdir: "Əgər biri deyərsə ki: Bir insandan iman adı getməyəcəyi halda ona: Mömin deyil,-demək nə dərəcədə doğru olacaq?

Ona deyiləcək: Bu, bizdə geniş istifadə edilən və qərib olmayan ərəblərin sözlərindəndir.Onlar, insanın əməli tələb olunan surətdə olmayacağı zaman əməli onu edəndən çıxarırlar.Məgər onların, bir ustanın işində səriştəli olmadığı zaman: Heç bir şey etmədin, heç bir iş görmədin,-dediklərini görmürsən? Onların burada istifadə etdikləri məna işin özünü deyil yalnız onun gözəlliyini inkar edir.Onlara görə

---

[253]Muslim:2766.

[254]İbn Xuzeyma "ət-təuhid:2/732.

həmin insan işi görmüşdür lakin onu dolğun surətdə etməmişdir.Üstəlik onlar bundan daha böyük olan şeylərdə bunu dilə gətirmişlər.Misal olaraq, bir adamın öz atasının üzünə ağ olub ona çoxlu əziyyət verdiyi zaman: Bu onun övladı deyil,-deyilmişdir.Lakin onlar bilirlər ki, həmin adam onun belindən gəlib.Sonra bu cür ifadə qardaş, zövcə və kölə haqqında da deyilir.Onların bu işdə tutduqları məslək: İtaət və yaxşılıq kimi vacib əməllərdən boyun qaçırmalarıdır."[255]

İmam Muhamməd bin Nasr əl-Mərvəzi buna bənzər söz söyləyərək demişdir: "Əgər deyilərsə ki: İman adı insanda bərqarar olduğu halda onun barəsində: O, mömin deyil,-sözünü demək nə dərəcədə doğrudur? Cavab olaraq belə deyiləcək: Bu, geniş istifadə edilən və qərib olmayan ərəblərin sözüdür.Biz buna əsərlərdə və başqa yerlərdə rast gəlmişik.Buna misal, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) namazını natamam qılana: Qayıt və namazını qıl, çünki sən namaz qılmadın!-deməsidir.Peyğəmbər (salləllahu aleyhi və səlləm) həmin şəxsin namaz qıldığını gördüyü halda onun namazı qılmadığını xəbər vermişdir.Lakin həmin insan namazını tamamlamadığı zaman Peyğəmbər (salləllahu aleyhi və səlləm) onu sanki namazı qılmamış kimi etmişdir.Həmçinin Peyğəmbər il boyu oruc tutan haqqında soruşulduqda belə demişdir: "Nə oruc tutmuş nə də ki, iftar etmişdir." Bununla da o, sanki onu oruc tutmamış kimi etmişdir.Həmin adam insanlardan daha artıq oruc tutmuşdur.Lakin onun bunu yersiz etməsi Peyğəmbərin (salləllahu aleyhi və səlləm) onu oruc

[255] Əbu Ubeyd "əl-İman:41-ci səh."

tutmayan kimi vəsf etməsi ilə nəticələnmişdir. Dedi: Ərəblərin kəlamları həmçinin belədir.Məgər sən onların mahir olmayan və səriştəsiz ustaya: Filankəs usta deyil,-dəmələrini görmürsən? Onlar bilirlər ki, həmin adam bu işlə məşqul olur və öz sahəsində usta kimi çalışır.Onlar həmin adamın bütün işini deyil sadəcə onun işində səriştəsizliyini inkar etmişlər.Həmçinin bir adamın öz yoldaşına, onun yoldaşı işi tələb olunan səviyyədə etmədiyi yaxud sübutsuz bir söz dilə gətirdiyi zaman: Heç bir şey etmədin,-deməsini göstərmək olar.Əgər ondan: Həmin şəxs əməli yaxud sözü tərk etmişdirmi?-deyə soruşulsa o: Xeyir! Lakin o, həmin işi doğru etməmişdir,-deyəcək.Bu kimi sözlər onların danışığında çoxalmış və bunun nəticəsi olaraq onlar qeyd etdiyimizdən daha da qəribə mənalar kəsb edən sözlər söyləmişlər.Əbu Ubeydullah dedi: Buna misal, valideyn-lərinin üzünə ağ olub, onlara əziyyət verən və onlara müxtə-lif işkəncələr verən adama: Bu övlad deyil və yalnız bir düşməndir,-dəmələridir..."[256].

---

[256]Tə`zımu qadri-s-saləh:2/578-582.Onun əvvəlində gəlmişdir: Əbu Abdullah imana dair ona mənsub edilən kitabda həmin xəbərləri məhz bu cür izah etmişdir.Əbu Abdullah demişdir: "Bizə görə günahlar imanı aparmır...".Bu kitabı tədqiq edən demişdir: "İmam dedi: "Əbu Abdullah imana dair..." Bu sözləri Mərvəzidən kitabı rəvayət edən ravi demişdir.Müəllifin açıq bildirdiyi kimi onun imana dair kitabı var." (Bax: əl-muqaddimə, məbhəs, muəlləfətuh)

Dedim: Görünür-doğrusunu bilən Allahdır-bizim məsələmizə dair nəql olunan sözlər Əbu Ubeyd əl-Qasim bin Sələmin sözləridir.Buna səbəb iki məsələdir: Birinci: Bu sözlər, bəzi kəlmələrdə və bəzi sözlərin yerlərində cüzi fərqliliyə rəğmən onun iman kitabında qeyd etdiyi sözlərə uyğun gəlir.

İkinci: Mərvəzi nəqlin sonunda demişdir: "Əbu Ubeydin sözləri bura qədərdir." Ola bilsin ki, Mərvəzi onun sözlərini iman kitabında nəql edib ardından bura öz sözlərini daxil etmişdir.Daha sonar isə ravi ona təqdimat edib demişdir: "Əbu Abdullah imana dair ona mənsub edilən..."Yaxud həmin cümlə

Bütün bunlar "heç vaxt xeyir etməyən" sözü ətrafında olan qaranlıq nöqtələri aradan qaldıran açıq-aydın sözlərdir. Məlum olur ki, burada qəsd edilən məna, onların əməli dolğun və kamil surətdə etməmələridir.Bununla da, bütün nasslar cəmləşdirilir.Üstəlik bir nassda varid olanlar cəmləşdirilir və onun əvvəli axırı ilə qarşı-qarşıya qoyulmur. Çünki həmin nassda onların namaz əhlindən olmaları və səcdə izlərinə sahib olmaları vurğulanır.Onların qardaşları və dostları onları tanımasalar belə Allah onların oradan çıxarılmasını əmr edəcək və onları oradan çıxaracaq kimsələri onların dalınca yollayacaq.

*Beşinci*: Artıq mən yığcam cavabda şeyx Abdullah əl-Qarnidən növbəti sözləri nəql etmişəm:

"Hər hansı bir məsələ haqqında sözün həmin məsələyə dair varid olan bütün nasslara nəzər yetirmə üzərində qurulması zəruridir.Həmin nasslara isə fiqhin əsaslarını şamil edən elmin qəbul edilmiş qaydalarına əsasən nəzər yetirmək gərəkdir.Bununla da, mütləq ilə muqayyədi, ümumi ilə xüsusini və bu kimi şeyləri ayırmaq mümkün olacaq.Habelə qəti əmin olmaq lazımdır ki, sələfin bu nassları anlamaqda və onlar arasında cəm aparmaqda tutduqları yol doğrudur.

---

çap xətasıdır.Doğru isə: "Əbu Ubeyd imana dair ona mənsub edilən kitabda həmin xəbərləri məhz bu cür izah etmişdir."Belə olan halda sözlər ravinin deyil Mərvəzinin sözləri olacaq.Bu, həqiqətə daha yaxındır.Ələxsus Mərvəzi Əbu Ubeydin sözlərindən sonra sunnədən buna güc qatan misallar çəkmişdir.Daha sonra demişdir: "Bu misala dair xüsusi olaraq iman kitabında rəvayət edilən xəbərləri qeyd edəcəyik." (tə`zımu qadri-s-salət:2/590)

Məsələn, "cəhənnəmlilər" haqqında varid olan hədisdə heç vaxt xeyir etməyən şəxslərin cənnətə girəcəkləri varid olduğu üçün bunun, əməlin imanda kamillik şərti olduğuna dəlil olduğunu söyləmək doğru deyil.Çünki sələf əməlin imandan olduğuna və onun kafirlərin əzabından qurtulmaq üçün şərt olduğuna icma etmişlər.Onlar bu görüş ilə həmin hədis arasında ziddiyyət görməmiş, üstəlik hədisi qeyd edilən əsasa uyğun şəkildə anlamışlar."

Şeyxin işarə etdiyi bu yol, Əhli sunnənin yoludur.Onlar bir məsələyə dair varid olan nassları toplayıb onun ümumi gələnini xüsusi olana, mütləqini muqayyəd olana aid edirlər. Bununla da, elm və hökm onlara aydın olur.

İbn Xuzeyma (rahiməhullah) şəfaət hədislərinə verdiyi izah-da demişdir: "Bu xəbərlər bizim görüşümüzün doğruluğunu göstərir.Çünki həmin xəbərlər onu rəvayət edən ravilərin hifz etdikləri elmə əsasən rəvayət edimişdir.Onlardan bəzisi hədisin bir hissəsini, bəzisi isə bütöv rəvayəti hifz etmişdir. Bəzi xəbərlər müxtəsər şəkildə, bəzisi isə ətraflı şəkildə rəvayət edilmişdir.Buna görə də, ətraflı xəbərlər ilə müxtəsər xəbərlər bir arada toplanacağı zaman elm və hökm bəlli olacaq."[257]

Şeyx ibn Useyminə (rahiməhullah) sual verilmişdir: "Muslimin kitabında varid olan Əbu Səid əl-Xudrinin (r.a) hədisini necə anlamalıyıq: "Allah oradan heç vaxt xeyir etməyən insanları çıxaracaq"?

[257] İbn Xuzeyma, "ət-təuhid:2/707".

Şeyx cavab olaraq demişdir: “Onun ümumi olduğunu, namazı tərk edənin kafir olacağına dair dəlillərin isə xüsusi olduğunu anlayırıq.Alimlərdə olan məlum qaydaya əsasən, ümumi, xüsusi ilə xüsusiləşdirilir (yaxud ümumi xüsusi ilə ziddiyyət təşkil etmir).Çünki həmin hədisdə: Namaz qılmadılar”,-sözləri gəlmir.Bu səbəbdən biz, həmin hədisin namazı tərk edənin küfrünü ifadə edən digər dəlillər ilə ziddiyət təşkil etdiyini demirik.Həmin hədisdə demişdir: “Heç vaxt xeyir etməyən”.Orada namaza işarə edilmir və sadəcə ümumiləşdirilir.Namazı tərk edənin kafir olmasına dair gələn nasslar isə xüsusidir.”[258]

Şeyxin dediyi bu sözlər, həmin “cəhənnəmlilərin” namaz əhlindən olmalarına dair az öncə qeyd etdiyim sözləri təsdiqləyir.

Əgər müxalif: Bu əzəmətli xislətə sahib olan şəxs haqqında: O, heç vaxt xeyir etməmişdir,-ifadəsini işlətmək doğru deyil,-deyərsə,

Ona deyiləcək: Belə olan halda ixlas, yəqinlik, sidq və qorxu kimi qəlb əməllərinə sahib olan şəxs haqqında: O, heç vaxt xeyir etməmişdir,-ifadəsini işlətmək doğrudurmu?!

Bir sözlə, həmin hədis namazı tərk edənin təkfir ediləcəyi ilə xüsusiləşən ümumi hədisdir.Habelə bu, “cəhənnəmlilərin” namaz əhlindən olduğuna dair üçüncü yanaşmada qeyd ediləni təsdiq edir.

---

[258] Artıq ondan bu, yuxarıda nəql edilmiş və hədisin xüsusi hala aid edilməsi və onun mütaşabih hədis olması mümkün sayılmışdır.

*Altıncı*: Hədisdə qeyd edilən halın, qisas nəticəsində yaxşı işləri itirən və dünyada etdikləri bütün yaxşı işlərdən məhrum qalan möminlərdən olan insanlara aid edilməsi mümkündür.Həmin şəxslərin üzərinə haqsızlıq etdikləri insanların pis əməlləri yüklənəcək və sonda haqq sahiblərinin bölgüsünə daxil olmayan tövhid kəlməsi qalacaq.

İbn Rəcəb (rahiməhullah) bu məsələyə dair demişdir: "Təsdiq olan tövhid kəlməsi və qəlb imanı, haqq sahiblərinin zülm nəticəsində bölüşdürə bilməyəcəkləri şeylərdir.Çünki bu şeylər sahibinə qalacaq.Çünki əgər haqq sahibləri bunu öz aralarında bölüşdürsəydilər, belə olan təqdirdə bəzi tövhid əhli cəhənnəmdə əbədi qalar və qəlbində olan təsdiqdən və dili ilə dediyi şəhadətdən məhrum olardı.Günahkar müsəlmanlar isə yalnız bu iki şey ilə atəşdən çıxacaqlar."[259]

Bu görüşə əsasən, hədisdə bunların dünyada saleh əməllər etmədiklərinə heç bir şey dəlalət etmir.Həmin şəxslərin əməlləri isə qisas nəticəsində getmiş və onlarda təsdiqlə birgə tövhid kəlməsi qalmışdır.Onlar cəhənnəmdən məhz bunun sayəsində çıxmışlar.

*Yeddinci*: Bəzi elm əhli, bu hədisi imanın söz və əməl olduğuna dair açıq-aydın nasslara və sələfin icmasına uyğun gələn xüsusi bir hala aid etmişlər.

---

[259] İbn Rəcəb "Fəthul bari:1/95".İbn Rəcəbin sözünə dair irəlidə açıqlama gələcək. Çünki bəzi şəxslər onun sözünü öz istədiyi səmtə yönəldib bunu öz sözlərinə dəlil gətirirlər.

Belə ki, fətvalar və elmi araşdırmalar üzrə daimi komitə murciəlik haqqında verdiyi fətvada (21436-cı nömrəli fətva, 8/4/1421 hic.) bəyan etmişdir: "Heç vaxt xeyir etmədən cənnətə daxil olanlar haqqında bəhs edən hədisə gəldikdə, qeyd edilməlidir ki, bu hal, qadir olduğu halda onu tərk edən hər bir şəxsə şamil edilmir.Hədis yalnız əmələ mane olan hər hansı bir üzr səbəbilə yaxud açıq-aydın nasslara və bu mövzuda sələfin icmasına uyğun gələn digər mənaları ifadə edən başqa səbəblərdən ötrü əməli etməyən şəxslərə aiddir."[260]

Əgər deyilərsə ki: Onlar namazı və digər əməlləri tərk etməkdə üzürlü olduqları halda onların cəhənnəmə girmələrinə səbəb nə olmuşdur?

Biz deyəcəyik: Məlum olduğu kimi, əhkamlar yalnız dəvət çatdıqdan sonra öz təsdiqini tapır.Bəzən insana hər hansı bir şey çatır və həmin insan ona çatan işdə səhlənkar yanaşmaya görə qınaq qazanır.Çox güman ki, həmin adamlara qətl və zina kimi günahlara dair hökmlər çatmış onlar isə bu günahları işlətmişlər.Lakin onlar bilmədikləri şeyləri tərk etdiklərinə görə üzürlü sayılmışlar.

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Xitab yalnız dəvətin çatmasından sonra öz təsdiqini tapır.Uca Allah buyurur: *"sizi və ona yetişəcək kimsələri xəbərdarlıq edib qorxutmağım üçün".*[261] Habelə Uca Allah buyurur: *"Biz, peyğəmbər*

---

[260] Beşinci əlavəyə bax.Bu, şeyx ibn Useyminin bəzi cavablarda cavab verdiyi məsələdir.(Liqaətul bəbil məftuh:3/169, 1258 saylı sual.

[261] əl-Ənam:19.

*göndərməmiş (heç bir ümmətə) əzab verməri̇k!".*[262] Habelə buyurur: *"daha insanlar üçün peyğəmbərlərdən sonra Allaha qarşı bir bəhanə yeri qalmasın."*[263]

Quranda bu çox rast gəlinir.Uca Allah bəyan etmişdir ki, O, elçisinin gətirdiyini insanlara çatdırmayana qədər heç kəsi cəzalandırmaz.Uca Allah, Muhammədin Allahın Elçisi olduğunu bilib buna iman gətirən lakin onun gətirdiyi bir çox şeyi bilməyən şəxsi xəbərsiz olduğu şeylərə görə əzablandırmaz.Əgər Allah dəvət çatandan sonra imanı tərk etdiyinə görə insanı əzablandırmırsa Onun bir şəxsi dəvətdən öncə bəzi şərtləri tərk etdiyinə görə əzablandırmaması daha münasib və məqsədəuyğundur.Bu, bu kimi məsələlərə dair peyğəmbərdən gələn məşhur sunnədir."[264]

Dəvət alimlərindən bəziləri demişlər: "Allahın heç vaxt xeyir etməyənləri və sadəcə qəlbində cüzi imana sahib olub şəhadəti dil ilə iqrar edənləri cəhənnəmdən çıxartması, həmin şəxslərin İslamın dayağları olan Allahın fərzlərini yerinə yetirmək imkanı tapmadıqları və qəlbdə cüzi imana sahib olaraq dil ilə şəhadəti gətirdikdən sonra həyatdan getdikləri lakin bildiyi halda günah işlər ğörüb cəhənnəmə girməyə layiq olduqları səbəbilədir,

Yaxud da ki, həmin şəxslərin din və iman əhlinə yaxın bir məkanda böyüyüb lakin Allahın Öz qullarına vacib etdiyi dinin, imanın və İslamın təfərrüatını bilmədikləri, bundan xəbərsiz olduqları, elm əhlinə buna dair sual vermədikəri və uzaq məsafənin qət edilməsi ilə hasil olarsa belə Uca Allahın Öz qullarına dində savadı artırmağı vacib etdiyini bilmədikləri səbəbilədir.Bunlar cahilliyində üzürlü deyillər. Çünki

---

[262] əl-İsra:15.

[263] ən-Nisa:165.

[264] Məcmu`əl-fətava:22/41.

belə şəxsin müsəlmanlara yaxın olması səbəbilə bundan xəbərsiz olması üzr sayılmır.Bu səbəbdən Uca Allah həmin adamları vacib buyuruqları tərk etdikləri üçün cəlalandıracaq.Habelə həmin adam, dindən zəruri surətdə bilinən bir şeyi inkar etməyəcəyi və müsəlman imamının onu dinin dayağlarını haqqı ilə yerinə yetirməyə çağırdığı zaman bundan imtina etməyəcəyi kimi İslama zidd şeylərdən kənar olarsa cəhənnəmdə əbədi qalmayacaq.Bu insan Allaha, Onun mələklərinə, elçilərinə, kitablarına, axirət gününə və qədərə, həmçinin İslamın bütün dayağlarına iman gətirir və ondan heç bir şeyi inkar etmir.Lakin həmin adam bu işlərin təfsilatını, əhkamlarını və ona vacib olan şeyləri bilmir.

İman, insanların durumu nisbəti ilə fərqlənir.Onlardan bəzisi möhkəm dağlar kimi imana sahibdir və onun imanını heç bir amil sarsıtmaq gücündə deyil.Onun imanı sonsuzluğacan artmaqda davam edir.Onlardan bəzisinin imanı isə azalmağa doğru gedir və nəhayət zərrə dənəsi çəkisində qalır.Birincinin səbəbi, itaət, elm və Allahın yaratdıqlarına dair düşüncədir.İkincinin səbəbi isə günahlar, cahillik, qəflət və unutqanlıqdır.

Həmin ikinci səbəb, qəlbdə imanın olacağı və imkan dairəsində İslam dayağlarının yerinə yetiriləcəyi təqdirdə qulun cəhənnəmdə əbədi qalmasını vacib etməyəcək.Lakin cahillik, qəglət, unutqanlıq və günahlar səbəbilə həmin adamın imanı zəifləmişdir.Ancaq onun imanında olan zəiflik, onun namazı və bacardığı digər İslamın dayağlarını yerinə yetirməməsini gərəkdirmir.Çünki bəzən insan zəif imana sahib olduğu halda bunları yerinə yetirir və hətta son olaraq onun imanı zərrə kimi olana qədər azalır.

Onun əmələ sahib olmadığını deməyə səbəb, həmin əməlin cahil birisi tərəfindən sadir olmasıdır.Bu səbəbdən

imam Malik kimi alimlərin çoxu namazın təfsilatını bilməyən şəxsin ibadətinin səhih olmadığını qeyd etmişlər. Həmin şəxs namazın dayağları, vacibləri və sunnələrini ayırd edə bilmir.Namazdan savayı ibadətlər həmçinin belədir.Həmin şəxs bu halda sanki heç bir əməl etmir."[265]

*Səkkizinci*: Elm əhlindən bir qismi bu hədisin möhkəmə qaytarılması vacib olan mütaşabih hədislər qəbilindən olduğunu söyləmişlər.

Şeyx ibn Useyminə (rahiməhullah) sual vermişlər: "Peyğəmbərin (salləllahu aleyhi və salləm), Allaha bir səcdə belə etməyən insanların cənnətə girməsi hədisi ilə namazı tərk edənin küfrünü ifadə edən hədislər arasında necə cəm aparıla bilər?

Şeyx cavab olaraq demişdir: "Peyğəmbərin (salləllahu aleyhi və salləm) bu sözləri, Allaha bir səcdə belə etmədən cənnətə daxil olan insanların namazın vacibliyini bilməyən insanlara aid edilməlidir.İslamdan uzaq yerlərdə yaşayan insanlar yaxud çöllükdə yaşayıb namaz haqqında heç bir şey eşitməyən şəxslər buna misaldır.Habelə bu hədis, İslama girdikdən dərhal sonra ölüb Allah üçün bir səcdə belə etməyə imkan qazanmayan şəxslərə aid edilməlidir.

Bizim bunu deməyimizə əsas, həmin qeyd etdiyin hədisin mutəşabih hədislərdən olmasıdır.Namazı tərk edənin küfrünə dair gələn hədislər möhkəm və açıq-aydın hədislərdir.Mömin, Quran yaxud sunnəni dəlil gətirdiyi zaman mütəşabihi möhkəmə qaytarmalıdır.Mütəşabihə tabe olub möhkəmi kənara qoymaq qəlblərində əyrilik olanların üslubudur.Uca Allah buyurur: *"Sənə Kitabı (Quranı) nazil edən Odur. Onun (Kitabın) bir hissəsi möhkəm (mənası aydın, hökmü bəlli), digər qismi isə mütəşabih (çətin anlaşılan, dəqiq*

[265]ət-Təudih an təuhid əl-Xalləq:105-ci səh.

*mənası bilinməyən, məğzi bəlli olmayan) ayələrdir. Ürəklərində əyrilik olanlar fitnə-fəsad salmaq və istədikləri kimi məna vermək məqsədilə mütəşabih ayələrə uyarlar."*[266] [267]

Habelə şeyx Salih əl-Fəuzana (hafizahullah) sual verilmişdir: "Müəyyən insanlar külli şəkildə bütün əməlləri tərk edənin naqis imanlı mömin olacağına dair mövcud olan bəzi hədisləri dəlil göstərirlər. Bu hədislərdən məsələn: "Heç vaxt xeyir etməyən", habelə "vərəq" və digər hədislərdir.Buna necə cavab verilməlidir?

Şeyx cavab olaraq demişdir: "Bu, mütəşabihdən yapışmaqdır.Habelə bu, qəlblərində əyrilik olanların üslubudur.Uca Allah buyurur: "*"Sənə Kitabı (Quranı) nazil edən Odur. Onun (Kitabın) bir hissəsi möhkəm (mənası aydın, hökmü bəlli), digər qismi isə mütəşabih (çətin anlaşılan, dəqiq mənası bilinməyən, məğzi bəlli olmayan) ayələrdir. Ürəklərində əyrilik olanlar fitnə-fəsad salmaq və istədikləri kimi məna vermək məqsədilə mütəşabih ayələrə uyarlar."*[268] Onlar mütəşabih dəlilləri götürüb onu açıqlayan və izah edən möhkəm dəlilləri tərk edirlər.Bu səbəbdən, mütəşabihi möhkəmə qaytarmaq gərəkdir.Belə deyiləcək: Əgər biri şər`i üzr səbəbilə əməli tərk edib ölənə qədər onu etmək imkanı qazanmazsa, həmin şəxs üzürlü hesab ediləcək.Həmin hədislər də məhz bu cür insanlara aid edilir.Habelə deyiləcək: Bu insan, etiqad edərək və xalis Allah üçün şəhadəti dilə gətirmiş və əməl etməyə imkan qazanmayaraq dərhal ölmüşdür.Lakin həmin şəxs ixlasla və tövhidlə birgə şəhadəti dilə gətirmişdir.Peyğəmbərin (salləllahu aleyhi və səlləm) dediyi kimi: "Kim "lə iləhə illəllah" deyib Allahdan başqa

---

[266] Ali İmran:7.
[267] Liqaətul bəbil məftuh:3/169, 1258 saylı sual.
[268] Ali İmran:7.

ibadət olunanları inkar edərsə onun malı və qanı haram olar.Onun sorğu-sualı isə Allaha aiddir.Həqiqətən də, Uca Allah "lə iləhə illəllah" deyib bununla Allahın vəchini diləyən şəxsi atəşə haram etmişdir." Bu şəxs, şəhadəti dilə gətirib onun mənasını etiqad etməsi ilə birgə əməl etmək imkanı tapmamışdır.Həmin şəxs Allaha ixlaslı olmuş lakin ölənə qədər əməl etmək fürsəti əldə etməmişdir.Məhz belə insan şəhadət ilə cənnətə daxil olacaq."Vərəq" hədisi və eyni mənada gələn digər hədislər həmçinin bu hala aid edilir.Həmçinin heç vaxt xeyir etməyən şəxslərin atəşdən çıxacağı haqqında bəhs edən hədis, həmin şəxslərin şəhadəti dilə gətirib İslama girmələri ilə bərabər əməl etmək imkanı qazanmadıqları səbəbilədir və hədis məhz buna aid edilir. Ancaq əgər biri əməl etmək imkanına sahib olması ilə birgə ixtiyarı surətdə bütün əməlləri tərk edərsə mömin olmaz.Hədislərin arasında cəm məhz bu cür aparılır." [269]

Dedim: Habelə bu görüşə güc qatan amillərdən biri də, Əbu Səidin hədisinin şəfaəti açıqlayan digər səhih və sabit hədislərə müxalif olmasıdır.Həmin hədislərdən biri də, iki səhih kitabda varid olan Əbu Hureyranın hədisidir.Həmin hədisi Əbu Hureyradan Atə bin Yəzid və Səid bin Museyyib rəvayət etmişlər.Atə xəbər vermişdir ki, Əbu Səidin hədisindən heç bir şey rədd edilmir.Habelə Əbu Hureyra Uca Allahın həmin kişiyə: ...və onun mislində olanı,- deyə rəvayət etdiyi zaman Əbu Səid demişdir: Ey Əbu Hureyra! O və onunla birgə on mislində olanı."

Hədisdə "heç vaxt xeyir etməyən" sözlərindən başqa varid olan ən önəmli fərqlilik iki məsələdə öz əksini tapır:

---

[269] Əsilətun va əcvibətun fi məsəilil imən val kufr.

Birinci məsələ: Əbu Səidin hədisi "cəhənnəmlilərin" Allahın əli ilə oradan çıxacaqlarını bildirir: "Atəşdən bir ovuc alıb".

Bu isə, Əbu Bəkr əs-Siddiq, Ənəs, Əbu Musa və Əbu Hureyranın hədisinə müxalifdir.

Əbu Bəkrin rəvayətində: "Cənnətimə daxil olun!"-gəlmişdir.

Ənəsin rəvayətində: "Onların dalınca yollayacaq və onlar oradan çıxarılacaqlar",-gəlmişdir.

Əbu Musanın rəvayətində: "Allah qiblə əhlindən olanların çıxarılmasını əmr edəcək",-gəlmişdir.

Əbu Hureyranın rəvayətində: "Allah qulları arasında öz hökmünü bitirdikdən sonra O, Allahdan başqa haqq məbudun olmadığına şahidlik edənlərin cəhənnəmdən çıxmalarını istədiyi zaman mələklərə onların çıxarılmasını əmr edəcək."

Heç şübhəsiz ki, Əbu Bəkr, Ənəs və Əbu Musanın rəvayəti "cəhənnəmlilər" haqqında bəhs edir.

Müxalif yalnız Əbu Hureyranın rəvayətində çəkişmə apara bilər.Çünki həmin rəvayət, mələklərin bu insanları səcdə izləri ilə tanıyacaqlarını açıq bildirir.

Müxalif, Əbu Hureyranın hədisində "قبضة : bir ovuc" sözünün qeyd edilməməsini və yalnız mələklərin onları oradan çıxarmalarını əsas tuta bilər.Belə olan halda onlara deyiləcək: Sənin "قبضة : bir ovuc" sözünün qeyd edilmədiyi Əbu Bəkrin, Ənəsin və Əbu Musanın hədisinə verəcəyin cavab bizim Əbu Hureyranın hədisinə verdiyimiz cavab mislindədir.

Bu, cəm halında olan rəvayətlərin ləfzləridir.Artıq araşdırma əsnasında qeyd edilmişdir:

1-Huzeyfənin Əbu Bəkrdən olan rəvayəti: "...Daha sonra: Siddiqləri çağırın!-deyiləcək və onlar şəfaət edəcəklər. Sonra: Peyğəmbərləri çağırın! -deyiləcək.Peyğəmbərlərdən eləsi olacaq ki, onun yanında bir dəstə, eləsi də olacaq ki, yanında beş yaxud altı nəfər, eləsi də olacaq ki, yanında heç kəs gəlməyəcək.Sonra: Şəhidləri çağırın!-deyiləcək və onlar istədikləri şəxslər üçün şəfaət edəcəklər.Şəhidlər bunu etdikdən sonra Uca Allah deyəcək: Mən rəhmlilər Rəhmlisiyəm! Mənə heç bir şərik qoşmayanı cənnətimə salın! Daha sonra onlar cənnətə girəcəklər.

Sonra Uca Allah buyuracaq: Cəhənnəmə baxın görün orada nə vaxtsa xeyir iş görənə rast gəlirsinizmi? Onlar orada bir kişiyə rast gələcəklər.Ona deyəcək: Nə vaxtsa xeyir iş görmüsənmi?" Hədis.

2-Əhməd və ibn Mandəhin Ənəsdən gələn rəvayəti: Cəbbar olan Allah deyəcək: And olsun izzətimə! Mən onları atəşdən azad edəcəyəm.Daha sonra Allah onların dalınca göndərəcək və onlar oradan közə dönmüş halda çıxacaqlar. Onlar həyat çayına girəcək və sel köpüyündə toxumun bitdiyi kimi bitəcəklər.Onların gözləri arasında: Bunlar Allahın azad etdiyi kəslərdir!-yazılacaq.Daha sonra onları cənnətə götürəcəklər.Cənnət əhli onlara deyəcək: Bunlar Cəhənnəmlilərdir! Cəbbar olan Allah deyəcək: Xeyir! Bunlar Cəbbar olan Allahın azad etdiyi kəslərdir!".

3- Nəsainin Ənəsdən olan rəvayəti.Belə ki, Hafiz "əl-fəth" kitabında bu rəvayəti Nəsaiyə aid etmişdir.Lakin mən Nəsainin nə "əs-sunən əl-kubra" nə də ki, "əs-sunən əl-

suğra" kitabında bu rəvayətə rast gəlməmişəm: "Cəbbar olan Allah deyəcək: İzzətimə and olsun ki, onları atəşdən qurtaracam.Daha sonra onların dalınca yollayacaq və onlar oradan çıxarılacaqlar."

4-Əbu Musanın rəvayəti ibn Əbu Asimin kitabındadır. Qeyd edildiyi kimi hədis səhihdir: "Allah qiblə əhlindən olanların oradan çıxarılmasını əmr edəcək.Kafirlər isə deyəcəklər: Kaş ki, biz də müsəlman olardıq!".

5-Əbu Hureyranın hədisində gəlmişdir: ""Allah qulları arasında öz hökmünü bitirdikdən sonra Öz rəhməti ilə cəhənnəm əhlindən istədiyini çıxartmaq istədiyi zaman mələklərə Allaha heç bir şeyi şərik qoşmayanı və "Lə iləhə illəllah" kəlməsini deyənlərdən rəhm etmək istədiyini atəşdən çıxartmalarını əmr edəcək. Mələklər cəhənnəmdə onları tanıyacaqlar.Onları səcdə izləri ilə tanıyacaqlar.Atəş adəm övladının yalnız səcdə yerini yaxmayacaq.Allah atəşə səcdə yerlərini yaxmağı haram etmişdir.Onlar atəşdən közə dönmüş halda çıxarılacaqlar və onların üzərinə həyat suyu töküləcək.Onlar sel axarında toxumun bitdiyi kimi bitəcəklər."

İkinci məsələ: Əbu Səidin hədisi ilə digərlərin hədisi arasında yer alan fərqlilik: Əbu Səidin rəvayət etdiyi hədisin zahiri "cəhənnəmlilərin" peyğəmbərlərin və mələklərin şəfaətindən sonra çıxacaqlarını göstərir: Peyğəmbərlər, mələklər və möminlər şəfaət edəcəklər.Cəbbar olan Allah deyəcək: Mənim şəfaətim qalmışdır.Daha sonra atəşdən bir ovuc alıb közə dönmüş insanları oradan çıxaracaq." Hədis.

Bu, Həsən əl-Bəsrinin Ənəsdən şəfaət hədisinə dair rəvayət etdiyinə uyğun gəlir.Həmin hədis iki səhih kitabdadır.Bu Muslimin ləfzidir: Həmin hədisdə Uca Allahın

peyğəmbərinə belə deməsi varid olmuşdur: "Yollan və qəlbində buğda yaxud arpa dənəsi çəkisində iman olanı çıxart!

Daha sonra mənə deyiləcək: Yollan və qəlbində xardal dənəsi çəkisində imanı olanı oradan çıxart!

Daha sonra mənə deyiləcək: Yollan və qəlbində cüzi, cüzi, cüzi xardal dənəsi çəkisində imanı olanı atəşdən çıxart! Mən yollanıb mənə buyurulanı edəcəm."

"Artıq dördüncü dəfə olduqda mən Rəbbimin hüzürüna gəlib Ona həmin tariflər ilə həmd-sənaları edəcəm və ardından səcdəyə qapanacam.Mənə deyiləcək: Ey Muhamməd! Başını qaldır və de, sözün eşidiləcək! İstə, istəyin veriləcək! Şəfaət et, şəfaətin qəbul ediləcək! Mən deyəcəm: Ey Rəbbim! Mənə "lə iləhə illəllah" demiş insanlara şəfaət etməyə izn ver.

Uca Allah deyəcək: Bu, sənin işin deyil yaxud bu sənə aid deyil.Lakin izzətimə, kibrimə, əzəmətimə və yenilməzliyimə and verirəm ki, Mən "lə iləhə illəllah" sözünü deyənləri çıxardacam.Dedi[270]: Şahidlik edirəm ki, bu hədisi bizə Həsən danışmışdır.O isə həmin hədisi, düşünürəm ki, iyirmi il öncə Ənəs bin Malikdən eşitmişdir.

Hədisin zahiri Peyğəmbərin (salləllahu aleyhi və səlləm) "cəhənnəmlilərə" şəfaətçi durmamasıdır.

İmam Nəvəvi (rahiməhullah) demişdir: Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Mənə "lə iləhə illəllah" demiş insanlara şəfaət etməyə izn ver. Uca Allah deyəcək: Bu, sənin işin deyil yaxud bu sənə aid deyil.Lakin izzətimə, kibrimə, əzəmətimə və yenilməzliyimə and verirəm ki, Mən "lə iləhə

[270] Deyən Həsəndən hədisi rəvayət edən Mə`bəd bin Hiləl əl-Anəzidir.

illəllah" sözünü deyənləri çıxardacam." Bunun mənası: Mən heç bir şəfaətsiz Öz lütfüm ilə onları oradan çıxardacam. Ötən hədisdə gəldiyi kimi: Mələklər şəfaət etdi.Peyğəmbərlər şəfaət etdi.Möminlər şəfaət etdi.Yalnız rəhimlilər Rəhimlisi qaldı." Bitdi.

Lakin bu, səhih Buxari və sunən Tirmizi, Əbu Davud, ibn Macə, habelə Əhmədin kitabında "cəhənnəmlilərin" Peyğəmbərin (salləllahu aleyhi və səlləm) şəfaəti sayəsində çıxacaqları ilə ziddiyyət təşkil edir.

İmran bin Huseyn (r.a) rəvayət edir ki, Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: Bir dəstə insan Muhammədin (salləllahu aleyhi və səlləm) şəfaəti sayəsində cəhənnəmdən çıxıb cənnətə girəcəklər.Onlara "cəhənnəmlilər" deyiləcək." Bu, Buxarinin ləfzidir.[271]

Tirmizinin ləfzi: "İnsanlardan bir dəstə məmin şəfaətim sayəsində cəhənnəmdən çıxacaq və "cəhənnəmlilər" adlanacaqlar.

Əbu Davudun ləfzi: "İnsanlardan bir dəstə Muhammədin (salləllahu aleyhi və səlləm) şəfaəti sayəsində cəhənnəmdən çıxıb cənnətə girəcəklər.Onlara "cəhənnəmlilər" deyiləcək."

İbn Macənin ləfzi: "İnsanlardan bir dəstə mənim şəfaətim sayəsində cəhənnəmdən çıxacaq və "cəhənnəmlilər" adlanacaqlar."

Bu, heç şübhəsiz ki, Əbu Səidin və Ənəsin hədisinin zahirinə zidd gəlir.

---

[271] Buxari:6566.Tirmizi:2600.Əbu Davud:4740.İbn Macə:4315.

Hafiz ibn Həcər "əl-fəth" kitabında demişdir: "Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Cənnət əhli onları "cəhənnəmlilər" adlandıracaq." Bu bölümün on səkkizinci fəslində İmran bin Huseyndən növbəti ləfz ilə hədis vurğulanacaq: "İnsanlardan bir dəstə Muhammədin (salləllahu aleyhi və səlləm) şəfaəti sayəsində cəhənnəmdən çıxıb cənnətə girəcəklər.Onlara "cəhənnəmlilər" deyiləcək." Bu əlavə, Humeydin Ənəsdən gətirdiyi rəvayətdə sabit olmuşdur.

Cabir hədisə əlavə etmişdir: "Onların boyunlarında "Allahın azad etdikləri" yazılacaq və onlar orada "cəhənnəmlilər" adlanacaqlar." İbn Hibban və Beyhaqi nəql etmişlər.Həmin hədisin əsli Muslimin kitabındadır.

Nəsainin kitabında Amr bin Amrın Ənəsdən rəvayətində gəlmişdir: "Cənnət əhli onlara deyəcəklər: Bunlar cəhənnəmlilərdir.Allah deyəcək: Xeyir! Bunlar Allahın azad etdiyi kimsələrdir." Muslim digər yöndən Əbu Səiddən rəvayət edib əlavə etmişdir: "Onlar Allaha dua edəcəklər və Allah onlardan bu adı aparacaq."[272]

Habelə Hafiz (rahiməhullah) demişdir: "Araşdırma nəticəsində orada digər bir şəfaətin olması mənə bəlli olmuşdur.Həmin şəfaət, yaxşılıqları və pislikləri eyni olan insanların cənnətə girməsi üçün olacaq.

[272] Fəthul bəri:11/437.

Başqa şəfaət, onun “lə iləhə illəllah” kəlməsini deyib heç vaxt xeyir etməyənlərə şəfaət etməsidir.Bunu deməyə əsas, növbəti bölümün şərhində izah ediləcəyi kimi Həsənin Ənəsdən gətirdiyi rəvayətdir.Uca Allahın ona: “Bu, sənə aid deyil”,-deməsini, bunu Peyğəmbərin şəfaətindən hesab etməyə heç bir maneə deyil.Çünki burada inkar edilən, çıxarılmanın gerçəkləşməsi ilə əlaqəlidir.Şəfaətin özü isə ondan sadir olmuşdur.Habelə onun şəfaəti qəbul edilmiş və öz nəticələrini vermişdir.”[273]

Habelə demişdir: ”Beydavi dedi: Hədisdə gəlmişdir: “Bu sənin işin deyil”.Yəni, adımı təzim etmək və tövhidimi uca etmək üçün bunu Mən edəcəyəm.Bu, irəlidə gələn Əbu Hureyranın hədisində gələn ümumiliyi xüsusiləşdirir: “Şəfatim sayəsində səadətə qovuşan şəxs, ixlasla “lə iləhə illəllah” kəlməsini deyəndir”.Dedi: Habelə ehtimal olunur ki, bu, ümumiliyi üzərə qalır və digər bir hala və məqama aid edilir.Ət-Tıbi demişdir: “Biz Allaha xas olanı, səmərədən kənar olan bir təsdiq ilə, habelə Peyğəmbərə xas olanı, yəqinliyin yaxud saleh əməlin artması kimi səmərəsi olan iman olaraq açıqladığımız zaman hamısı hasil olacaq.

[273] Fəthul bəri:11/464.

Dedim (deyən ibn Həcərdir): Habelə digər bir cəhətin olması ehtimalı vardır.Belə ki, Uca Allahın "bu sənin işin deyil",-sözü, şəfaətin özəyini deyil çıxartmanın gerçəkləşməsini ifadə edir.Belə olan halda sonuncu şəfaət qeyd edilən şəxslər üçün edilmiş olur.Burada çıxartmanın özəyinə cavab verilmiş və onun gerçəkləşməsinə əngəl edilmişdir.Ancaq bu, onun şəfaətinə aid edilmişdir: "İnsanlardan mənim şəfaətim sayəsində səadətə qovuşanı".Çünki ilk olaraq o, bunu istəmişdir.Həqiqi elm isə Uca Allahın bildiyidir." Hafizin sözləri bitir.[274]

Beləliklə qeyd edilən səkkiz yanaşmadan bəlli olur ki, bütövlüklə zahiri əməli tərk edənin qurtulacağına dair bu hədisi sübut gətirənin sözləri əsassızdır.Habelə hədisdə keçən həmin sözləri digər rəvayətlərin işığında və sələfin icma etdiyinə əsasən anlamaq gərəkdir.

*Bu yanaşmaların yekunu iki məsələdə öz əksini tapır:*

Birinci: Hədisdə qeyd olunan "cəhənnəmlilər" namaz əhlindən olmuşlar.Onların bütün zahiri əməlləri tərk etdiklərini demək isə doğru deyil.Bu üzdən, həmin hədis çəkişmə mövzusundan kənardır.

[274] Fəthul bəri:11/437.

İkinci: Əgər həmin şəxslərin namaz əhlindən olmadığı və onların bədən əməllərindən heç vaxt heç bir şey etmədikləri fərz edilərsə, həmin hədis xüsusi hala aid ediləcək və həmin hədis, namazı tərk edənin küfrünü ifadə edən digər dəlillər ilə, habelə əməlin imanda zəruri olmasına və onu bütövlüklə tərk edənin kafir olmasına dair Əhli sunnənin icma etdikləri ilə heç bir ziddiyyət təşkil etməyəcək.

Doğrusunu bilən Allahdır![275]

[275] Bu üzdən, həmin şəxslərin əməlsiz qurtulacağına dair İbn Rəcəb və digər elm əhlinin sözlərini dəlil gətirib bunu imkan olan yerdə zahiri əməli tərk edən hər bir şəxs üçün ümumiləşdirmək istəyənlərin cəhdləri faydasız olmuşdur.Çünki qeyd edildiyi kimi bu sözlərin sahibi bunu nasslara zidd olmayan, namazı tərk edənin təkfir olunmasına və əməlin imanda lübüdlüyünə əmin olmağa heç bir maneə törətməyən xüsusi hala aid edir.Daimi komitənin fətvasında məhz bu cür gəlmişdir.Buna diqqət yetir və hər danışanın sözünə aldanma!

# Dördüncü araşdırma:

## "Tövhiddən savayı heç vaxt xeyir etmədi" hədisinə dair verilən cavab

*Hədisin mətni*: Əbu Hureyra rəvayət edir ki, Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Heç vaxt xeyir etməmiş kişi demişdir ki, öləcəyi zaman onu yandırsınlar və yarısını quruya yarısını isə dənizə səpələsinlər. Allaha and olsun ki, Allah onu yaxalayarsa aləmlərdən heç kimsəyə verməyəcəyi əzabı ona daddıracaq.Ardından Uca Allah dənizə buyurmuş və dəniz onun qalıqlarını toplamışdır.Habelə quruya buyurmuş və quru onun qalıqlarını toplamışdır.Daha sonra dedi: Nə üçün bunu etdin? Həmin adam: Səndən qorxduğum üçün və sən daha yaxşı bilirsən,-dedi.Allah həmin adamı bağışladı." Buxari və Muslim rəvayət etmişlər.[276]

Buxarinin rəvayəti: "Dedi: Günah işlədən bir kişi var idi. Onun ölüm anı gəldiyi zaman övladlarına demişdir: "Öləcəyim zaman məni yandırıb ardından yüyüdün.Sonra məni küləyə səpələyin. Allaha and olsun ki, əgər Allah məni yaxalayarsa aləmlərdən heç kimsəyə verməyəcəyi əzabı mənə daddıracaq.Həmin adam öldüyü zaman onu buyurduğu kimi etdilər.Allah yerə əmr edib: Səndə ondan qalanı bir yerə topla!-demişdir.Yer ona əmr olunanı etdi.Nəhayət həmin adam (Onun qarşısında) durdu.O, dedi: Səni bunu

---

[276] Buxari:7506.Muslim:2756.

etməyə nə vadar etdi? Həmin şəxs dedi: Ey Rəbbim! Səndən qorxmağım.Allah onu bağışladı."[277]

İmam Əhməd rəvayət etmişdir: "Əbu Kəmil bizə təhdis edib dedi: Hamməd Səbitdən, o da Əbu Rafi`dən, o da Əbu Hureyradan, o da Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) bizə təhdis etdi, habelə bir sıra insanlar Həsəndən, o da, ibn Sirindən, o da, Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) onun belə dediyini rəvayət edirlər: "Sizdən öncəkilərdən tövhiddən savayı heç vaxt xeyir etməmiş bir kişi var idi. Onun ölüm anı gəldiyi zaman həmin adam öz ailəsinə demişdir: Öldüyümü gördüyünüz zaman məni közə dönüncəyə qədər yandırın, daha sonra yüyüdün və küləkli gündə səpələyin.Həmin adam öldüyü zaman onlar bunu etdilər. Nəhayət həmin adam Allahın əlinə keçdiyi zaman İzzət və Cəlal sahibi olan Allah dedi: Ey Adəm oğlu! Səni bu etdiyinə nə vadar etdi? Adam dedi: Ey Rəbbim! Səndən qorxduğum üçün etdim.Dedi: Həmin adam tövhiddən savayı heç bir xeyir etmədiyi halda bununla bağışlandı."[278]

Müxalif imam Əhmədin bu rəvayətini sübut gətirib: "İstisna, heç bir yozum ehtimalı daşımayan dəlildir (nassdır)",-demişdir.

***Buna bir necə yöndən cavab veriləcək*:**

---

[277] Buxari:3481.

[278] Əhməd:8027.Təhqiqçi demişdir: Hədisin iki isnadı vardır: Birinci: Hamməd bin Sələmə Sabit əl-Bənənidən, o da, Əbu Rafi` əs-Saiğdən o da, Əbu Hureyradan rəvayət edir.Bu, birləşik isnadlı səhih hədisdir.İkinci: Hamməd bin Sələmə bir sıra şəxslərdən, Həsən bin Sirindən mursəl olaraq rəvayət edir.Bu isnad, mursəl olduğu, habelə Hamməd bin Sələmə məchul olduğu üçün zəifdir.

*Birinci*: Artıq qeyd edilmişdir ki, “heç vaxt xeyir etmədi” sözləri bəzi elm əhlinə[279] görə mütaşəbih sözlərdəndir və həmin sözləri, imanın söz və əməl olduğunu və əməlsiz imanın yetərli olmadığını ifadə edən sələfin icma etdiyi möhkəm sözlərə, habelə namazı tərk edənin təkfir ediləcəyinə dair Peyğəmbərin əshabının, sələfin cumhurunun və hədis əhlinin sübut olaraq icma etdikləri möhkəm dəlillərə qaytarmaq vacibdir.

*İkinci*: Bu hədis üçün “cəhənnəmlilər” haqqında bəhs edən hədisə dair deyilən söz deyiləcək.Deyiləcək ki, həmin hədis xüsusi hala aiddir yaxud bu hədis, namazı tərk edənin təkfir ediləcəyini ifadə edən dəlillər tərəfindən xüsusiləşdirilən ümumi hədisdir.

İmam Nəvəvi (rahiməhullah) demişdir: “Alimlər bu hədisin açıqlamasına dair ixtilaf etmişlər: “Bəziləri demişlər: “Bu adam “fətra” zamanı (Allahın dini yoxa çıxdığı zamanda), adicə tövhidin fayda verdiyi vaxtda yaşamışdır.Səhih görüşə əsasən isə şəriət gəlməmişdən öncə heç bir öhdəçilik sabit olmur.Uca Allah buyurur: *“Biz elçi göndərməmiş əzab verməriк”*.[280] [281]

Artıq Şeyxul-İslam (rahiməhullah) kitablarının bir neçə yerində həmin kişinin Allahın qüdrətinə və axirətə şübhə etdiyini lakin həmin insanın cahil və yanlış fikirli olduğunu qeyd etmişdir.Bu səbəbdən, Uca Allah onu üzürlü etmiş-

---

[279] Şeyx ibn Useymin, şeyx əl-Bərrak, şeyx əl-Fəuzanın yuxarıda keçən sözlərinə bax.

[280] əl-İsra:15.

[281] Şərhu-n-nəvəvi alə muslim:17/71.

dir.[282] Belə olacağı halda həmin şəxsin əməllərə və şər`i əhkamlara dair bilgisiz olması heç də uzaq ehtimal deyil. Çünki həmin şəxs "fətra" zamanında yaşamışdır yaxud onu öyrədən şəxs olmamışdır.Çəkişmə isə yalnız əməli, onun hökmü insana çatandan və onu yerinə yetirmək imkanı qazanandan sonra onu tərk edən barəsindədir.

Hafiz ibn Həcər (rahiməhullah) demişdir: "Güman ki, həmin adam bunu ümidsizliyin və qorxunun dərin olmasından ötrü demişdir.Digərinin yanlışlıq edib: Sən mənim qulum mən isə Sənin rəbbinəm,-deməsi buna misaldır.Yaxud onun " لئن قدَرعلي: ləin qaddəra aleyyə" sözlərində, "dəl" hərfi şəddəli formada gəlmişdir.Belə olan halda bunun mənası: Məni əzablandırmaq üçün bunu mənə təqdir etmişdirsə,- olacaq.Yaxud həmin şəxs Yaradanın olduğunu isbat edir və "fətra" zamanında yaşayırdı.Bu səbəbdən, həmin şəxsə imanın şərtləri çatmamışdır.Lakin görüşlərin ən üstünü, həmin şəxsin bu sözləri dəhşət və güclü qorxu halında deməsi və nəticədə dediyi sözün fərqinə varmaması olmuşdur. Həmin adam gerçək mənasını qəsd edərək bu sözləri deməmişdir.O, ancaq edəcəyi şeyə görə qınağa tuş gəlməyən qəflətə yaxud unutqanlığa düşmüş insan kimi olan bir halda bunu demişdir. Görüşlərin ən zəifi isə, onların şəriətində kafirin bağışlanmasının caiz olmasını deməkdir."[283]

Muhamməddin (salləllahu aleyhi və səlləm) ümmətindən olmayan bir kişiyə dair varid olan bu hədisi sübut gətirənlərin

---

[282] Məcmu`əl-fətəva:7/619,8/11,11/409,23/347.Buğyətul murtəd:310-cu səh.əl-İstiqamə:1/164.Minhəcu-s-sunnə:5/484.
[283] Fəthul bəri:6/523.

halı təəccüb doğurmaya bilməz.Bütövlüklə əməli tərk edənin xilas olacağına dair ümumi qayda ortaya gətirmək üçün deyilmişdir ki, həmin adam cəhənnəmdən çıxan ən sonuncu adamdır.Bu qaydanı qoyanlar öncəkilərdən heç kimsənin dəlil gətirmədiyi şeyi dəlil gətirərək Quran və sunnənin nasslarına və müsəlmanların icmasına məhəl qoymurlar.

Artıq daimi komitənin irca fikri haqqında fətvası nəql edilmişdir.Orada deyilir: "Habelə orada gəlmişdir: Cənnətə heç vaxt xeyir etməyən insanların girəcəyi haqqında bəhs edən hədis, ümumi deyil və əməl etməyə qadir olduğu halda əməli tərk edənə aid deyil.Həmin hədis, yalnız əməl etməyə mane olan üzr səbəbilə onu tərk edən şəxslərə aid edilir.Yaxud həmin hədis möhkəm nasslara və sələfin bu mövzuya dair icma etdikləri şeylərə uyğun gələn mənalara aid edilir."[284]

*Üçüncü*: Müxalif burada "tövhiddən savayı" sözündən tutunub əməlin yoxluğuna dair bunun dəlil olduğunu hesab edir.Müxalif unudur ki, tövhid, bəzi cahillərin düşündüyü kimi adicə söz deyil.Əksinə tövhidin qəlb, dil və bədən əzaları ilə olması labüddür.

Şeyx Muhamməd bin Abdul-Vahhəb demişdir: "Ümmət arasında ixtilaf yoxdur ki, tövhidin elm olan qəlb ilə, söz olan dil ilə və əmr və qadağalara riayət etmə olan əməl ilə olması labüddür.Əgər insan onlardan birini pozarsa müsəlman olmaz."

[284] Yuxarıda şeyx ibn Useymindən nəql edilən sözlərə bax.

Hədis həmin kişiyə "qorxu" sifətini isbat edir.Heç şübhəsiz ki, bu sifət tövhiddən və bədən əməllərini əmələ gətirən qəlb əməllərindən biridir.

Rəvayətlərin birində gəlmişdir ki, həmin kişi öz əməli haqqında pis zəndə olmuşdur.Bu isə, əməlin varlığına açıq-aydın işarədir.Lakin digər rəvayətlərdə gəldiyi kimi həmin adam günahlar işlətməsi səbəbilə, Allahın onu günahlarına görə cəhənnəmə atmasından qorxmuşdur.

Huzeyfə (r.a) rəvayət edir ki, Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Sizdən öncəkilərdən öz əməli haqqında pis zəndə olan bir kişi var idi.Həmin adam öz yaxınlarına demişdir: Öləcəyim zaman məni götürün və küləkli bir gündə dənizə səpələyin.Onlar bunu etdilər.Nəhayət Allah onu bir yerə toplayıb dedi: Bunu etməyə səni nə vadar etdi? Adam dedi: Bunu etməyə məni yalnız Səndən qorxmağım vadar etmişdir.Allah isə onu bağışladı."[285]

Həmçinin: Namazı tərk edənin küfrünü deyənlər namazı, qulu xilas edəcək tövhiddən edirlər.Allahdan qeyri-sinə ibadət edən yaxud Allaha şərik qoşan yaxud icma ilə haram olduğu bəlli olan şeyi halal sayan şəxs qiyamət günü xilas olmayacağı kimi həmçinin namazın tərki və bütövlüklə əməlin tərki kimi İslamı pozan şeyləri edən şəxs xilas olmayacaq.Müstəsna hal olaraq yalnız əməli tərk etməkdə üzürlü olan şəxs göstərilə bilər.

[285] Buxari:6480.

Bir sözlə, həmin hədis Əhli sunnə üçün müəmmalı deyil və möhkəm dəlillər ilə heç bir ziddiyyət təşkil etmiş.Vacib olan isə hədisi digər dəlillər işığında anlamaqdır.Məhz bu səbəbdən, həmin hədisi rəvayət edən səhabələrə və onu nəql edən imamlara adı çəkilən hədis müəmmalı qalmamışdır.

## Beşinci araşdırma:

## İslamın yoxa çıxması hədisinə dair verilən cavab

*Hədisin mətni*: Huzeyfə bin Yəmən rəvayət edir ki, Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "İslam, libasın rəngi yoxa çıxdığı kimi yoxa çıxacaq.Nəhayət orucun, namazın, həccin, sədəqənin nə olduğu bilinməyəcək.Bir gecə içində Allahın kitabı qaldırılacaq və yer üzündə ondan bir ayə belə qalmayacaq.Həmin vaxt insanlardan qoca kişi və qarı qalacaq.Onlar deyəcəklər: Biz atalarımızı "Lə iləhə illəllah" sözünü deyən gördük və biz də onu deyirik.Sılə ona dedi: Onlar namazın, orucun, həccin və sədəqənin nə olduğunu bilmədikləri halda onlara "Lə iləhə illəllah" fayda verməyəcək.Huzeyfə bunu eşitdikdə ondan üzünü çevirdi. Daha sonra o, bu sözləri üç dəfə söylədi.Sılə bu sözü hər dediyi zaman Huzeyfə ondan üzünü çevirirdi.Nəhayət üçüncü dəfə dediyi zaman üzünü ona tutub dedi: Ey Sılə! Onları atəşdən qurtaracaq! Bunu üç dəfə təkrarladı."[286]

Müxalif demişdir: Huzeyfədən (r.a) nəql edilən bu rəvayət, namazı və digər dayağları tərk edənin kafir deyil qiyamət günü əbədi oddan qurtulan müsəlman olduğunu göstərir.

***Cavab***:

---

[286] İbn Macə:4049.Buseyri dedi: İsnadı səhihdir.Ravilərin hamısı etibarlıdır.Şeyx Albani həmçinin bu hədisi səhih saymışdır.

Bu əsər, çəkişmə mövzusundan kənardır.Çünki çəkişmə, namazı və zahiri əməlləri, onun vacibliyini biləndən və onu etmək imkanına sahib olandan sonra tərk edən şəxs ətrafındadır.Lakin "lə iləhə illəllah" dediyi halda müsəlman olması ilə birgə onun vacibliyini bilmədən ölən və namazın, zəkatın və orucun nə olduğunu bilməyən şəxs üzürlüdür. Buna yerində gələn bir çox dəlillər dəlalət edir.

Şeyxul-İslam (tayyəbəllahu sərahu) demişdir: "İnsanlardan bir çoxu nübuvvət elmlərindən bir çoxunun yoxa çıxdığı vaxtlarda və yerlərdə həyat sürürlər.Həmin insanlara Allahın Öz Peyğəmbərinə verdiyi kitabı və hikməti çatdıran şəxslər qalmır.Belə olan halda Allahın Peyğəmbəri vasitəsi ilə göndərdiyi bir çox şeylər bilinmir və bunu təbliğ edən insanlar olmur.Belə bir şəxs kafir olmur.Bu səbəbdən, imamlar, elm və iman əhlindən uzaq bir çöllükdə yaşayan və İslamda yeni olan insanın aşkar və mütavatir olan əhkamlardan bir şeyi inkar edəcəyi halda ona Peyğəmbərin gətirdiyi izah edilməyənə qədər küfr hökmünün çıxarılmayacağına dair yekdil olmuşlar.Bu səbəbdən hədisdə gəlmişdir: "İnsanlara namazın, zəkatın, orucun və həccin nə olduğu bilinməyəcək bir zaman gələcək.Yalnız qoca kişi və qarı qalacaq.Onlar deyəcəklər: Biz atalarımızı "Lə iləhə illəllah" sözünü deyən gördük...".[287]

Şeyx ibn Useymin (rahiməhullah) demişdir: "Dördüncü qism: Namazın tərkini üzürlü edən hal ilə bağlı olan dəlillər. Buna misal İbn Macənin rəvayət etdiyi hədisdir.Huzeyfə bin

[287] Məcmu`əl-fətəva:11/407.Buğyətul murtəd:311.

Yəmən Peyğəmbərin belə dediyini rəvayət edir: “İslam, libasın rəngi yoxa çıxdığı kimi yoxa çıxacaq.” Hədisin davamında gəlir: “Həmin vaxt insanlardan qoca kişi və qarı qalacaq.Onlar deyəcəklər: Biz atalarımızı “Lə iləhə illəllah” sözünü deyən gördük və biz də onu deyirik.Sılə ona dedi: Onlar namazın, orucun, həccin və sədəqənin nə olduğunu bilmədikləri halda onlara “Lə iləhə illəllah” fayda verməyəcək.Huzeyfə bunu eşitdikdə ondan üzünü çevirdi. Daha sonra o, bu sözləri üç dəfə söylədi.Sılə bu sözü hər dediyi zaman Huzeyfə ondan üzünü çevirirdi.Nəhayət üçüncü dəfə dediyi zaman üzünü ona tutub dedi: Ey Sılə! Onları atəşdən qurtaracaq! Bunu üç dəfə təkrarladı.” Həmin kəlmə sayəsində cəhənnəmdən qurtulan bu şəxslər İslamın buyuruğlarını tərk etməkdə üzürlü olmuşlar.Çünki onlar, həmin buyuruğlar haqqında bilgisiz olmuşlar.Onlar edə biləcəkləri ən böyük şeyi etmişlər.Onların halı, İslamın buyuruğları fərz edilməmişdən öncə ölən yaxud şəhadəti gətirib buyuruğları etmək fürsəti əldə etməmişdən öncə ölən yaxud küfr diyarında İslamı qəbul edib buyuruqlar haqqında bilgiyə yiyələnmək fürsəti əldə etməyən kimi onu etmək fürsəti əldə etməyən insanların halına bənzəyir.”[288]

Şeyx Albani (rahiməhullah) demişdir: “Həmin səhih hədisdən çıxan faydalardan: Müəyyən hallarda bəzi insanlarda olan cəhalət, onların İslamdan yalnız şəhadəti bilməsi dərəcəsinə çatır.Bu, o demək deyil ki, onlar namazın və digər dayağların vacibliyini bilir sonra isə onu yerinə yetirmirlər.Xeyir, hədisdə buna dair heç bir şey yoxdur.

[288] əş-Şərhul mumti`:2/23.

Onlar bu məsələdə, çöllükdə yaşayan və küfr diyarlarında İslama yeni girən bir çoxları kimi İslamdan yalnız şəhadəti bilirlər.

Buna bənzər şeylər bəzi məkanlarda baş verir.Belə ki, belə yerlərin birində yaşayan şəxs telefon vasitəsilə məndən, ərə gedib cinsi əlaqədən sonra qüsl almadan namaz qılan bir qadın haqqında soruşmuşdur...".Daha sonra Şeyxul-İslamın sözlərini nəql etdi: Muhammədin (salləllahu aleyhi və salləm) Allahın Elçisi olduğunu bilən və buna iman gətirən şəxs onun gətirdiyi bir çox şeyləri bilməzsə, Allah həmin şəxsə çatmayan şeylərə görə ona əzab verməz...".[289]

Məsələ belə olduğu halda, səhabələrin namazı tərk edənin təkfir ediləcəyinə dair icmasını Huzeyfədən gələn bu nəql ilə pozmaq heç bir vəchlə doğru deyil.Çünki müxalif heç olmazsa bir səhabədən, onun üzr və müstəsna halında deyil bilgi və imkan olduğu, habelə maneə olmadığı halda namazın tərk edilməsini küfr hesab etmədiyinə dair səhih xəbər nəql etmək zorundadır.Əslində biz elə bir səhabənin olduğunu bilmirik.Habelə buna diqqətimizi çəkən şəxs olmamışdır.Bu səbəbdən, onların icması səhih və doğru olmuşdur.

Artıq təfsilata girməmişdən öncə bu məsələyə dair çəkişmə nöqtəsinin təyin edilməsinin önəmi vurğulanmışdır.

---

[289] Hukmu təriki-s-salət:55-ci səh.Şeyx namazı tərk edənin təkfir olunmayacağına dair bu hədisi dəlil gətirmişdir: əs-Silsilətu-s-sahiha:1/130.Lakin şeyx bu əlavədə sanki bu əsərin çəkişmə mövzusundan çıxdığına diqqət çəkmiş və üzr məsələsini qeyd etməklə kifayətlənmişdir.Habelə Şeyxul-İslamın sözlərini nəql etmişdir.Doğru görüş də, məhz budur.Doörusunu bilən Allahdır.

# Altıncı araşdırma:

## Peyğəmbərin Muazı Yəmən əhlinə göndərməsi hədisinə dair verilən cavab

***Hədisin mətni***: İbn Abbas (r.a) rəvayət edir ki, Peyğəmbər (salləllahu aleyhi və səlləm) Muaz bin Cəbəli Yəmənə göndərdiyi zaman ona demişdir: "Həqiqətən, sən kitab əhlindən olan bir tayfanın yanına gələcəksən.Onlara gəldiyin zaman onları Allahdan başqa (ibadətə haqqı olan) ilahın olmadığına və Muhammədin Allahın Elçisi olduğuna şahidlik etmələrinə çağır! Əgər onlar sənə bu işdə itaət etsələr onlara xəbər ver ki, Allah onlara hər gün və gecə beş namazı fərz buyurmuşdur.Əgər onlar sənə bu işdə itaət etsələr onlara xəbər ver ki, Allah onlara, zənginlərindən alınıb kasıblara verilən sədəqəni fərz buyurmuşdur.Əgər onlar sənə bu işdə itaət etsələr, belə olan halda onların ən dəyərli mallarından çəkin və məzlumun duasından özünü qoru! Çünki onunla Allah arasında heç bir sipər yoxdur."[290]

Onlardan biri bu hədisi sübut gətirib demişdir: "Bu, insan əməl etməyəcəyi halda belə İslamın doğru olacağına bir dəlildir.Çünki hər hansı bir şəxsin, bir şeyi səhih edəcək dayağı yaxud şərti buraxıb bir şeyi əmr etməsi icazəli deyil." Daha sonra dedi: "Əgər insanın imanı şəhadətdən savayı yalnız zahiri əməlin olması ilə doğru olsaydı İslama gəlmək

[290] Buxari:1496.Muslim:19.

istəyənə tövhid şəhadətini deməsi və bir-başa onun daxili imanını və tövhidi dilə gətirməsini doğru edən əməl etməsi buyurulardı."

*Buna bir neçə yöndən cavab veriləcək:*

*Birinci*: Bu cür dəlil üslubu gördüyüm ən qəribə haldır. Bu cür dəlil üslubu xurafatlara uyanların və qəbirlərə tapınanların, şəhadəti dilə gətirənin İslamı pozan amilləri edəcəyi halda belə himayənin şəhadət ilə sabit olacağını demələri qəbilindən bir dəlil üslubudur.

Müxalif himayənin sabit olması ilə onun davamiyyəti yaxud İslam hökmünün sabit olması və davamı arasında fərqi görmür.Həmin şəxsin, dəlil gətirmək istədiyi zaman Usamənin hədisini və şəhadət ilə İslam hökmünün alınacağını ifadə edən digər hədisləri dəlil gətirməsi daha münasib olardı.

Həmin adam demişdir: (İnsan əməl etməyəcəyi halda belə İslamın doğru olacağına).

Cavab olaraq deyiləcək: İslam dedikdə nəyi qəsd edirsən.Onun başlanğıcda sabit olmasını yoxsa davamiyyətini?

Birinciyə gəldikdə, başlanğıcda İslamın əməlsiz sabit olmasını heç kəs çəkişmir.Artıq qeyd etmişəm ki, adicə şəhadətin tələffüz edilməsi ilə İslam hökmü verilir və bu, müsəlmanların icma etdikləri məsələdir.Daha sonra insandan İslamın əhkamlarına riayət etmək tələb olunur.

İkinciyə gəldikdə isə, əməlin tərk edilməsi ilə birgə İslam hökmünün davamiyəti, çəkişmə mövzusudur.Hədisdə Muazın göndərildiyi kitab əhlinin, əməli tərk edəcəkləri təqdirdə İslam hökmü üzərə davamiyyətli qalacaqlarına heç bir dəlil yoxdur.Hədisdə ən uzağı deyilə bilər ki, həmin şəxslərdən başlanğıcda əməl, üstəlik əmələ riayət etmə tələb olunmamışdır.Burada isə əməlin tərkinə dair hökmdən yaxud ona riayət etməməkdən bəhs olunmur.

İbn Rəcəb əl-Hənbəli (rahiməhullah) demişdir: "Zəruri elm ilə bilinir ki, Peyğəmbər (salləllahu aleyhi və səlləm) onun hüzuruna gəlib İslama daxil olmaq istəyən hər bir kəsdən yalnız şəhadəti qəbul edir və bununla onun qanını himayə edib onu müsəlmanların sırasına qatırdı.Artıq o, Usamə bin Zeydin "Lə iləhə illəllah" deyənin üzərinə qılınc qaldırıb onu öldürməsini pisləmiş və sərt şəkildə ona irad tutmuşdur.O, İslama girmək üçün gələnə namaz və zəkata riayət etmək şərti qoymamışdır."

Həmçinin demişdir: "Əgər insan şəhadəti iqrar edərsə hökm baxımından müsəlmana çevriləcək.[291]Əgər o, bununla İslama daxil olarsa İslamın digər tələblərini yerinə yetirməyə vadar ediləcək."[292]

---

[291] Hökmü islamın faydası: Biz ona müsəlman hökmünü verəcəyimiz zaman İslamın vaciblərini yerinə yetirməyi ondan tələb edəcəyik.Belə olan halda, həmin şəxs müsəlman yaxınlarına onlar da ona varis çıxacaqlar.Əgər həmin şəxs: Mən bunu istehza olaraq dedim,-deyərsə biz onu mürtəd hesab edəcəyik.Onun mürtəd olması ilə əsli küfrü arasında olan fərq, mürtədlik küfrünün rahat buraxılmamasıdır.Əsli küfr isə fərqlidir."(əş-şərhul mumti`, şeyx ibn Useymin:2/19)

[292]Cəmiul ulum val hikəm:1/228,230.

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Peyğəmbər (salləllahu aleyhi və səlləm) hər iki hədisi öz vaxtında demişdir.O, demişdir: "Mən insanlar ilə, onlar "lə iləhə illəllah" kəlməsini deyincəyə qədər savaşmağa əmr olundum." Peyğəmbər bildirmişdir ki, müsəlmanlara qarşı vuruşan kafir bu kəlməni deyəcəyi zaman onun rahat buraxılması vacib olacaq və onun qanı və malı qorunacaq.Daha sonra digər hədisdə savaşın iki şəhadət və iki ibadətə qədər uzanacağını bəyan etmişdir.Peyğəmbər, şübhə yaranmasın deyə bildirmişdir ki, himayənin dolğunluğu və kamilliyi yalnız bununla hasil olur.Çünki adicə iqrar davamiyyətli himayəni təmin etmir. Bəzi səhabələr bunda şübhəyə düşdükləri zaman Əbu Bəkr əs-Siddiq bu şübhəni aradan qaldırmış daha sonra səhabələr onunla razılaşmışlar.Nəticədə bəlli olur ki, insan "lə iləhə illəllah" kəlməsini dediyi zaman o, canını qoruyan mərhələyə qədəm qoymuş olur və onun rahat buraxılması vacib olur.Əgər həmin şəxs bunu tamamlayırsa onun himayəsi gerçək mərhələyə girir əks halda puç olur."[293]

Şeyx Abdul-Lətif bin Abdur-Rahmən bin Həsən (rahiməhullah) demişdir: "Onun (yəni müxalifin), güya ki, şeyximizin İslama daxil olmaq üçün İslamın buyuruqlarını şərt qoyanlardan olduğunu iddia etməsi batildir.İslamın dayağları və digər şeylər İslama girmək üçün deyil İslamın səhih olması üçün şərt qoyulur."[294]

---

[293] Şərhul umdə:2/63.

[294] Misbahu-z-zaləm:358.

Əgər biri: “Lə iləhə illəllah Muhammədun rasulullah”,- deyərsə İslama girər.Daha sonra həmin şəxsdən əməl tələb olunacaq.Həmin əməllərdən biri də, namazdır.Əgər həmin şəxs bunu etməzsə, cumhur sələfin və hədis əhlinin sözünə əsasən kafir olacaq.Onlara bu hədis müəmməlı qalmamışdır. Üstəlik deyərdim ki, onlara müxalif olan şəxslərə həmçinin bu hədis müəmməlı qalmamışdır.İnsanlardan kiminsə bu hədisi, müxalif tək həmin məsələyə dair dəlil gətirdiyini ümumiyyətlə bilmirəm.

*İkinci*: Müxalifin gətirdiyi dəlil üslubuna bənzər söz: Mələklərə yaxud kitablara yaxud qədərə yaxud dirilişə imanın yoxluğunun küfr olmamasıdır.Çünki əgər bu məsələlər imanın zəruri dayağları olsaydı həmin dayağların İslama daxil olma zamanı qeyd edilməsi gərəkli olardı. Çünki müxalifin təbiri ilə desək: “Hər hansı bir şəxsin, bir şeyi səhih edəcək dayağı yaxud şərti buraxıb bir şeyi əmr etməsi icazəli deyil!!”

Bu isə qəti olaraq batildir.Çünki əgər biri şəhadəti dilə gətirərsə icma ilə ona İslam hökmü çıxarılacaq.Bəzən insan hər hansı bir nazil olmuş səmavi kitab yaxud qədərə iman haqqında heç bir şey eşitmir.Buradan məlum olur ki, bunun şəhadətdən kənar qalmasının, onun dayağ yaxud şərt olması yaxud onun tərk edilməsinin haram və ya küfr olması hökmünə heç bir aidiyyatı yoxdur.Namaz və əməl həmçinin belədir.Belə ki, namaz və əməlin İslama dəvət zamanı qeyd edilməməsi, müxalifin yanlış düşündüyü kimi onun dayağ yaxud şərt olmadığını gərəkdirmir.

Habelə namazın və İslamda məlum olan digər vaciblərin vacibliyinə riayət etmək labüddür.Bu riayət etmənin tərk edilməsi yekdilliklə küfrdür.Buna rəğmən Peyğəmbər (salləllahu aleyhi və səlləm) onun yanına gəlib İslama girməyi istəyən şəxslərə namaza və zəkata riayət etmək şərtini qoymurdu.

Daha dolğun olması üçün deyiləcək: Elm əhlindən bəzisi Muhamməddin (salləllahu aleyhi və səlləm) risalətinə şahidlik etmədən adicə "lə iləhə illəllah" deyənlərə İslam hökmünü isbat edir, daha sonra "Muhammədun rasulullah" sözlərini deməyi vacib edirlər. Əgər insan bunu deməkdən imtina edirsə həmin şəxs mürtədə çevrilir.Peyğəmbərin risalətinə şahidlik etməyin islam və imanın dayağı olması ixtilafsız məsələdir.

İmam Nəvəvi (rahiməhullah) demişdir: "Cumhurun qəti olaraq seçdiyi görüş iki şəhadətin labüd olmasıdır.İslam yalnız hər ikisi ilə hasil olur.Bununla belə, imam tədqiqçilərə nisbət olunan digər bir üslubu xəbər vermişdir: Əgər biri şəhadətdən onun etiqadına müxalif olan sözü deyərsə ona İslam hökmü çıxarılar.Ancaq əgər biri şəhadətdən onun etiqadına müvafiq gələn sözü deyərsə ona İslam hökmü verilməz.Belə ki, dualist Allahı təkləşdirdiyi yaxud dinsiz "lə iləhə illəllah" kəlməsini dediyi zaman müsəlmana çevrilir.Ardından ona Muhammədin risalətinə şahidlik etmək ərz edilir.Əgər o, bunu inkar edirsə mürtədə çevrilir. Yəhudi: "Muhammədun rasulullah",-dediyi zaman ona

İslam hökmü çıxarılır.[295] Bu yoldan, yəhudi yaxud nəsraninin bizim dində olan namaza uyğun namazı yaxud bizim şəriətə xas olan hökmü etiraf edəcəyi zaman bunun İslam olması məsələsində ixtilaf xəbər verilir.Demişdir: Tədqiqçilərin böyük qismi bunun İslam olduğuna meyl etmişlər. Qadı Hüseyndən rəvayət edilir ki, o, demişdir: "Müsəlmanı danmaqla kafirə çevirən hər bir şey kafiri ona müxalif olanı etiqad etməklə müsəlmana çevirir.Daha sonra əgər o, təsdiq etdiyindən savayı bir şeyi təkzib edərsə mürtəd olar. Məşhur görüş isə yuxarıda qeyd etdiyimizdir.

Bölmə: İmam Şafii (r.a) İslama daxil olma zamanı kafirin ölümdən sonra dirilişi iqrar etməsi ilə imtahan edilməsini müstəhəb görmüşdür."[296]

Hafiz ibn Həcər (rahiməhullah) demişdir: "Bu rəvayət (yəni Muazın hədisi), Muhammədin risalətinə şahidlik əlavə edilməyincə "lə iləhə illəllah" şəhadəti ilə kifayətlənməyin yetərli olmayacağı üçün dəlil göstərilmişdir.Bu, cumhurun sözüdür.Bəzisi demişdir: Birinci ilə musəlmana çevrilir daha sonra ondan ikinci tələb olunur.İxtilafın faydası isə mürtədlik hökmündə üzə çıxır."[297]

Məgər elm əhlindən olan bu insanlar haqqında onların Muhammədin risalətinə şahidliyi, onun İslama daxil olma

[295] Şeyxul-İslam (rahiməhullah) demişdir: Lakin onlar ixtilaf etmişlər ki, əgər insan: "Şahidlik edirəm ki, Muhamməd Allahın Elçisidir",-sözünü deyərsə bu tövhidə şahidliyi şamil edəcək yoxsa etməyəcək.Yaxud tövhidi iqrar edənlə bunu iqrar etməyən arasında fərq qoyulacaq? Buna dair Əhmədin və digər fəqihlərin məzhəbindən olan üç məşhur görüş vardır.

[296] Raudatu-t-talibin:8/283.

[297] Fəthul bəri:3/359.

zamanı deyilməsinin şərt olmadığı səbəbilə dayaq hesab etmədiklərini demək olar?!

Habelə heç bir adam ölümdən sonra dirilişə iman etməyincə onun imanı doğru olmaz.Bununla bərabər hökmü islam onsuz sabit olur və onun şəhadət kəlməsi ilə birgə dilə gətirilməsi şərt və vacib deyil.Qəti şəkildə bilinmişdir ki, əməlin İslamın səhih olması üçün dayağ yaxud şərt olması ilə onun şəhadət ilə birgə dilə gətirilməsi arasında heç bir bağlılıq yoxdur və müxalifin: Hər hansı bir şəxsin, bir şeyi səhih edəcək dayağı yaxud şərti buraxıb bir şeyi əmr etməsi icazəli deyil,-sözü batildir və əsassızdır.Habelə bu söz, bəzi aşırıya varmış adamların: Şəhadəti dilə gətirən bir şəxsə İslam hökmü yalnız o, yoxlanıldıqdan yaxud namazın vaxtı girdikdə namaz qıldıqdan sonra verilir,- sözünə bənzəyir.

Nəfsi istəklərin insanların başına nə kimi oyunlar açdığına bir bax! Onların bir bidətdən digər bir bidətə, səhlənkarlıqdan ifrata keçdiklərini görə bilərsən.

Mən sanki həmin müxalifin namazı tərk edənin küfrünü deyən cumhur sələfə və hədis əhlinə, şəhadətə namazın qılınması əlavə edilməyincə kafirə müsəlman hökmünün çıxarılmamasını təklif etdiyini görürəm.Əks halda onlara görə namaz dayağ olmayacaq, onun tərki isə küfr sayılmaya-caq.

*Üçüncü*: Kafir İslama daxil olduğu zaman vaciblik zamanında vacibləri yerinə yetirməli olduğu halda ondan vacibləri etmək tələb olunacaq.O, namazın vaxtından bir

rükətə yaxud bir təkbirə yetişəcəyi zaman ondan namazın qılınması tələb olunacaq və həmin insan ondan öncə ona cəm edilən namaz ilə birgə onu qılacaq.Bu, cumhurun görüşüdür.[298] Habelə əgər qadın heyz yaxud nifas halında İslama girərsə namaza çağırılmayacaq.Lakin bu, namazın dayağ olmaması yaxud bunun tərkinin küfr olmaması səbəbilə deyil.Çünki bu, tamamilə başqa məsələdir.Habelə zəkat, oruc və həcc kimi ibadətlər yalnız vacibliyin şərtləri mövcud olandan sonra tələb olunur.

Bu hədis, kitab əhlindən olan şəxsin İslamı qəbul edəcəyi zaman başlı başına buraxılıb əməl vacib olduğu halda əmələ çağırılmayacağını ifadə etmir.Hədis yalnız İslamdan öncə əməlin tələb olunmayacağına dəlalət edir.İnsan İslama girməmişdən öncə namaza çağırılmayacaq.[299] Çünki İslam onun səhih olması üçün şərtdir.Habelə insan namaz qılmamışdan öncə zəkata çağırılmayacaq.Çünki əgər o, namazı iqrar etməzsə kafir olar və onun malı qənimətə çevrilər və zəkat olaraq ona heç bir fayda verməz.[300]

Burada tələb olunan sadəcə namazın iqrar edilməsidir yoxsa yerinə yetirilməsi?

Cavab: Tələb olunan adicə onun vacibliyinin iqrarı deyil yerinə yetirilməsidir.Buna Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) gələn növbəti rəvayət dəlalət edir: “Onlara xəbər ver ki, Allah onlara hər gün və gecə beş namazı fərz

---

[298] əl-Muğni:1/441.Şeyx ibn Useymin həmin şəxsə yalnız tam namazın gərəkdiyini üstün saymışdır: əş-şərhul mumti`:2/131.
[299] Şərhul umdə, ,Şeyxul-İslam:2/36.Buna Muazın hədisini dəlil gətirmişdir.
[300] Fəthul bəri:3/359.

buyurmuşdur.Onlar namazı qılacaqları zaman onlara xəbər ver ki, Allah onlara zənginlərin mallarından alınıb kasıblara verilən zəkatı fərz buyurmuşdur.”[301]

Bir rəvayətdə: “Bunu edəcəkləri zaman onlara xəbər ver ki, Allah onlara zənginlərin mallarından alınıb kasıblara verilən zəkatı fərz buyurmuşdur.”[302]

Bu, onun növbəti sözlərini açıqlayır: “Əgər onlar sənə bu işdə itaət etsələr”.Habelə burada zəkatın namazdan sonra gəlməsinə səbəb İslamın namazsız səhih olmamasıdır. Nasslar və səhabələrin icması bu sözün doğru olduğuna dəlalət edir.

Əslində bu vaciblər haqqında gələn buyuruq zaman və məkan, habelə mükəlləfin durumu nisbəti ilə fərqli olur.Bu, bir şeydir.Onun yaxud onun bir qisminin küfr olduğuna hökm vermək isə fərqli şeydir.Belə ki, heyzli halda İslama girmiş qadından dərhal namazın tələb olunmaması namazı tərk etməyin küfr olmadığını ifadə etmir.

*Dördüncü*: Müxalifin, əməli tərk edənin təkfir edilməyəcəyinə dair bu hədisi dəlil gətirməsi əsassızdır.Çünki bu məsələdə yer alan çəkişmə, hökmü çatandan və əməli etmək imkanı əldə edəndən sonra əməli tərk edən şəxs ətrafında gedir.Ancaq hər hansı bir ibadəti dərhal yerinə yetirmək üçün yararsız olması yaxud vaciblik vaxtına yetişməməsi səbəbilə əməl etməyə çağırılmayan şəxs çəkişmə mövzusundan kənardır.Bu səbəbdən, əgər bir şəxs əməl etmək imkanı

---

[301] Buxari:7372.

[302] Buxari:1458.Muslim:19.

əldə etmədən öncə ölərsə həmin adam çəkişməsiz müsəlman sayılacaq.Yəhudinin əhvalatı buna misaldır.Burada söhbət bir yaxud iki vaxtda, habelə bir yaxud iki günlük əməli tərk edən barəsində deyil.Əslində müxalif ömür boyu Allah üçün bir səcdə etməyən, habelə fərz və nafilə ibadətlərini yerinə yetirməyən şəxsin müsəlman olduğunu deyir və iddia edir ki, həmin adam daxildə iqrar və tabeçiliyə sahib olur.Üstəlik onun lazım olan qədər qorxu, ümid və sevgi kimi qəlb əməlləri olur.

*Beşinci*: Bu hədisin ravisi olan Muaz namazı tərk edənin küfrünü deyən şəxslərdən biridir.Habelə o, səhabələrin alimləri və fəqihlərindən biridir.Yəmənə dəvətçi və müəllim kimi göndərilən Muaz bu hədisdə gələn mənanı anlamaqda insanların ən ləyaqətlisidir.Bununla belə Muaz müxalifin anladığı kimi namaza dəvətin şəhadətin vaxtından təxirə salınmasını namazı tərk etməyin küfr olmadığını, üstəlik bütün əməli tərk etməklə birgə İslamın sabit qalacağını anlamamışdır!!

Muazın namazı tərk edənin təkfir ediləcəyi haqqında görüşünü bir sıra imamlar xəbər vermişlər.Onlardan: İbn Hazm, Munziri, Abdul-Haqq əl-İşbili, ibnul-Qayyim və qeyriləridir.

Munziri (rahiməhullah) demişdir: Əbu Muhamməd ibn Hazm demişdir: "Ömər, Abdur-Rahmən bin Auf, Muaz bin Cəbəl, Əbu Hureyra və digər səhabələrdən (radıyəllahu anhum əcməin) gəlmişdir ki, əgər biri qəsdən və vaxtı çıxana qədər bir

fərz namazını tərk edərsə kafir və mürtəd olar.Biz həmin səhabələrə müxalifin olduğunu bilmirik.

Hafiz Abdul-Azim demişdir: Səhabələrdən və onlardan sonra gələnlərdən bir toplum insan qəsdən və bütün vaxtı çıxana qədər namazı tərk edənin təkfir ediləcəyi görüşünü seçmişlər.Onlardan: Ömər bin Xattab, Abdullah bin Məsud, Abdullah bin Abbas, Muaz bin Cəbəl, Cabir bin Abdullah və Əbu Dərdadır (Allah onların hamısından razı olsun)."[303]

İbnul-Qayyim (rahiməhullah) demişdir: "Artıq bunun mislində olanı Muaz bin Cəbəl, Abdur-Rahmən bin Auf, Əbu Hureyradan qeyd edilmişdir.Hər hansı səhabədən onlara müxalif olması isə bilinmir.

Hafiz Abdul-Haqq əl-İşbili (rahiməhullah) "əs-salət" kitabında demişdir: "Səhabələrdən və onlardan sonra gələnlərdən bir toplum şəxs qəsdən və bütün vaxtı çıxana qədər namazı tərk edənin təkfir ediləcəyi görüşündə olmuşlar.Onlardan: Ömər bin Xattab, Muaz bin Cəbəl, Abdullah bin Məsud, ibn Abbas, Cabir və Əbu Dərdadır. Habelə bu görüş Əli bin Əbu Talibdən rəvayət edilir.Bunların hamısı səhabələrdəndir."[304]

---

[303] ət-Tərğib va-t-tərhib:1/22.Habelə: "əs-salətu va hukmu tərikihə, ibnul-Qayyim: 29,43" kitabına bax.

[304] əs-Salətu va hukmu tərikihə, ibnul-Qayyim:43-cü səh.

Bu məsələdə müxalif olanların çoxu aşağıda göstərilən əqli şübhələri gətirmişlər:

1-İmanın söz, əməl və niyyət olduğuna və üçündən birinin digər birisiz yetərli olmayacağına dair Əhli sunnənin icmasını şübhə altına qoymaq.

2-Zahir ilə daxil arasında olan bağlılığı, onun gerçəyindən və mənasından çıxarıb həmin bağlılığı "tələzum"u qəlbdə olan kamil iman çərçivəsində etmək.Məhz bu, ona görə əməli gərəkdirir.İmanın özəyinə gəldikdə isə, ona görə onunla zahiri əməl arasında heç bir bağlılıq yoxdur.

3-Şeyxul-İslamın "tələzum" məsələsinə dair dedikləri sözlərə istinad edib ona görə imanın söz və əməl olmasını və tək əməlin yoxluğunun daxili özəyi pozmadığını iddia etməsidir.

4-Müasir alimlərin "əməl imanın kamillik şərtidir" sözünün, murciələrin sözü olduğunu qeyd etmələrinə narazıçılıq və etiraz etmək.

Əqli şübhələr qeyd edilən bu ümumi mənalar ətrafında cərəyan edir.Həmin əqli şübhələr tədqiqat və araşdırmadan sonra on şübhədə öz əksini tapmışdır.

Bu şübhələrə nəzər saldığım zaman onun əsas mənbəyinin yaramaz anlayış tərzi yaxud pis niyyət yaxud hər ikisi olduğunu gördüm.Əsasən birinci olur.Müvəffəq olan isə Allahın müvəffəq etdiyi şəxsdir.Allahın nur bəxş etmədiyi şəxsin isə ümumiyyətlə heç bir nuru yoxdur.

# Birinci şübhə:

Onlar demişlər: Sələf: “iman, söz və əməldir”,- dedikdə mütləq (kamil) imanı bəyan etmək məqsədini güdmüşlər. Sözü və əməli şamil edən məhz budur.İmanın doğru olması üçün gərəkli olan imanın mütləqinə (özəyinə) isə əməl daxil deyil.Çünki o, təsdiq, habelə qəlb əməli və dil sözüdür.

Onların bu məsələdə olan əsası, sələfin bu sözü əməli tərk edənin kamil mömin olduğunu iddia edən murciələrə cavab əsnasında deməleridir.Sələf isə öz növbəsində bəyan etmişlər ki, kamil imanda əməlin olması labüddür.[305]

*Buna bir neçə yöndən cavab veriləcək*:

[305] Bu, müxaliflərdən bir neçəsinin qeyd etdiyi şübhədir.Onlardan biri Şeyxul-İslamın bədən əməllərinə dair “o, mütləq imanın yığımından bir şöbə və onun bir hissəsidir” sözlərini dəlil gətirib ardınca demişdir: “İtaətlər və asiliklər olan zahiri əməllər varlığı və yoxluğu etibarı ilə imanın mütləqi (özəyi) ilə deyil mütləq imanla (kamil imanla) əlaqəlidir.Buna fikir ver.”Digər yerdə isə bu sözlərə əlavə edərək demişdir: “Dedik: Şeyxul-İslamın bir sıra yerdə qeyd etdiyi kimi kamillik olan mütləq imanın yoxluğu isə özəy olan imanın mütləqinin getməsini gərəkdirmir.”bitdi.

Dedim: Onların Şeyxul-İslamdan anladıqları sözlərə dair irəlidə müfəssəl cavab gələcək.İnşallah bu, sonuncu fəsildə olacaq.Lakin mən ağıl sahibi üçün gizli qalmayacaq bir məsələni vurğulamaq istərdim.Belə ki, dil sözü həmçinin mütləq imanın şöbələrindən biridir.“İmanın şöbələri” hədisi buna bariz nümunədir.Elə isə müxalifin sözünə əsaslansaq dil sözünün, varlığı və yoxluğu etibarı ilə mütləq imanla (kamil imanla) əlaqəli olduğunu və mütləq imanın yoxluğunun imanın mütləqinin yoxluğunu gərəkdirməyəcəyini demək lazım olacaq?! Müxalifin diqqətindən yayınmışdır ki, qəlb təsdiqi həmçinin mütləq imanın şöbələrindən biridir.Məgər əməllər haqqında deyiləni təsdiq haqqında demək doğrudur?!

*Birinci*: Sələf imanın söz və əməl olması sözləri ilə kifayətlənməmişlər.Bu səbəbdən, onların burada kamil imanı yaxud imanın özəyini yaxud başqa şeyi qəsd etmələri deyilə bilməz.Onlar məqsədlərini bəyan edərək: Söz əməlsiz yetərli deyil və əməl yalnız sözlə qəbul edildiyi kimi həmçinin söz yalnız əməl ilə qəbul edilir,-demişlər.Habelə demişlər: Əməl qəlbdə imanın olduğunu təsdiq edir.Əməl olmadığı zaman isə bu, qəlbdə imanın olduğunu deyənin sözünü təkzib edir.Habelə demişlər: Əgər biri sözlə təsdiq edib əməli tərk edərsə yalançı və imandan çıxmış olar. Habelə demişlər: Əgər o, əməlsiz söz olarsa küfr olar.Şeyxul-İslam bunu Səhl ət-Təstəridən nəql etmiş və bu sözə öz iradını bildirməmişdir.[306] Onlar əməlin imanda olan yerini dodağların dildə olan yeri kimi etmişlər.Çünki ağızdan çıxan söz yalnız onların hər ikisi ilə mümkündür.Həmçinin demişlər: Əməlin düşməsi ilə iman gedir.Həmçinin öz aydınlığı ilə seçilən başqa sözlər.[307] Əgər məsələ müxalifin qeyd etdiyi kimi olsaydı əməlin tərki küfr olmaz və sözün qəbul edilməsi əmələ dayanmazdı.

*İkinci*: Murcilər Əhli sunnəyə bir sıra məsələlərdə müxalif olmuşlar:

1-Onlar iddia etmişlər ki, əməl yetərli yaxud kamil imandan deyil.

---

[306] Yuxarıda əl-Əcurri və ibn Battadan nəql olunan xəbərlərə bax.

[307] Bu nəqllərə üçüncü bölümün üçüncü fəslində bax.

2-Onlar iddia etmişlər ki, zahir ilə daxil arasında heç bir bağlılıq yoxdur və bədən əməlləri olmadan insanın qəlbində tam və kamil imanın olması mümkündür.

3-Onlar iddia etmişlər ki, iman artıb azalmayan və istisna edilməyən bir şeydir.Lakin qeyd edildiyi kimi onlardan bəzisi bunu isbat etmişlər.

4-Onlar iddia etmişlər ki, küfr əməl ilə olmur və yalnız inkar və təkzib yaxud onlardan olan tayfaya görə inadkarlıqla olur.

Əhli sünənin sözü, öz qısalığı və möhkəmliyi ilə birgə onların etiqadını bəyan etməkdə və əleyhdarlara cavab verməkdə dolğun şəkildə ortaya qoyulmuşdur.Onların: İman söz və əməldir,-sözü ilk olaraq buna dəlalət edən nasslar üzərində qurulmuş və əksər sözlərində murciələrə cavab verməyə köklənmişdir.Onların bu sözünə: Artır və azalır və onda istisna edilir,- sözü əlavə edildiyi zaman murciələrin, üstəlik xəvaric və mötəzili kimi digərlərin bütün sözlərinə cavab olmuşdur.

Belə ki, insanın: Onlar bu sözü deməklə murciələrə rəddiyyə vermək istəmişlər.Çünki murciələr əməlsiz kamil imanı isbat edirlər,-deməsi haqsız nəticə və heç bir dəlilə dayanmayan iddiadır.Çünki digəri deyə bilər ki: Onlar murciələrə hər iki məsələdə rəddiyə vermişlər.Çünki murciələr əməlsiz səhih və kamil imanın olduğunu iddia etmişlər. Bu səbəbdən, onlar əməlin labüdlüyünü bəyan edib bunu qeyd edilən açıq-aydın ifadələr ilə vurğulamışlar.

Misal üçün onlar demişlər: "Yetərli deyil." "Faydasızdır." "Qəbul edilmir."

Bir sözlə, müxalif iddia etdiyi şeyə heç bir səhih dəlil gətirməmişdir.O, yalnız etiqad etmiş daha sonra sələfin sözlərini anlamaq və yozmaqda özünü çətinə salmışdır.[308] Habelə mən bu məsələyə dair Şeyxul-İslamdan gələn və söz və əməlin mütləq imanı şamil etdiyini ifadə edən sözləri dəlil gətirdiyini görmüşəm.Əslində isə bu sözlərdə onlar üçün heç bir dəlil yoxdur.Habelə bu sözlər ilə bizim: İmanın mütləqində əməlin olması labüddür,-sözlərimiz arasında heç bir ziddiyyət yoxdur.Çünki imanın mütləqi yaxud cəhənnəmdə əbədi qalmaqdan qurtaran imanda təsdiqin özəyinin, qəlb əməllərinin özəyinin, dil sözünün və bədən əməlinin özəyinin yaxud itaətin özəyinin olması labüddür. İrəlidə qeyd ediləcəyi kimi bu, Şeyxul-İslamın təbiridir.

Mütləq iman isə bu dayağlardan ibarət ən uca kamilliyi şamil edir.Ora bütün zahiri və daxili söz və əməllər daxil olur.

*Üçüncü*: Müxalifin sözünə əsasən zahiri əməl daxili imanın zəruri amili deyil səmərəsidir.Onun sözünə əsasən əməlsiz qəlbdə daxili imanın səhih və yetərli olması mümkündür.Bu, murciələrin gerçək sözüdür.Çünki murciələr zahiri əməlin daxili imanın səmərəsi olmasında çəkişmirlər. Habelə onlar əməli tərk edənin cəzaya layiq olduğunu

[308] Beşinci şübhəyə cavabda İbn Təlməsəni, Qastaləni, Nəfravi kimi bu cür yozumda müxalifi qabaqlayanların sözləri qeyd ediləcək.Qeyd edək ki, onların hamısı əşarilərdir.

çəkişmirlər.Onlar yalnız əməlin zəruri amil və daxili imandan ayrılmaz olması məsələsində çəkişirlər.

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Murciələr qəlbdə olan imanın itaətə sövq etdiyini və bunu tələb etdiyini, habelə itaətin onun səmərəsi və nəticələrindən olmasını çəkişmirlər.Onlar yalnız itaətin zəruri olması məsələsində çəkişirlər."[309]

Buna güc qatan amillərdən biri də, Şeyxul-İslamın, imanın söz və təsdiq olduğunu deyən şəxsin "ləzim"in yoxluğunun "məlzum"un yoxluğunu ifadə edəcək surətdə zahiri əməlin daxili imanın zəruri amili və ondan ayrılmaz olduğunu iqrar edəcəyi təqdirdə ixtilafın ləfzi olacağını hesab etməsidir.[310]

Bu isə, əməlin imana daxil olmasında gələn mənanın, onun yalnız imanın kamilliyi ilə deyil həmçinin özəyi ilə bağlı olan bir hissəsi yaxud zəruri amili olmasını bəyan edir.

Müxalifin sözlərinə diqqət yetirəcəyin zaman həqiqətdə onun zahir ilə daxil arasında olan bağlılığı isbat etmədiyini görəcəksən. Həmin şəxs bədəndə öz əksini tapacaq mümkün əməllərin yoxluğu ilə qəlbdə təsdiq və sevginin olduğunu təsəvvür edir.Üstəlik o, bütün ömrünü yaşayıb Allah üçün bir səcdə belə etməyən, Onun üçün heç bir itaəti yerinə yetirməyənin təsdiqə sahib olub daxilən tabe və təslim olduğunu təsəvvür edir.

---

309 Məcmu`əl-fətəva:7/50.

310 Buna dair ətraflı izah üçün birinci hissəyə bax.

Belə ki, onlar deyirlər: Əgər insan təsdiq edər, dil ilə deyər və qəlb əməlinə sahib olarsa daha sonra bütün bədən əməllərini tərk edib hətta yüz il olsa belə bu hal üzərə yaşayar, bütün haramları işlədər və digər vacibləri tərk edərsə, bununla bərabər İslamı pozan heç bir amil işlətməzsə həmin şəxs müsəlman olaraq qalacaq.Çünki həmin şəxs təsdiq və qəlb əməli kimi imanın özəyinə sahibdir.

Bununla da, onlar özləri etiraf edirlər ki, qəlbdə olan imanın özəyinin bütün bədən əməllərinin tərk edilməsi ilə birgə mövcud və davamiyyətli olması təsəvvür edilə bilər. Bu isə, heç şübhəsiz ki, "tələzum"u inkar etmək anlamına gəlir.[311]

Müxalif bu nəticənin onun gerçək sözünün mənası olduğunu anladığı zaman iddia etmişdir ki, "tələzum" yalnız kamil imanda olur.Təsdiq və əməl olaraq qəlbdə olan imanın özəyi bədən əməllərindən heç bir şeyi zəruri etmir. Bu isə digər bir şübhə, haqsız nəticə və heç bir dəlilə dayanmayan iddiadır.Bu şübhəyə irəlidə cavab gələcək.

*Dördüncü*: Şeyxul-İslam (rahiməhullah va əskənəhu fəsiha cənnətih) insanlar içərisində sələfin və imamların sözlərini ən yaxşı bilən şəxsiyyətdir.O, isə bir sıra yerdə bu icmanı namazı tərk edənin, habelə zahiri əməli tərk edənin küfrünə dəlil gətirmişdir.Onun dediyi sözlərdən bəzisi: "Habelə Əhli sunnə vəl cəmaata görə iman söz və əməldir.Buna Quran, sunnə və sələfin icması dəlalət edir. Həmçinin bu, yerində

[311] Əslində bəla bu sözü filankəsin deməsi deyil.Lakin həqiqi bəla bu sözün sələfə nisbət olunmasıdır.

öz təsdiqini tapmış məsələdir.Belə ki, söz, Peyğəmbəri təsdiq etmək, əməl isə sözü təsdiq etməkdir.Bu üzdən, insan bütövlüklə əməldən kənar düşəcəyi zaman mömin olmayacaq.

İnsanı möminə çevirən söz xüsusi bir sözdür ki, o da şəhadət kəlməsidir.Əməl isə namazdır.

Həmçinin dinin gerçəyi itaət və boyun əymədir.Bu isə yalnız söz ilə deyil həmçinin əməl ilə tamamlanır.Allah üçün heç bir əməl etməyən şəxs isə Allahın dininə boyun əyməmişdir.Dini olmayan isə kafirdir." [312]

Əgər əməl yalnız kamil iman ilə əlaqəli olsaydı, onun tərk edilməsi küfr olmaz və bu icmanı namazı tərk edənin küfrü üçün dəlil gətirmək icazəli olmazdı.

Habelə Şeyxul-İslam (qaddəsəllahu ruhahu) demişdir: "Bu məsələnin iki tərəfi vardır: Birinci: Zahiri küfrün isbatına dair. İkinci: Daxili küfrün isbatına dair.

Məsələnin ikinci tərəfi, qeyd edildiyi kimi imanın söz və əməl olması üzərində qurulur.Bir insanın Allahın ona namazı, zəkatı, orucu və həcci vacib etdiyinə qəlbində sabit imanla inandığı bir halda Allah üçün ömründə bir dəfə olsun səcdə etməməsi və Allahın buyurduğu zəkat və həcc kimi ibadətləri yerinə yetirməməsi qeyri-mümkündür.Bu qeyri-mümkündür.Bunu doğru iman sahibindən yox, yalnız qəlbdə zındığlıq və nifaq olan şəxsdən gözləmək olar."[313]

---

[312] Şərhul umdə:2/86.

[313] Məcmu`əl-fətəva:7/611.

Şeyxul-İslam, bütün ömrünü yaşayıb bu əməllərdən heç birini yerinə yetirməyən şəxsə daxili küfrün isbat edilməsini imanın söz və əməl olması məsələsi üzərində qurmuşdur.Bu cür dəlilin gətirilməsi yalnız əməlin (imanın mütləqinə) yaxud küfrdən qurtaracaq miqdarda olan imana daxil ediləcəyi zaman dolğun olacaq.Bu səbəbdən sələfin: İman, söz və əməldir,-sözünə mütləq, kamil iman daxil olduğu kimi həmçinin imanın mütləqinin daxil olması doğru olmuşdur.Bunların hər ikisində əməlin olması labüddür.

Şeyxul-İslam (rahiməhullah) buna bənzər demişdir: "Artıq bəlli olmuşdur ki, dində söz və əməlin olması labüddür və insanın namaz, zəkat, oruc və başqa vaciblərdən olan zahiri vacibləri yerinə yetirməyəcəyi halda dili yaxud dili və qəlbi ilə Allaha və Elçisinə iman gətirməsi qeyri-mümkündür. Əgər fərz edilərsə ki, insan əmanəti əda etmək, doğru danışmaq, bölgü və qərarlarda ədalətli olmaq kimi vacibləri Allahın bunu vacib buyurduğu səbəbilə deyil və Allaha və Elçisinə iman gətirmədən edərsə bununla küfrdən çıxmış olmayacaq.Çünki müşriklər və kitab əhli bu işlərin vacib olduğunu hesab edirlər.Lakin insan Muhammədə (sal-ləllahu aleyhi və səlləm) xas olan vaciblərdən heç bir şeyi yerinə yetirməzsə, Allaha və Elçisinə iman gətirmiş olmaz."[314]

Bu, öncəki kimi göstərir ki, Şeyxul-İslam sələfin: İman söz və əməldir,-sözlərindən imanın səhih olması üçün əməlin labüd olduğunu və onun bəndəni qurtaracaq imanın mütləqinə daxil olduğunu anlayır.Məhz bu səbəbə görə

[314] Məcmu`əl-fətəva:7/621.

Şeyxul-İslam əməli tərk edənin təkfir ediləcəyi qənaətinə gəlmişdir.

*Beşinci*: Şeyxul-İslam bildirmişdir ki, əgər kafir təsdiq edib dili ilə iqrar edərsə həmin bu təsdiq daxili əməl ilə, dil sözü isə zahiri əməl ilə birləşməyincə bu, ona heç bir fayda verməyəcək.

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Əgər mömin olmayan həmin bilən və danan şəxslərdən biri, yəhudi və başqalarının dediyi kimi: Muhamməd Allahın Elçisidir!-deyərsə, bu, onların biliyinə uyğun gələn adi xəbər verməni ifadə edəcək.Uca Allah onlar haqqında buyurur: *"Kitab verdiyimiz şəxslər onu öz oğullarını tanıdıqları kimi tanıyırlar. Həqiqətən də, onlardan bir dəstə haqqı bilə-bilə gizlədir."*[315] Lakin adi elm onlara fayda vermədiyi kimi həmçinin adi xəbər vermə onlara fayda vermir.Daxildə olan elm ilə onun tələbi olan sevgi, təzim, tabeçilik və buna bənzər əməllərin bir arada gəlməsi gərəkdir.Həmçinin zahiri xəbər ilə onun tələbi olan təslimçilik, tabeçilik və itaətin özəyinin bir arada gəlməsi gərəkdir."[316]

Bu dörd dayağın olması labüddür.Zahiri əməl isə onlardan biridir.Şeyxul-İslam onu "itaətin özəyi" olaraq ifadə etmişdir.Bu isə, çox dəqiq təbirdir.Onun (rahiməhullah) bu dörd dayağın varlığını şərt qoyması, heç şübhəsiz ki, sələfin: İman, söz və əməldir,-sözünə izah verməsidir.Bu səbəbdən,

---

[315] əl-Bəqərə:146.
[316] ət-Tis`iniyyə:2/673.

zahiri və daxili sözün, habelə zahiri və daxili əməlin olması labüddür.

*Altıncı*: Artıq səhabələrin namazı tərk edənin təkfir ediləcəyinə dair icması xəbər verilmişdir.Bu isə, bədən əməllərinin onlara görə imanın səhih olması üçün labüdlüyünə dəlalət edir.Belə olan halda əməl, insanı əbədi cəhənnəmdən qurtaran imanın mütləqinə yaxud yetərli qədərinə daxil olur.

*Yeddinci*: İmanın söz və əməl olması sözü, səhabə, tabiin və imamlardan olan Əhli sunnənin icma etdiyi bir sözdür. Müxalif isə deyir: Onlara görə iman yalnız mütləq imana daxil olur vəssalam! İmanın mütləqi isə bütün bədən əməlləri olmasa belə səhih olur.

Deyiləcək: Artıq bilinmişdir ki, sələf və hədis əhlinin cumhuru namazın tərkini küfr hesab edirlər.[317]Bu söz isə "iman, söz və əməldir" onların arasında geniş yayılmışdır. Üstəlik onlar həmin sözü deyən və yayan insanlardır.Belə olan halda onlara görə əməlin yalnız vacib kamilliklə bağlı olduğunu iddia etmək nə dərəcədə doğrudur? Əslində isə namaz kimi əməldən bəzisi onun özəyinə daxildir.Onu tərk edən şəxs isə müsəlman deyil.

Əgər müxalif insaflı olsaydı, məsələn belə deyərdi: Bədən əməlləri yalnız namazın tərkini küfr hesab edən sələfin cumhuruna görə imanın özəyinə daxildir.Çünki onlar

---

[317] Qeyd edildiyi kimi o, səhabələrin icmasıdır.Lakin burada söhbət həmin icmanı qəbul etməyən müxaliflə güzəşt misalında gedir.

namazı labüd olan tövhiddən edirlər.Bunun tərki isə küfrdür.

Habelə əgər insaflı olsaydı belə deyərdi: Bütövlüklə bədən əməllərini tərk edən yalnız namazı tərk edəni təkfir edən sələfin cumhuruna görə kafir olur.

Habelə deyərdi: "İmanın söz və əməl" olması sözü ilə, namazın tərkini küfr hesab edən cumhur sələfə görə yetərli imanın tərifi qəsd edilir.

Lakin o, bunu deməmiş və daha da uzağa gedərək demişdir: "Bütün sələf bədən əməllərinin imanın özəyi deyil imanın kamilliyindən olduğuna icma etmişlər."[318]

Sonra isə daha da irəli gedərək əməli imanın özəyinə daxil edənlər barəsində demişdir: "Əslində isə onlar, hiss etsələr də hiss etməsələr də, bununla xəvaric və mötəzilənin məzhəbini dirçəldirlər."[319]

Dedim: Həqiqətən də, bunların yazdıqları bu yazılar böyük müsibətlərə yol açmışdır!

Məgər yazar, sələfin namazı tərk edənin hökmünə dair görüşünü bilmir?

İmam Muhammməd bin Nəsr əl-Mərvəzi (rahiməhullah) demişdir: "Bu, hədis əhlinin cumhurunun görüşüdür."[320]

---

[318] Şərhu əlfazı-s-sələf fil imən:344.Təaccüb doğurur ki, həmin şəxs özündən əvvəl heç bir şəxsdən bu icmanı nəql etməmişdir.Əslində heç bunu edə bilməzdi!
[319] Öncəki.
[320] Tə`zımu qadri-s-salət:2/936.

Şeyxul-İslam (rahmətullahi aleyhi) demişdir: "Namazı tərk edənin təkfir edilməsi səhabə və tabiindən olan sələfin cumhurundan məşhur görüşdür."[321]

Habelə demişdir: "Sələfin çoxu onun kafir olaraq öldürüləcəyini demişlər.Bütün bunlar isə onun vacibliyini iqrar etməsi ilə birgə olmuşdur."[322]

Əgər deyilərsə ki: Bu sual sizin sözünüzü həmçinin rədd edir.Çünki siz: Bütövlüklə bədən əməllərinin tərk edilməsi küfrdür,- dediyiniz zaman yaxud: Bədən əməli imanın səhih olması üçün labüddür,-dediyiniz, habelə buna dair icmanın olduğunu iddia etdiyiniz zaman namazın tərk edilməsinə dair baş vermiş məşhur ixtilafı necə nəzərinizdən qaçırmısınız?

Cavab: Biz bunu nəzərimizdən qaçırtmamışıq.Lakin sələfdən namazı tərk edəni təkfir etməyənlər bütün əməlin tərk edilməsinin küfr olmayacağını deməmişlər.Habelə onlar imanın qəlbdə təsdiq və tabeçilik olaraq yer almasını daha sonra bunun ümumiyyətlə bədən əzalarında üzə çıxmamasını mümkün saymamış və bunu deməmişlər.Əgər biri icmanın xəbər verildiyi əsirdə yaxud öncəki vaxtda bundan bir şeyə rast gələrsə bizə bunu xəbər verməkdə xəsislik etməsin.

Biz isə namazı tərk edənin küfrünə dair səhabələrin icmasına qəti əminik.Bu isə öz növbəsində, bədən əməllərinin imanda labüd olması və onun bütövlüklə tərk edil-

[321] Məcmu`əl-fətəva:20/97.

[322] Məcmu`əl-fətəva:28/308.

məsinin küfr olması məsələsində dediyimiz üçün yetərlidir. Çünki o, namazın tərk edilməsi və əlavədir.Üstəlik həmin külli tərk etmə qəlb əməlinin fəsada uğramasına bir dəlildir.

Əlavə olaraq biz deyirik: Səhabələrdən sonraki Əhli sunnədən namazı tərk edənin təkfir edilməyəcəyini deyənlərin sözlərində bütövlüklə əməlin tərk edilməsinin küfr olmadığına rast gəlinmir.Üstəlik biz qəti əminik ki, onlar digər Əhli sunnə ilə birgə əməlin imanda labüd olmasını və imanın onsuz səhih olmayacağını deyirlər. Yuxarıda qeyd edildiyi kimi şeyximiz Abdul-Əziz bin Bəz bunu açıq bildirmişdir.

# İkinci şübhə:

## İmanın özəyi və şaxəsi ətrafında

Bu şübhənin əsas nöqtəsi, sələfin imanın şöbələri arasında fərq qoymaları və ondan bəzisini özəy bəzisini isə şaxə etmələridir.Şaxə isə özəy kimi deyil.Şaxə burada bədən əməlləridir. Əməlin imanın özəyindən olması deyilsəydi bu fərqləndirmə mənasız olardı.

***Buna bir neçə yöndən cavab veriləcək:***

***Birinci***: Biz imanın özəy və şaxədən ibarət olmasında çəkişmirik.Lakin biz şaxə adlanan şeylərin yoxluğunun icazəli olması və özəyin onsuz səhih olması məsələsində çəkişirik.Biz deyirik: O, şaxə olsa belə yenə də o, zəruri şaxə-dir və onsuz daxili imanın olması təsəvvür edilməzdir.Bu, öncə dəfələrlə vurğulandığı kimi adətən bilinən hallarda olur.Əhli sunnədən imanı özəy və şaxəyə bölənlərin sözlərində isə bütövlüklə şaxəni tərk etməyin küfr olmadığı mövcud deyil.

*İkinci*: Sələf və imamlardan imanı özəy və şaxəyə bölən-lər özəyin və şaxənin dəqiq müəyyənləşməsi məsələsində yekdilliyə gəlməmişlər.Onlardan bəzisi dil sözünü özəydən etmişdir.Bu, ibn Mandəh və Mərvəzinin görüşüdür.Bir

qismi isə dil sözünü şaxədən etmişdir.Bu, bir neçə yerdə qeyd etdiyi kimi Şeyxul-İslamın görüşüdür.[323]

Bəzən isə Şeyxul-İslam onun şaxə olmasında əminlik ifadə etmir və məsələni ehtimallara buraxır.Sanki bu hərəkət, onun sözü imanda özəy edənlərlə müvafiq olmasını bildirir. Şeyxul-İslam (rahiməhullah) demişdir: “Mömin, qəlbi və bədən əzaları ilə Allaha iman gətirən şəxsdir.Onun imanı, qəlbinin elmi ilə qəlbinin halı arasında, qəlbinin təsdiqi ilə qəlbinin itaəti arasında cəm edir.Habelə imanın özəyi qəlbdə yaxud qəlb və dildə olduğu halda belə dil sözünü və bədən əməllərini cəm edir.İnsanın qəlbində Allahı təsdiq etmənin və Ona təslimçiliyin olması labüddür.Biri qəlbinin sözü digəri isə Allahı iqrar etmə olan qəlb əməlidir.”

Nəhayət demişdir: “Əgər bura həmçinin dil sözü və bədən əməli daxil olarsa, belə olan halda səhih şaxələrin varlığı özəylərin varlığını gərəkli edəcək.Bu bəlli məsələdir və burada onun haqqında geniş danışmaq məqsədi güdülmür.”[324]

Müxalifin sözünə və qoyduğu qaydaya əsaslansaq, deyəcəyik ki, Şeyxul-İslam sözü (lə iləhə illəllah kəlməsini) tərk edənin qurtulacağını deyir.Çünki o, bunu imanın özəyi deyil şaxəsi edir.

Gizli deyil ki, bu yaramaz görüşdür və bunu heç bir vəchlə Şeyxul-İslama nisbət etmək mümkün deyil.Bu, heç cür mümkün deyil.Çünki Şeyxul-İslam özü, iqtidarında

---

[323] Buna dair ətraflı birinci hissəyə bax.

[324] Məcmu`əl-fətəva:2/382.

olduğu halda şəhadəti tərk edənin həm zahirən həm də daxilən kafir olacağına icma hekayət edir.

Bununla da, aydın olur ki, “söz”ün şaxə yaxud özəy adını daşıması onu tərk edənin küfr yaxud İslam hökmü ilə heç bir əlaqəsi yoxdur.Fərz edilsə ki, o, şaxədir, onun zəruri şaxə olması və özəyin onsuz səhih olmaması deyiləcək. Zahiri əməl həmçinin belədir və burada heç bir fərq yoxdur.Onun bütövlüklə tərk edilməsi küfrdür və onun özəy yaxud şaxə adlanması gerçəyi dəyişmir.

***Üçüncü***: Namaz “şaxə”[325] adlanan bədən əməllərindən biridir.Səhabələrin onun tərk edilməsinin küfr olmasına dair icması bağlanmışdır.Nəticədə bir şeyin şaxə yaxud özəy adlanmasından küfrün yalnız özəyin təkr edilməsi ilə məhdud olmaması məlum olmuşdur.

Səhabələrin icmasını adlayacağımız zaman müxalifin imam İbn Mandəhdən nəql etdiyi xəbər ilə kifayətlənəcəyik. İmamın (rahiməhullah) bədən əməlini şaxə adlandırmasına rəğmən o, namazı tərk edənin kafir olacağını deyənlərdən biridir.Bədən əməli şaxə adlansa belə bu, açıq-aydın bir məsələdir.Onun tərk edilməsi səbəbilə təkfir etmək isə tamamilə başqa məsələdir.

***Dördüncü***: Artıq qeyd etmişik ki, zahiri əməl daxili imanın zəruri amilidir və ondan ayrılmazdır.Habelə “ləzim” gedəcəyi zaman “məlzum” gedəcək.Buradaki məsələnin ger-

---

[325] Şeyxul-İslam onu şəhadətə birləşik olan dinin və imanın əsaslarından etmişdir.İrəlidə buna dair açıqlama gələcək.

çəyi, bütövlüklə zahiri əməli tərk edənin özəy olan qəlb əməlini tərk etməsidir.

Müxalif isə bu bağlılığı "tələzum"u dərk etməkdə acizdir.Habelə o, ona təslim olmaqdan üz çevirir.Əgər o, bu sözə hidayət olunsaydı ondan bu şübhələr qalxar, habelə o, Əhli sunnənin sözünə yol tapar və onların icması önünə insanların ixtilaf etdikləri, üstəlik gördüyümüz kimi bir şəxsdən varid olan fərqli ifadələr və adlardan tutunmazdı.

*Beşinci*: Özəy ilə şaxə arasında qoyulan fərqin səmərəsi, həmin dörd hissəyə nəzər yetirməklə, habelə bu dörd hissədən hansı birinə üzürün daxil olacağını təsəvvür etməklə bilinir.Məsələn, dil ilə tələffüzə üzr daxil olur. Çünki insanlardan danışmaq iqtidarında olmayan lal adamlar vardır.Bədən əməllərinə həmçinin üzr daxil olur. Buna misal olaraq, iman gətirib əməl etmək imkanı qazanmamışdan öncə dərhal ölən şəxsi göstərmək olar.

Təsdiq və qəlb əməlini tərk edənin isə heç bir vəchlə üzürü ola bilməz.[326]

Bu, ümumi şəkildə dörd dayağa nəzər salmaq vasitəsilə özəy ilə şaxə arasında fərq qoymağın səmərəsidir.Habelə ayrı-ayrı əməllərə nəzər salmaqda öz əksini tapan digər bir səmərə vardır.

Buna dair açıqlama: Mükəlləf cəhətindən vacib ilə iki məsələ əlaqəli olur:

---

[326] Artıq Şeyxul-İslam (rahiməhullah) qəlb əməllərindən bəzisinin, mükəlləf qəsd etməsə belə təsdiq üçün zəruri olduğunu qeyd etmişdir: məcmu`əl-fətəva:7/16.

Birinci: Onun iqrar edilməsi, vacibliyinin etiqad edilməsi və daxilən ona tabeçiliyin olması.Bu, özəydir.

İkinci: Onun zahirən yerinə yetirilməsi və itaətin hasil olması. Bu isə, şaxədir.Həmçinin özəy və şaxə haram şeylərlə əlaqəli olur.Mükəlləf özəyə sahib olacağı zaman namaz istisna olmaqla həmin şaxəyə sahib olmasa belə onun imanı səhih olacaq.Özəy gedəcəyi zaman isə iman gedəcək.Növbəti ifadə məhz buna aid edilir: Şaxənin tərk edilməsi küfrə müqabil tərəfdə yer almır.Yəni, burada bütün əməllər deyil namazdan savayı ayrı-ayrı əməllər qəsd edilir.

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Üçüncü cəhət: İnsan, Allahın haram buyurduğunu etiqad etməsi, habelə Allahın haram və vacib buyurduğu işlərdə Allaha tabeçiliyi etiqad etməsi ilə birgə günah edəcəyi zaman kafir olmayacaq.Ancaq əgər insan Allahın həmin şeyləri haram etmədiyini etiqad edərsə yaxud haram etdiyini etiqad edər lakin bu haramlığı qəbul etməkdən imtina edərsə və Allaha təslim olub Ona tabe olmaqdan boyun qaçırarsa həmin şəxs danan yaxud inadkar olacaq.Bu səbəbdən deyirlər ki, əgər biri iblis kimi təkəbbürlük göstərərək asi olarsa yekdilliklə kafir olar. Şəhvətinə uyub asi olan şəxs isə Əhli sunnə vəl cəmaata görə kafir olmur.Belə şəxsi yalnız xəvariclər təkfir edir.Təkəbbürlü asikar, Allahın onun Rəbbi olduğunu təsdiq etsə belə onun Allaha qarşı inadkarlığı və ədavəti həmin təsdiqə zidd gəlir."[327]

[327] əs-Sarimul məslul:3/970.

Habelə (rahiməhullah) demişdir: "İnsan yalnız imanın və sevginin zəifliyi səbəbilə haram işlər görür.İnsan haqqa zidd olan məkruh işlər etdiyi zaman bunu, qəlbdə ona qarşı olan müəyyən zəifliyi yaxud həmin məkruhlara olan güclü sevgisi səbəbilə edir.İnsan həm aşkar həm də gizli edilən yaramaz işlər, günah, haqsızcasına zülm etmək, Allahın, haqqında heç bir dəlil nazil etmədiyi bir şeyi Ona şərik qoşmaq və Allaha dair elmsiz söz söyləmək kimi haramlardan olan hər hansı bir şeyi yalnız imanın özəyində yaxud kamilliyində zəif imana sahib olması yaxud elmin və təsdiqin zəif olması yaxud da ki, sevgi və nifrətin zəif olması səbəbilə edir.Lakin imanın özəyi olan təsdiq səhih olacağı zaman mömin həmin haram işləri, ona nifrət bəsləyərək və ondan xoşlanmayaraq edəcək.İnsan həmin haramları şəhvətin onu üstələməsi səbəbilə edəcəyi təqdirdə onun həmin haramları, ona olan nifrətlə etməsi, Allahın bundan ötrü cəzasından qorxması, habelə Onun cəzasından tövbə yaxud yaxşı işlər yaxud əfv yaxud da ki, digər bir şey səbəbilə xilas olacağına dair ümid etməsi labüd olacaq. Ancaq əgər insan haramlara nifrət etməyib Allahdan qorxmaz və Onun rəhmətinə ümid bəsləməzsə onun heç bir vəchlə mömin olması mümkün olmayacaq.Əslində həmin şəxs kafir yaxud münafiq olacaq."[328]

Bu, çox dəyərli sözlərdir.İnsandan, yalnız təsdiqin yaxud sevginin zəifliyi səbəbilə müxaliflik sadir olur.Ancaq bu, bütövlüklə deyil ayrı-ayrı əməllərdə olur.Əgər fərz edilərsə ki, insan güc və imkana sahib olması ilə birgə əməllərdən

[328] Qaidətun fil məhabbə:104.

heç bir şeyi etmir, belə olan halda bu, qəlb əməlinin zəifliyi deyil yoxluğuna dəlalət edəcək.Zahiri əməlin zəifliyi qəlbdə imanın zəifliyinə dəlalət edir.Onun yoxluğu isə yoxluğuna dəlalət edir.Bu məna Şeyxul-İslamın sözlərində geniş istifadəsini tapmışdır. Şeyxul-İslam müxtəlif yerlərdə zahiri əməlin daxili imanın zəruri amili olduğunu, habelə "ləzim" in (zahiri əməlin) yoxluğunun "məlzum"un (daxili imanın) yoxluğuna dəlalət edəcəyini vurğulayır.

Artıq ibnul-Qayyimdən (rahmətullahi aleyhi) növbəti nəql qeyd edilmişdir: "Heç bir maneə olmadan zahirdə əməlin yoxluğu daxilin fəsada uğramasına və imandan kənar düşməsinə dəlildir.Onun naqısliyi isə imanın naqisliyinə dəlildir.Onun güclü olması isə imanın gücünə dəlildir."[329]

Bir sözlə, bədən əməllərinin şaxə adlandırılması, onu bütövlüklə tərk etməyin küfr olmadığını ifadə etmir.Çünki o, zəruri şaxədir.Onun yoxluğu ilə qəlb imanı yoxa çıxır. Habelə özəy ilə şaxə arasında fərqin qoyulmasında səmərələr və faydalar vardır və bu səmərə qeyd edildiyi kimi bütün əməllərə yaxud ayrı-ayrı əməllərə nəzər salmaqla üzə çıxır.

---

[329] əl-Fəvaid:85.

# Üçüncü şübhə:

## Sələfə görə "əl-iczə" anlamı ətrafında

Sələfin növbəti sözləri demələri məşhur olmuşdur: Əməlsiz söz və etiqad yetərli deyil.İmam Şafii (rahiməhullah) səhabə və tabiinlərin icmasını məhz bu tərzdə hekayət etmişdir.Ardından Əcurri (rahiməhullah) Əhli sunnənin icmasını bu tərzdə hekayət etmişdir.Bu isə, bizim məsələmizlə əlaqəli olan ən açıq-aydın dəlillərdəndir.Müxalif bunu gördüyü zaman nə edəcəyi haqqında çaşqınlığa düşmüşdür.Belə ki, o, bəzən icmanın hüccət olması məsələsini şübhə altına qoyub onun hüccət olaraq ixtilaflı "sukuti icma" olduğunu deyir. Bəzən isə deyir: Burada gələn "əl-iczə : yetərlik" kəlməsi kamillik mənasını ifadə edir.Yəni, iman yalnız söz, əməl və niyyətlə kamilləşir.

Nəhayət onlardan birinin anlayış tərzi digər bir mənanı ortaya qoymuşdur.O, demişdir: Burada məqsəd, söz və etiqadın mütləq və kamil imanın gerçəkləşməsi üçün yetərli olmamasıdır.Üstəlik əməlin olması labüddür.

Bu söz, ondan öncəki yozumdan fərqlənmir, üstəlik deyərdim ki, o və ondan öncəki söz eyni şeydir.Yəni, iman yalnız əməl ilə kamilləşir.Lakin imanın hissələrinin kamilliklə yozumu xoşagəlməz təəssürat yaratdığı zaman həmin şəxs bu növ təhrifə əl atmışdır.

*Bu şübhəyə bir neçə yöndən cavab veriləcək:*

***Birinci***: Biz imam Şafii və Əcurrinin (rahiməhuməllah) sözlərini nəql edib həmin sözləri qeyd edən müxalifin dediyinə uyğun gəlib gəlmədiyinə nəzər salacağıq:

İmam Şafii (rahiməhullah) demişdir: "Səhabələr, tabiinlər, onlardan sonra gələnlər və yetişdiyimiz insanların icması onların belə demələrində olmuşdur: "İman söz, əməl və niyyətdir və üçündən biri digərsiz yetərli deyil".[330]

Gördüyün kimi bu sözlər, bu üç hissə arasında bağlılığa və onlardan bəzisinin digərsiz yetərli olmayacağına dəlalət edən ən qüvvətli ifadələrdir.Burada kamil yaxud naqis imandan söhbət getmir.Səhabələrin çoxu irca bidətinin yayılmasından öncə ölmüşdülər.Bu səbəbdən, onların murciələrə rəddiyə əsnasında bu sözləri demələri üçün həmin sözlərlə kamil imanı qəsd etdiklərini iddia etməyə heç bir əsas yoxdur.

İmam Əcurrinin ifadələri isə bundan daha aydındır.[331] İmam (rahiməhullah) demişdir: "Bilin ki,-Allah bizə və sizə rəhm etsin-, müsəlmanların alimləri imanın bütün məxluqata vacib olduğunu etiqad edirlər.O, qəlb ilə təsdiq, dil ilə iqrar və bədən əzaları ilə əməldir.

---

330 Məcmu`əl-fətəva:7/209.Şərhu usul i`tiqad əhli-s-sunnə, Ləlakəi:5/956_1593-cü rəqəm.

331 İmam Əcurrinin müxtəlif ifadələri mövcuddur.Artıq onlardan bir qismi yuxarıda qeyd edilmişdir.Həmin sözlərdə gələn şərh və təkid, sözləri yozanların yozumunu puça çıxarır.

Sonra bilin ki, qəlbin biliyi və təsdiqi yalnız dil ilə olan tələffüzün olacağı təqdirdə yetərli olacaq.Qəlb ilə bilik və dil ilə tələffuz isə bədən əzaları ilə əməl olmayınca yetərli olmaz.Əgər onda bu üç xislət kamilləşərsə (bir arada gələrsə) insan mömin olar.Buna Quran, sunnə və alimlərin sözü dəlalət edir."[332]

İlk növbədə imanın növbəti sözlərinə diqqət yetir: "Qəlbin biliyi və təsdiqi yalnız dil ilə olan tələffüzün olacağı təqdirdə yetərli olacaq".Bu sözləri yozan müxalifin yozumuna əsaslansaq belə nəticə çıxacaq: Bilik və təsdiq yalnız dil sözü ilə kamilləşir.Bunun mənası: Dil sözü olmadan bilik və təsdiqin səhih olmasıdır.

Yaxud digər bir forma: Mütləq (kamil) imanda dil sözü olmadan bilik və təsdiq yetərli olmur.Bunun mənası: Bunun imanın mütləqində (özəyində) yetərli olmasıdır.

Hər iki yozuma əsasən dil sözü olmadan iman səhih və yetərli olacaq.Bu isə, Əhli sunnədən heç kəsin demədiyi sözdür.

Nəfsi istəklərin oyuncağına çevrilən və nəticədə həlak olan insanların halına bir bax!

Daha sonra Əcurri öz sözlərini şərh edərək növbəti sözləri demişdir: Bədən əməlləri isə-Allah sizə rəhm etsin-qəlb və dildə olan imanın təsdiqidir.

[332] əş-Şəria:2/611.

Əgər biri təharət, namaz, zəkat, oruc, həcc, cihad və sayira bədən əzalarına daxil olan əməllər ilə təsdiq etmədən sadəcə söz və biliklə qane olarsa mömin olmaz.[333]Bilik və söz ona fayda verməz və onun əməli tərk etməsi imanını təkzib etməsi anlamına gələcək.Onun, qeyd edilənlərə əməl etməsi isə onun imanını təsdiq etmiş olur.Müvəffəqiyyət Allahdandır."[334]

Habelə demişdir: "Din yalnız qəlb təsdiqi, dil iqrarı və namaz, zəkat, oruc, həcc, cihad və sayira bədən əməlləri ilə səhih olur."[335]

Əcurri (rahiməhullah) deyir: Əməlin tərk edilməsi imanı təkzib edir və din yalnız onunla səhih olur.Müxalif isə deyir: Əməlin tərki yalnız kamilliyi aparır!

*İkinci*: Səhabələrdən nəql olunan bu icmaya onların namazı tərk edənin təkfir ediləcəyinə dair icmasından kənar baxılmamalıdır.Onların namazı tərk edənin küfrünə icması təsdiq olunacağı zaman anlaşılmazlıq aradan qalxacaq və əməlin imanda labüd şəkildə olmasına, habelə əməlsiz onun səhih və yetərli olmayacağına dair onların icma etdikləri bəlli olacaq.

---

[333] Ən qəribə yozumlardan onlardan birinin növbəti sözləri deməsidir: İmamın "mömin olmaz" sözündən həmin adamın kafir olması anlamı çıxmır." Bununla belə, Əcurri ardından demişdir: "Bilik və söz ona fayda verməz və onun əməli tərk etməsi imanını təkzib etməsi anlamına gələcək."Bundan sonra hansı İslam qalır!

[334] əş-Şəria:2/614.

[335] əş-Şəria:2/563.

*Üçüncü*: Müxalif öncə qeyd edilənləri bir növ yozmaq imkanında olsa belə, onun bu kimi icma ilə nə edəcəyi məlum deyil.Şeyxul-İslam Muhammməd bin Abdul-Vahhəb (rahiməhullah) demişdir: "Ümmət arasında ixtilaf yoxdur ki, tövhidin, qəlbdə olan elm, dildə olan söz, habelə əmrlər və qadağaların icrasını ifadə edən əməl ilə olması labüddür. İnsan bunlardan bir şeyi pozarsa müsəlman olmaz."[336]

Sonralar mən onlardan birinin yazdığı məqaləyə rast gəldim.Yazar orada iddia etmişdir ki, "əl-iczə: yetərlik" sözünün inkarı zəruri şəkildə batilliyi və faydasızlığı ifadə etmir.Çünki bəzən ibadətin yetərli olmaması ilə birgə insan ondan ötrü savab alır.Daha sonra Şeyxul-İslamın (rahiməhullah) sözlərini dəlil gətirmişdir:

"Sonra deyiləcək: Əgər müəyyən şəkildə itaət qadağan edilərsə, məsələn: Namaz qıl ancaq bu yerdə qılma, habelə bu paltarı tik, ancaq bu evdə tikmə,-deyilərsə, belə olan halda insanın həmin yerdə namaz qılması və paltar tikməsi heç şübhəsiz ki, əmr edildiyi kimi ona ünvanlanan əmri yerinə yetirməməsini ifadə edəcək.Lakin həmin adamın, vəsfi istisna olmaqla əmr olunanın bir qismini yaxud onun özəyini yerinə yetirməsi deyilə bilərmi? O isə, vəsfi yaxud qadağa xaric olmaqla namazın və tikmənin mütləqidir. Həmin insan vacibi tərk etmir yaxud asiliyə görə cəzalanır. Bununula belə həmin insan etdiyinə görə savab alacaqmı?

---

[336] əd-Duraru-s-səniyyə fil əcvibəti-n-nəcdiyyə:2/124.Məcmuatu-r-rasəil val məsəili-n-nəcdiyyə:4/37.

Artıq bunu qeyd edib bəyan etmişəm ki, məsələ məhz belədir.Həmin məsələ bayram və bu kimi günlərdə tutulan oruca bənzəyir.Belə ki, Əbu Hanifə orucun yararsız olmadığını və "əl-iczə" yetərlik və savabın bir arada və fərqli gəldiyini deyir.Belə ki, "əl-iczə": İnsanın üzərində olan öhdəçilikdən azad olmasıdır.Bu, Rəbbin məzəmməti yaxud cəzasından qurtulmaqdır.Savab isə: İtaətdən ötrü mükafat almaqdır.Savab adi tabeçiliyin tələblərindən deyil.əl-İczə isə fərqlidir.Çünki əmr, əmr olunanın yetərli olmasını tələb edir.Lakin onlar şəriətdə bir arada gəlir.Çünki bərqərar olmuş qaydalardan biridə itaətkarın savab, asikarın isə cəza almasıdır.Ancaq bəzən ona, savaba əks olan asilikdən bir şey birləşdiyi zaman onlar fərqli olur və yetərli əməl savabsız qalır.Belə deyilmişdir: Ola bilsin ki, oruc tutanın orucdan yalnız susuz qalmaq payı olsun.Habelə: Ola bilsin ki, gecə namazı qılanın namazdan yalnız yuxusuz qalmaq payı olsun.Çünki oruc zamanı haram sözlər və əməllər orucun savabına əks olan günahı gərəkli edir. Artıq oruc, əmr olunan tabeçiliyi və qadağan olunmuş əməli şamil etmiş və tabeçilik səbəbilə öhdəçilik düşmüş, asilik səbəbilə isə məhrumiyyət hasil olmuşdur.Bəzən savabı şamil edən əməl, insanın onu şərt və dayağlardan kənar edəcəyi zaman yetərsiz olur.İnsan etdiyi şeyə görə savab alır ancaq insan yalnız onu kamil surətdə etdiyi zaman öhdəçiliyi üzərindən salır.Əmr olunanın yerinə yetirilməsi öhdəçiliyin düşdüyünü vacib edir deмək gözəl yanaşmadır.Əgər ona, məramı pozan asilik birləşərsə savaba müqabil tərəfdə olar.Əgər insan ərm olunanı nöqsanlı yerinə yetirərsə savab alar lakin o,

tam surətdə öhdəçilikdən azad olmaz.Həmin əməl yenidən yerinə yetiriləcək yaxud insan günah qazanacaq.”

Müxalif “əl-iczə” haqqında sələfin sözlərini bunun işığında anlamağın gərəkli olduğunu iddia etmişdir.Bundan irəli gələrək bütövlüklə əməlin tərki nəticəsində imanın səhih olmayacağı deyilməməlidir.Habelə demişdir: Bu sözlər, bizə Əcurrinin sözlərini anlamaq üçün bədən əməllərindən kənar olan imanın qınaq və cəzadan xilas olmaq üçün sahibinə yetərli olmadığı ifadə edir.Çünki bəzi dayağlar ondan kənar qalmışdır.Lakin insan imanın özəyinə sahib olduğu üçün savabını alır.Yetərliyin “əl-iczə”nin inkar edilməsi, zahiri əməl yoxa çıxdıqdan sonra yerdə qalan şeylərdən faydalanmağın inkarını tələb etmir.”

***Buna bir neçə yöndən cavab veriləcək:***

***Birinci***: Bunu Əcurrinin sözlərində tətbiq etmək doğru deyil.Çünki belə halda dil sözünün tərk edilməsi ilə birgə imanın səhih olması lazım olacaq.Artıq imam demişdir: “Sonra bilin ki, qəlbin biliyi və təsdiqi yalnız dil ilə olan tələffüzün olacağı təqdirdə yetərli olacaq.Qəlb ilə bilik və dil ilə tələffuz isə bədən əzaları ilə əməl olmayınca yetərli olmaz.”

*İkinci*: Şeyxul-İslam (rahiməhullah) burada qeyd edir ki, dayağını yaxud şərtini itirmiş ibadət öhdəçiliyi aradan qaldırmır və ibadətin yenidən yerinə yetirilməsi labüdlüyü yaranır.Bu, bizim məsələmiz üçün kifayət edir.Bədən əməlindən kənar olan iman yetərli olmur və öhdəçiliyi

aradan qaldırmır.Bu səbəbdən onun təkrar və doğru şəkildə edilməsi labüd olur.

*Üçüncü*: Buna güc qatan amillərdən: Şeyxul-İslam bu araşdırmada qeyd etmişdir ki, ibadətin dayağı gedəcəyi zaman o, batil olacaq.Bizi burada maraqlandıran məhz budur.İman batil olacağı zaman öhdəçilik aradan qalxmayacaq.Bu isə yalnız küfrü ifadə edir.Küfr hasil olduqda isə axirətdə fayda və savabın olması mümkünsüz olur.Buna diqqət yetir!

Şeyxul-İslam (rahiməhullah) bu araşdırmanın əvvəlində demişdir: Vacibin yoxluğu iki növ olur: Təharətin, namazın və həccin dayağlarının yoxluğu kimi ibadəti batil edən növ. Habelə dayağ olmayan həccin vaciblərinin yoxluğu, imam Əhməddə məşhur görüşə əsasən səhvən tərk ediləcəyi zaman namazın vaciblərinin yoxluğu və Əbu Hanifənin yaramazlıq olaraq vəsf etdiyi və fatihənin oxunuşu və digər şeylər tək namazı batil etməyən vaciblərin yoxluğu kimi batil etməyən növ."[337]

Dayaq olmayacağı zaman, bunun qəsdən yaxud qəsdsiz olmasına rəğmən ibadət batil olacaq.İmanın dayağı olan əməl olmayacağı zaman isə iman batil olacaq.Məqsəd məhz budur.Onun yerinə yetirilmə səbəbilə savab alması məsələsi isə bu məqamda həmçinin doğru deyil.Bunun açıqlaması:

*Dördüncü*: Şeyxul-İslamın burada qeyd etdiyi hal, batil olması və dayağın getməsi ilə birgə kişinin savab almaq

[337] Məcmu`əl-fətəva:19/292.

imkanını saxladığı şeylərdə olur.Onun axirətdə savab alacağı qəsd ediləcəyi zaman bunun iman məsələsində olması doğru olmayacaq.Çünki imanın səhih olmaması küfr üzərə qalmağı yaxud mürtədliyi ifadə edir.Kafir və mürtəd isə, yerində qeyd edildiyi kimi əməllərinə görə axirətdə savab almır.

*Beşinci*: İbadətin şərtini yaxud dayağını tərk edənin həmin ibadətdən etdiyinə görə savab alacağını demək doğru deyil.Bu, qəsdli şəxsə deyil yalnız üzürlü şəxsə aiddir.Çünki əgər biri dəstəmaz alıb yaxud namaz qılıb yaxud həcc edib dayağı yaxud şərti qəsdən tərk edərsə öhdəçilikdən azad olmaz və onun ibadəti səhih sayılmaz.Habelə o, buna görə günah qazanar.Lakin əgər biri dayağı yaxud şərti qəsdsiz şəkildə yerinə yetirməzsə, məsələn cahil olarsa yaxud qəsb edilmiş evdə namaz kimi səhihliyinə dair ixtilaf olan əməli edərsə yaxud etinasızlıq olmadan Arafat duruşuna yetişməzsə, həmin şəxs bununla öhdəçilikdən azad olmasa belə etdiyi əmələ görə savab ala bilər.

Şeyx ibn Useyminə (rahiməhullah) sual verilmişdir: "Bəzi insanlar deyirlər: İnsan bütövlüklə bədən əməllərini tərk edəcəyi zaman imandan çıxacaq lakin bu, onun imanın özəyi və şəhadət kəlməsindən fayda görməyəcəyini tələb etməyəcək və həmin şəxs adı çəkilən şeylərdən fayda görəcək.Buna misal, həcc etmək istəyən lakin həccin dayağı olan Arafata yetişməyən şəxsdir. Həmin şəxs digər dayağlardan yararlanacaq.Bu barədə nə deyə bilərsiniz?

Şeyx cavab olaraq demişdir: "Deyirik ki, bu, doğru deyil. İnsan namazı tərk etməsi ilə birgə imanından fayda görə

bilməz.Çünki dəlillər namazı tərk edənin kafir olduğunu göstərir.Habelə əgər bir şəxs Arafatda duruşu tərk edərsə, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) sunnəsində gəldiyi kimi onun həcci səhih olmayacaq.Qurban günü sübhdən öncə Arafata yetişən şəxs isə həccə yetişmiş olacaq.Əks halda yetişmiş olmayacaq.Hətta əgər həmin şəxs bunun ardından daş atma, Minada gecələmə, təvaf və sə`y kimi ayinləri yerinə yetirərsə həcc etmiş olmayacaq."

Əgər biri Arafatda duruşu tərk edərsə onun həcci səhih olmayacaq.Həmçinin öz ixtiyarı ilə, habelə imkan və qüdrətə malik olduğu halda bütün əməli tərk edən şəxs.Beləsinin imanı yetərli deyil və bununla onun öhdəçiliyi üzərindən düşmür.Habelə o, bunu tərk etməklə küfr günahı daşıyır.

## Dördüncü şübhə:

## Növbəti sözlər: Zahir ilə daxil arasında olan bağlılıq imanın özəyi deyil yalnız kamil imanda olur

Bu, müxalifin gətirdiyi ən qəribə şübhələrdən biridir. Əslində isə bu, şübhə deyil və sadəcə batil bir nəticədir.Bunu dilə gətirən şəxs yanlış surətdə anladığı bəzi sözləri dəlil gətirməyə çalışır.

Məsələnin sirri ondan ibarətdir ki, müxalif Əhli sunnənin zahir ilə daxil arasında olan bağlılığa böyük diqqət ayırdığını və Şeyxul-İslamdan və qeyrilərindən buna dair çoxlu nəqllər gətirdiklərini və bunu Əhli sunnə ilə murciələr arasında fərqləndirici xüsusiyət hesab etdiklərini gördüyü zaman "tələzum" məsələsini rədd etməyə cürət tapmamışdır.Lakin o, zahirdə bunu etiraf etməsi təəssüratını yaradıb onun gürçəyindən yayınmışdır.Müxalif "tələzum"u isbat etdiyini və bu görüşdə olduğunu elan etmişdir.Daha sonra özünə zidd gələrək bütövlüklə əməli tərk edənə müsəlman hökmü vermiş və bununla bərabər daxildə imanın qalmasını xəyalına gətirmişdir.

Müxaliflərdən bəziləri daha cürətli çıxıb zahir ilə daxil arasında bağlılığın yalnız qəlbdə olan iman kamil olacağı yaxud özəyin üzərinə əlavə gələcəyi zaman gerçəkləşəcəyini

iddia etmişdir.Məhz bu zaman iman, əməlləri ortaya gətirir. Bundan öncə əməl olmasa belə iman səhih olur.

***Buna bir neçə yöndən cavab veriləcək:***

***Birinci***: Əgər bunu deyən şəxs zahir ilə daxil arasında olan bağlılığı qəbul edərsə, ona deyiləcək: Bu dəlillər həmin əsası isbat etmək üçün gəlmişdir.Artıq biz həmin dəlilləri sənə gətirdik.Orada iddia etdiyin həmin fərqləndirməni tapa bilirsənmi?

Bunun açıqlaması: Daxili iman zahiri söz və zahiri əməli gərəkdirdiyi bir halda onun özəyinin bundan heç bir şeyi gərəkdirmədiyinə zəmin yaradan nədir? Onun məhz özəyin üzərinə əlavə gəldiyi zaman bu xüsusiyyətə yiyələnməsinə və nəticədə söz və əməllərin bu zaman meydana gəlməsinə zəmin yaradan nədir?!

İmanın özəyi bunu ortaya gətirmək gücündə olmayacağı təqdirdə bunun ardından onu səmərəli edə biləcək amil nə ola bilər?!

*İkinci*: Müxalif Şeyxul-İslamın qeyd etdiyi "tam iman" yaxud "qəlbdə olan vacib iman zahiri əməli gərəkdirir" kimi bəzi ifadələrinə bel bağlamışdır.

Ona deyiləcək: Şeyxul-İslamın "tam" yaxud "vacib" dediyi zaman "kamil" yaxud "özəyə əlavə olan" sözünü qəsd etdiyini qəbul etsək, belə olan halda bu cür nəticə alınacaq: Qəlbdə olan kamil iman zahiri əməli və zahiri sözü gərəkdirir.Bu isə özəyin əməli gərəkdirməməsini ifadə etmir.Üstəlik burada özəy və onun hökmündən söhbət getmir.

Habelə Şeyxul-İslam bir neçə yerdə zahiri əməlin yoxluğunun daxili imanın yoxluğuna dəlalət etdiyini qeyd edir.Şeyxul-İslam heç bir yerdə: "Yalnız özəyin üzərinə əlavə gələnin yoxluğuna dəlalət edir",-demir.

Şeyxul-İslam yerlərin birində deyir: "Siz, əməllərin qəlb imanının zəruri amili olduğunu qəbul etdiniz.Bu səbəbdən, o, olmayacağı zaman qəlbdə iman qalmayacaq.Məqsəd məhz budur."[338]

Habelə Şeyxul-İslam (tayyəbəllahu sərahu) demişdir: "Əməl qəlbdə imanın olduğunu təsdiq edir.Əməlin yoxluğu isə qəlbdə imanın olduğunu təkzib edir.Çünki qəlbdə olan, zahiri əməli gərəkli edir."Ləzim"in yoxluğu isə "məlzum"un yoxluğuna dəlalət edir."

Habelə (rahiməhullah) demişdir: "Murciələr zahiri əməli imandan çıxartmışlar.Onlardan qəlb əməllərini həmçinin çıxartmağı qəsd edib onu təsdiq edənlərin sözü açıq-aydın zəlalətdir. Zahiri əməli imandan çıxartmağı qəsd edənlərə deyiləcək: Zahiri əməl daxili əməlin zəruri amilidir və ondan ayrılmazdır.Zahirin yoxluğu isə daxilin yoxluğunu göstərir."

Habelə demişdir: "Qəlbdə Onun təsdiq edilməsi və Ona qarşı olan sevgi yer alacağı zaman zəruri surətdə bədənin bunu gərəkdirən zahiri söz və zahiri əməllərlə hərəkətə gəlməsi lazım olacaq."[339]

---

[338] Buna dair ətraflı şəkildə üçüncü bölümün birinci fəslinə bax.

[339] Buna və digər sözlərə üçüncü bölümün birinci və üçüncü fəslində bax.

Yuxarıda qeyd edilən sözlərdə məqsədin kamil iman olduğunu anlamaq nə dərəcədə doğrudur?! Yaxud deyiləcək: Məgər zahiri əməl olmayacağı zaman yalnız qəlb özəyinə əlavə gələn yoxa çıxacaq?

Bir sözlə, əgər şübhənin mənbəyi Şeyxul-İslamın sözlərindən alınan bəzi sözlərdirsə, elə isə onun sözləri haqqında yaxşı düşün! Çünki insaf sahibi üçün onun sözləri həddindən ziyadə açıq-aydındır.

Əgər bunun mənbəyi "tələzum"a dəlalət edən nasslardırsa, belə olan halda orada iddia olunan fərqləndirmə yoxdur.

*Üçüncü*: Müxalifin sözünə əsaslansaq dil sözünün yoxluğu ilə imanın səhih olacağını deməli olacağıq.

Bu isə, ən yaramaz sözlərdəndir.Ona aparan yol isə daha yaramazdır.

Bunun açıqlaması: Belə ki, Şeyxul-İslam daxili imanın zahiri sözü və zahiri əməli gərəkdirdiyini qeyd edir.Müxalif bunu qəbul edir.Lakin deyir: Daxili iman deyildikdə özəyə əlavə gələn qəsd edilir.

Belə olan halda belə nəticə çıxır: Daxili özəyə əlavə gələn, zahiri sözü və zahiri əməli gərəkdirir.Özəyin özü isə bunu gərəkdirmir və həmin şaxənin yoxluğu ilə birgə özəyin mövcudluğu səhih olur.Bunun mənası: Dil sözü olmadan daxili imanın olması səhihdir.Bunu isə Əhli sunnədən heç kimsə deməmişdir.

# Beşinci şübhə:

## Murcilələr və kamillik şərti ətrafında

Bu şübhə, yalnız irca fikrini dəstəkləyən bəzi yazılara dair daimi komitənin fətvası çıxdıqdan sonra ortaya atılmışdır. Belə ki, daimi komitənin fətvasında gəlmişdir: "Qeyd edilən bu söz, əməli iman anlamından çıxaran murciələrin sözüdür.Habelə onlar deyirlər: İman yalnız qəlb ilə təsdiqdir yaxud qəlb ilə təsdiq və dil ilə sözdür.Əməllər isə onlara görə sadəcə kamillik şərtidir və ondan deyil.Bu səbəbdən, əgər biri qəlbi ilə təsdiq edib dili ilə tələffüz edərsə, vacibləri tərk edib haramları işlədəcəyi halda belə onlara görə kamil imanlı mömin olar və heç bir xeyir etməyəcəyi halda belə cənnətə girməyə layiq olar." Habelə şeyx Salih əl-Fəuzan və şeyx Bəkr bin Abdullah Əbu Zeyd bu sözləri demişlər.[340]

Onlardan biri etiraz edib demişdir: Bu sözün murciələrə nisbət edilməsi nə dərəcədə doğrudur.Axı onlar kamillik və nöqsan sözlərini demirlər?

### *Buna iki yöndən cavab veriləcək:*

***Birinci***: Murciələr bir məzhəb deyillər.Onlardan "artma" və "azalma"nın inkar edilməsi məşhur olsa da belə onlardan

---

[340] Yuxarıda qeyd edilmişdir.Habelə kitabın sonunda gələn beşinci əlavədə daimi kömitənin fətvasına bax.

bir qismi bunu isbat etmişdir.Məhz bu görüş, sonraki əşarilərin etimad göstərdikləri görüşdür.Onlar isə murciələrin firqələrindən sayılırlar.Onların murciələrin firqələrindən sayılmasına səbəb yalnız əməli imandan çıxartmaları deyil, həmçinin mötəbər görüşlərinə əsasən dil ilə sözün dayaq deyil yalnız dünya əhkamlarının icrası üçün şərt olmasını dəmələridir.Habelə onların istisna anlamına dair, küfr və onun gerçəyinə dair digər müxalif sözləri vardır.Artıq mən bu məsələyə dair ikinci bölümdə geniş danışmışam.İstəyən ora müraciət edə bilər![341]

*İkinci*: "Əməl kamillik şərtidir" sözü, heç şübhəsiz ki, əşarilərin əsasını qoyduqları və öz təliflərində isbat etdikləri kəlmədir.Onlardan öncə bu sözü deyəni tapmaq çətindir.

"İthaful murid şərhu cəuharati-t-təuhid" kitabında demişdir: "Əhli sunnənin saleh əməllərə dair seçdiyi görüş onun iman üçün kamillik şərti olmasıdır.Halal saymadan, habelə inadkarlıq etmədən və onun məşru\` olmasında şübhə etmədən onu yaxud onun bir qismini tərk edən kamilliyi əldən qaçırmış mömindir.Tabeçilik göstərib onu edən isə ən kamil xislətlər əldə edən şəxsdir."[342]

Əs-Savi demişdir: "Çünki Əhli sunnənin seçdiyi görüş, saleh əməllərin iman üçün kamillik şərti olmasıdır."[343]

---

[341] Artıq murciələrdən bəzisinin belə deməsi vurğulanmışdır: "İman, hissələrə bölünür və möminlər bir-birindən iman baxımından fərqlənirlər." Bu, Muhamməd bin Şəbib adlı şəxsin ardıcıllarının məzhəbidir.(məqalətul isləmiyyin:1/218, məcmu\`əl-fətəva:7/546)

[342] İthaful murid:92-ci səh.Habelə: Şərhul beycuri:45,49,51.

[343] Şərhu-s-savi aləl cəuharat:132-ci səh.

Ən-Nəfravi demişdir: “Bədən əməlləri isə onun kamil olması üçün şərtdir.”

Habelə demişdir: “Sələfin, habelə əşari və maturudilərin cumhurunun sözlərində bədən əməllərin imanın kamilliyi üçün şərt olması məşhur olmuşdur.

Habelə demişdir: “Mötəzililər və onlara müvafiq gələnlər əməlləri imanın həqiqi dayağı edirlər.”

Habelə demişdir: “Əməllərin imanın səhihliyi üçün şərt olduğu haqqında yanlış düşüncəni dəf etmək üçün müəllif buna işarə etmişdir.Əslində isə belə deyil.O, bədən əməllərinin imanın kamilliyi üçün şərt olmasında Əhli sünnənin sözünə etimad etmişdir.Müəllif bu məzhəb üzərə olub belə demişdir: “İman yalnız onun mənası ilə kamilləşir”.Bu səbəbdən, əgər biri qəlbi ilə təsdiq edib dili ilə tələffüz etdiyi halda vacib əməlləri tənbəllik üzündən tərk edərsə onun imanı naqis olsa belə səhih olacaq.Bir sözlə, əməllər kamil imandan bir hissədir.”[344]

Dedim: Bu sözlər, müxalifin, ətrafında aramsız danışdığı sözlərdir: Əməllər kamil imanın bir hissəsidir!

Burada növbəti sözləri deyənlərə cavab vardır: Murciələr əməli tərk edəni kamil imanlı mömin hesab edirlər.Biz isə onun naqis imanlı mömin olduğunu hesab edirik.

Belə ki, qeyd edildiyi kimi əşarilər həmçinin onun kamil imanlı mömin olduğunu hesab etmirlər.Onlar isə murciələr-

[344] əl-Fəvakihu-d-dəvani:1/38,39,92,93,94.Habelə: Haşiyətul adəvi alə kifayəti-t-talibi-r-rabbəni:1/126.

dən bir firqədirlər.Bu üzdən, onlar və müxalif bu məsələdə eynidirlər.

Qastaləni Buxarinin şərhində demişdir: “İmanın təsdiq və əməl üçün bir ad olması haqqında sələfə nisbət olunan söz, ibn Təlməsəni və ona müvafiq gələnlərin dediyi kimi kamil imana yozulur.”[345]

Bununla da, aydın olur ki, artıq müxalifdən öncə bunu yozan tapılmışdır.Bunu yozanlar isə Təlməsəni, Qastalani və Nəfravidir.Onların hamısı əşarilərdir!

Bunlar isə iman məsələsində sələfə müxalif olmuşlar.Bu səbəbdən, onların həmin sözləri yozmaları və həmin sözlərlə özlərinin etimad etdikləri görüş arasında cəm etməyə çalışmaları təəccüb doğurmamalıdır.Ancaq özlərini sələfin mənhəcinə nisbət edənlərin sələfin icmasını tərk etməkdə üzürü nədir?!

Bir sözlə, əşarilər artma və azalmanı, habelə istisnanı isbat edirlər.Habelə onlar deyirlər: Əməl iman üçün kamil-lik şərti yaxud kamil imanın bir hissəsidir.Habelə onlar küf-rü danma və təkzib etmə çərçivəsinə salır və söz yaxud fe`l ilə küfrün olduğunu inkar edirlər.Onlar deyirlər ki, bəzən söz yaxud fe`l daxili küfrün əlaməti olur.

İman məsələsində özünü sələfin məzhəbinə aid edənlər bu sözlərdən heç də uzaq düşməmişlər.

---

[345] əl-Fəkihu-d-dəvani:1/93.

# Altıncı şübhə:

## Növbəti sözlər: Daxil üçün zəruri olan zahir birlikdə gələn söz və əməldir

Onlar bununla demək istəyirlər ki, küfr və daxilin fəsada uğraması yalnız iki şeyin birlikdə yoxa çıxması ilə olur.

Müxalif Əhli sunnənin Şeyxul-İslamdan növbəti sözləri nəql etdiklərini gördüyü zaman bu şübhə yaranmışdır: “Zahir olmadığı zaman iman həmçinin olmur.” Müxalif zahirin birlikdə gələn söz və əməl olduğunu və daxilin yalnız bu ikisinin birlikdə yoxluğu ilə olmayacağını iddia etmişdir.[346]

Bu şübhə, bu kimi məsələlərin tədqiq edilməsində cahil və saxta elm əhli ilə bir arada olmağın nə qədər böyük fitnə olduğunu göstərir.Çünki heç kəsə gizli deyil ki, əgər daxili iman hər iki şeyi gərəkdirsəydi əməlin yoxluğu onun yetərsiz olacağına dəlil olardı.Sözün yoxluğu həmçinin.Çünki səhih imanın şəni, onun hər iki şeyi gərəkdirməsidir.

Müxalif qəlb imanının hər iki şeyi gərəkdirdiyinə dair Şeyxul-İslamdan nəql olunan sözləri göstərmişdir.Şeyxul-

[346] Dedim: Müxalif həqiqətən zahirin olmayacağı zaman daxilin (özəyi və kamilliyi)nin olmayacağını qəbul etsin daha sonra zahir ilə nəyin qəsd olunduğu məsələsini onunla birlikdə araşdırarıq.

İslam (rahiməhullah) demişdir: "Qəlbdə Onun təsdiq edilməsi və Ona qarşı olan sevgi yer alacağı zaman zəruri surətdə bədənin bunu gərəkdirən zahiri söz və zahiri əməllərlə hərəkətə gəlməsi lazım olacaq."

Habelə demişdir: "Qəlb, qəlb elmi və əməli olaraq onda olan iman ilə saleh olacağı zaman bədənin zəruri surətdə zahiri söz ilə və mütləq imana uyğun əməl ilə düzəlməsi lazım olacaq.[347]"

Burada ümumiyyətlə heç bir anlaşılmazlıq yoxdur.Üstəlik bu, doğru sözlərdir.Daxili imanın əməlin yoxa çıxması ilə yoxa çıxacağını deyən söz, bizim və Şeyxul-İslamın sözlərinə zidd gəlmir.

Artıq Şeyxul-İslamın belə deməsi qeyd edilmişdir: "Əməl qəlbdə imanın olduğunu təsdiq edir.Əməl olmayacağı zaman isə bu, qəlbdə imanın olduğunu təkzib edəcək.Çünki qəlbdə olan, zahiri əməli gərəkdirir."Ləzim"in yoxluğu isə "məlzum"un yoxluğuna dəlalət edir."

---

[347] Bəziləri bu cümlədən yapışıb"mütləq imana uyğun əməl ilə" həmin cümləni iri və qara xəttlə qeyd etməyə girişmişlər.Əslində isə onun üçün bu sözlərdə heç bir istinad yeri yoxdur.Çünki qəlb düzələcəyi zaman bütün bədən düzələcək. Çəkişmə isə bu məsələdə deyil.Çəkişmə yalnız iki məsələdədir: Birinci: Qəlb imanının özəyi əməli gərəkdirirmi? Habelə bütövlüklə zahiri əməlin getməsi ilə imanın özəyi gedirmi? İmanın güclü olması nisbətilə bəzi əməlləri yaxud bütün əməlləri gərəkdirməsi məsələsi heç də müşkül deyil.Şeyxul-İslamın dəqiq anlayış tərzindən onun burada növbəti ifadəni işlətməsidir: "Qəlb düzələcəyi zaman".Bu isə dürüstlüyün müxtəlif dərəcələrini şamil edir və bunun nəticəsində "mütləq əməl" hasil olur.Ancaq o, adicə sözü və itaətin özəyini qəsd etdiyi zaman növbəti ifadəni işlədir: "Qəlbdə təsdiq və sevgi yer alacağı zaman"v.s.

Habelə demişdir: “Murciələr zahiri əməli imandan çıxartmışlar.Onlardan qəlb əməllərini həmçinin çıxartmağı qəsd edib onu təsdiq edənlərin sözü açıq-aydın zəlalətdir. Zahiri əməli imandan çıxartmağı qəsd edənlərə deyiləcək: Zahiri əməl daxili əməlin zəruri amilidir və ondan ayrılmazdır.Zahirin yoxluğu isə daxilin yoxluğunu göstərir.”

Habelə demişdir: “Siz, əməllərin qəlb imanının zəruri amili olduğunu qəbul etdiniz.Bu səbəbdən, o, olmayacağı zaman qəlbdə iman qalmayacaq.Məqsəd məhz budur.”

Habelə demişdir: “İman fərdi şəkildə geyd ediləcəyi zaman ora zahiri əməllər həmçinin daxil olacaq.Çünki onlar qəlbdə olanın zəruri amilləridir.Belə ki, qəlbdə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gətirdiyinə iman və təsdiq sabit olduğu zaman zəruri olaraq bunu tələb edən amillərin hasil olması vacib olacaq.Çünki hər hansı bir şeyi gizlədən elə bir kimsə yoxdur ki, Allah onun gizlətdiyini üz çizgilərində və tələffüz etdiyi ifadələrdə aşkara çıxartmasın.Bu səbəbdən qəlbdə olan təsdiq sabit olacağı zaman onun tələbi olaraq əməl heç bir vəchlə ondan kənar qalmayacaq. Zahirdə öz izini buraxmayacağı təqdirdə dolğun biliyin və doğru sevginin bərqərar olması mümkün deyil.Bu səbəbdən Uca Allah, imanın zəruri amilləri olmayacağı təqdirdə imanın varlığını inkar etmişdir.Çünki “ləzim”in (zahiri əməllərin) yoxluğu “məlzum”un (daxili imanın) yoxluğu deməkdir.”[348]

---

[348] Bu və digər nəql olunan xəbərlərə üçüncü bölümün birinci və üçüncü fəsilində bax.

Dedim: Şeyxul-İslamın (rahiməhullah) buna dair sözləri bir çox yerdə gəlir və saxta elm əhli bundan qafil olsalar belə onun kitablarına diqqət ayıran şəxslər bunu gözəl bilirlər.

# Yeddinci şübhə:

## İmanda tələb olunan əməl ətrafında

Həmin əməl namazdır yaxud dörd dayağdır yaxud vaciblərdir yaxud hər hansı bir əməldir?[349]

Müxalif bu sualı qoymaqla iki şeyi güdür:

Birinci: Məsələnin nizamsız olduğunu göstərmək istəyir. Belə olan halda, bunun sələfin icma etdiyi məsələ olması və bu səbəbdən müxalifin bidətdə ittiham edilməsi nə dərəcədə doğru olur?

İkinci: Əgər deyilsə ki, tələb olunan əməl namazdır, bu halda müxalif deyəcək: Əhli sunnə arasında bu məsələyə dair ixtilaf mövcuddur.Habelə bu, mötəbər ixtilafdır.Belə olan halda, müxalif hansı əsasla tənqid olunur?

***Buna bir neçə yöndən cavab veriləcək:***

*Birinci*: İlk öncə bütövlüklə əməli tərk etməyin imanı pozan küfr olduğuna həmrəy olmaq vacibdir.Çünki artıq qeyd edilmişdir ki, Əhli sunnə əməlsiz söz və etiqadın yetərli olmadığını deyirlər.Habelə zahir ilə daxil arasında olan bağlılıq məsələsi və qəlbdə təsdiq və sevgi yer alacağı

[349] Bu, bir neçə müxalifin gətirdiyi şübhədir.Bununla da, onlar imanın səhih olması üçün əməlin zəruriliyinə dair Əhli sunnənin məzhəbini şübhə altına qoymaq istəmişlər.

zaman zəruri surətdə bədənin bunu gərəkdirən zahiri söz və zahiri əməllərlə hərəkətə gəlməsinin lazım olması kimi vurğulanan digər məsələ.

Tələb olunan, müxalifin bunu qəbul etməsidir.Çəkişmə nöqtəsi məhz budur.[350] Çəkişmə, bəzi əməlləri edib bəzisini tərk edən şəxs ətrafında deyil.Çəkişmə yalnız bütövlüklə əməli tərk edən və ömür boyu Allah üçün bir səcdə belə etməyən və heç bir itaəti yerinə yetirməyən şəxs ətrafındadır.Əhli sunnə deyirlər: Bu, yalnız qəlbdə zındığlıq və nifaq ilə olur.İnsanın daxildə səhih imana sahib olması sonra isə bunun tələbinin üzə çıxmaması qeyri-mümkündür. Murciələr demişlər: İnsan bütün əməlləri tərk edərsə belə onun daxilində olan iman sabit və səhih olacaq.Sonralar onlar bölünmüşlər.Onlardan bir tayfa demişdir: Onun imanı Cəbrayılın imanı kimidir.Digər tayfa demişdir: O,

[350] Bəzi müxaliflər zahir ilə daxil arasında olan bağlılığın inkarı üzə çıxmasın deyə bu sözdən qaçır və onun açıqlamasından kənar dururlar.Daha sonra o, şübhə altına qoymaq üslubuna əl ataraq deyir: Görəsən tələb olunan əməl nədir və onun həddi nə qədərdir? Onlardan bəzisi isə deyir: İnsan əməli tərk etməklə nə vaxt kafir olur? Bu, bir andan sonra yoxsa bir saatdan sonra yoxsa bir gündən sonra yoxsa bir müddətdən sonra baş verir? Həmin məsələyə dair ona verilən cavab bizim cavabımızdır.Əslində bu, sələfin araşdırmadığı faydasız söhbətdir. Müxalifin açıq-aydın formada gələn misalı qəbul etməsi onun üçün daha münasib olardı.Həmin hal: Bütün ömrünü yaşayıb Allah üçün bir səcdə belə etməyən və bir itaəti belə yerinə yetirməyən şəxs.Həmin şəxsin təsdiqi və tabeçiliyi qala bilərmi? Habelə həmin şəxs daxilən doğru imana sahib olan mömin ola bilərmi? Müxalifin diqqətindən yayınmışdır ki, bu məsələyə dair söhbət zahirə deyil gerçəyə verilən hökm qəbilindən bir məsələdir.Çünki əksər hallarda müəyyən şəxsin bütövlüklə zahiri əməli tərk etdiyinə qəti əmin olmaq mümkünsüz olur.

ancaq kamilliyi əldən vermişdir.Habelə o, cəzaya məruz qala bilər.[351]

*İkinci*: İmanın söz və əməl olduğuna icma etmiş Əhli sunnə müəyyən əməli qeyd etməmişlər.Onlar yalnız namaz, zəkat, həcc, cihad və digər əməlləri misal göstərmişlər.Bu isə əməlin hal, məqam və dəvətin çatması nisbəti ilə fərqli olduğunu göstərir.Təhlükə, imanın əməldən kənar qalmasıdır.Lakin həmin əməlin Uca Allaha tabeçilik və yaxınlıq niyyəti ilə yerinə yetirilməsi şərtdir.

Əcurri (rahiməhullah) demişdir: Bədən əməlləri isə-Allah sizə rəhm etsin- qəlb və dildə olan imanın təsdiqidir.

Əgər biri təharət, namaz, zəkat, oruc, həcc, cihad və sayira bədən əzalarına daxil olan əməllər ilə təsdiq etmədən sadəcə söz və biliklə qane olarsa mömin olmaz. Bilik və söz ona fayda verməz və onun əməli tərk etməsi imanını təkzib etməsi anlamına gələcək.Onun qeyd edilənlərə əməl etməsi isə onun imanını təsdiq etmiş olur.Müvəffəq edən Allahdır!"[352]

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Habelə onların əməli çıxartmaları qəlb əməllərini çıxartmaları təəssüratını yaradır. Bu, isə qəti şəkildə batildir.Çünki əgər biri

---

[351] Bu, əşarilərin dediyi sözdür.Onlar isə qeyd edildiyi kimi murciə firqələrindən sayılırlar.Müxalif əməli tərk edənin kamil imanlı mömin olacağına dair qədim murciələrin sözlərinə aldanıb əməli tərk edənin naqis imanlı və cəzaya məruz qalan şəxs olduğunu deyən sözün onu ircadan çıxaracağını düşünmüşdür.Lakin onu murciələrə bənzədən təməl onun diqqətindən yayınmışdır.Həmin əsas: Zahir ilə daxil arasında olan bağlılığın inkar edilməsi və bədən əməli olmadan qəlbdə səhih imanın olması düşüncəsidir.

[352] əş-Şəria:2/614.

Peyğəmbəri (sallallahu aleyhi və səlləm) təsdiq edib qəlbi və bədəni ilə ona nifrət və düşmənçilik edərsə zəruri olaraq kafir olar.Əgər onlar qəlb əməllərini imana daxil etsələr bədən hərəkəti olmadan qəlbdə imanın yer alması imkansız olması səbəbilə yenə də xəta edəcəklər.Burada məqsəd, müəyyən bir əməli qeyd etmək deyil.Çünki əgər biri qəlbən Allaha və Elçisinə iman gətirərsə, onun, peyğəmbəri və onun düşmənlərinin onunla savaşdığını gördüyü zaman onların işini bitirməyə, habelə Peyğəmbərə zərər verməyəcək şəkildə onun müdafiəsinə təşviq etməyə qadir olduğu bir halda Peyğəmbərin müdafiəsi üçün ediləcək hərəkəti etməməsi təsəvvür edilə bilərmi? Adətən bu, mümkündürmü? Məlum olduğu kimi bu, qeyri-mümkündür."[353]

Əgər biri deyərsə ki: Biz, bütövlüklə zahiri əməli tərk etməyin küfr olduğunu, habelə sələfin İslamı pozan bu amildən çıxmaq və imanı gerçəkləşdimək üçün müəyyən əməli şərt etmədiklərini qəbul etdik.Üstəlik bu məsələ hal, məqam, hökmün çatması və digər şeylərin müxtəlifliyi səbəbilə fərqli olur.Belə olan halda, həmin əməlin nafilələrdən biri olması kifayət edirmi yoxsa bunun vaciblərdən biri olması gərəkdir?

Cavab: Artıq Şeyxul-İslam bəyan etmişdir ki, həmin əməlin Muhammədin dininə (salləllahu aleyhi və səlləm) xas olan vaciblərdən biri olması labüddür və bu məsələdə, əmanətə vəfakarlıq, doğru danışmaq, bölgü və hökmdə ədalətli

---

[353] Məcmu`əl-fətəva:7/556.

olmaq kimi müsəlmanların və qeyrilərinin müştərək olduqları əməllər kifayət etmir.

Belə ki, dörd dayağdan və qeyrisindən ibarət bütün fərzləri tərk edənin təkfir ediləcəyinə dair Sufyən bin Uyeynə və İshaq bin Rahuyədən gələn sözlər Şeyxul-İslamın seçdiyi bu görüşə güc qatır.

Sufyən bin Uyeynə (rahiməhullah) demişdir: "Murciələr "lə iləhə illəllah" kəlməsinə şahidlik edib qəlbi ilə fərzlərin tərk edilməsində israrlı olan şəxsə cənnətin vacib olduğunu demiş və fərzlərin tərk edilməsini haramların işlədilməsi səviyyəsində olan günahlar adlandırmışlar.Əslində isə onlar eyni ola bilməz.Çünki haramları halallaşdırmadan işlətmək asilikdir.Fərzləri isə cahillik və üzr olmadan tərk etmək küfrdür."[354]

İshaq bin Rahuyə (rahiməhullah) demişdir: "Murciələrin həddi aşması onların belə bir söz deməlerinə gətirib çıxarmışdır: " Əgər biri fərz namazları, Ramazan orucunu, zəkatı, həcci və bütün fərzləri danmadan tərk edərsə biz onu təkfir etməyəcəyik və onun işini Allaha həvalə edəcəyik. Çünki o, bunları iqrar edir.Bunu deyən adamlar heç şübhəsiz ki, murciələrdir."[355]

Şeyxul-İslam (rahiməhullah) demişdir: ""Artıq bəlli olmuşdur ki, dində söz və əməlin olması labüddür və

---

[354] Abdullah bin Əhməd, "əs-sunnə:1/347".İbn Rəcəb, "fəthul bəri:1/25", "cəmiul ulum val hikəm:44-cü səh".

[355] Məsəilul iməm Əhməd va İshaq bin Rahuyə:377-ci səh, Harb əl-Kirməni."Fəthul bəri:1/25", ibn Rəcəb.

insanın namaz, zəkat, oruc və başqa vaciblərdən olan zahiri vacibləri yerinə yetirməyəcəyi halda dili yaxud dili və qəlbi ilə Allaha və Elçisinə iman gətirməsi qeyri-mümkündür. Əgər fərz edilərsə ki, insan əmanəti əda etmək, doğru danışmaq, bölgü və qərarlarda ədalətli olmaq kimi vacibləri Allahın bunu vacib buyurduğu səbəbilə deyil və Allaha və Elçisinə iman gətirmədən edərsə bununla küfrdən çıxmış olmayacaq.Çünki müşriklər və kitab əhli bu işlərin vacib olduğunu hesab edirlər.Lakin insan Muhammədə (salləllahu aleyhi və səlləm) xas olan vaciblərdən heç bir şeyi yerinə yetirməzsə, Allaha və Elçisinə iman gətirmiş olmaz."[356]

Bunu dilə gətirən müasir alimlərdən biri Abdur-Rahmən bin Nəsir əl-Bərrak olmuşdur.Şeyx (hafizahullah) demişdir: "Üçüncü: İnsan şəhadəti zahirdə dilə gətirsə belə onun daxilən şəhadəti iqrar etmədiyini zahirdə gərəkli edən və ona zahirdə dəlalət edən amillər aşağıda gələn məsələləri şamil edir:

1-İslam dinindən üz çevirmək, onu öyrənməmək və ona əməl etməmək, habelə tərk etdiyi vaciblərə, işlətdiyi haramlara və bilgisiz olduğu əhkamlara əhəmiyyət verməmək.

Bilmək lazımdır ki, mükəlləf, yaxşılığın hər hansı bir xislətini və imanın hər hansı bir şöbəsini etməklə iqrarın yoxluğunu qaçılmaz edən üz çevirmə küfründən çıxmır. Çünki bu xislətlərdən eləsi vardır ki, bütün insanlar, kafir və möminlər onda müştərək olurlar.Bu xislətlərdən: Yoldan əziyyət verən şeyləri kənar etmək, valideyinlərə yaxşılıq etmək, əmanətə vəfakar olmaq.Üz çevirmənin yoxluğu yalnız namaz, zəkat, oruc, həcc kimi Peyğəmbərin gətirdiyi

[356] əl-İmənul əusat, məcmu`əl-fətəva:7/621.

İslam dininə xas olan hər hansı bir vacibin imanla və savabı Allahdan umulacağı zaman yerinə yetirilməsi ilə mümkün olur.

Şeyxul-İslam ibn Teymiyyə demişdir: "İnsan, xüsusi olaraq Muhammədin (salləllahu aleyhi və səlləm) vacib buyurduğu vaciblərdən hər hansı bir şeyi etməməsi ilə birgə Allaha və Elçisinə iman gətirmiş olmaz.(məcmu`əl-fətəva:7/261) "[357]

[357] Cəvəb fil imən va nəvaqidih:23-cü səh, şeyx Abdur-Rahmən bin Nəsir əl-Bərrak.

# Səkkizinci şübhə:

## Məsələ namazı tərk edənin hökmünə dair ixtilafa qayıdır

Müxalif demişdir: Məsələ namazı tərk edənin hökmünə qayıdır.Çünki əgər insan bütün əməlləri edib namazı tərk edərsə kafir olar.Lakin əgər bütün əməlləri tərk edib namazı qılarsa kafir olmaz.

**Cavab**: Məsələ, mükəlləflərin halı etibarı ilə dörd haldan kənar çıxmır:

***Birinci hal***: Bütün zahiri əməlləri, namazı və qeyrisini tərk etməsi.Beləsinin küfründə heç bir şübhə yoxdur.Belə şəxsdə İslamı pozan iki amil cəmləşir: Birinci: Qəlb əməlinin yoxluğuna dəlalət edən bütövlüklə əməlin tərk edilməsi. İkinci: Namazın tərk edilməsi.

*İkinci hal*: Tək namazı yerinə yetirməsi.Bu, hər iki pozan amildən xilas olan müsəlmandır.Birinci: Çünki onun bütövlüklə əməli tərk etdiyini demək doğru deyil.Çünki o, namazı yerinə yetirmişdir.O isə, əməldir.İkinci: Çünki o, namazı tərk etməmişdir.

***Üçüncü hal***: İnsanın Muhammədə (salləllahu aleyhi və səlləm) itaət və tabeçilik olaraq zəkat və oruc kimi bəzi vacibləri yerinə yetirib namazı buraxmasıdır.Bu şəxs, əməlin tərk

olunmasında öz əksini tapan birinci pozan amildən xilas olmamışdır.Onun zəkatı və orucu, onu bu işləri etməyə sövq edən qəlb əməlinin olmasına dəlalət edir.Lakin həmin şəxs, namazın tərkini küfr hesab edən şəxslərə görə namazı tərk etdiyinə görə kafir olur.Namazın tərkini küfr hesab etməyən şəxslərə görə isə bu adam müsəlmandır.

*Dördüncü hal*: İnsanın namaz, zəkat, oruc və sayira zahiri əməlləri etməsi.Belə şəxsin müsəlman olmasında heç bir şübhə yoxdur.Çünki bu adam, ikinci hal sahibi kimi hər iki pozan amildən salamat qalmışdır.

Bununla da, aydın olur ki, məsələ namazı tərk edənin hökmünə dair olan ixtilafa qayıtmır[358] və orada bəzən bir insanda cəmləşən, bəzən isə biri olub digəri olmayan, bəzən isə hər ikisindən salamatlıq hasil olan İslamı pozan iki amil vardır.

Lakin müxalif bəzən birinci hala dair, bütün əməlləri, namazı və qeyrilərini tərk etmə halına dair çəkişir və həmin

---

[358] Onlardan biri iddia etmişdir ki, namazı tərk etmə ilə əməlin cinsini tərk etmə arasında təkfiri cəm etmək mümkün deyil.Bu sözlər isə ona rəddiyədir.Həmin şəxs birinin digərini batil etdiyini iddia etmiş və bunu iki zidd şeyin bir arada yer alması hesab etmişdir.O, demişdir: "Biz namaz qılan bir şəxsin eyni vaxtda əməlin cinsini tərk etdiyini necə təsəvvür edə bilərik.Onun mislində, namazı tərk etdiyi halda digər fərzləri yaxud vacibləri yaxud müstəhəbləri yerinə yetirən şəxsdir"bitdi.

Dedim: Onun qeyd etdiyi birinci halda əməlin cinsinin tərk edilməsi yoxdur.Çünki onun sahibi az öncə qeyd etdiyim kimi İslamı pozan iki amilə düşməkdən xilas olmuşdur.İkinci hal həmçinin.Həmin halda əməlin cinsi tərk edilmir.Bunu üçüncü halda bəyan etmişəm.Onun gətirdiyi hər iki misal doğru deyil.Namazın və əməlin cinsinin tərk edilməsi səbəbilə təkfir hökmünün bir arada gəldiyi hal: İnsanın mütləq şəkildə heç bir əməl etməməsidir. Bu isə, mümkün haldır və burada iddia etdiyi kimi iki ziddiyətli tərəf bir arada yer almır.

şəxsin namazın tərkini küfr görməyənlərə görə kafir olmadığını düşünür.Əslində isə məsələ bunun təm əksinədir.Bütün Əhli sunnə daxildə sahih imanın olması üçün zahiri əməlin labüd olduğunu deyirlər.

*Bu, aşağıdaki məsələlər vasitəsi ilə aydınlaşır:*

*Birinci*: Görüşlərin birində olduğu kimi imam Şafii, onun şagirdi Muzəni, müxalifin nəql etdiyinə əsasən Muhamməd bin Abdul-Vahhəb kimi sələf alimləri, namazı tərk edəni təkfir etməmələri ilə birgə əməlsiz imanın yetərli və məqbul olmayacağını açıq bildirmişlər.[359]

*İkinci*: Artıq İshaq bin Rahuyədən bütün fərzləri tərk edənin təkfir edilməsi və buna müxalif sözün murciələrə nisbət edilməsi nəql edilmişdir.Bununla bərabər İshaq (rahiməhullah) namazı tərk edənin təkfir edilməsinə dair ixtilafın ictihadı məsələ olduğunu hesab edir. [360] Bu səbəbdən, İshaq namazın tərk edilməsi ilə bütün fərzlərin tərk edilməsi arasında fərq qoyur.Birincinin təkfir edilməsində çəkişənin murciə olduğu deyilməz.İkincinin təkfir edilməsində çəkişən isə fərqlidir.

Şeyxul-İslam (rahmətullahi aleyhi) demişdir: "İshaq dedi: Əgər biri zöhrün vaxtı məğribə qədər çıxanacan, məğribin vaxtı isə gecənin yarısına qədər çıxanacan qəsdən namazı tərk edərsə, həmin adam böyük Allaha küfr etmiş

---

[359] Onların sözləri birinci hissədə və yuxarıda qeyd olunmuşdur.Habelə Muzəninin namazı tərk edənin hökmünə dair mövqeyinə: əl-məcmu`:3/16, kitabına bax.Artıq ona həmin şəxsin həbs ediləcəyinə lakin öldürülməyəcəyinə dair görüş nisbət olunmuşdur.

[360] Bununla bərabər o, namazı tərk edənin küfrünə dair icma hekayət edir.

olar.Həmin şəxs üç gün tövbəyə dəvət edilər.Əgər o, namaza qayıtmayıb: Onun tərki küfr deyil,-deyərsə, onun, yəni tərk edənin boyunu vurular.Ancaq əgər həmin şəxs namaz qıldığı halda bunu deyərsə, belə olan halda bu, ictihadı məsələ olacaq."[361]

Həmin bölgü vasitəsilə namazın tərk edilməsi məsələsi ilə bütövlüklə əməlin tərk edilməsi məsələsi arasında fəqr üzə çıxmış və namazı tərk etməyin küfr olmadığını deyən bəzi Əhli sunnənin əməlin şərt olduğunu demələrinə dair şeyx ibn Bəzin (rahiməhullah) qeyd etdikləri öz təsdiqini tapmışdır.

Üçüncü: Şeyx ibn Bəz (rahiməhullah) Abdul-Əziz bin Feysal ər-Racihi (hafizahullah) qardaşın əməllər və onun iman üçün səhihlik şərti yoxsa kamillik şərti olması haqqında sualına cavab olaraq demişdir: "Əməllərdən bir qismi imanın səhihlik şərtidir.Belə ki, namaz kimi əməllər olmadan iman səhih olmur.Onu tərk edən şəxs kafir olur.Əməllərdən bir qismi isə onun kamillik şərtidir və həmin əməllər olmayacağı təqdirdə, onu tərk edən şəxsin günahkar olmasına rəğmən iman səhih olur.

Mən ona dedim: Sələfdən namazı tərk edəni təkfir etməyən şəxslərə görə əməl kamillik şərtidir yoxsa səhihlik şərtidir?

Şeyx cavab olaraq dedi: "Xeyir! Əməl hamıya görə səhihlik şərtidir.Lakin onlar imanın hansı əməllərlə səhih olacağı məsələsində ixtilaf etmişlər.Bəzi insanlar demişlər: O, namazdır.Buna dair, Abdullah bin Şəqiqin xəbər verdiyi

[361] Məcmu`əl-fətəva:7/308.

kimi səhabələrin icması mövcuddur.Digərləri isə başqa əməlləri göstərmişlər.Hər bir halda, bütün sələf alimlərinə görə imanın səhih olması üçün əməlin cinsinin olması labüddür. Bu səbəbdən, onlara görə iman; söz, əməl və etiqaddır və iman yalnız bu üçü bir arada gələcəyi təqdirdə səhih olur."[362]

*Dördüncü*: Şeyx Abdul-Əziz Ali-ş-Şeyxə (hafizahullah) sual verilmişdir: Əməlləri iman anlamından çıxaran şəxslə bizim aramızda olan ixtilaf ləfzidir yoxsa həqiqidir?

Şeyx cavab verib demişdir: "Bizimlə fəqih murciələr arasında olan ixtilaf həqiqidir və heç də, ləfzi və formal deyil.

Belə ki, gerçək baxımından deyil fərziyyə baxımından, bizimlə onlar arasında olan fərq: Fəqih murciələrə görə bir insanın səhih və doğru etiqada sahib olması və tövhid kəlməsini dil gətirməsi ilə birgə əməlin cinsini tərk etməsi təsəvvür edilir.Həmin şəxs şəriətin əmrinə itaət olaraq heç vaxt əməl etmir və şəriətin əmrinə itaət olaraq heç bir qadağını tərk etmir.Onlara görə belə insan, ümumiyyətlə əməl etməsə belə müsəlman və mömindir.

Bizə görə isə həmin şəxs əməlin cinsinə sahib olmayınca nə müsəlman nə də ki, mömin olmur.

Əməlin cinsi (cinsul aməl) sözünün mənası: İnsanın Uca Allaha itaət olaraq Allahın hər hansı əmrinə boyun əyməsi,

---

[362] Cəridətu-r-riyad:12506-cı sayı.13/7/1423.

habelə Uca Allaha və Elçisinə itaət olaraq bəzi qadağalardan çəkinməsidir.

Bunun ardından Əhli sunnə ixtilaf etmişlər: Namaz digər əməllər mislindədir yoxsa namazın şəni fərqlidir? Həmin məsələ, namazı səhlənkarlıq və tənbəllik üzündən tərk edənin təkfir ediləcəyinə dair məşhurdur.

Məlum olduğu kimi Əhli sunnə bu məsələdə ixtilaf etmişlər.Onların bu məsələdə ixtilafı əməlin şərt olması ətrafında deyil.

Namazın səhlənkarlıq və tənbəllik üzündən tərkinin küfr olduğunu deyənlər belə deyirlər: Burada vacib olan əməl namazdır.[363]Çünki əgər o, namazı tərk etsə imansız olacaq.

Əhli sunnədən namazın səhlənkarlıq və tənbəllik üzündən tərkinin küfr olmadığını deyən digərləri isə belə deyirlər: Əməlin cinsinin olması labüddür.İnsanın itaətkarlıq olaraq zəkatı, itaətkarlıq olaraq orucu, itaətkarlıq olaraq həcci, yəni onlardan birini yerinə yetirməsi labüddür. İnsan əməllərdən bəzisinə, əməlin özəyinə sahib olana qədər bu işdə itaətkarlıq olaraq ibadətlərdən birini yerinə yetirməlidir.Çünki əməl olmayana qədər bu, iman adlanmayacaq.

Çünki nasslarda imanın gerçəyi bu üç şeyə qayıdır: Söz, əməl və etiqad.

---

[363] Bunun mənası, əgər insan namaz qılarsa əməl etmiş olacaq və hər iki pozan amildən yan duracaq.

Əgər biri: Əməl imanın gerçəyindən çıxır,-deyərsə, nassların dəlalət etdiyini tərk etmiş olar.

Beləliklə, bizimlə onlar arasında olan fərq şəkli və formal deyil həqiqidir.

Gerçəkdə bu öz tətbiqini tapa bilərmi? Yəni bu, təsəvvür edilir yoxsa təsəvvür edilməzdir? Bəzi insanlara müəmmalı qalır və onlar bir insanın tövhid kəlməsini deyən və haqq etiqadda olan mömin olub heç vaxt əməl etmədiyini, Allahın əmrinə boyun əyərək heç bir itaəti yerinə yetirmədiyini və Allahın əmrinə boyun əyərək haramlardan çəkinmədiyini təsəvvür edə bilmirlər.

Bu, gerçəkdə onlara görə təsəvvür edilməz olduğu zaman onlar onu səmərə etmişlər.Beləliklə də, onların düşündüyü kimi ixtilaf formal ixtilafa çevrilmişdir.Lakin bu, doğru deyil.Çünki biz bu məsələyə gerçək cəhətdən baxmırıq.Biz bu məsələyə nassların dəlalət etdiyi məna cəhətindən baxırıq.

Nasslar əməlin, imanın dayağlarından biri olduğuna dəlalət edir.Nasslar məhz buna dəlalət etdiyi zaman onun dayaq edilməsi vacib olmuşdur.Buna müxalif olan şəxs isə əsaslı surətdə müxalif olur.Onun ixtilafı şəkli və formal ixtilaf deyil əsaslı ixtilafdır.

Bu, gerçəkdə öz təsdiqini tapır yoxsa yox? Uca Allah bu məsələni Özü ilə qullar arasında etmişdir.Çünki insana,

bütün məxluqatın işlərini və insanların əməllərini, onların etdiklərini və tərk etdiklərini bilmək müyəssər olmur."[364]

[364] Şərit: Əsilətun fil imən val kufr.Şeyxin fəqih murciələr haqqında sözləri onlardan zahir ilə daxil arasında olan bağlılığı qəbul etməyənlərə aid edilir.

# Doqquzuncu şübhə:

## Fəqih murciələrlə ləfzi ixtilaf ətrafında

Müxalif deyir: Fəqih murciələr, bütün zahiri əməlləri tərk edərsə belə şəhadəti dilə gətirəni və təsdiq edəni təkfir etmirlər.Artıq Şeyxul-İslam bir çox yerdə onlarla digər Əhli sunnə arasında olan ixtilafın ləfzi olduğunu dəfələrlə demişdir.Əgər o, zahiri əməli tərk edəni təkfir etməyə dair məzhəbin Əhli sunnədə sabit məzhəb olduğunu hesab etsəydi bu zaman ixtilafın ləfzi deyil əsaslı olduğunu bəyan edərdi.

### *Buna iki yöndən cavab veriləcək:*

***Birinci***: Şeyxul-İslam fəqih murciələrlə Əhli sunnə arasında ixtilafı mütləq şəkildə ləfzi etməmişdir.Şeyxul-İslam bunu sadəcə zahir ilə daxil arasında olan bağlılığı "tələzum"u isbat edənlərə və "ləzim" yox olacağı zaman "məlzum"un olmayacağını iqrar edənlərə xas etmişdir.Məhz bu halda ixtilaf ləfzi olur.Artıq bu məsələ ətraflı izah edilmişdir.[365]

Burada onun iki yerdə dediyi sözləri qeyd etməklə kifayətlənirəm:

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Zahiri əməllərin iman adına girməsinin məcaz olduğunu deyənlərə: Sizin

[365] Birinci hissəyə bax.

ixtilafınız ləfzidir,-deyiləcək.Çünki sən bunun qəlbdə olan vacib imanın zəruri amilləri və gərəkli ünsürləri olduğunu qəbul edəcəyin zaman bəlli olacaq ki, ləzimin (zahiri əməllərin) yoxluğu məlzumun (daxili əməllərin) yoxluğunu gərəkdirəcək.Həmin zahirin yoxluğu isə daxilin yoxluğunu vacib edir.Bunu etiraf edəcəyin zaman ixtilafın ləfzi olduğu üzə çıxacaq.Əgər sən, Cəhm və onun ardıcılarının dediyi kimi küfrü aşkar etmək və bütün zahiri vacibləri tərk etməklə yanaşı qəlbdə tam və vacib imanın bərqərar olduğunu deyərsənsə, cavab olaraq sənə deyiləcək: Bu, sənin: Zahir onun zəruri amili və onun gərəkli ünsürüdür,-dediyin sözə zidd gələcək.Üstəlik deyiləcək: Sənin sözündən çıxan gerçək məna budur: Bəzən zahir daxilə bağlı olur bəzən isə ondan ayrı olur və o, onun zəruri amili, gərəkli ünsürü və nəticəsi deyil.Lakin o, olacağı zaman daxilin olmasına dəlalət edən, olmayacağı zaman isə yoxluğu ilə yoxluğa dəlalət etməyən dəlildir.Bu, sənin sözünün gerçəyidir."[366]

Habelə (rahiməhullah) demişdir: "Bu, zahiri əməllərin daxili imanın zəruri amilləri olmadığını deyən hər bir şəxs üçün vacib olur.Əgər biri: O, onun zəruri amillərindən biridir və daxili iman saleh zahiri əməli qaçılmaz edir,-deyib ardından: Həmin əməllər iman anlamının zəruri amilləri yaxud onun bir hissəsidir,-deyərsə, qeyd edildiyi kimi bu ləfzi ixtilaf olacaq."[367]

---

[366] Məcmu`əl-fətəva:7/577.

[367] Öncəki mənbə:7/584.

*İkinci*: Şeyxul-İslam bəzən fəqih murciələrin qəlb əməllərini imana daxil etmədiyinə dair əminlik ifadə etdirir, bəzən isə buna əmin olmur.Onun buna dair sözlərindən: “Cəhmilərə görə iman adi qəlb təsdiqi və biliyidir.Bu, Cəhm və Salihinin görüşüdür.Bu, habelə Əşari və onun əksər əshabından gələn məşhur görüşdür.Fəqih murciələr isə deyirlər ki, iman, qəlb təsdiqi ilə birgə dil sözüdür.Sahib olduqları iki görüşdən birinə əsasən onlara görə qəlb əməlləri bədən əməlləri kimi imandan deyil.Belə olan halda, bir insanın dili və qəlbi ilə təsdiq etməsi ilə bərabər Allahın nazil etdiyinə nifrət bəsləməsi mümkün olur.“[368]

Habelə demişdir: “İmanın qəlb təsdiqi və dil sözü olduğunu, əməllərin isə ondan olmadığını deyən murciələrın arasında Kufə fəqihlərindən və abidlərindən bir toplum insan olmudşur.Lakin onların sözü Cəhmin sözü mislində olmamışdır.Onlar, insanın bacardığı halda iman kəlməsini dilə gətirməyəcəyi təqdirdə mömin olmayacağını anlamışlar. Habelə onlar iblis, firon və digərlərinin qəlbləri ilə təsdiq etmələrinə rəğmən kafir olduqlarını bilmişlər. Ancaq əgər onlar qəlb əməllərini imana daxil etməsələr bu zaman onların Cəhmin sözünü demələri qaçılmaz olacaq. Onlar onu imana daxil etsələr, belə olan halda bədən əməllərini həmçinin ona daxil etmələri qaçılmaz olacaq. Çünki bədən əməlləri qəlb əməllərinin zəruri amilidir.

[368] Minhəcu-s-sunnəti-n-nəbəviyyə:5/288.

Lakin məsələnin onlara qaranlıq qalmasına səbəb həmin şəxslərin müəyyən şər`i dəlillərə sahib olmalarıdır."[369]

Müxalif qoyduğu qaydaya uyğun olaraq, Şeyxul-İslamdan gələn birinci nəqlə əsasən qəlb əməlini tərk edənin kafir olmayacağını deməlidir.Çünki Şeyxul-İslam (rahiməhullah) bunun murciələrin sözü olduğunu isbat edəndən sonra onlarla Əhli sunnə arasında ixtilafın ləfzi olduğuna əminlik ifadə etmişdir.Əgər o, qəlb əməlini tərk edənin küfrünü Əhli sunnənin məzhəbi hesab etsəydi ixtilafın həqiqi və əsaslı olduğunu deyərdi!

Görəsən müxalif bu gərəkdirmənin cavabında nə deyəcək?!

Heç şübhəsiz ki, müxalif Şeyxul-İslamın bütün fəqih murciələrlə ixtilafın ləfzi olduğunu hesab etmədiyini deməyə məcburdur.Şeyxul-İslam, özünun bir neçə yerdə bildirdiyi kimi qəlb əməlini, habelə "tələzum"u isbat edənlərlə ixtilafın ləfzi olduğunu açıq vurğulayır.Tələb olunan məhz budur.

[369] Məcmu`əl-fətəva:7/194.

# Onuncu şübhə:

## Növbəti sözlər: Sələfin istilahında əməl dil sözünü şamil edir

Müxalif iddia etmişdir ki, sələfin əmələ dair ifadələri bədən əməli ilə məhdudlaşmır, üstəlik dil sözünü əməldən edir.Bu qaydaya əsasən bütün zahiri əməli tərk edəni təkfir etməyən şəxsin Əhli sunnənin imanın söz və əməl olması haqqında icmasına müxalif olması deyilməz.

***Buna bir neçə yöndən cavab veriləcək:***

*Birinci*: Bu, bəzi murciələrin istifadə etdiyi qədim şübhədir. Bu şübhəni dilə gətirənlərdən biri: Şəbəbə bin Suvardır.Onlar bununla, sələfə və murciələrə müvafiq gəlməyi qəsd etmişlər.Onlar Əhli sunnəyə müvafiq gəlməkdən ötrü: İman, söz və əməldir,-deyirlər.Daha sonra əməlin dil sözü olduğuna açıqlama verirlər.

Heç şübhəsiz ki, dil sözü əmələ daxil olur.Lakin bu, sələfin: İman, söz və əməldir,-dediyi zaman qəsd etdikləri əməl deyil.Əks halda onların sözləri faydasız təkrar olardı. Onlar söz dedikdə, qəlb və dil sözünü qəsd etmişlər.Əməl dedikdə isə qəlb əməli və bədən əməlini qəsd etmişlər.Bu, onlardan məşhurdur və həmin məsələyə dair cüzi bilgisi

olan adama bu gizli deyil.Artıq onların ifadələri nəql edilmişdir.[370]

Burada mən Əcurridən (rahiməhullah) gələn bir nəqli qeyd etməklə kifayətlənirəm.İmam (rahiməhullah) demişdir: “Bilin ki,-Allah bizə və sizə rəhm etsin-, müsəlmanların alimləri imanın bütün məxluqata vacib olduğunu etiqad edirlər.O, qəlb ilə təsdiq, dil ilə iqrar və bədən əzaları ilə əməldir.

Sonra bilin ki, qəlbin biliyi və təsdiqi yalnız dil ilə olan tələffüzün olacağı təqdirdə yetərli olacaq.Qəlb ilə bilik və dil ilə tələffuz isə bədən əzaları ilə əməl olmayınca yetərli olmaz.Əgər bu üç xislət bir arada gələrsə insan mömin olar.Buna Quran, sunnə və alimlərin sözü dəlalət edir.”[371]

Əcurri (rahiməhullah) dil sözü ilə bədən əməli arasında fərq qoymuş daha sonra bir qədər də açıqlama verərək demişdir: “Bədən əzaları ilə edilən əməllər qəlb və dildə olan imanı təsdiq edir.

Əgər biri təharət, namaz, zəkat, oruc, həcc, cihad və sayira bədən əzalarına daxil olan əməllər ilə imanı təsdiq etmədən sadəcə bilik və sözlə qane olarsa mömin olmaz. Bilik və söz ona heç bir fayda verməz və onun əməli tərk etməsi imanını təkzib etmiş olacaq.Onun qeyd edilənlərə əməl etməsi isə onun imanını təsdiq etmiş olur.Müvəffəq edən Allahdır!”.[372]

[370] Birinci bölümün birinci fəsilinə bax.
[371] əş-Şəria:2/611, Əcurri.
[372] Öncəki mənbə:2/614.

*İkinci*: Sələflə murciələr arasında olan çəkişmə dil ilə tələffüz və onun imandan olub olmaması ətrafında getmirdir.Çünki Cəhm və ona müvafiq gələnlərdən öncə bütün qədim murciələr dil sözünün imandan olduğunu etiqad edirdilər. Habelə onlar qəlb əməlinin imandan olmasında çəkişmirdilər.Çünki Cəhm və ona müvafiq gələnlərdən başqa bütün murciələr onun imandan olduğunu isbat edirlər.Çəkişmə yalnız bədən əməli ətrafında getmişdir.Belə olan halda ağıl sahibi birisinin: Sələf iman söz və əməldir dedikdə əməlin arxasında dil sözünü qəsd edirlər,-deməsi nə dərəcədə doğrudur? İxtilaf ümumiyyətlə dil sözü ətrafında olmamışdır. Habelə belə olan halda onların: İman, söz və əməldir,-demələrində nə fayda vardır?

Məhz bu səbəbdən, imam Əhməd bu görüşü seçənlərə sərt münasibət göstərib bu sözü misli görünməyən iyrənc sözlərdən saymışdır.

Əbu Bəkr əl-Əsram (rahiməhullah) "əs-sunnə" kitabında demişdir: "Əbu Abdullahın sözlərini eşitdim.Ona Şəbəbə[373]

---

[373] Şəbəbə bin Suvar əl-Fəzzəri.Onların köləsi Əbu Amr əl-Mədəini.Onun mənşəyi Xorasandandır."Təhzibu-t-təhzib:4/2642 kitabında demişdir: "Əhməd bin Hənbəl dedi: Onun murciəliyinə görə onu tərk etdim və ondan heç bir şey yazmadım.Ona deyilmişdir: Ey Əbu Abdullah! Əbu Muaviyə necə? Dedi: Şəbəbə (həmin bidətə) dəvətçi idi. Zəkəriyyə əs-Səci dedi: Saduq ravidir, ircaya çağırırdı.İmam Əhməd onu tənqid etmişdir.İbn Xarraş demişdir: Əhməd onu bəyənmirdi.Lakin o, hədisdə saduq ravi idi.Habelə Cəfər ət-Tayəlisi ibn Məin haqqında demişdir: Etibarlıdır.Osman əd-Dərimi demişdir: Mən Yəhyəyə dedim: Şəbəbə necədir? Dedi: Etibarlıdır.İbn Sa`d demişdir: Hədis elmində etibarlı və xeyirxah birisi idi.Murciə idi.Habelə əl-Acəli dedi: Murciə fikirli idi.Ona deyildi: Məgər iman söz və əməl deyil? O, dedi: İnsan deyəcəyi zaman əməl etmiş olacaq.əl-Bərzəi Əbu Zur`adan onun haqqında rəvayət edir: Murciə fikirli idi.Ona deyildi: Bu fikirlərdən döndümü? Dedi: Bəli.Habelə Əbu Hatim dedi:

haqqında: Ona dair nə deyirsən?-deyildiyi zaman demişdir: "Şəbəbə irca iddiasında olmuşdu.Dedi: Şəbəbədən bu sözlərdən daha çirkin və onun mislində olan və heç kəsdən eşitmədiyim sözlər hekayət edilir.Əbu Abdullah demişdir: Şəbəbə dedi: Bir şəxs, insanlar dediyi kimi deyəcəyi zaman artıq dili ilə əməl etmiş olacaq.İnsan deyəcəyi zaman bədən əzası ilə, yəni danışdığı anda dili ilə əməl etmiş olacaq.Daha sonra Əbu Abdullah dedi: Bu, çirkin sözdür.Kiminsə bu sözü dediyini eşitmədim və mənə buna dair heç bir şey çatmamışdır.Əbu Abdullaha deyildi: Sən Şəbəbədən müəyyən şeylər yazmışdın? O, dedi: Bəli! Əvvəllər, onun bu sözləri dediyini bilməmişdən öncə ondan az bir şey yazmışdım.Əbu Abdullaha dedim: Daha sonra ondan bir şey yazdınmı? Dedi:Xeyir, bir hərf belə yazmadım!".[374]

İbn Rəcəb (rahiməhullah) demişdir: "Murciələrdən bir tayfa Əhli sunnəyə müvafiq olmaqdan ötrü: İman, söz və əməl-dir,-deyir daha sonra əməli söz olaraq acıqlayırdılar.Onlar deyirlər: O, dil əməlidir.İmam Əhməd bu sözü Şəbəbə bin Suvardan qeyd edib həmin sözü pisləmişdir.O, demişdir: O, ən çirkin sözdür.Kiminsə bu sözü dediyini eşitmədim və mənə buna dair heç bir şey çatmamışdır.

Mənası: Bu, sələfdən heç kəsin demədiyi bidətdir.

---

Saduq ravidir.Onun hədisləri yazılır lakin dəlil kimi istifadə edilmir. Habelə ibn Adiyy demişdir: İnsanlar onu yalnız irca fikirlərinə görə pisləmişlər.Onun hədisləri isə qəbahətsizdir.Buxari dedi: Deyilənə görə o, 254 yaxud 255-ci ildə vəfat etmişdir. Əbu Musa və qeyriləri isə onun 256-cı idə öldüyünü demişlər." (bəhru-d-dəm fimən təkəlləmə fihil iməm Əhməd bimədhin əu zəmm:189-cu səh0

[374] Məcmu`əl-fətəva:7/255.Xalləl, "əs-sunnə:3/571_982-ci rəqəm.

Güman ki, imam Əhmədin burada qəsdi: İman, söz və əməldir,-deyən Əhli sunnənin sözlərinin bu cür surətdə açıqlanmasını pisləməsidir.Bu, bidətdir.Habelə bu sözlər faydasız təkrardır.Çünki bu sözə əsasən əməl sözün özüdür. İmamın burada qəsdi, sözün əməl adlanmasını inkar etməsi deyil."[375]

İbn Rəcəb (rahiməhullah) dil sözünün əməl olduğunu bəyan etmiş və buna dəlil gətirmişdir.Habelə bəyan etmişdir ki, Buxari bu görüşü seçmiş və imanın söz olduğunu deyənlərə zidd olaraq imanın bütövlüklə əməl olduğunu qəsd etmişdir.Təsdiq əməldir.Habelə dil sözü əməldir.Bədən əzaları ilə edilən əməldir.Adicə adda qorxulu heç bir şey yoxdur.Təhlükə və bidət yalnız Əhli sunnənin "iman, söz və əməldir" sözünü bu tərzdə açıqlamaqdadır.

*Üçüncü*: Müxalifin sözünə əsasən ümumiyyətlə "irca" deyilən bir şey yoxdur.Çünki murciələr dil sözünü imandan edirlər.Onlar imanın söz və əməl olmasında Əhli sunnəyə müvafiq gəlirlər.Habelə bu sözə əsasən sələfin murciələri pisləməsi və onları bidətdə ittiham etməsi yersiz olur. Habelə bu sözə əsasən əməlin şəninin kiçildilməsi və ona çağıran nassların dil sözünə yaxud sözlərinə aid edilməsi gərəkli olur.Bu isə, açıq-aydın zəlalətdir.

---

[375] Fəthul bəri:1/122.

# On birinci şübhə:

## Növbəti sözlər: Əgər əməlin tərki küfr olsaydı mütləq alimlər bunu bildirərdilər

Bu şübhənin mahiyyəti: Onlar deyirlər: Necə ola bilər ki, zahiri əməlin tərk edilməsi küfr olsun biz isə elm əhlinin sözlərində, digər İslamı pozan amillərdə olduğu kimi buna dair heç bir açıqlamaya rast gəlməyək?

### *Buna iki yöndən cavab veriləcək:*

*Birinci*: Bu, məqbul deyil.Çünki elm əhlindən bir toplum adamın bunu açıq bildirməsi varid olmuşdur. Onlardan: Səhl bin Abdullah ət-Təstəridir. Şeyxul-İslam onun sözünü nəql edib həmin sözləri iqrar etmişdir.Habelə onlardan biri Şeyxul-İslamın özüdür.Habelə Şeyxul-İslam Muhamməd bin Abdul-Vahhəbdir (rahiməhumullah). Bunlar əməli tərk etməyin küfr olduğunu açıq bildirmişlər. Habelə digər alimlərin sözlərində, bədən əməli olmadan təsdiq və tələffüzün faydasız və yetərsiz olacağı kimi bu mənanı ifadə edən sözlər varid olmuşdur.Bu kimi sözləri öncə ətraflı qeyd edildiyi kimi Əcurri və digər alimlər demişlər.[376]

---

[376] Həmin xəbərlərə üçüncü bölümün üçüncü fəslində və eyni bölümün ikinci fəslində bu məsələdə hekayət edilən icmaya dair araşdırmaya bax.

*İkinci*: Müxalifə deyiləcək: Məgər qəlb əməlinin tərk edilməsi yekdilliklə küfr deyil? Bununla belə, imamların sözlərində bunun qeyd edilməsinə çox az rast gəlinir. Məgər bu, onun küfr olmadığını ifadə edir?

Üstəlik deyərdim ki, bədən əməlinin tərkinə dair varid olan sözlər qəlb əməlinin tərkinə dair varid olan sözlərdən daha çoxdur.

# On ikinci şübhə:

## Növbəti sözlər: Bu məsələnin araşdırılması bekarçılıqdan doğan bir işdir

Bu şübhəni ortaya atan şəxslər, kitablar yazan, təlif edib münaqişə edən və üzərində olduğu yolun haqq ona müxalif olanın yolunun batil olduğunu deyən müxalif deyil.

Bunu yalnız müxtəlif səbəblərə görə başqa adamlar deyirlər:

*Bu şübhəyə bir neçə yöndən cavab veriləcək:*

*Birinci*: Küfr yaxud imanla nəticələnən məsələnin araşdırılması bekarçılıqdan doğan iş ola bilməz.Hətta əgər biz bu məsələnin gerçəyə yaxud əksər hallarda daxili küfrə verilən hökmlə əlaqədar olduğunu desək, yenə də küfrün və onun növlərinin bəyan edilməsi labüd olacaq.

*İkinci*: Bu məsələnin müzakirəsi, əməlin məqamını bəyan etməkdə Əhli sunnənin əsaslarını təyin edir və onun imana daxil olmasına dair onların qəsdini açıqlayır, habelə şeytanın oyuncağına çevrilmiş murciələrə rəddiyə verir.

*Üçüncü*: Həmin məsələnin araşdırılmasında olan faydalardan: Elm tələbəsini, digər firqələrin ixtilaf etdikləri

bir çox nasslarda sələfin fəhmi ilə tanış etməkdir.Məsələn, şəfaət hədisi və ümumən təhdid məzmunlu nasslar.

*Dördüncü*: Bunun müzakirəsi, zahir ilə daxil arasında olan bağlılıq məsələsinin təməlini qoyur.Tələzum isə, qədim və müasir zamanlarda bir çox insanların anlamadığı önəmli bir məsələdir.Şeyxul-İslamın dediyi kimi məhz "tələzum" məsələsinin dərk edilməməsi səbəbilə yanlışlıqlar meydana gəlmişdir.

*Beşinci*: Əgər bu, bekarçılıqdan doğan bir iş olsaydı elm əhli bunu bəyan etməz, bu məsələdə müxalif olan kitablardan çəkindirməz və həmin kitabları yaramaz murciəlik məzhəbinə dəvət edən hesab etməzdilər.

*Altıncı*: Bu sözü deyən şəxs çəkişmənin formal yaxud ləfzi yaxud səmərəsiz olduğunu düşünür.Əslində isə belə deyil.Çünki bu, nassların anlaşılması, habelə sələf və imamların sözlərinin anlaşılması və yekdilliklə bidət olan irca fikrinin anlaşılması ətrafında gedən həqiqi ixtilafdır.

Əgər bu, ləfzi ixtilaf olsaydı yaxud hamı, zənn edildiyi kimi yekdil olsaydılar müxalif öz sözünü tərk edib elm əhlinin sözlərinə qayıtmaqdan imtina etməzdi.

Son olaraq: Bu, müxalifin gətirdiyi əqli şübhələrə rast gəldiyim sözlərdir.Həmin sözlərin nə dərəcədə zəif və əsassız olması və həmin sözlərin Əhli sunnənin açıq-aydın dəlil və sübutları, habelə onların icması önündə tab gətirməyəcəyi bəlli olmuşdur.Əgər müxalif bu şübhələri təkrar-

**təkrar çoxlu sayda gətirsəydi mən öz növbəmdə onu nəql edib ona cavab verməkdə usanmazdır.**

Müxalif elm əhlinin bir sıra sözlərinə istinad edərək həmin sözlərin əməlin iman üçün kamilliyi və onu bütövlüklə tərk edənin qiyamət günü qurtulacaq müsəlman olduğunu ifadə etdiyini iddia etmişdir.

*Bilmək lazımdır ki, bu sözlər üç məsələnin birindən kənar çıxmır:*

*Birinci*: Həmin sözün səhabə və tabiinlərdən sonra gələn sonraki söz olmasıdır.Heç şübhəsiz ki, bu söz, icma ilə puça çıxarılır.

*İkinci*: Həmin sözün, bir neçə ehtimala malik olmasıdır. Belə olan halda həmin söz bu mövzuda öz dəyərini itirir.

*Üçüncü*: Həmin sözün yanlış olmasına dair müxaliflə yekdil olduğumuz söz olmasıdır.Belə olan halda onun həmin sözə əsaslanması icazəli deyil.

Uzun araşdırmadan sonra, kəlamçılıq bidətindən təsirlənənlərin və etiqadın böyük bir hissəsində sələfin məzhəbinə müxalif olanların sözləri istisna olmaqla müxalifin görüşünü dəstəkləyəcək açıq-aydın sözün olmadığı mənə bəlli olmuşdur.İrəlidə ibn Hazm və Beyhaqi-dən nəqllər gələcək.

Elm əhlindən gələn xəbərlərin, ələxsus onların icmasına dair nəql olunan sözlərin açıq-aydın olmasına rəğmən müxalif bəzi imamlardan gələn bir sıra sözlərdən yapışıb həmin sözlərin icmaya müxalif gəlməsi yaxud onu pozması təəssüratını yaratmağa çalışmışdır.

Nəhayət mən bütün bu sözləri qeyd edib onu elmi şəkildə münaqişə etməyə çalışmışam.

*Bunun izahı aşağıda göstərilən şəkildədir:*

1-İmam Sufyən bin Uyeynədən gələn xəbər (hic.198-ci ildə v.e)

2-İmam Şafiidən gələn xəbər (hic.204-cü ildə v.e)

3-İmam Abdullah bin Zubeyr əl-Humeydidən gələn xəbər (hic.219-cu ildə v.e)

4-İmam Əhməd bin Hənbəldən gələn xəbər (hic.241-ci ildə v.e)

5-İmam ibn Quteybə əd-Deynuridən gələn xəbər (hic.276-cı ildə v.e)

6-İmam Muhamməd bin Nəsr əl-Mərvəzidən gələn xəbər (hic.394-cü ildə v.e)

7-Mərvəzinin hekayət etdiyi və hədis əhlindən bir sıra insanlardan gələn xəbər

8-İmam ibn Mandəhdən gələn xəbər (hic.395-ci ildə v.e)

9-İmam ibn Hazmdan gələn xəbər (hic.456-cı ildə v.e)

10-İmam Beyhaqidən gələn xəbər (hic.458-ci ildə v.e)

11-İmam Qadı İyaddan gələn xəbər (hic.544-ci ildə v.e)

12-İmam ibn Salahdan gələn xəbər (hic.643-cü ildə v.e)

13-Şeyxul-İslam ibn Teymiyyədən nəql edilən bir sıra sözlər (hic.728-ci ildə v.e)

14-İmam ibnul-Qayyimdən gələn xəbər (hic.751-ci ildə v.e)

15-İmam ibn Əbul İzzdən gələn xəbər (hic.792-cu ildə v.e)

## *Birinci*: İmam Sufyən bin Uyeynənin sözlərindən dəlil gətirdikləri məqam və bunun izahı

İmam (rahiməhullah) demişdir: ”Əgər biri imanın xislətlərindən birini danaraq tərk edərsə bununla o, bizə görə kafir olar.Ancaq əgər biri onu tənbəllik və səhlənkarlıq üzündən tərk edərsə biz onu tərbiyyə edərik və həmin şəxs bununla bizə görə nöqsanlı olar.Sunnə məhz belədir.İnsanlardan sənə sual verənə mənim adından belə çatdır.”[377]

Müxalif imamın növbəti sözlərinə əsaslanmışdır: ”Ancaq əgər biri onu tənbəllik və səhlənkarlıq üzündən tərk edərsə biz onu tərbiyyələndirərik və həmin şəxs bununla bizə görə nöqsanlı olar.” Müxalif bu sözlərin ardından demişdir: Əgər əməlin tərk edilməsi küfr olsaydı o, tərbiyyələndirmə ilə kifayətlənməz və həmin şəxsə yalnız naqislik hökmünü verməzdi.

### *Buna iki yöndən cavab veriləcək:*

***Birinci***: Bu, çəkişmə mövzusundan kənar bir məsələdir. Çünki çəkişmə hər hansı xislətin tərk edilməsi yaxud hansısa əməldə etinasızlığın olmasında deyil.Çəkişmə yalnız bütün zahiri əməlin tərk edilməsindədir.Bu zaman insanın qəlbində imanın olması mümkündürmü?

---

[377] Əcurri, “əş-Şəria:2/559_197-ci rəqəm.İbn Batta, “əl-İbənə:2/631_817-ci rəqəm.

*İkinci*: İmam Sufyən bin Uyeynədən (rahiməhullah) fərzləri tərk edənin təkfir ediləcəyinə dair xəbər nəql edilmişdir. Belə ki, imam demişdir: ″Murciələr "lə iləhə illəllah" kəlməsinə şahidlik edib qəlbi ilə fərzlərin tərk edilməsində israrlı olan şəxsə cənnətin vacib olduğunu demiş və fərzlərin tərk edilməsini haramların işlədilməsi səviyyəsində olan günahlar adlandırmışlar.Əslində isə onlar eyni ola bilməz. Çünki haramları halallaşdırmadan işlətmək asilikdir. Fərzləri isə cahillik və üzr olmadan tərk etmək küfrdür." Bu sözlər, bütün vacibləri tərk edənlə ayrı-ayrı əməlləri tərk edən arasında fərqin olmasına dəlalət edir.

## *İkinci*: İmam Şafiinin sözlərindən dəlil gətirdikləri məqam və bunun izahı

Müxalif demişdir: İmam Şafii dedi: "Bilin ki, iman qəlb biliyi, dil iqrarı və bədən əməlidir.Daha sonra iman özəy və şaxədən ibarətdir. Əgər insan bilik, təsdiq və mükəlləflərin əhkamlarına dair vacib inanclar kimi onun özəyini tərk edərsə artıq bəyan etdiyimiz kimi kafir olar.Ancaq əgər insan onun şaxəsini tərk edərsə kafir olmaz.Lakin fərz namazlarının tərk edilməsi kimi bəzisini tərk etməklə asilik etmiş olar."[378]

Onun sözlərində əsas məqam: İmam Şafii əməli, tərk edilməsi küfr olan özəydən etməmişdir.İmam onu sadəcə insanın onu tərk edəcəyi təqdirdə kafir olmayacağı şaxədən etmişdir.

### *Buna bir neçə yöndən cavab veriləcək:*

*Birinci*: Bu risalənin imam Şafiiyə nisbəti səhih deyil.

Şeyx Muhamməd bin Abdul-Vahhəb əl-Aqil (hafizahullah) demişdir: Əbu Hatim, Beyhaqi, ər-Razi, ibn Hacər və qeyriləri, həmçinin ərəb tarıxının irsi və ərəb ədəbiyyatı kimi əsərlərin sahibləri və ümumiyyətlə İmam Şafii haqqında yazanların heç biri, onun yazdığlarını araş-

[378] əl-Fiqhul Əkbər.İmam Şafiiyə nisbət edilən kitab.

dırmağa böyük rəğbət bəsləmələrinə rəğmən bu risaləni imam Şafiinin əsərləri arasında qeyd etməmişlər.Üstəlik onlar itmiş sayılan bir neçə kitablar saymışlar.Şübhəsiz ki, əgər onlar bu risalə haqqında eşitsəydilər çox sevinərdilər. Xüsusən ər-Razini qeyd etmək olar. Çünki bu risalədə gələnlərin bir çoxu onun əşari əqidəsinə uyğun gəlir.Onun bu risalə haqqında eşidib onu diqqətsiz qoyması isə mümkün olan şey deyil.Üstəlik həmin risalə, ər-Razi üçün imam Şafiinin Allahı bənzətmək və cisim vermək kimi Əhli sunnəyə nisbət etdiyi, lakin Əhli sunnənin bundan uzaq olduğu məsələlərdən uzaq olduğunu isbat etməkdə ən böyük dəlili olardı.Bu isə həmin risalənin ona nisbətinin səhih olmadığına ən böyük dəlildir."[379]

Kəlam əhlinin istilahları ilə dolu olan və onların məzhəbini isbatlamağa yönələn bu risaləni dəlil gətirənlərin halı təəccüb doğurmaya bilməz.Həmin risalədə misal üçün ilk vacib baxışdır.Həmçinin Allah cövhər, cism və ərəz deyil. Həmçinin Onun məkanı yoxdur və istiva ayəsi mütaşabih ayələrdəndir.Həmçinin Allah heç bir səbəbsiz yaradır və orada gələn digər şeylər.Şübhəsiz ki, imam Şafiinin bu cür sözlərdən və onu dilə gətirənlərdən uzaq olması qəti bilinməkdədir.

---

[379] Minhəcul imam əş-Şafii fi isbətil aqidə:2/467.Şeyx qeyd edilən kitabın Şafiiyə nisbətinin səhih omadığını bəyan etmək üçün on bir yöndən sübutlar gətirmişdir.Habelə: Bəraətul əimmətil ərbəa min məsəilil mutəkəlliminəl mubtədia:88-91-ci səh, Abdul-Əziz bin Əhməd əl-Humeydi" kitabına bax.Şeyx həmin kitabda adı çəkilən nüsxənin Bəqiləninin müəllifi olduğu "əl-insaf" kitabına çox uyğun gəldiyini bəyan etmişdir.Onlar arasında aparılan müqayisə bunu bir daha təsdiq edir.

Məgər məsələ, imam Şafiinin xəbər verdiyi icmaya müxalif olan bidəti müdafiə etmək məqsədilə nəql olunanın mahiyyətinə varmadan adi nəql etməyə çevrilmişdir?

*İkinci*: Bu xəbər haqqında ən uzağı bu sözlər deyiləcək: İnsan fərz namazları kimi bəzi şaxəni tərk edəcəyi zaman asilik edəcək lakin kafir olmayacaq.Bizim söhbətimiz isə bəzi əməllərin tərk edilməsi haqqında getmir.

Həmçinin zahiri əməlin şaxə adlandırılması, yuxarıda qeyd etdiyimiz kimi anlaşılmayan məsələ deyil.

***Üçüncü***: İmam dil sözünü, insanın onu tərk edəcəyi halda kafir olacağı özəydən etməmişdir.Müxalifin anlayışına əsasən sözü tərk edənə müsəlman hökmü vermək gərəkdir.

## *Üçüncü*: İmam Humeydinin sözlərindən dəlil gətirdikləri məqam və bunun izahı

İmam (rahiməhullah) demişdir: ”Biz xəvariclər kimi: Əgər biri böyük günah işlədərsə kafir olar,- sözünü demirik.Hər hansı bir günaha görə təkfir çıxarılmır.Küfr yalnız Peyğəmbərin (salləllahu aleyhi və səlləm) dediyi beş şeyin tərk edilməsində olur: “İslam beş (əsas) üzərə qurulmuşdur: Allahdan başqa (ibadətə haqqı olan) ilahın olmadığına və Muhammədin Onun Elçisi olduğuna şahidlik etmək, namaz qılmaq, zəkat vermək, Ramazan orucunu tutmaq və (Allahın) evinə həcc etmək.”

Onlardan üçünü tərk edən, şəhadəti dilə gətirməyən, namaz qılmayan və oruc tutmayan şəxs barəsində heç bir mübahisə aparılmaz.Çünki bu şeylərdən heç biri vaxtından geç buraxılmaz.Həmin şeyləri qəsdən vaxtı çıxana qədər buraxan şəxs onu səhlənkarlıqdan sonra qəza olaraq əda edərsə yetərli olmaz.

Zəkat isə fərqlidir.İnsan hər hansı vaxtda onu ödəyəcəyi zaman bu, yetərli olacaq.Lakin həmin şəxs malını saxladığı üçün günah daşıyacaq.Həmçinin insana həcc vacib olacağı və buna imkan tapacağı zaman həcc ona vacib olacaq.Bütün bu şeylər ona, yerinə yetirəcəyi vaxt yerinə yetirmiş olacağı və yerinə yetirdiyi zaman, zəkatda günah qazandığı kimi

gecikdirmə səbəbilə günah qazanmayacağı halda vacib olacaq.Çünki zəkat yoxsul müsəlmanların haqqıdır və insan onları həmin hüquqdan məhrum etmiş olur.Həmin hüquq onlara çatana qədər insan günah daşıyır.Həcc isə onunla Rəbbi arasındadır.İnsan onu yerinə yetirəcəyi zaman vacibi yerinə yetirmiş olacaq.Ancaq əgər insan imkan sahibi olduğu halda həcc etmədən ölərsə həcc etmək üçün dünyaya qayıtmağı diləyəcək.Onun yaxınlarına onun yerinə həcc etmələri vacibdir.Ölümdən sonra insanın əvəzinə borc ödənildiyi kimi bunun həmçinin onun əvəzinə yerinə yetirilməsinə ümid edirik."[380]

Müxalif onun növbəti sözlərini əsas gətirmişdir: "Küfr yalnız Peyğəmbərin (salləllahu aleyhi və səlləm) dediyi beş şeyin tərk edilməsində olur...".Dedi: Beş şeydən savayı əməllərdən heç bir şeyin tərki küfr adlanmır.

## *Buna iki yöndən cavab veriləcək:*

***Birinci***: Doğrudan da, bu, rast gəldiyim ən qəribə dəlil gətirmə üsublarından biridir.İmam Humeydinin sözlərində bütövlüklə əməli tərk edənin kafir olmayacağı yoxdur.Üstəlik onun sözləri namazı və orucu tərk edənin təkfir ediləcəyini açıq göstərir.Heç şübhəsiz ki, bunu deyən şəxs zəruri olaraq bütün əməlləri tərk edənin kafir oldğunu deyir.[381]

---

[380] Humeydi, "usulu-s-sunnə:43-cü səh".

[381] Müxalif Humeydinin sözlərinə əlavə edərək demişdir: " Humeydi dedi: "Küfr yalnız beş şeyin tərk edilməsindədir." Bununla o, hər iki növ küfrü, həm böyük küfrü həm də, kiçiyi qəsd edir.O, beşdən savayı əməllərdən heç bir şeyin tərkini küfr adlandırmır.Buna dəlil, onun şəhadət, namaz və oruc ilə zəkat və həcc

İbn Rəcəb (rahiməhullah) dörd dayağı tərk edənin küfrünə dair sözü ona nisbət edib demişdir: "Habelə Yəqub əl-Əşari Leysdən, Səid bin Cubeyrdən rəvayət edib demişdir: Əgər biri qəsdən namazı tərk edərsə kafir olar.Əgər biri qəsdən Ramazanın bir günündə orucu pozarsa kafir olar.Əgər biri qəsdən həcci tərk edərsə kafir olar.Əgər biri qəsdən zəkatı tərk edərsə kafir olar.Həkəm bin Uteybədən buna bənzər söz rəvayət edilir.Həmçinin bu, Əhməddən hekayət edilən bir rəvayətdir.Onun əshabından Əbu Bəkr bu görüşü seçmişdir. Habelə Abdul-Məlik bin Həbib əl-Məlikidən bunun mislində olanı rəvayət edilir.Habelə bu, Əbu Bəkr əl-Humeydinin görüşüdür."[382]

*İkinci*: İmam həmin risalədə növbəti sözləri demişdir: "İman, söz və əməldir, artır və azalır.Söz yalnız əməli ilə, əməl və söz yalnız niyyət ilə, söz, əməl və niyyət isə yalnız sunnə ilə faydalı olur." Humeydinin dediyi bu sözlər, imamların sözü və Əhli sunnənin icmasıdır.Söz yalnız əməl ilə fayda verir.Üstəlik Humeydi bundan daha aydın görüşü ortaya qoyub demişdir: "Mənə, bəzi insanların belə dediyi xəbər verilmişdir: "Hər kim danmayacağı halda namazı, zəkatı, orucu və həcci iqrar edib ölənəcən onlardan heç bir şeyi etməzsə yaxud ölənəcən arxasını qibləyə tutub namaz qılarsa, habelə fərzləri və qibləyə tərəf yönəlməyi iqrar

---

arasında fərq qoyması və zəkatı simiclik edərək geçikdirən şəxsin günahkar olmasını deməsidir."

Dedim: Humeydinin sözlərindən görünən tərəf namaz və orucun şəhadət kimi olmasıdır.Belə olan halda bu ikisinin tərk edilməsi böyük küfr olur.Bizim məqsədimizin isbat edilməsi üçün isə bu kifayətdir.

[382] Fəthul bəri:1/121, ibn Rəcəb.

edəcəyi zaman bunu tərk etməyin onun imanına təsir edəcəyini bilərsə, həmin şəxs mömindir. Mən isə dedim: Bu, Allaha aşkar küfr etmək və Allahın kitabı, Peyğəmbərin sunnəsi və müsəlmanların əməlinə zidd gəlməkdir.”

Belə olan halda onun əməli tərk edəni təkfir etmədiyi necə iddia oluna bilər?!

## *Dördüncü*: İmam Əhmədin sözlərindən dəlil gətirdikləri məqam və bunun izahı

İmam Əhməd Musəddəd bin Musərhidə yolladığı məktubda demişdir:

“İman söz və əməldir və o, artıb azalır.Yaxşı işlər görəcəyin zaman artır, pis işlər edcəyin zaman azalır. Bununla da, insan imandan islama çıxır.Əgər o, tövbə edərsə imana qayıdır.Lakin insanı İslamdan yalnız Uca Allaha şirk qoşmaq yaxud Allahın vacib buyurduğu hər hansı bir fərzi danaraq rədd etmək çıxardır.Ancaq əgər biri onu səhlənkarlıq və tənbəllik üzündən tərk edərsə Allahın məşiəti altında olar.Allah istəsə ona əzab verər, istəsə onu əfv edər.”[383]

Müxalif demişdir: “Bu rəvayət açıq-aydın göstərir ki, imam Əhməd yalnız Allaha şərik qoşmaq və fərzləri rədd etmək, yəni onu etməkdən imtina etmək yaxud fərzləri danmaq səbəbilə təkfir edir.Habelə imam adicə tərk etmə səbəbilə təkfir etmir.”

### *Buna bir neçə yöndən cavab veriləcək:*

*Birinci*: Həmin risalə hədis əhlinə görə məşhur olsa belə, qeyd etmək lazımdır ki, onun isnadı səhih deyil.Çünki

[383] Mənaqibul iməm Əhməd:226-cı səh, ibn Cəuzi.

həmin risaləni imam Əhməddən rəvayət edən Əhməd bin Muhammməd əl-Bərdai məchul ravidir (naməlum şəxsdir).

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Onlardan bəziləri İmam Əhmədin Musəddədə göndərdiyi risaləni inkar edib demişlər: Bunu Əhməddən rəvayət edən naməlum şəxsdir. İmam Əhmədin əshabı arasında Əhməd bin Muhammməd əl-Bərdai adlı şəxsin olması bilinmir."

Daha sonra o, Əbul Qasim Abdur-Rahmən bin Mandəhin "ər-radd alə mən zəamə ənnə-l-lahə fi kulli məkən va alə mən zəamə ənnə-l-lahə leysə ləhu məkən va alə mən təəvvalə-n-nuzul alə ğeyri-n-nuzul" adlı təlifində dediyi sözü nəql edib dedi:

"Dedi: Əhməd bin Muhammməd əl-Bərdai: İmam Əhmədin əshabı arasında bilinməyən naməlum şəxsdir. İmam Əhməd bin Muhammməd bin Hənbəldən Əhməd bin Muhammməd adlı ravilər bunlardır: Əhməd bin Muhammməd bin Həni Əbu Bəkr əl-Əsram, Əhməd bin Muhammməd bin əl-Həccac Əbu Bəkr əl-Mərvəzi, Əhməd bin Muhammməd bin İsa əl-Bərrani əl-Qadi, Əhməd bin Muhammməd əs-Saiğ, Əhməd bin Muhammməd bin Ğalib əl-Qass və Əhməd bin Muhammməd bin Məzid əl-Varraq.

Habelə ibn Cəuzi bunları əlavə etmişdir: Əhməd bin Muhammməd bin Xalid Əbu Bəkr əl-Qadi, Əhməd bin Muhammməd bin Xalid Əbul Abbəs əl-Bərrani, Əhməd bin Muhammməd bin Abdullah bin Sadaqa, Əhməd bin Muhammməd bin Abdullah bin Salih əl-Əsədi, Əhməd bin

Muhamməd bin Abdul-Hamid əl-Kufi, Əhməd bin Muhamməd bin Yəhyə əl-Kəhhal, Əhməd bin Muhamməd bin əl-Buxari, Əhməd bin Muhamməd bin Batta.Habelə bunları qeyd etdi: Əhməd bin Həsən Əbul Həsən ət-Tirmizi, Əhməd bin Səid.Habelə deyilmişdir: Əbul Uşubətu ət-Tirmizi.Muhammədlər sırasında isə Muhamməd bin İsmail ət-Tirmizini qeyd etmişdir.Dedi: Musaddəddən rəvayət edənlər içində bunun adını çəkməmişdir."[384]

*İkinci*: Bu risalənin imam Əhməddən səhih olduğu fərz edilərsə belə, ən uzağı orada ayrı-ayrı əməllər və namazı tərk edənin yaxud zəkatı tərk edənin v.s kafir olmayacağı haqqında söhbətin getdiyi deyiləcək.Burada bütövlüklə zahiri əməli tərk edənin hökmünə toxunulmur.

Üstəlik deyilə bilər ki, həmin risalə namazı tərk edənin təkfir edilməyəcəyinə dəlalət etmir.Çünki onun tərk edilməsi küfr və şirkdir.Bu isə onun növbəti sözlərinə daxildir: "İnsanı İslamdan yalnız Uca Allaha şirk qoşmaq çıxardır." Artıq Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "İnsan ilə şirk və küfr arasında namazın tərki durur."[385]

---

[384] Məcmu\`əl-fətəva:5/381.Sonralar şeyx Abdul-Əziz bin Əhməd əl-Humeydinin həmin risalənin imam Əhmədə nisbətinin zəif olduğunu qeyd etdiyini və həmin risalənin iki isnadına rast gəldiyini qeyd etdiyini gördüm.Hər iki isnadda bir sıra məchul şəxslər vardır.Habelə həmin risalənin mətni çox qarışıq və böyük fərqliliklərə malikdir. O, dedi: Qeyd edilənlərə əsasən risalənin iki yoldan zəif olması aydın olmuşdur.Bu səbəbdən, həmin risalənin imam Əhmədin təlif etdiyi risalə olması nisbəti öz təsdiqini tapmır.Bax: Bəraətul əimmətil ərbəa min məsəilil mutəkəlliminəl mubtədia:100-113."

[385] Muslim:82.

*Üçüncü*: Müxalif imam Əhmədin sözlərində olan çərçivəliyi dəlil gətirmiş: "Lakin insanı İslamdan yalnız Uca Allaha şirk qoşmaq yaxud Allahın vacib buyurduğu hər hansı bir fərzi danaraq rədd etmək çıxardır" daha sonra onun əməli tərk edəni təkfir etmədiyini iddia etmişdir.

Bunun cavabı: Heç şübhəsiz ki, insanı kafirə çevirən amillər Uca Allaha şərik qoşmaq yaxud fərzlərdən birini rədd etməkdə məhdudlaşmır.Əksinə Əhli sunnənin yekdil olduğu küfrün digər növləri mövcuddur.Bunlardan: Uca Allahı yaxud Peyğəmbəri (salləllahu aleyhi və səlləm) söymək, Allahın dininə və şəriətinə istehza etmək və digər sözlü, əməli və etiqadı küfr amilləri.

Daha yaxın olması üçün müxalifə deyiləcək: Bütövlüklə qəlb əməlini yaxud bacardığı halda dil sözünü tərk edənin hökmü nədir? Habelə hər hansı bir şəxs imam Əhmədin sözlərində gələn çərçivəliyi bunun İslamdan çıxardan küfr olmadığına dəlil gətirə bilərmi?!

Cavab aydındır! [386]

---

[386] Müxalifin imam Əhmədin sözlərindən dəlil gətirdiyi məqamlardan biri, onun imanın artıb azalmasına dair dediyi sözlərdir: "Onun artması əməldə, azalması isə əməlin tərk edilməsindədir."Bunu bizim məsələmizdə dəlil gətirmək yersizdir.Çünki biz yekdilik ki, əgər biri əməl edərsə onun imanı artacaq.Əgər əməli tərk edərsə imanı azalacaq. Burada isə bütün əməllərin tərk edilməsi araşdırılır.Onun ifadəsində isə buna işarə olunmur.Əslində müxalif, zahir ilə daxil arasında olan bağlılığı inkar etmək və qəlbdə səhih imanın olması ilə birgə bədəndə söz və əməl olaraq bunun üzə çıxmamasının mümkün olduğunu zənn etmək ətrafında çabalayır.Şübhə yoxdur ki, bu, heç bir sələf alimindən bilinməyən əsassız zənn və yaramaz etiqaddır.Bu, yalnız murciələrin sözüdür.

## *Beşinci*: İbn Quteybənin sözlərindən dəlil gətirdikləri məqam və bunun izahı

Demişdir: "Mən Peyğəmbərin (salləllahu aleyhi və səlləm) növbəti hədisi haqqında soruşdum: "İman yetmiş və bir neçə şöbədən ibarətdir.Onun ən fəzilətlisi "lə ilahə illəllah" kəlməsidir.Onun Ən aşağı olanı, yoldan əziyyət verən şeyləri kənar etməkdir.Mən dedim: Məgər sən yoldan əziyyət verən şeyləri kənarlaşdırmayan şəxsə naqis imanlı deyirsən?

Bu hədisə dair yanaşmaya gəldikdə isə, deyiləcək ki, iman iki qism olur: Özəy və şaxə.

Özəy: İki şəhadət, habelə dirilişi, cənnəti, cəhənnəmi və mələkləri təsdiq etmək və Allahın Öz kitabında xəbər verdiyi və Peyğəmbərin Allahdan xəbər verdiyi hər bir şeydir.İnsan bu şeylərdən birinə küfr edərsə imandan çıxmış olacaq.Həmin şəxsə mömin və naqis imanlı şəxs deyilməyəcək.

Habelə əsaslardan: Namaz, zəkat, oruc, habelə imkanı olan üçün Kəbəyə həccdir.İnsan bu şeylərin fərz olduğuna iman edib daha sonra onların bəzisində gec qalma yaxud yayınma səbəbilə səhləkarlıq edərsə tövbə edib qayıtmayınca naqis imanlı olar.

Habelə insan halal saymadan böyük günahlar işlədərsə həmin günahları tərk etməyənə qədər naqis imanlı olar.

Şaxələr: Yoldan əziyyət verən şeyləri kənar etmək imandandır.Salamı yaymaq imandandır.Habelə digər şeylər..."[387]

Müxalif növbəti sözləri dəlil gətirmişdir: "Dörd dayağ əsaslardır.İnsan onu danmadan tərk edərsə iman azalacaq. Habelə fərzlərin tərk edilməsi daha ağır günah olsa belə o, böyük günahlar hökmünə bənzərdir."

***Buna bir neçə yöndən cavab veriləcək:***

*Birinci*: Bu, çəkişmə mövzusundan kənar sözlərdir. Həmin sözlər bütövlüklə əməli tərk edənin hökmünə toxunmur.Bu sözlərdə yalnız növbəti şəxslər haqqında söhbət gedir: "bəzisində gec qalma yaxud yayınma səbəbilə səhləkarlıq edərsə".

*İkinci*: Orada dörd dayağın tərk edilməsi məsələsi haqqında bəhs olunmur.Orada yalnız əməllərin bəzisində səhlənlarlıq haqqında bəhs olunur.Bu səbəbdən, əgər hər hansı bir tədqiqatçı bu sözlərdən ibn Quteybənin namazın tərkinə görə təkfir etmədiyini anlasaydı heç şübhəsiz ki səhvə yol vermiş olardı.Belə olan halda, bu sözlərdən dord dayaq barəsində hökm necə götürülə bilər?!

*Üçüncü*: Onun şəhadəti və qeyd edilən şeylərin təsdiqini özəy etməsi və ona küfr edənin imandan çıxmasını deməsi doğrudur və bunda heç bir şübhə yoxdur.Habelə deyiləcək:

[387] əl-Məsəil val əcvibətu:231-ci səh, ibn Quteybə.

Əgər biri namaza yaxud zəkata yaxud oruca yaxud həccə küfr edərsə həmçinin kafir olacaq.Lakin ibn Quteybə (rahiməhullah) bu məsələyə toxunmamışdır.O, yalnız iman gətirib daha sonra bəzi əməllərdə səhlənkarlıq edən şəxsə toxunmuş və onun naqis imanlı şəxs olduğunu bəyan etmişdir.Bu isə, heç şübhəsiz ki, doğrudur.

Bir sözlə, müxalif imamlardan çəkişmə mövzusundan kənar sözləri gətirir.Əgər bəzi şəxslərin ondan gələn nəql-dən qürrələnməsi qorxusu olmasaydı həmin sözlərin burada qeyd edilməsinə heç bir lüzum olmazdı.[388]

[388] Bu səbəbdən onun "təvilu muxtələfil hadis:120" kitabındaki sözlərini gətir-məyə lüzum görmədim.Çünki həmin sözlər, bir çoxları onu dəlil olaraq gətirsələr belə çəkişmə mövzusundan kənardır.

## *Altıncı*: İmam Muhamməd bin Nəsr əl-Mərvəzinin sözlərindən dəlil gətirdikləri məqam və bunun izahı

İmam (rahiməhullah) murciələrin şübhəsini rədd etdiyi əsnada növbəti sözləri demişdir: Həmin şübhə: Siz imanın bütün itaətlərin adı olduğunu deyəcəyiniz zaman insanı, edəcəyi ilk asilik zamanı təkfir etməyiniz gərəkli olacaq.

İmam (rahiməhullah) demişdir: "Çünki biz deyirik: Həqiqətən də, iman özəydir.O, zərrə qədər azalacağı zaman insandan iman adı gedəcək.Ancaq o, azalmayacağı zaman ondan iman adı getməyəcək.Lakin bunun ardından imanın üzərinə iman artır.Özəydən sonra olan artma azalacağı təqdirdə Allahın haqq olmasına və Onun dediyinin doğru olmasına dair iqrar olan özəy azalmayacaq.Çünki bunun azalması Allaha, Onun haqq olub olmadığına, habelə Onun sözünün doğru yaxud yalan olduğuna şübhə etməyi ifadə edir.

Azalma onun şaxələrindəndir.O, budağlar və yarpaqdan ibarət olan xurma ağacına bənzəyir.Hər dəfə ondan budaq qırıldıqca o, ağac adını itirməyəcək.Ancaq o, adını dəyişməmək şərtilə öncə olduğu kamillikdən daha aşağı olacaq. Çünki o, budaqları naqis olan ağacdır.Digər xurma ağacları

isə yarpağlarının dolğun olması səbəbilə daha kamil olacaq."[389]

Əslində bu sözlərdə onun və bütövlüklə bədən əməllərini tərk edənin qurtulacağını hesab edənlər üçün heç bir dəlil və istinad yeri yoxdur.Bunun izahı bir neçə yöndən veriləcək:

*Birinci*: İqrarın və təsdiqin özəy, əməlin isə şaxə adlandırılması, qeyd edildiyi kimi müəmmalı məsələ deyil.Belə ki, bədən əməlləri qəlb imanının zəruri şaxəsidir."Lazim"in yoxluğu isə "məlzum"un yoxluğuna dəlalət edir. Ümumiyyətlə dil sözü özəyə yaxud şaxəyə daxildir? Bu, "iqrar" sözünün izah edilməsinə qayıdan bir məsələdir.Mənə görə Mərvəzi onu özəydən edir.

Artıq Şeyxul-İslam (rahiməhullah) bir sıra yerdə dil sözünün şaxədən olduğu görüşünü qeyd etmişdir.[390] Habelə o, iqrarın açıqlanması haqqında demişdir: "Məlumdur ki, iman adicə təsdiq deyil, habelə iqrardır.İqrar isə təsdiq olan qəlb sözünə və tabeçilik olan qəlb əməlinə daxildir.Peyğəmbəri, xəbər verdiyi şeylərdə təsdiq etmək və əmr etdiyi şeylərdə ona tabe olmaq.Habelə Allahı iqrar etmək, Onu etiraf etmək və ibadəti Ona etməkdir."[391]

Mərvəzi (rahiməhullah) imanın tam olması məsələsində namazı "dil sözü" ilə müqayisə edir.İmam murciələrlə münaqişəsində demişdir: "Onlara deyilmişdir: İblis yalnız şaxə-

[389] Tə`zımu qadri-s-salət:2/703.
[390] Birinci hissəyə bax.
[391] Məcmu`əl-fətəva:7/638.

ni tərk etməsilə kafir olmuş və bilgi ona heç bir fayda verməmişdir.Söz isə heç bir vəchlə bilgiyə aid deyil.Çünki o, ona adla uzlaşan bir şaxədir və onun cinsindən deyil.Dil ilə iqrar etmə onunla birgə və onun cinsindən deyil və yalnız ondan ayrıdır.Çünki səslər, hərflər və hərəkətlər heç bir vəchlə daxili düşüncə növündən deyil.

Əgər iman yalnız bilgidən ayrı olan və onun cinsindən olmayan şaxə ilə tamamlanırsa imanın yalnız bilgi cinsindən olmayan lakin ondan ayrı olan namazla tamamlanacağını deyən şəxslərə irad tutmağınızı necə anlayaq?”[392]

Dedim: Bu, bir neçə məsələyə dəlalət edir:

*Birinci*: Dil sözü şaxə adlansa belə onun tərk edilməsi küfrdür.Onun şaxə adlanması buna mane olmur.Bu üzdən, bədən əməllərinin şaxə adlanması həmçinin onu tərk edəni təkfir etməyə mane olmur.

*İkinci*: Özəydən olmasa belə onu tərk edənin küfrünə dair namazın “söz” ilə müqayisə edilməsi.Onun buradaki ifadələri təkfir məsələsinə dair açıq-aydın deyil.Lakin onun buna dair məzhəbi, qeyd ediləcəyi kimi məlumdur.

Üçüncü: Sələfə görə “tamamlıq” sözündə olan məqsədin, habelə imanın yalnız dil sözü ilə tamam olmasının, yəni yalnız onunla səhih olmasının bəyan edilməsi.

*İkinci*: İmam demişdir: “Özəydən sonra olan artma azalacağı təqdirdə Allahın haqq olmasına və Onun dediyinin

---

[392] Tə`zımu qadri-s-salət:2/778.

doğru olmasına dair iqrar olan özəy azalmayacaq".Burada bütövlüklə artmanın gedəcəyi haqqında bəhs olunmur.Bu isə araşdırma tələb edən məsələdir.Ancaq bəzi əməllərin yerinə yetirilməsi və bəzi əməllərin tərk edilməsi ilə əməlin azalması məsələsi çəkişmə mövzusundan kənardır.[393] Lakin murciələr imanın bir şey olduğunu, bir hissəsi gedəcəyi zaman bütövlüklə gedəcəyini düşündükləri zaman onlara vacibin tərk edilməsi yaxud haramın işlədilməsi ilə birgə imanın qalması müəmmalı olmuşdur.Yerində bəyan etdiyim kimi bu şübhə, onlara əməli imandan çıxartmağa vadar etmişdir.Əhli sunnənin cavabı belə olmuşdur: Əməlin azalması özəyin getməsini ifadə etmir.Bu, heç şübhəsiz ki, doğrudur.

---

[393] Buna bənzər imam Mərvəzi (rahiməhullah) deyir "2/713": "Artıq onların qəlb və dil ilə iqrar edəcəyi zaman həmin şəxsi mömin dərəcəsinə qaldırmaları və onun iman sahibi olduğuna şahidlik etmələri gərəkli olacaq. Habelə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) imanın şöbələri adlandırdığı əməllərdən biri artdıqca onun artdığına şahidlik etmələri gərəkdir.Ondan bir şöbəni zay etdiyi zaman isə onun bunu yerinə yetirəndən kamillik baxımından daha nöqsanlı olduğunu biləcəklər.Beləliklə də, özəy getməyincə ondan iman adı aparılmayacaq".Çəkişmə şöbələrdən birini yaxud bir neçəsini tərk edən haqqında deyil bütün əməlləri tərk edə ətrafındadır.

Onun sözləri: "Beləliklə də, özəy getməyincə ondan iman adı aparılmayacaq." Yəni, həmin şəxs imanın şöbələrindən birini zay etməklə digərindən daha naqis olur, lakin Mərvəzinin fasiqi mömin adlandırmağına dair məzhəbinə əsasən ondan iman adı getmir.İrəlidə Şeyxul-İslamın bu sözlərə münasibəti qeyd ediləcək.Əsas məqsəd odur ki, imam Mərvəzinin sözlərindən olan bu cümlə ondan öncəkinə birləşikdir.Bu səbəbdən, onu ayrıca qeyd etmək doğru deyil.Çünki belə olan halda məna dəyişəcək və ona, qəlb və dil iqrarı olan özəy getməyincə iman getməyəcək kimi söz nisbət olunacaq.Əslində isə bu, Mərvəzinin adından yalan danışmaqdır.Qəti bilinir ki, Mərvəzi bunu demir. Üstəlik ona görə iman tək namazın tərk edilməsi ilə gedir.Onun digər əməllərin tərk edilməsi ilə getməsi isə daha öndədir.

*Üçüncü*: Mərvəzi namazı tərk edənin təkfir ediləcəyi görüşündədir.Bu səbəbdən, onun sözlərini bütövlüklə əməlin tərk edilməsinə aid etmək mümkün deyil.Onun sözləri yalnız namazın qılınması ilə birgə əməlin nöqsanlı olması məsələsinə aid edilə bilər.[394]

Məsələ bəlli olduğu zaman bilinməlidir ki, bu məsələdə, yəni əməlin tərk edilməsi məsələsində namazı tərk edənin kafir olduğunu hesab edən şəxsin sözlərini dəlil gətirmək bir növ qəflətdən irəli gəlir.Çünki bütövlüklə əməli tərk edən namazı tərk etmiş olur.Həmin şəxs ona görə zəruri şəkildə kafir olur.Habelə bir alimin namaz məsələsinə dair görüşünü bilmək, onun "özəy", "şaxə", "tamamlıq" və "kamillik" məsələlərinə dair qəsdini və məzhəbini anlamağa yardımçı olur.Buna diqqət yetir!

*Bildiriş:*

İmam Mərvəzinin sözləri iki mübahisəli məqamı özündə şamil edir:

**Birinci məqam**: İmam demişdir: "Ancaq o, (yəni özəy) azalmayacağı zaman insandan iman adı getməyəcək."

Bu, mübahisəli sözlərdir.Çünki fasiq, mütləq ada yiyələnmiş olmur.

Şeyxul-İslam ibn Teymiyyə (rahmətullahi aleyhi) Mərvəzinin buna bənzər sözlərinə əlavə edərək demişdir: O, demişdir: İnsan iqrar və təsdiq istisna olmaqla bunlardan bir şeyi tərk

---

[394] Mərvəzinin namazı tərk edəni təkfir etməsinə dair bax:1/132,133/2,925, 1002,1009.Habelə Hammədəl-Ənsarinin müqəddiməsinə bax.

edərsə ondan islam və iman adı getməyəcək.Ancaq o, bu məsələdə digərindən daha nöqsanlı olacaq.

Deyiləcək: Əgər burada onunla birgə islam və imandan hər hansı bir şeyin qalacağı qəsd edilirsə, bu haqqdır.Habelə xəvaric və mötəzililərə əks olaraq nasslar buna dəlalət edir.Ancaq əgər o, həmin şəxsə qeyd şərtsiz tərif və cənnət vədi əsnasında mömin və müsəlman adının veriləcəyini qəsd edirsə bu, Quran və sunnəyə müxalifdir.Çünki əgər bu, belə olsaydı həmin şəxslər növbəti ayənin məzmununa daxil olardılar: *"Allah mömin kişilərə və qadınlara (ağacları) altından çaylar axan cənnətlər vəd etmişdir."*[395] Habelə əzabsız cənnət vədinə dair gələn digər dəlillər.Həmçinin şəriət sahibi bir sıra yerlərdə onlardan iman adını inkar etmişdir.Üstəlik demişdir: "Onunla savaşmaq isə küfr-dür".[396] [397]

İkinci məqam: İmam (rahiməhullah) demişdir: "Özəydən sonra olan artma azalacağı təqdirdə Allahın haqq olmasına və Onun dediyinin doğru olmasına dair iqrar olan özəy azalmayacaq.Çünki bunun azalması Allaha, Onun haqq olub olmadığına, habelə Onun sözünün doğru yaxud yalan olduğuna şübhə etməyi ifadə edir."

Bu sözlərin zahirindən görünür ki, qəlbdə olan imana (təsdiqə) azalma daxil olmur.

---

[395] ət-Təubə:72.

[396] Yuxarıda qeyd olunub.

[397] Məcmu`əl-fətəva:7/413.

Bu, mübahisəli məsələdir.Artıq Şeyxul-İslam ibn Teymiyyə (rahiməhullah) Mərvəzinin buna yaxın sözlərinə əlavə edərək demişdir: Habelə o, demişdir: “Onların Allahın haqq olduğuna və Onun dediyinin doğru olduğuna iqrar etmələrində nöqsan (azalma) olmur.”

Deyiləcək: Əslində isə azalma onların bilgisi və elmi kimi qəlblərdə olan imanda olur.Onların bilgisi, habelə Allahı, onun adlarını, sifətlərini və əmr, qadağa, habelə müjdə və təhdid kimi dediyini təsdiq etməsi, istər yığcamlıq və təfsilat cəhətindən istər, qüvvət və zəiflik cəhətindən, istərsə də anma və qəflət cəhətindən digərlərinin biglisi və Onu təsdiq etməsi kimi olmur.Bütün bu işlər Allaha və Onun göndərdiyi dinə iman etməyə daxildir.

Qəlblərdə Allaha, Onun ad və sifətlərinə olan iman bərabər necə ola bilər? Yaxud Allahın hər bir şeyi Bilən, hər bir şeyə Qadir, Bağışlayan, Rəhmli, Əziz, Hakim, cəzası şiddətli olduğuna dair olan imanın Ona olan imandan olmaması necə ola bilər? Müsəlmanın bu şeylərə olan imanın Ona olan iman olmadığını deməsi, habelə insanların bu şeylərdə bərabər olmalarını iddia etməsi mümkün deyil.”[398]

Təəccüblüdür ki, müxaliflər bu yerləri çoxsayda dəlil gətirmələri ilə birgə mən onlardan heç birinin bu məqamlara diqqət yetirdiklərini görmədim.

---

[398] Məcmu`əl-fətəva:7/413.Habelə: Tə`zımu qadri-s-salət:2/535.

## *Yeddinci*: İmam Mərvəzinin hədis əhlindən bir toplum insandan nəql etdiyi sözlərdən dəlil gətirdikləri məqam və bunun izahı

İmam (rahiməhullah) hədis əhlindən olan bir toplum insandan Peyğəmbərin (salləllahu aleyhi və səlləm) "zinakar zina edərkən zina etdiyi zaman mömin olmaz" hədisinin izahını nəql etmişdir.Belə ki, onlar həmin şəxsdən iman adının gedəcəyini və islam adının qalacağını gördükləri zaman onun bununla birgə kafir olduğunu əlavə etmişlər.Onlar onun Allaha küfr etdiyini deyil əməl baxımından, yəni İslamdan çıxarmayan küfr baxımından küfr etdiyini demişlər.

Habelə onlar həmin şəxsi kafir adlandırdıqları zaman onlara həmin şəxsin kafir olduğuna hökm verməli olduqlarını deyənlərə belə cavab vermişlər:

"Biz onların irəli sürdükləri sözü demirik.Biz ancaq belə deyirik: İmanın özəyi və şaxəsi vardır.İmana zidd olan isə hər bir mənası ilə küfrdür.

İmanın özəyi: İqrar və təsdiqdir.

Onun şaxəsi: Əməlin qəlb və bədən ilə təkmilləşməsidir.

İmanın özəyi olan iqrarın və təsdiqin ziddi, Allaha və Onun dediyinə küfr etmək və Onu və Ona aid olan təsdiqi tərk etməkdir.

İqrar deyil əməl olan imanın ziddi isə, İslamdan çıxaran Allaha küfr kimi küfr deyil.Ancaq o, əməli zay edən küfrdür.Əməl imandır lakin o, Allahı iqrar etmək olan iman deyil.Belə ki, Allahı iqrar etməkdən ibarət olan imanı tərk edən şəxs tövbəyə dəvət olunan kafir olur.Ancaq əgər biri zəkat, həcc, oruc yaxud şərab içmək və zina etməkdən əl çəkməmək kimi əməl olan imanı tərk edərsə həmin şəxsdən imanın bir hissəsi gedər.Xəvariclər istisna olmaqla bu cür insanın bizə görə və Əhli sunnədən və imanın təsdiq və əməl olduğunu deyən bidət əhlindən bizə müxalif olanlara görə tövbəyə dəvət olunması vacib deyil.Habelə əməlin zay edilməsi cəhətindən həmin şəxsin kafir olduğunu deməyimiz onun tövbəyə dəvət edilməsini gərəkli etmir. Ancaq şəriətin kəsdiyi cəzalar ondan yan ötmür.Əməl olan imanın getməsi ilə tövbəyə dəvət hasil olmur və şər`i cəzalar onun üzərindən qaldırılmır.Çünki həmin şəxsdən imanın özəyi getmir.Həmçinin bizim həmin şəxsə əməldən öncə küfr adını isbat etməyimiz bizə onu tövbəyə dəvət etməyi və şər`i cəzaları və əhkamları onun üzərindən qaldırmağı vacib etmir.Çünki həmin şəxs Allahı və Onun dediyini danmanı ifadə edən küfrün özəyini etmiş olmur.

Onlar demişlər: Allah haqqında elm iman, onun haqqında bilgisizlik küfr olduğu zaman fərzlərə əməlin iman, (fərzlər) enməmişdən öncə onun haqqında bilgisizliyin küfr

olması deyilməz.Onun enməsindən sonra onu bilməyən həmçinin küfrə düşmür.Çünki Peyğəmbərin əshabı Peyğəmbər göndərdiyi ilk vaxtda Allahı iqrar etmiş lakin bundan sonra onlara fərz ediləcək fərzləri bilməmişlər.Onların bundan bilgisiz olmaları isə küfr olmamışdır.Daha sonra Allah onlara fərzləri endirmişdir.Bu zaman onların bunu iqrar etmələri və bunu yerinə yetirmələri iman olmuşdur. İnsan yalnız, Allahın xəbərini təkzib etdiyi üçün onu danacağı zaman kafir olur. Lakin əgər Allahdan buna dair heç bir xəbər gəlməsəydi həmin şəxs cahilliyi üzündən kafir olmazdı.

Xəbərin gəlişindən sonra müsəlmanlardan xəbəri eşitməyən şəxslər cəhaləti səbəbilə kafir olmamışlar.Allah haqqında bilgisizlik isə hər bir halda, xəbərin gəlişindən öncə və sonra küfrdür.

Onlar demişlər: Bu üzdən deyirik: Allaha təsdiqi tərk etmək Ona olan küfrdür.Allahı təsdiq etməklə birgə Allahın vacib buyurduğu fərzləri tərk etmək isə Allaha küfr etmək deyil.O, sadəcə haqqın tərk edilməsi cəhətindən küfrdür. Belə ki, bəzi insanlar deyirlər: Mənim haqqıma və nemətimə küfr etdin.Bununla həmin şəxs onun haqqının zay edilməsini və onun nemətinə şükr etməməsini qəsd edir.

Onlar demişlər: Bizim bu məsələdə örnəyimiz Peyğəmbərin əshabından və tabiinlərdən gələn rəvayətlərdir. Belə ki, onlar özəy olmayan və insanı İslamdan çıxartmayan küfr üçün şaxələr etmişlər.Eyni zamanda onlar tərk ediləcəyi

təqdirdə insanı İslamdan çıxartmayacaq əməl cəhətindən iman üçün özəyin şaxələrini isbat etmişlər."[399]

*Buna verilən cavab*: Yuxarıda keçən sözlər, bütövlüklə əməli tərk edənin qurtulacağını hesab edənlərin dadına çatacaq heç bir istinad nöqtəsi yoxdur.Bunun izahı bir neçə yöndən veriləcək:

*Birinci*: Əgər müxalif hədis əhlindən həmin tayfanın bədən əməlini şaxə olaraq onun ziddini isə İslamdan çıxartmayan küfr olaraq vəsf etmələrinə etimad edirsə, belə olan halda deyiləcək: Həmin tayfa həmçinin qəlb əməlini şaxə olaraq onun əksini isə İslamdan çıxartmayan küfr olaraq vəsf etmişdir.Siz isə bunu demirsiniz.Bu səbəbdən, həmin sözü kənara qoymaq və onun xəta olduğunu hesab etmək, habelə onu deyən üçün üzr axtarmaq vacibdir. Misal olaraq onun sözü qəlb yaxud bədən əməllərindən olan bəzi əməllərin tərk edilməsinə aid edilsin.

Artıq qeyd etmişəm ki, iman məsələsinə dair sələfin icmasına müxalif olan sözlər dörd məsələnin birindən kənar çıxmır.Onlardan qeyd etdiyim: Üçüncü: Bizim və müxalifin xəta olduğuna yekdil olduğumuz söz.Belə olan halda onu dəlil gətirmək icazəli deyil."

*İkinci*: Əgər müxalif hədis əhlindən həmin tayfanın növbəti sözlərini dəlil gətirərsə: "Ancaq əgər biri zəkat, həcc, oruc yaxud içki içmək və zina etməkdən əl çəkməmək kimi əməl olan imanı tərk edərsə həmin şəxsdən imanın bir

[399] Tə`zımu qadri-s-salət:2/519.

hissəsi gedər.Xəvariclər istisna olmaqla bu cür insanın bizə görə və Əhli sunnədən və imanın təsdiq və əməl olduğunu deyən bidət əhlindən bizə müxalif olanlara görə tövbəyə dəvət olunması vacib deyil.",- cavab olaraq deyiləcək: Bizim çəkişdiyimiz mövzu zəkat, həcc və orucu tərk edən haqqında deyil bütövlüklə bədən əməllərini tərk edən haqqındadır. Çünki bu dayağları tərk edənin təkfir edilməsinə dair sələfin arasında məlum ixtilaf vardır.

*Üçüncü*: Əgər müxalif növbəti sözləri dəlil gətirərsə: "Fərzlərə əməl iman, enməmişdən öncə onun haqqında bilgisizlik küfr olmamışdır.Onun enməsindən sonra isə onu bilməyən həmçinin küfrə düşmür", habelə: "Bu üzdən deyirik: Allahı təsdiq etməyi tərk etmək Ona küfrdür.Allahı təsdiq etməklə birgə Allahın vacib buyurduğu fərzləri tərk etmək isə Allaha küfr etmək deyil.O, sadəcə haqqın tərk edilməsi cəhətindən küfrdür. Belə ki, bəzi insanlar deyirlər: Mənim haqqıma və nemətimə küfr etdin.Bununla həmin şəxs onun haqqının zay edilməsini və onun nemətinə şükr etməməsini qəsd edir",- cavab olaraq deyiləcək: Bu, öncəki mislindədir.Orada bütün əməllərin tərk edilməsi vurğulanmır.Qeyd edildiyi kimi onlara görə fərzlərin tərk edilməsi sözlərilə növbəti şeylər qəsd edilir: "zəkat, həcc, oruc yaxud içki içməkdən və zina etməkdən əl çəkməmək kimi...". Görünür onlar namazı bura daxil etməmişlər.Ola bilsin ki, onlar onu tərk edənin kafir olacağını deyən şəxslərdir.Çünki bu, sələfin cumhurundan nəql edilən görüşdür.İmam

**Mərvəzi bu görüşü hədis əhlinin cumhuruna nisbət etmişdir.[400]**

[400] Tə`zımu qadri-s-salət:2/936.Bəzən, namazı tərk edəni kafir hesab edənlər fərzləri tərk edənin təkfir edilməyəcəyinə dair ifadələr işlədirlər.Misal olaraq ibn Battanı (rahiməhullah) göstərmək olar.İbn Batta "əl-İbənə-s-suğra:201-ci səh" kitabında demişdir: "Onu İslamdan çıxaran yalnız Allaha şərik qoşması yaxud Allahın buyurduğu fərzlərdən birini danaraq rədd etməsidir.Əgər onu səhlənkarlıq və tənbəllikdən buraxarsa Allahın məşiəti altında olar və Allah istəsə onu əzaba düçar edər istəsə bağışlayar." Bununla belə imam, bəzi tədqiqatçıların "əl-ibənətu-s-suğra" kitabının əsli hesab etdikləri "əl-İbənətul kubra" kitabında namazı tərk edənin kafir olduğu görüşünü seçmişdir.Belə ki, o, namazı tərk edənin küfrünü bəyan edən dəlilləri qeyd etdikdən sonra demişdir: "Peyğəmbər (salləllahu aleyhi və salləm), səhabələr və tabiinlərdən gələn xəbərlər, əsərlər və bütün sunnələr ağıl sahiblərini və qəlbində cüzi həyası olan şəxsi namazı tərk edəni və fərzləri dananı təkfir etməyə və onu dindən çıxartmağa sövq edir." Bitdi. Habelə bu xəbər imam Əhməddən, onun yalnız fərzi rədd etmə səbəbilə təkfir edəcəyinə dair rəvayəti açıqlaya bilər.Bununla birgə Əhməddən gələn məşhur rəvayətlər onun namazı tərk edəni təkfir etməsidir.Onun sözləri ilə müxalif rəvayətin müxtəsərliyə aid edilməsi və namazdan sonraki digər fərzlərin qəsd edilməsi arasında cəm etmək bəzi rəvayətləri digər rəvayətlərlə üz-üzə qoymaqdan daha münasibdir.Doğrusunu bilən Allahdır.

## *Səkkizinci*: İmam ibn Mandəhin sözlərindən dəlil gətirdikləri məqam və bunun izahı

İmam ibn Mandəh (rahiməhullah) "əl-imən" kitabında firqələrin imana dair görüşlərini qeyd etdikdən sonra demişdir: "Camaat əhli demişlər: İman qəlb, dil və digər əzalarla edilən bütün itaətlərdir.Sadəcə onun özəyi və şaxəsi vardır. Onun özəyi: Allaha boyun əymək, Onu sevmək, Ondan qorxmaq və Onu təzim etmək, habelə təkəbbürlük, xoşagəlməzlik və inadkarlığı tərk etməklə birgə Allah haqqında bilgi, Onu, Ona aid olanı və Onun dərgahından gələni qəlb və dil ilə təsdiq etməkdir.Bu özəyi gerçəkləşdirəcəyi zaman o, imana daxil olacaq və onun adı və əhkamları ona vacib olacaq.Ancaq o, şaxəni gerçəkləşdirməyincə onu təkmilləşdirmiş olmaz.Ona fərz edilmiş şaxə: Fərzlərin yerinə yetirilməsi və haramlardan çəkinməsidir."[401]

Müxalif imam ibn Mandəhdən gələn bu nəqlin bədən əməlinin imanın özəyinə daxil olmadığını və onun sadəcə imanı kamil edən şaxə olduğunu iddia etmişdir.Onu bütövlüklə tərk edən Allahın məşiəti altında olan müsəlmandır.

### *Buna bir neçə yöndən cavab veriləcək:*

[401] İbn Mandəh, əl-İmən:1/331.

*Birinci*: Əgər bu nəql ilə, kafirlərin əzabından qurtulmaq üçün dil sözü, qəlb təsdiqi və qəlb əməlindən ibarət olan özəyin kifayət edəcəyi qəsd edilsəydi heç şübhəsiz ki, bu yanlış söz olar və imam Şafii və qeyrilərindən nəql olunan icma ilə puç edilərdi.

*İkinci*: Onun sözləri ilə deyilənlər arasında heç bir ziddiyət yoxdur.O, demişdir: "Bu özəyi gerçəkləşdirəcəyi zaman o, imana daxil olacaq və onun adı və əhkamları ona vacib olacaq." Bu səhih sözdür.Üstəlik biz deyirik: Əgər biri adicə söz deyərsə imana daxil olacaq və onun adı və əhkamları ona gərəkli olacaq.Həmin şəxs möminlərə ünvanlanan hər bir müraciətə daxil olacaq.

Habelə imam demişdir: "Ancaq o, şaxəni gerçəkləşdirməyincə onu təkmilləşdirmiş olmaz.Ona fərz edilmiş şaxə...".Bu, həmçinin doğrudur.İnsanın imanı yalnız fərzlərin yerinə yetirilməsi və haramlardan çəkinməsi ilə kamilləşir.

Lakin onun sözləri, insanın qeyd edilmiş "özəy"lə kifayətlənəcəyi təqdirdə müsəlman olaraq qalacağını və qiyamət günü bunun sayəsində qurtulacağını ifadə etmir.Bu, onun sözlərində qeyd edilmir.

Əgər biri: Bu onun özəy və şaxə ifadələrindən, habelə "onu təkmilləşdirmiş",-sözlərindən anlaşılır,-deyərsə, biz deyəcəyik: Bədən əməllərinin "şaxə" adlanması müəmmalı məsələ deyil.Belə ki, o, qeyd edildiyi kimi qəlb imanının

zəruri şaxəsidir."Ləzim"in yoxluğu "məlzum"un yoxluğuna dəlalət edir.

Onun "kamillik" ifadəsi, qeyd edildiyi kimi doğrudur. İman yalnız bütün əmrlərin yerinə yetirilməsi və qadağaların tərk edilməsi ilə kamilləşir.İnsan ərm olunmuş şeyləri edib qadağaları tərk etdikcə onun imanı artır.Habelə insan bu işlərdə səhlənkarlıq etdikcə onun imanı azalır.Lakin bu o demək deyil ki, insan bütün şaxəni tərk edəcəyi təqdirdə onun imanı səhih və yetərli qalacaq.Bu, ibn Mandəhin demədiyi sözdür.Bu söz yalnız zahir ilə daxil arasında bağlılığı görməyən şəxsin dediyinə uyğun gələ bilər.Çünki "ləzim" olmayacağı zaman "məlzum" həmçinin olmayacaq.

Bizim növbəti sözlərimizdə heç bir anlaşılmazlıq yoxdur: İman yalnız söz, təsdiq və əməl ilə kamilləşir.

Yaxud: Əgər biri bunu kamilləşdirərsə mömin olar.Eyni zamanda deyirik: Əgər biri əməli tərk edərsə söz və təsdiq ona fayda verməz.Yaxud deyirik: Əgər təsdiqi tərk edərsə söz və əməl ona fayda verməz.Bu, heç də gizli məsələ deyil. Bunu açıqlayan amil:

*Üçüncü*: Sələfdən bəziləri kamillik dedikdə, tərkinin küfr olduğuna dair Əhli sunnənin yekdil olduqları özəyi ifadə etmişlər.Bu sözlərdən birində imam Şafii (rahmətullahi aleyhi) demişdir: "Şəni uca olan Allah Peyğəmbərini (salləllahu aleyhi və səlləm) Öz dinində, fərz etdiyində və kitabında elə bir məqama qoymuşdur ki, bununla onu fərz etdiyi itaətdə və haram etdiyi asilikdə dinin nümunəsi etdiyini bəyan

etmişdir.Habelə Ona iman ilə birgə Peyğəmbərə imanı birləşdirməklə onun qədir-qiymətini bəyan etmişdir.Uca Allah demişdir: *“Allaha və Elçisinə iman edin!”* Habelə demişdir: *“Həqiqətən, möminlər ancaq Allaha və Onun Peyğəmbərinə iman gətirən, ümumi bir iş üçün Peyğəmbərlə bir yerdə olduqda ondan izin almamış bir yerə getməyən kimsələrdir.”* Bununla da, ondan savayı olanın ona tabe olacaq imanın başlanğıcını Allaha sonra Peyğəmbərə (salləllahu aleyhi və səlləm) imana dəlil etmişdir.Əgər insan Ona iman gətirib Peyğəmbərə (salləllahu aleyhi və səlləm) iman gətirməzsə, Allah ilə birgə Peyğəmbərə (salləllahu aleyhi və səlləm) iman gətirməyənə qədər ona heç vaxt kamil iman adı şamil edilməyəcək.”[402]

**Dedim:** Əgər biri Peyğəmbərə (salləllahu aleyhi və səlləm) iman gətirməzsə imanı kamilləşməz.Habelə əgər biri bütün əməlləri yerinə yetirməzsə imanı kamilləşməz.Əgər birinin təsdiqi qəlb əməlinə birləşməzsə imanı kamilləşməz.Bu sözlər zahirinə uyğun olaraq haqqdır.Təhlükə isə yalnız kamillik vəsfi üzərinə hökm qurub: Bu kamilliyi təkr edən şəxs müsəlmandır,-deməkdədir.Belə olan halda Peyğəmbərə imanı tərk edən müsəlman olur.Bunu isə heç kəs demir.[403]

---

[402] Əhkəmul quran: 1/27, Şafii.

[403] Əgər müxalif imam Şafiinin ifadəsinə bənzər ifadəyə rast gəlsəydi və həmin ifadənin məzmununda heç bir bədən əməli etməyənin heç vaxt kamil iman adı ilə vəsf olunmayacağına rast gəlsəydi sevincdən özünə yer tapmaz və deyərdi: Həmin sözlər bütövlüklə əməli tərk edənin kafir olmadığına dəlalət edir! İrəlidə görəcəksən ki, müxalif sadəcə əməlin kamillik olaraq vəsf olunduğu ifadələri dəlil gətirir!

Habelə imam Şafii demişdir: "İmanın iqrar edilməsi iki cəhətlidir: Bütpərəstlər və dini olmayanlar heç bir kitaba sahib olmadıqları halda dinlərinin nübuvvət dini olduğunu iddia edirlər.İnsan Allahdan başqa haqq məbudun olmadığına və Muhammədin Onun qulu və elçisi olduğuna şahidlik edəcəyi zaman imanı iqrar etmiş olacaq.Ondan dönəcəyi zaman isə öldüruləcək.Dedi: Lakin yəhudilik və nəsranilik dini üzərə olan  şəxslər Musa və İsa peyğəmbərin (aleyhimə-s-sələm) dinini iddia edirlər.Artıq onlar dinin bir qismini dəyişmişlər.Uca Allah onlardan Allahın elçisi Muhammədə (salləllahu aleyhi və sələm) iman etmək əhdi almışdır onlar isə Ona iman etməyi və Onun dininə tabe olmağı tərk etməklə kafir olmuşlar.Üstəlik onlar bundan öncə Allaha iftira yaxıdıqları səbəbilə kafir olmuşlar.Artıq mənə belə deyilmişdir: Onlardan bəziləri öz dinlərində sabit qalıb Allahdan başqa haqq məbudun olmadığına və Muhammədin Allahın qulu və elçisi olduğuna şahidlik edir və deyir: O, bizə göndərilməmişdir.Əgər onların içərisində belə şəxs varsa və onlardan biri: Şahidlik edirəm ki, Allahdan başqa haqq məbud yoxdur və Muhamməd Onun qulu və elçisidir,-deyərsə bu, imana iqrarı kamilləşdirməyəcək.Həmin şəxs: Muhammədin dini haqq yaxud fərzdir,-deməyincə və Muhammədin dininə yaxud İslam dininə müxaliflikdən yan durmayınca bu, belə olacaq.Bunu deyəcəyi zaman imana iqrarı kamilləşdirəcək.Bundan dönəcəyi zaman isə tövbəyə çağırılacaq.Əgər tövbə etməzsə öldürüləcək.

Onlardan olan bir tayfa yalnız İslama daxil olma zamanı Muhammədin nübuvvətini iqrar etməklə tanınacaqları yaxud Muhamməsin nübuvvəti iqrar ediləcəyi zaman İslamın gərəkli olacağını iddia edəcəkləri təqdirdə Allahdan başqa haqq məbudun olmadığına və Muhamməmdin Onun qulu və elçisi olduğuna şahidlik etməklə imana iqrarı kamilləşdirəcəklər.Əgər şəhadətdən dönsələr tövbəyə çağılıracaqlar. Əgər tövbə etməsələr öldürüləcəklər."[404]

Dedim: Bu öncəki sözlər mislindədir.Burada İslamı səhih edəcək şey kamillik olaraq ifadə olunur.Çünki Muhamməmdin (salləllahu aleyhi və səlləm) risalətinə şahidlik iqrarı kamilləşdirir və iqrar onsuz səhih olmur.

Əslində isə sələfdən: Əməl imanı təkmilləşdirir yaxud iman yalnız əməl ilə kamilləşir,-sözünü deyənlərin bu sözləri zahirinə uyğun doğrudur.Ola bilsin ki, kamillik ifadəsini işlətməyə sövq edən amil iqrar və təsdiqə sahib olanın imanı kamilləşdirdiyini iddia edən murciələrə rəddiyə olsun.Əhli sunnə isə onlara əks olaraq demişlər: İman yalnız əməllə kamilləşir.Burada əməlin tərk edilməsi hökmünə toxunulmur və onun küfr olub olmaması araşdırılmır.Bunu deyənlər bəzən "kamilliyin" getməsini küfr hesab edirlər.Artıq imam Şafiinin sözlərində bu qeyd edilmişdir. Habelə buna güc qatan amillərdən:

*Dördüncü*: İbn Mandəh (rahiməhullah) namazı tərk edənin kafir olduğunu deyir.Bu səbəbdən, onun bədən əməllərini şaxə yaxud kamillik olaraq vəsf etməsindən onun bütöv-

[404] əl-Umm:6/171.

lüklə bədən əməlini tərk edəni təkfir etməməsini anlamaq doğru deyil.

Namazı tərk edənin kafir olduğunu deyən şəxs zəruri olaraq bütün bədən əzalarını tərk edənin kafir olacağını demiş olur.Bu üzdən, heç kəs bu görüşdə olanlardan nəqllər gətirməklə özünü yormasın!

İmam (rahiməhullah) demişdir: "Zəkatı verməkdən imtina edənin və namazı tərk edənin küfr adına layiq olduqlarına dəlalət edən amillər qeyd olunmuşdur."[405]

Habelə demişdir: "Namazın tərki küfrdür.Habelə orucu, zəkatı və həcci danmaq."[406]

Gördüyün kimi bu, "böyük küfr"dür.Çünki orucu, zəkatı və həcci danmaq yekdilliklə böyük küfrdür.

[405] əl-İmən:2/382, ibn Mandəh.
[406] Öncəki mənbə:2/362.

## *Doqquzuncu*: İbn Hazmın sözlərindən dəlil gətirdikləri məqam və bunun izahı

1-İbn Hazm (rahiməhullah) demişdir: "Əgər biri bütün əməlləri zay edərsə kafir olmaz və sadəcə naqis imanlı və asikar mömin olar."[407]

2-Habelə demişdir: Artıq Peyğəmbər (aleyhi-s-sələm) qəlbində arpa dənəsi çəkisində xeyirə sahib olanın, sonra qəlbində buğda dənəsi çəkisində xeyirə sahib olanın, sonra qəlbinə xardal dənəsi çəkisində xeyirə sahib olanın, sonra qəlbində cüzi, cüzi, cüzi zərrə qədər buna sahib olanın, nəhayət İslam şəhadətindən savayı heç bir xeyir etməyənin cəhənnəmdən çıxacağını bəyan etmişdir.Bu səbəbdən, yığcam nassı izah edən bütün nassları nəzərdən keçirtmək vacibdir."[408]

3-Habelə demişdir: Əməli tərk edən kafir olmur, sözü tərk edən isə kafir olur.Çünki Peyğəmbər (salləllahu aleyhi və səlləm), qəlbi ilə imanın doğru olduğunu bilərsə belə sözü deməkdən imtina edənə kafir hökmü çıxartmışdır.Habelə o, heç vaxt xeyir etməzsə belə qəlbi ilə bilib dili ilə deyənin atəşdən çıxacağına hökm vermişdir."[409]

---

[407] əl-Muhallə:1/62.

[408] əl-Fisal:4/90.

[409] əd-Durratu fimə yəcibu i`tiqaduh:337-ci səh.təhqiq: Əhməd bin Nəsir əl-Həməd.

4-Habelə demişdir: "Əbu Muhamməd dedi: Əgər biri: Məgər küfr imanın ziddi deyil?-deyərsə, biz deyəcəyik: Sözün bu şəkildə işlədilməsi yanlışdır.Çünki iman, qeyd etdiyimiz kimi müxtəlif mənalara şamil edilən müştərək addır.Bu mənalardan bəzisi küfrün əksini ifadə edir.Bəzisi isə küfrün deyil sadəcə fasiqliyin əksini ifadə edir.Bəzisi isə küfr və fasiqliyin deyil sadəcə tərk etmənin əksini ifadə edir.

Əksi küfr olan iman: Qəlb ilə etiqad, dil ilə iqrardır.Küfr məhz bu cür imanın əksi olur.

Əksi küfr deyil fasiqlik olan iman: Fərz olan əməllərdir. İnsanın onu tərk etməsi əmələ zidd gəlir.O isə, küfr deyil fasiqlikdir.

Əksi tərk etmə olan iman: Könüllü olan bütün əməllər-dir.Onun tərk edilməsi əmələ ziddir.Lakin o, küfr və fasiqlik deyil."[410]

Müxalif ibn Hazmın əməlin tərk edilməsi məsələsinə dair toxunduğu bu dörd məqamı dəlil olaraq gətirmişdir.

***Bunun cavabı:***

Artıq mən araşdırmanın əvvəlində sələfin icmasına müxalif olan sözlərin üç məsələnin birindən kənar çıxmadı-ğını qeyd etmişəm.Onlardan: Üçüncü: Bizim və müxalifin yanlış olmasına yekdil olduğumuz söz.Bu səbəbdən, həmin sözləri dəlil gətirmək icazəli deyil.

---

[410] əl-Fisal:3/255.

Bu sözlər, onların ibn Hazmın sözlərindən dəlil gətirdiklərinə tamamilə uyğun gəlir.

Müxalif qəlb əməli olmayacağı zaman imanın olmayacağını və təsdiqə sahib olmayan şəxs qurtulmayacağı kimi qəlb əməlinə sahib olmayanın qurtulmayacağını hesab edir.

İbn Hazm (rahiməhullah) isə iqrar və təsdiqə sahib olub bütün əməlləri, habelə qəlb əməllərini zay etmiş şəxsin Allahın məşiəti altında olan müsəlman olduğunu hesab edir. Bunun bir neçə yöndən izahı vardır:

*Birinci*: İbn Hazm "əl-muhallə" kitabında demişdir: "Əgər biri bütün əməlləri zay edərsə kafir olmaz və naqis imanlı və günahkar mömin olar." Bu isə, həm bədən əməllərini həm də, qəlb əməllərini zay edənlər üçün ümumi sözdür.Belə ki, buna ümumi şəkildə gələn "əməllər" sözü dəlalət edir.Buna güc qatan amil, onun bu cümləyə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) növbəti hədisini dəlil gətirməsidir: "Allah qulları arasında öz hökmünü bitirdikdən sonra Öz rəhməti ilə cəhənnəm əhlindən istədiyini çıxartmaq istədiyi zaman mələklərə Allaha heç bir şeyi şərik qoşmayan və "Lə iləhə illəllah" kəlməsini deyənlərdən rəhm etmək istədiyini atəşdən çıxartmalarını əmr edəcək."[411]

Habelə bunu "əl-fisal" kitabında vurğulayıb demişdir: "Sonra qəlbində cüzi, cüzi, cüzi zərrə qədər buna sahib olanın, nəhayət İslam şəhadətindən savayı heç bir xeyir etməyənin cəhənnəmdən çıxacağını".

[411] əl-Muhallə:1/62.

*İkinci*: Habelə ibn Hazm bunu "əd-durra" kitabında vurğulayaraq demişdir: "Əməli tərk edən kafir olmur, sözü tərk edən isə kafir olur." Daha sonra demişdir: "Habelə o, heç vaxt xeyir etməsə belə qəlbi ilə bilib dili ilə deyən şəxsin atəşdən çıxacağına hökm vermişdir."

Bu sözlər, qəlb və bədən əməllərindən heç vaxt xeyir etməsə belə elmə (bilgi və təsdiqə) və dil sözünə sahib olanın qurtulacağını ifadə etdiyini açıq-aydın göstərir.

*Üçüncü*: Qeyd ediləcəyi kimi o, küfrü, iqrar və ona görə bilgi olan etiqadın müqabilində etmişdir.Habelə fasiqliyi fərz əməllərin tərk edilməsi müqabilində etmişdir.Bu isə qəlb və bədən əməllərini şamil edir.

Demişdir: "Əksi küfr olan iman: Qəlb ilə etiqad, dil ilə iqrardır.Küfr məhz bu cür imanın əksi olur.

Əksi küfr deyil fasiqlik olan iman: Fərz olan əməllərdir. İnsanın onu tərk etməsi əmələ zidd gəlir.O isə, küfr deyil fasiqlikdir."

Müxalif isə deyir: Qəlb əməlinin tərk edilməsi küfrdür. Bu üzdən həmin sözləri rədd edib ona bel bağlamamaq gərəkdir.

İbn Hazmın "etiqad" sözünü dedikdə təsdiq və bilgini qəsd etdiyinə dəlil onun növbəti sözləridir: "Etiqadın sayı və kəmiyyəti yoxdur.Kəmiyyət və say yalnız əməllər və sözlərdə olur".Bunu o, növbəti sözlərdən sonra demişdir: "Hər hansı bir şeyi təsdiq etməyə artma və azalmanın daxil

olması qətiyyən mümkün deyil...". İrəlidə bu, dolğun şəkildə nəql ediləcək.

Əgər biri deyərsə ki: Şeyxul-İslam (rahiməhullah) ibn Hazmın imana dair etiqadını tərifədiyi bir halda onun tənqid olunması nə dərəcədə doğrudur?

Cavab olaraq deyiləcək: Şeyxul-İslamın iman və irca məsələlərinə dair onu tərifləməsi ibn Hazmın dediyi bütün sözlərin doğru olduğunu ifadə etmir.Əslində onun qeyrilərindən daha doğru olması qəsd edilir.Şeyxul-İslam bunu bildirərək demişdir: "Habelə Əbu Muhamməd bin Hazmın təlif etdiyi "əl-miləl və-n-nihal" kitabı yalnız sunnə və hədisə uyğun gəldiyi üçün tərifəlayiqdir.Misal olaraq, onun qədər, irca və bu kimi məsələlərə dair qeyd etdikləridir.Onun səhabələr arasında olan üstünlüyə dair dediyi sözlər isə fərqlidir.

Habelə onun sifətlər mövzusuna dair dedikləri, sunnə və hədis əhlinə uyğun gəldiyi səbəbilə tərifəlayiqdir.Belə ki, o, səhih hədisləri isbat edir və sələfi, habelə hədis imamlarını yüksək tutur.Habelə deyir: O, Quran və digər məsələlərdə imam Əhmədə müvafiqdir.Heç şübhəsiz ki, o, bəzi şeylərdə ona və onlara müvafiqdir.Lakin Əşari və onun kimilər Quran və sifətlər mövzusunda imam Əhməd bin Hənbəl və ondan öncəki imamlara daha çox müvafiq olmuşlar.Ancaq ibn Hazm iman və qədər məsələlərində digərlərindən daha doğru olmuş, hədis elmini daha çox bilmiş və hədisi və onun əhlini digərlərindən daha yüksək tutmuşdur.Lakin o, sifət məsələlərində fəlsəfəçilər və mötəzlililərin sözlərini qarışıq

salmış və nəticəsə bu, onu hədis əhlinin görüşlərində gələn mənaya müvafiq gəlməkdən kənar qoymuşdur.Nəticədə o, bunlara ləfzdə digərlərinə isə mənada müvafiq olmuşdur. Məhz bu kimi şeylərə görə bəzi fəqihlər, kəlamçılar və hədis alimləri daxilsiz zahirə uyduğu səbəbilə onu pisləmişlər. Habelə o, əmr, qadağa və sözlərin mənşəyində gələn mənaları rədd etmişdir.Habelə o, xəriqələrin mövcudluğunu və digər qəlb ibadətlərini rədd etmişdir.Dediyi sözlərə əlavə olaraq o, böyük şəxsiyyətlərə təhqirlər ünvanlamış və mənaları rədd etməkdə və zahirlərə tabe olmaq iddiasında aşırıya varmışdır.Buna rəğmən o, yalnız inadkarın etiraf etməyəcəyi iman, din, habelə çoxlu və geniş elmlərə sahib olmuşdur."[412]

Belə ki, o, iman və qədər məsələlərində qeyrilərindən daha doğru olmuşdur.Habelə o, qədər və irca məsələlərində, habelə sifət mövzusunda qeyd etdiklərinə görə sunnə və hədis əhlinə uyğun gəldiyi səbəbilə tərifəlayiq görülmüşdür.O, bütün bu mövzularda səhih hədisləri isbat edir, sələfi və hədis imamlarını yüksək tutur və imam Əhmədə müvafiq olduğunu deyir.

Ancaq sifətlər mövzusunda onun halı Əşarinin halından daha mənfidir.Üstəlik onun bu mövzuda sözü həqiqət və mənada fəlsəfəçi və mötəzililərin sözlərinə müvafiqdir.[413]

---

[412] Məcmu`əl-fətəva:4/18.

[413] İbn Hazmın Əhli sunnəyə müxalif olduğu etiqadla əlaqəli görüşləri ilə tanış olmaq üçün: "əd-durratu fimə yəcibu i`tiqaduh" kitabına təhqiqçi Əhməd bin Nəsir əl-Həmədin və Səid bin Abdur-Rahmən əl-Qarninin müqəddiməsinə

Buna rəğmən ibn Hazm xəvaric və mötəzililərə, habelə murciə, cəhmiyyə və əşarilərə rəddiyələr verməklə, ələxsus küfrün söz və əməl ilə olacağını isbat etmək və onun danma və etiqad çərçivəsində olduğunu ibtal etməklə seçilmişdir. Buna rəğmən o, qəlb əməlini tərk edənin müsəlman olacağını gördüyü zaman murciələrə müvafiq gəlməkdən xilas olmamışdır.

Belə ki, əşarilərin zəlalətlərini ifşa edib imam Əhmədin məzhəbini müdafiə edib daha sonra Əhməd və Əhli sunnəyə daha yaxın olanların, habelə Əhli sunnəyə ləfzdə, onlara müxalif olanlara isə mənada müvafiq olanların bu cür halı heç də qəribə deyil.

Bir sözlə, Şeyxul-İslamın onu tərifləməsi heç də ibn Hazmın iman mövzusuna dair dediyi bütün sözlərin haqq və doğru olduğu demək deyil.

Məsələnin daha aydın olması üçün ibn Hazmın iman və murciələrə cavablar mövzusunda əsas olaraq tutduğu, Şeyxul-İslamın isə ona müvafiq olmadığı bir sıra məsələləri qeyd etməyi münasib gördüm.Burada altı məsələnin qeyd edilməsi ilə kifayətlənirəm:

1-İbn Hazmın təsdiqin artıb azalmadığını iddia etməsi.

2-Onun Kərramilərin imana dair məzhəbini yanlış çatdırması.

3-Onun Əşarinin küfrə dair məzhəbini yanlış çatdırması.

---

bax.Habelə: Əhməd bin Nəsir əl-Həmədin “məuqifu ibn Hazm minəl iləhiyyət” adlı kitabına bax.

4-Onun Əbu Hanifə haqqında yanlış məlumatı.

5-İslam və imanın bir şey olduğunu iddia etməsi.

6-İmanla birgə günah zərər verməz,-sözünün Muqatil bin Süleymana nisbət edilməsində Şeyxul-İslamın ona müxalif gəlməsi.

*Beləliklə bunun açıqlaması:*

1-İbn Hazm təsdiqin artıb azalmadığını iddia etmişdir.

İbn Hazm (rahiməhullah) demişdir: "Hər hansı bir şeyin təsdiq edilməsinə artma və azalmanın daxil olması qətiyyən mümkün deyil.Habelə tövhid və nübuvvətin təsdiq edilməsinə artma və azalmanın daxil olması qətiyyən mümkün deyil.Çünki təsdiqin mənası, baş verdiyi zaman təsdiq olunanın varlığının gerçək olduğuna yəqinliyin hasil olmasıdır.Bu sifətdə isə fərqliliyin olması yolverilməzdir.Bununla da, bəlli olur ki, Uca Allahın imanda qeyd etdiyi artma qətiyyən təsdiq və etiqadda deyil.Əslində o, təsdiqdən savayı bir şeydə olan zərurətdir.Burada yalnız əməllər vardır.Qurana əsasən əminliklə aydın olur ki, xeyirli əməllər imandır.

Habelə Uca Allah buyurur: *"Möminlərə gəlincə, onların imanını artırar və onlar sevinərlər."*[414] Habelə buyurur: *"O kəslər ki, xalq onlara: "Camaat sizə qarşı (qüvvə) toplamışdır,*

---

[414] ət-Təubə:124.

*onlardan qorxun!" -dedikdə, onların imanını daha da artırdı".*[415]

Artma digər bir şeydə deyil və yalnız say kəmiyyətində olur.Etiqadın isə sayı və kəmiyyəti yoxdur.Kəmiyyət və say yalnız əməllər və sözlərdə olur."[416]

Habelə demişdir: "Artıq imanda artmanın olması aydın olmuşdur.İmanın təsdiq olduğunu deyənin sözü isə fərqlidir.Çünki biz zəruri şəkildə bilirik ki, artma azalmanı tələb edir.Çünki artmanın mənası müəyyən saya birləşik olan saydır.Belə olan halda ona birləşik olan say, ona daxil olan artmanın olmayacağı zaman nöqsanlı və az olacaq.Artıq azalmanın qeyd olunmasına dair Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) məşhur söz gəlmişdir.Peyğəmbər (salləllahu aleyhi və səlləm) qadınlara demişdir: "Kamallı kişinin ağlını siz tək daha çox aparacaq ağlı və dini naqis birisini görmədim. Qadınlar: Bizim dinimizin naqisliyi nədədir, ey Allahın elçisi?-deyə soruşdular.O, dedi: Məgər qadın bir sıra günlər və gecələri oruc tutmadan və namaz qılmadan keçirtmir? Bu, onun dininin naqisliyidir."

Əbu Muhamməd dedi: Əgər təsdiqdən hər hansı bir şey azalsaydı onun təsdiq olması batil olardı.Çünki əslən təsdiq hissələrə bölünmür.Əks halda o, şübhəyə çevrilərdi.Müvəffəq edən Allahdır!"[417]

---

[415] Ali İmran:173.
[416] əl-Fisal:3/232,233.
[417] Öncəki mənbə:3/237.

Habelə demişdir: "Əbu Muhamməd dedi: Əgər biri deyərsə ki: Siz nəyə əsasən təsdiqin fərqli olmadığını deyirsiniz.Axı biz yaşıllığın digər yaşıllığdan daha gür, mərdliyin digər mərdlikdən daha qabarıq olduğuna rast gəlirik. Ələxsus mərdlik və təsdiq birlikdə nəfsin sifətlərindən olan keyfiyyətlərdir?

Cavab olaraq deyiləcək: Gürluq və solğunluq kimi keyfiyyətlər qəbul edən hər bir şey bunu yalnız ona daxil olan digər keyfiyyətin qarışması nəticəsində qəbul edir.Bu isə yalnız bir şey ilə ona əks olan digər bir şey arasında ortaqlar olan şeylərdə olur.Bəzən həmin ortaqlar bir-birinə əks olan iki şeyi qarışdırır yaxud bu, iki əks şeyin qarışması caiz olan şeylərdə olur.

Ancaq əgər təsdiq digər bir şeyə qarışmış olsaydı dərhal yalana çevrilərdi.Habelə əgər təsdiq digər bir şeyə qarışsaydı dərhal şübhəyə çevrilər və nəticədə təsdiq bütövlüklə batil olardı.

Artıq demişik ki, iman yalnız təsdiqdən ibarət deyil. Təsdiqlə bərabər bir çox digər şeylər vardır.Fərqlilik yalnız bu şeylərin çoxluğu, azlığı və onun hasil olma keyfiyyətinə daxil olmuşdur.Müvəffəq edən Uca Allahdır."[418]

Beləliklə ibn Hazm bu üç yerdə təsdiqin artıb azalmadığını vurğulayır.Bütün bu sözlər, onun "əl-fisal" kitabında iman məsələləri və murciələrə cavablar bölümündə gəlmişdir.Habelə "əl-muhallə" kitabında demişdir: "Yəqinlik, fərq-

[418] əl-Fisal:3/262,263.

lilik qəbul etmir.Buna dəlil, yəqinliyin bir şeyin isbat edilməsidir.Bir isbatın isə digər isbatdan daha çox olması mümkün deyil.Əgər insan isbatı gerçəkləşdirməzsə bu, şübhəyə çevriləcək."[419]

Habelə "əd-durra" kitabında demişdir: "Qəlb ilə təsdiq qətiyyən fərqlilik qəbul etmir."[420]

Belə olan halda, Şeyxul-İslamın ibn Hazmın bu mövzuda dediyi bütün sözləri dəstəkləməsi deyilə bilərmi?!

2- Onun Kərramilərin imana dair məzhəbini yanlış çatdırması.

İbn Hazm (rahiməhullah) demişdir: "İnsanlardan bir tayfa, insanın qəlbi ilə küfr etiqadda olacağı halda belə imanın Allahı dil ilə iqrar etmək olduğunu demişlər.İnsan bunu etdiyi zaman mömin və cənnətlik olur.Bu, Muhamməd bin Kərram əs-Sicistəni və onun ardıcıllarının sözüdür."[421]

Habelə demişdir: "Əbu Muhamməd dedi: Aşırıya varmış murciələr iki firqədirlər.Onlardan biri deyir: İnsan kürf etiqadında olsa belə iman dil ilə sözdür.Həmin şəxs Uca Allah qatında mömin, Allahın dostu və cənnətlikdir.Bu,

---

[419] əl-Muhallə:1/62.

[420] əd-Durratu fimə yəcibu i`tiqaduh:339-cu səh.Təsdiqə fərqliliyin daxil olması məsələsi hər bir insanın duyduğu bir təzahürdür.Bir sıra kəlamçıların bunu qəbul etməsilə birgə İbn Hazmın bu məsələdə müxalifliyi bir qədər təəccüb doğurur.

[421] əl-Fisal:3/227.

Muhamməd bin Kərram əs-Sicistəni və onun ardıcıllarının sözüdür.Onlar Xorasan və Beytul-Maqdisdə yerləşirlər."[422]

Bu sözlər, həmin insanların münafiqin qurtulacağını və cənnətə daxil olacaqlarını dediklərini ifadə edir.Bu isə, onlara nisbət edilən yanlış sözdür.

Şeyxul-İslam (tayyəbəllahu sərahu) "şərhul əsfahəniyyə" kitabında demişdir: "Buna dair digər bidət sözlərdən kərramilərin sözüdür.Onlar deyirlər ki, qəlb etiqadı olmasa belə iman, dil ilə söz üçün bir addır.Bu söz, ən yaramaz sözlərdən biridir.Lakin bu sözün sahibləri hökmdə müxalif olmurlar. Onlar deyirlər: Qəlbsiz olan dil ilə iman, münafiqlərin imanıdır və axirətdə sahibinə heç bir fayda verməyəcək."[423]

Habelə demişdir: "Cənnətə layiq olan möminin daxilən mömin olması labüddür.Bu məsələdə qiblə əhlinin, hətta münafiqi mömin aldandıran kərramilərin yekdilliyi mövcuddur.Kərramilər deyirlər: İman sözdür.Habelə deyirlər: Axirətdə yalnız daxili iman fayda verəcək.

Bəziləri onların adından güya onların münafiqləri cənnət əhlindən etmələrini xəbər vermişlər.Bu, onların adından yanlış sözdür. Onlar imanın hissələrə bölünmədiyinə və fərqlənmədiyinə dair murciələrin şübhəsi səbəbilə hökm deyil yalnız ad məsələsinə dair ixtilaf etmişlər."[424]

Habelə demişdir: "Ümmətin sələfindən və imamlardan heç kəs, habelə müsəlman firqələrindən olan heç kəs

---

[422] Öncəki mənbə:5/73.
[423] Şərhu aqidətil əsfəhəniyyə:182-ci səh.
[424] Məcmu`əl-fətəva:7/215.

münafiqləri mömin adlandırmır.Bu məsələdə yalnız kərramilər adlı murciə firqəsi istisnadır.Onlar deyirlər: İman, zahirdə olan adicə təsdiqdir.İnsan bunu edəcəyi zaman daxildə təkzib edən olsa belə mömin olacaq.Onlar həmin şəxsin axirətdə əbədi əzaba düçar olacağını qəbul etmişlər. Onlar hökmdə deyil sadəcə adda çəkişmişlər.İnsanlardan bəzisi onların həmin şəxsləri cənnət əhlindən etmələrini xəbər verir.Bu, onların adından yanlış sözdür.Bütün bunlara rəğmən onların belə şəxsi mömin adlandırması Quran, sunnə və ümmətin sələfinin icmasına müxalif olan bidətdir. Kərramilər bu çirkin bidətlə digərlərindən seçilmişlər."[425]

Şeyxul-İslam (rahiməhullah) sanki burada ibn Hazmın kərramilərdən xəbər verdiyi sözlərin yanlış olduğuna işarə edir.

Sonralar ibn Hazmın, münafiqlərin qurtulacağına dair sözü kərramilərin sözünün zəruri amili etdiyini gördük.Bu isə, onun təzadlı fikirlərini ortaya qoyur.Çünki o, ilk olaraq bunu onların sözü etmiş daha sonra həmin sözü zəruri amil etmişdir.Ancaq sözlə həmin sözün zəruri amili arasında fərq açıq-aydındır.

İbn Hazm "əl-fisal" kitabında demişdir: "Əbu Muhamməd dedi: Onların sözləri, dil ilə iqrar etdikləri üçün münafiqlərin mömin olduqlarını zəruri edir.Bu isə, İslamdan çıxardan sözdür.Uca Allah buyurur: *"Heç şübhəsiz ki, Allaha bütün münafiqləri və kafirləri cəhənnəmdə toplayacaq"*...".[426] [427]

---

[425] Məcmu`əl-fətəva:7/475.

[426] ən-Nisə:140.

Əslində isə, kərramilər bunu demir və onların sözləri bunu gərəkdirmir.

3-Onun Əşarinin küfrə dair məzhəbini yanlış çatdırması.

İbn Hazm (rahiməhullah) demişdir: "İnsanlar imanın mahiyyətinə dair ixtilaf etmişlər.İnsanlardan bir qismi, bir şəxs yəhudiliyi, nəsraniliyi və küfrün digər növlərini dili və ibadəti ilə aşkar edəcəyi halda belə imanın yalnız Uca Allah haqqında qəlb ilə bilgi olduğunu demişlər.İnsan Uca Allahı qəlbi ilə tanıyacağı zaman cənnət əhlindən müsəlman olacaq.Bu, Əbu Mihrəz Cəhm bin Safvan, Əbul Həsən əl-Əşari və onun ardıcıllarının sözüdür."[428]

Habelə demişdir: "İkinci firqə: İnsan təqiyyəsiz dili ilə küfrü elan edib bütlərə ibadət etsə yaxud İslam diyarında yəhudilik və ya nəsranilikdən tutunsa, xaça ibadət etsə, habelə İslam diyarında üçlük etiqadını elan edib bu hal üzərə ölsə belə iman, qəlb ilə etiqaddır və həmin şəxs Uca Allah qatında kamil imanlı mömin, Allahın dostu və cənnətlikdir.Bu, Rasib oğullarının köləsi, habelə Haris bin Sureyc ət-Təmiminin katibi olan Əbu Mihrəz Cəhm bin Safvan əs-Səmərqandinin və Həsən Əli bin İsmail bin Əbul Yusr əl-Əşari əl-Bəsrinin və onun ardıcıllarının sözüdür."[429]

Dedim: Burada Cəhm bin Safvan ilə Əbul Həsən əl-Əşarinin eyni tutulması Şeyxul-İslamın bir çox yerdə qeyd etdiyi sözlərə zidd olan yanlış fikirdir.

---

[427] əl-Fisal:3/249.
[428] əl-Fisal:3/227.
[429] əl-Fisal:5/73.

Əşari sözlərin birində imana dair Cəhm bin Safvanın sözlərini müdafiə etsə belə o, dili ilə yəhudiliyi, nəsraniliyi və küfrün digər növlərini aşkar edən şəxsi cənnətlik mömin-lərdən etmir.

Əksinə o, deyir: Ondan aşkar olan bu şeylər onun daxilən kafir olduğuna bir dəlildir.

Şeyxul-İslam (rahmətullahi aleyhi) demişdir: "Əbul Həsən demişdir: Eşitmə yolu ilə gələnlər ona birləşik digər şərtlərlə varid olmuşdur.Bu şərtlər, icra və tərk etmə olaraq insanın edəcəyinin küfrə dəlalət edən amil ilə birləşik olmamasıdır. Belə ki, şəriət bütə ibadət və səcdə etməməyi ona əmr etmiş-dir.Əgər insan bunu edərsə bu, onun küfrünə dəlalət edəcək. Habelə əgər biri peyğəmbəri öldürər yaxud onu alçaldarsa bu, onun küfrünə dəlalət edəcək.Habelə əgər biri Quran yazısını yaxud Kəbəni yüksək tutmağı tərk edərsə bu, onun küfrünə dəlalət edəcək."[430]

Habelə demişdir: "Bu məzhəbdə Əbul Həsən, Qadı və onlardan öncə Cəhmin ardıcıllarından olanlar kimi ən səriştəli şəxslər bunun təməli pozan ziddiyət olduğunu bilmişlər.Onlar demişlər: İnsan yalnız qəlbində olan təsdiq gedəcəyi zaman kafir olur.Onlar şəriətin kafir hökmü çıxardığı hər bir şəxsin qəlbən Allahı və Peyğəmbəri tanımadığını əsas olaraq tutmuşlar.Bu səbəbdən bir çox dərrakəli insan onların bu sözünə irad tutaraq demişlər: Bu, inadcıllıq və boşboğazlıqdır."[431]

---

[430] Məcmu`əl-fətəva:7/149.

[431] Məcmu`əl-fətəva:7/146.

Cəhm bin Safvana gəldikdə isə, artıq o, küfr deyən yaxud edən şəxsin zahirdə kafir daxildə isə mömin olacağını hesab etmişdir.Bu səbəbdən, həmin şəxs ona görə cənnətlikdir.Axirətdə əzaba düçar olacaq kafir olması haqqında dəlil varid olan şəxslər isə müstəsnadır.

Şeyxul-İslam demişdir: "Əhməd dedi: Onun belə deməsi gərəkdir: Bir şəxs iqrar edəcəyi zaman ümumi şəkildə zəkatı iqrar edib hər yüz dirhəm üçün beş dirhəm tapmasa belə o, mömindir.Habelə onun belə deməsi gərəkdir: İnsan iqrar edəcəyi zaman "zunnər" kəmərini belinə taxıb xaca tərəf namaz qılarsa, habelə kilsə və məbədlərə gedərsə və bütün böyük günahları edərsə və eyni zamanda Allahı iqrar edərsə, belə şəxsin ona görə mömin olması gərəkdir.Bu, onların deməli olduqları ən çirkin şeylərdir.

Dedim: İmam Əhmədin qeyd etdiyi bu sözlər insanların onların əleyhinə gətirdiyi ən gözəl sözlərdir.O, bu məsələyə dair digər insanların dedikləri sözlərin bir qismini bir araya toplamışdır.Bu, qaçılmaz bir gərəkdirmədir.Bu səbəbdən Cəhm və ona müvafiq gələnlər mislində olan kəlam əhli bunun məzhəblərinə uyğun riayət etməli olduqları zəruri amil olduğunu bildikləri zaman demişlər: Əgər bir şəxs (küfr olan) zahiri əməllərdən bir şey edərsə bununla daxildə kafir olmaz lakin bu, dünya əkamlarında küfrə bir dəlil olacaq.Onlara həmin şəxsin axirətdə kafir olacağını tələb edən nasslar göstərildiyi zaman onlar demişlər: Bu nasslar, onun daxilən Allah haqqında heç bir bilgiyə sahib

olmadığına dəlalət edir.Bu, onlara görə bir şeydir.Bununla da, onlar sağlam ağıla və səhih dəlilə müxalif çıxmışlar."[432]

Cəhmin etimad etdiyi əsas, əgər bir insan küfr olan zahiri əməllərdən müəyyən şeyləri edərsə bununla daxildə kafir olmaz.Lakin bu, dünya əhkamlarında küfrə bir dəlil olar. Əşari isə belə şəxsin daxilən kafir olduğuna əminlik ifadə edir və bunu bilgi və təsdiqin yoxluğuna qaytarır.

Sonraki əşarilərdən bəzisi Cəhmin sözünə üstünlük verib demişlər: Bunu edən şəxsin daxilən mömin olması caizdir.Onlardan bəzisi isə demişlər: Şəriət sahibi bu şeyləri təkzib etməyə bir əlamət etmişdir.Bu səbəbdən, həmin şəxsin qəlbində təkzib etmənin olduğuna və ondan təsdiqin getməsinə hökm verilir.Artıq bunu izahı qeyd edilmişdir.

4-Onun Əbu Hanifə haqqında yanlış məlumatı.

İbn Hazm insanların iman haqqında sözlərini qeyd edib cəhmiyyə, kərramiyyə və Əbu Hanifənin sözlərinə, habelə Əhli sunnənin sözlərinə toxunmuşdur.Daha sonra Muhamməd bin Zəyyad əl-Hariri əl-Kufinin sözlərini qeyd etmişdir: "Əgər biri Uca Allaha iman edib Peyğəmbəri (salləllahu aleyhi və səlləm) təkzib edərsə mütləq şəkildə mömin olmaz. Lakin o, həm mömin həm də, kafirdir.Çünki o, Uca Allaha iman edib mömin olur, Peyğəmbəri (salləllahu aleyhi və səlləm) inkar edib kafir olur."[433]

---

[432] Məcmu`əl-fətəva:7/401.

[433] əl-Fisal:3/227.

Daha sonra demişdir: “Əbu Muhamməd dedi: Muhamməd bin Zəyyad əl-Haririnin sözü bütün bu firqələrə zəruridir və ərəb dilinin tələbinə əsasən ondan ayrılmazdır. Hətta iki müsəlman bu sözün özlüyündə küfr olduğuna və onun qeyd etdiyimiz kimi Qurana zidd gəldiyinə ixtilaf etmirlər.”[434]

Dedim: İbn Hazm (ğafərallahu ləhu) bu məsələdə xəta etmişdir.Çünki bu söz, qətiyyən Əbu Hanifəyə heç bir şeyi gərəkdirmir.Bu söz yalnız, yəhudiliyi, nəsraniliyi və küfrün digər növlərini aşkar edərsə belə imanın qəlb biliyi olduğunu deyən Cəhmə gərəklidir.

5-İslam və imanın bir şey olduğunu iddia etməsi.

İbn Hazm (rahiməhullah) demişdir: “Məsələ: İman və islam bir şeydir.Uca Allah buyurur: *“Nəhayət, orada olan möminləri çıxartdıq. Lakin orada bir evdən başqa müsəlman (tövhid dinində olan) tapmadıq.”*[435] Habelə buyurur: *“Onlar islamı qəbul etdiklərinə görə sənə minnət qoyurlar. De: “Müsəlman olduğunuzla mənə minnət qoymayın! Xeyr, əgər doğru deyirsinizsə, (bilin ki) sizi imana müvəffəq etməklə, əslində Allah sizin boynunuza minnət qoymuş olur!”*[436] [437]

Şeyxul-İslam bu sözləri tənqid edib bu sözlərin Quran və sunnənin dəlillərinə zidd gəldiyini hesab etmişdir.

---

[434] əl-Fisal:3/229.
[435] əz-Zəriyat:35-36.
[436] Hucurat:17.
[437] əl-Muhallə:1/59.əl-Fisal:3/296.

**6-İmanla birgə günah zərər verməz,-sözünün Muqatil bin Süleymana nisbət edilməsində Şeyxul-İslamın ona müxalif gəlməsi.**

İbn Hazm (rahiməhullah) demişdir: "Murciələrin böyüklərindən olmuş Muqatil bin Süleyman demişdir: Böyük yaxud kiçik olsa belə iman olan yerdə ümumiyyətlə günah zərər verməz.Habelə şirklə birgə yaxşı əməl fayda verməz."[438]

Dedim: Şeyxul-İslamın görüşünə əsasən bu söz Muqatilin adından deyilən yalana daha çox oxşayır.

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Təhdid məzmunlu nasslarda dayanan murciə və cəhmilərin bir çoxu böyük günah sahiblərindən hər hansı birinə təhdidin keçərli olması məsələsində əminlik ifadə etmirlər.Bunu Qadı Əbu Bəkr və qeyriləri kimi şiələr və əşarilərin murciələrindən deyənlər olmuşdur.Qeyd olunur ki, onlardan aşırıya varmış olanlar bütövlüklə təhdidi rədd etmişlər.Ancaq mən burada həmin sözü qeyd edə biləcəyim müəyyən şəxsin olduğunu bilmirəm.Lakin bu, Muqatil bin Süleymandan hekayət edilmişdir.Ancaq bu onun adından deyilən yalana daha çox oxşayır."[439]

Habelə demişdir: "Ola bilsin ki: Tövhid əhlindən heç kəs atəşə girməyəcək,-sözləri, aşırıya varmış murciələrin sözü olsun.Ancaq mən müəyyən bir şəxsdən bu sözlərin nəql edildiyini bilmirəm.İnsanlar yalnız bunu kitablarda xəbər verir, ancaq onu deyəni qeyd etmirlər.Ola bilsin ki, bu sözlər, ümumiyyətlə Allah qatında heç bir payı olmayan şəxs tərəfindən deyilsin.Çünki bir çox fasiq və münafiqlər

---

[438] əl-Fisal:5/74.

[439] Şərhul əsfəhaniyyə:182-ci səh.

deyirlər: İman yaxud tövhidlə birgə günah zərər verməz. Murcilərə rəddiyə verənlər, bəzi sözlərində onları bu tərzdə vəsf etmişlər."[440]

Bu, Şeyxul-İslamın ibn Hazma müxalif olduğu altı yerdir.Bütün bu məsələlər iman və murcilərə cavablar bölümündə qeyd olunmuşdur.

Bu isə, qeyd etdiyim kimi Şeyxul-İslamın onu ümumilik və çoxluq baxımından təriflədiyini təsdiq edir və heç də ibn Hazmın bu mövzuda dediyi bütün sözlərin doğru olduğunu ifadə etmir.

Sonra deyiləcək: İbn Hazmın qəlb əməlinin tərk edilməsinə görə təkfir etdiyi və bədən əməlləri məsələsinə dair çəkişdiyi fərz edilərsə belə, onun görüşü ondan öncə bağlanmış sələfin icması ilə dəyərini itirəcək.Ümumiyyətlə onun etiqadı məsələlərdə sələfin bir çox icmalarına müxalif olması çox və məşhurdur.Əlxsus bu, Allahın sifətləri mövzusunda daha qabarıq görünür.Müxalif həmçinin bunu etiraf edir.Doğrusunu bilən Allahdır.

---

[440] Məcmu`əl-fətəva:7/181.

## *Onuncu*: Beyhaqinin sözlərindən dəlil gətirdikləri məqam və bunun izahı

Beyhaqinin dediyi sözlərin qeyd edilməsi və ona izah verilməsindən öncə Beyhaqinin etiqadın digər mövzularına dair olan mövqeyi ilə tanış olmağı zəruri hesab edirəm.Bəzi "sələfilərin" onun iman məsələsinə dair sözlərini dəlil gətirmələrindən onun sələfi etiqadı üzərində olması düşüncəsi yarana bilər.Həqiqətdə isə o, əşari məzhəbinin əsaslarını qoymaq və həmin məzhəbə xidmət göstərməkdə böyük əmək sərf etmiş əşari imamlarından biridir.Şeyx Abdur-Rahmən bin Salih əl-Mahmudun (hafizahullah) dediyi kimi artıq onun hədis elminə dair bilgisi və bu elmdə imamlığı hədis və sunnə əhlinin məzhəbinə xidmət etməyə deyil təvil əhlinə xidmət göstərməyə yönəlmişdir.Bu, əhkamlarda deyil etiqadı mövzularda olmuşdur.[441]

Artıq şeyx (hafizahullah) Beyhaqi haqqında müxtəsər lakin dolğun şəkildə söhbət açmış və əşari məzhəbinin Bəqilləni, ibn Fəurak və Bəğdadinin əli ilə inkişaf etdiyi kimi həmçinin Beyhaqi, Quşeyri, Cuveyni kimi adamların əşari məzhəbinin inkişaf etdiyi zaman kəsiyini təmsil edən şəxslərdən olduğunu bildirmişdir.

Şeyx (hafizahullah) demişdir: "Beyhaqi fiqh elmində Şafiinin məzhəbini təzələyən şəxs və ən mötəbər hədis alim-

[441] Məuqifu ibn Teymiyyə minəl əşəira:2/585.

lərindən biridir.Onun əşari məzhəbinin şafii fiqhi ilə uzlaşdırılmasında böyük rolu olmuşdur.Daha sonra onun, hədis və rəvayətə böyük marağı vasitəsilə əşariliyin əsaslarını möhkəmlətmək və bunun əşarilərin kəlamçı üslubuna zidd olmadığını bəyan etmək kimi işlərdə böyük rolu olmuşdur.

Quşeyri əşarilərin mənhəcinə və etiqadlarına təsavvufu daxil etmişdir.

Cuveyni isə məzhəbdə mötəzililik istiqamətində addımlar atmışdır."[442]

Habelə (hafizahullah) demişdir: "Belə ki, Beyhaqi "əl-əsməu və-s-sıfət" kitabını öz ustadının tələbini yerinə yetirərək və ən böyük alimləri olduğu əşari məzhəbinə xidmət göstərərək təlif etmişdir.Bu səbəbdən o, həmin kitabı onların sözləri və təvillərindən olan nəqllər ilə doldurmuş, üstəlik öz təvillərini ora yerləşdirmişdir.Beyhaqinin növbəti sözləri deməkdə nəyi qəsd etdiyini bilmirəm: "Təxric olunmuş hədislər sunnənin müdafiə edilməsi və bidətin əzilməsi üçün bir yardımçı olmuşdur." Görəsən Beyhaqi burada "tə`tıl" bidətini yoxsa "təcsim" və "təşbih" adlandırdıqları təvili rədd etmək və isbat etmək bidətini qəsd edir?!

Onların hamısının şeyxi olan ibn Fəurakın və onun şagirdi Əbu Mənsur əl-Əyyubinin (Beyhaqiyə kitabın təlif edilməsini tövsiyyə edən) halı, habelə Beyhaqinin bu kitabda etdiyi təvillərdə olan halı haqqında bilgi vasitəsilə

[442] Məuqifu ibn Teymiyyə minəl əşəira:2/580.

daha üstün görüş onun "təşbih:bənzətmə" olduğunu iddia etdikləri isbat bidətini əzdiyini qəsd etməsidir.Doğrusunu bilən Allahdır."[443]

Şeyxin bir sıra misallar çəkməsi vasitəsilə Beyhaqinin Allahın sifətlərini isbat edən bir çox səhih hədislərə münasibətdə kəlamçıların üslubuna əsasən hərəkət etməsi, mühəddis kimi qorumalı olduğu hüdudlardan çıxıb əşarilərin başbilənlərindən olan camaatın sözlərinə etimad etdiyinə işarə etməsi, kəlam elmini müdafiə etməsi və əşarilərin düçar olduqları fitnədə əməli surətdə iştirak etməsi bəlli olmuşdur.Şeyx sələfin hərtərəfli etiqadına dair Əşarinin mövqeyini qısa olaraq qeyd edib demişdir:

"Diqqət yetirilməlidir ki, Beyhaqi cismlərin yeni olması, "hulul əl-havadis", isteva, enmə, gəliş, gülüş və təəccüb siftlərinin təvili, habelə ucalığın (cəhətin) rədd edilməsi, qədəm, barmaqlar və digər sifətlərin təvil edilməsi məsələsində əşarilərin məzhəbinə müvafiq sözlərin sahibi olsa belə o, üz, iki əl və göz kimi sifətləri təvil etmədən isbat etmişdir.Bununla da, o, şeyxi Bağdədiyə müxalif olmuşdur".[444]

Şeyx Əhməd bin Atiyyə əl-Ğamidi (hafizahullah) Beyhaqi və onun ilahi elmlərə dair mövqeyini geniş şəkildə araşdırdırqdan sonra çox önəmli nəticələrə gəlmişdir.Bunlar:

---

[443] Məuqifu ibn Teymiyyə minəl əşəira:2/584.

[444] Məuqifu ibn Teymiyyə minəl əşəira:2/589.

3-Beyhaqi dəlilin gətirmə üslubunda sələfin yolunu tutmuş, tətbiq zamanı isə həmin dəlil gətirmə üslubuna bir çox məsələlərdə müxalif olmuşdur.

4-O, Uca Allahın varlığına dəlil olaraq Qurani Kərimin üslubunu seçmişdir.O, bu işdə sələfə müvafiq olmuşdur.Buna rəğmən o, aləmin yeni olması üçün cövhər və ərəzi dəlil gətirməkdə əşarilərdən olan əshabına müvafiq gəlib bu dəlilil səhih olduğunu iddia etmişdir.Çünki bu, onun nəzərində şər`i dəlildir.O, buna İbrahimin (aleyhi-s-sələm) üslubunu nümunə göstərmişdir.Artıq mən, bunun sələfin məzhəbinə müxalif olduğunu və bunun İbrahimin üslubu olduğuna dair onların təsəvvürünün yaramazlığını bəyan etdim.

7-Beyhaqi hər iki növü ilə (həyat, qüdrət, elm, eşitmə kimi zatı əqli sufətlər və yaratma, ruzi vermə və diriltmə kimi fe`li əqli sifətlər) əqli sifətlərin isbat edilməsində və bunun isbat edilməsi üçün dəlil gətirmə üslübunda sələfə müvafiq gəlmişdir.

8-Allahın zatında "hulul əl-havadis" sözünə dair, yəni Uca Allahın istədiyi zaman və istədiyi şəkildə etdiklərini isbat etmək məsələsində sələfə müvafiq gəlməmişdir.Bu səbəbdən bütün zatı əqli sufətlərin qədim olduğunu və ondan hər hansı bir şeyin yeni olmadığını demişdir.Artıq izah etmişəm ki, səhih görüş növün qədim ayrı-ayrı vəsflərin yeni olduğuna dair sələfin seçdiyi görüşdür.

9-Onun keçmişə nisbətdə “təsəlsul əl-havadis” məsələsini rədd etməkdə sələfə müxalif olmasıdır.Bu səbəbdən, onun fe`li əqli sifətlərin yeni olduğunu dediyini görmək mümkündür.Lakin mən onun seçdiyi görüşün yanlış olduğunu və Allahın əzəldən və əbədiyyatdan bəri istədiyini etdiyini deyən sələfin məzhəbinin doğru olduğunu bəyan etmişəm.

10-Beyhaqi zatı xəbəri sifətləri isbat etməklə sələfə müvafiq olmuş digər sifətləri təvil etməklə isə müxalif olmuşdur.Belə ki o, iki əl, üz, iki gözü isbat etmiş sağ əl, ovuc, barmaqlar, baldır, qədəm kimi sifətləri isə təvil etmişdir. Çünki həmin sifətlər əhad xəbər vasitəsilə gəlir, onun zahiri isə təşbihə (bənzətməyə) aparır.

11-Onun fe`li xəbəri sifətlərdə sələfə müxalif olmasıdır. Belə ki, o, həmin sifətlərin bəzisini təvil etmiş bəzisini isə “təfvid” (mənasını Allaha həvalə) etmişdir.Beyhaqi etdiyi təfvidin sələfin məzhəbi olduğunu iddia etmişdir.Artıq mən təfvid və təvil məsələlərini sələfə nisbət edənlərin sözünün yaramaz olduğunu bəyan edib sələfin məzhəbinin bütün sifətlərin təvil, təfvid və təşbih etmədən həqiqi surətdə isbat edilməsini izah etmişəm.

12-Beyhaqi isbat etdiyi “kəlam” sifəti ilə əlaqəli olan bütün şeylərdə sələfə müxalif olmuşdur.Belə ki, o, kəlamın nəfsi və qədim olduğunu, onun hərf və səssiz olduğunu və onun bir məna olduğunu demişdir.Artıq mən bütün bu məsələləri elmi surətdə münaqişə edib onun görüşünün yanlış sələfin məzhəbinin isə doğru olduğunu bəyan etmi-

şəm.Habelə mən, Uca Allahın kəlamına dair onun görüşü-nün onun əshabı olan əşarilərin görüşü olduğunu və onların Qurana dair məzhəblərinin gerçək surətdə mötəzililərin məzhəbindən fərqlənmədiyini bəyan etmişəm.Onlar arasında yeganə fərq mötəzililərin oxuduğumuz bu Quranın həqiqi surətdə Allahın kəlamı olmasını rədd etmələridir.

13-Beyhaqi qiyamət günü möminlərin Allahı görəcəkləri ilə əlaqəli olan bütün məsələlərdə sələfə müvafiq olmuşdur.O, yalnız görmə hədisini dəlil gətirərək istiqaməti rədd etməkdə onlara müxalif olmuşdur.Artıq mən onun bu hədisi dəlil gətirməsinin yararsız olduğunu və sələfin dəlil üslubunun doğru olduğunu bəyan etmişəm.

14-Beyhaqi insan qüdrətinin onun fellərinə təsir etmədiyini deyir.Artıq bəyan etmişəm ki, bununla o, gerçəyi olmayan "kəsb" etiqadında olan əşarilərin sözünə müvafiq olur və insanın qüdrətinin onun fellərinə təsir etdiyini deyən sələfə müxalif olur.

15-Beyhaqi səbəblərin onun nəticəsində ortaya gələnə təsir etdiyini rədd edir.Bu isə, əşarilərin məzhəbidir.Artıq mən bu görüşün həmçinin yaramaz olduğunu və bunun sabit nasslara müxalif olduğunu bəyan etmişəm."[445]

Beləliklə də bu, Beyhaqidir.O, bir çox etiqadı məsələlərdə sələfə müxalif olmuşdur.Görəsən onlara iman məsələsində müvafiq olacaqmı?

---

[445] "əl-Beyhaqi va məuqifuhu minəl iləhiyyət:331-333-cü səh", şeyx Əhməd bin Atiyyə əl-Ğamidi.

## *Beyhaqinin sözləri:*

**Beyhaqi** (rahiməhullah) demişdir: "İmana dair söz bölümü: Uca Allah buyurur: *"Möminlər ancaq o kəslərdir ki, Allah anıldığı zaman onların qəlbi qorxuya düşər, Onun ayələri onlara oxunduqda imanları artar, yalnız öz Rəbbinə təvəkkül edər, namaz qılar və Bizim onlara verdiyimiz ruzidən (Allah yolunda) xərcləyərlər. Onlar həqiqi möminlərdir."*[446]

Uca Allah məhz bu əməlləri cəm edənlərin mömin olduğunu xəbər vermişdir.Həmin əməllərin bəzisi qəlbdə bəzisi dildə bəzisi isə hər ikisi və bədənin digər əzalarında, bəzisi isə onların ikisində yaxud birində və mal ilə olur. Uca Allahın bu əməllərə dair qeyd etdiyində Onun burada qeyd etmədiyinə işarə vardır.Uca Allah onların imanlarının onlara oxunan ayələr ilə artıdığını xəbər vermişdir.Bütün bunlar isə bu əməllərin və həmin əməllər vasitəsilə işarə etdiyi şeylərin imanın xislətlərindən olduğuna və imanın artıb azaldığına dəlalət edir.Bu şeylər artma qəbul etdiyi zaman isə azalmanı həmçinin qəbul edəcək.

Bu ayəyə və Quran və sunnədən onun mənasında gələn şeylərə əsasən hədis əhli iman adının bütün itaətlər, fərzlər və nafilələr üçün ad olduğunu seçmişlər.Habelə o, üç qism-dir:

Tərk edilməsi küfr olan qism.Bu qism, etiqad edilməsi vacib olanın etiqad edilməsi və etiqad edilənin iqrar edilməsi.

---

[446] əl-Ənfəl:2-4.

Tərk edilməsi günah yaxud asilik olan qism.İnsan bunun danmayacağı zaman kafir olmur.Bu qism, namaz, zəkat, oruc, həcc və haramlardan çəkinmə kimi fərz itaətlərdir.

Tərk edilməsi yanlışlıq olan qism.Bunu tərk edən şəxs fasiq və kafir olmur və sadəcə daha yaxşını əldən qaçırmış olur.Bu qism, könüllü ibadətlərdir.

Onlar bütün bu şeylərin iman adını daşıması tərzində ixtilaf etmişlər.Onlardan bəzisi demişlər: Bütün bunlar Uca Allaha və Peyğəmbərə (salləllahu aleyhi və səlləm) imandır. Çünki ərəb dilində iman, təsdiq mənasındadır.Hər bir itaət isə təsdiqdir.Çünki heç kəs digər birini və onun sözünü isbat etmədiyi halda ona itaət etməz.

Onlardan bəzisi isə demişlər: İqrarsız etiqad, Allaha və Peyğəmbərə (salləllahu aleyhi və səlləm) iman gətirməkdir.Digər itaətlər isə Allah və Peyğəmbərə (salləllahu aleyhi və səlləm) iman etməkdir.Bununla da Allahı təsdiqləmək: Onu isbat etmək və Onun varlığını etifar etmək olur.Allahı təsdiq etmək isə: Onun əhkamlarını qəbul edib onun doğru, müdrik və ədalətli olması səbəbilə onun fərz buyuruqlarına tabe olmaqdır.

Peyğəmbəri (salləllahu aleyhi və səlləm) təsdiqləmək və onu təsdiq etmək həmçinin belədir.

Artıq biz bunun izahını və dəlilini iman kitabı və “əl-cəmi`” kitabında qeyd etmişik.Biz burada sadəcə onun bir

hissəsini qeyd edirik."[447] Daha sonra əməlin imandan olmasına dair bir sıra dəlilləri nəql etdi.

Dedim: Artıq Beyhaqi imanın "etiqad", "iqrar" və "əməl" adlandırması səbəbinə dair iki görüşü qeyd etmişdir.İkinci görüş, onun seçdiyi və "əl-cəmi` lişuabil imən" kitabında yeganə qeyd etdiyi görüşdür.

Beyhaqi "əl-cəmi` lişuabil imən" kitabında öz etiqadını ətraflı izah edib Allaha iman gətirməklə (الإيمان بالله) Allaha iman etmək (الإيمان لله), habelə Peyğəmbəri təsdiqləməklə (التصديق بالرسول) Peyğəmbəri təsdiq etmək (التصديق للرسول) arasında fərqi bəyan etmişdir.

Onun verdiyi təfsilatdan bəlli olur ki, Beyhaqi küfrün yalnız təsdiqin və tələffüzün müqabilində olacağını hesab edir.Bütövlüklə və hər iki növü ilə əməlin tərk edilməsi isə küfr deyil.

Beyhaqi "əl-cəmi` lişuabil imən" kitabında demişdir[448]:

---

[447] əl-İ`tiqad:191-ci səh, Beyhaqi.Müxaliflərdən bir çoxu onun əvvəldə dediyi sözləri dəlil gətirib növbəti sözləri diqqətsiz qoymuşlar: "Bütün bunların iman adını daşıması tərzində ixtilaf etmişlər v.s".Qəti əminəm ki, onun sözlərini dəlil gətirənlərin çoxu onun Allaha iman gətirməklə Allaha iman etmək, habelə Peyğəmbəri təsdiqləməklə Peyğəmbəri təsdiq etmək arasında fərq qoymaqla nəyi qəsd etdiyini anlamamışlar.Əgər onlar buna diqqət yetirsəydilər Beyhaqinin sözlərini dəlil gətirməzdilər.İrəlidə bunun izahı gələcək.

[448] Beyhaqi "əl-cəmi`" kitabının əksər yerlərində Əbu Abdullah əl-Huleyminin "əl-minhəc"də yazdığlarına əsaslanmışdır.O, bunu müqəddiməsində özü bəyan etmişdir.Beyhaqi demişdir: "Hədislərin fəsillərə bölüşdürülməsi məsələsində ona tabe oldum və onun sözlərindən hər bir fəsilə aydınlıq gətirən şeyləri hekayət etdim.Ancaq o, mətnlərin qeyd edilməsi ilə kifayətlənib müxtəsər olsun deyə isnadları çıxartmışdır.Mən isə hədis əhlinin üslubuna uyğun olaraq

“Uca Allaha iman gətirmək: Onu isbat etmək və Onun varlığını etiraf etməkdir.

Uca Allaha iman etmək isə: Onu qəbul etmək və Ona itaət etməkdir.

Peyğəmbərə (salləllahu aleyhi və səlləm) iman gətirmək: Onu isbat etmək və onun nübuvvətini etiraf etməkdir.

Peyğəmbərə (salləllahu aleyhi və səlləm) iman etmək isə: Ona tabe olmaq, ona müvafiq gəlmək və ona itaət etməkdir.

Habelə Allaha və Peyğəmbərə iman gətirmək mənasında gələn təsdiq bölünür:

Onun bəzisi gizli və məxfi olur: Bu, qəlbdə olandır və etiqad adlanır.

Onun bəzisi isə aşkar və bəlli olur: Bu, dildə olandır və iqrar və şəhadət adlanır.”[449]

Bunun ardında dedi: “Habelə Allaha və Peyğəmbərə iman etmək iki qismə, gizli və aşkar olana bölünür:

Gizli olan: İbadətlər üçün yeganə vasitə olan niyyətlər və məqsədlər, habelə vacibin vacib, mübahın mübah, rüxsətin rüxsət, qadağanın qadağa, ibadətin ibadət, şər`i cəzanın şər`i cəza v.s olması etiqadıdır.

Aşkar olan: Zahirdə bədən əzaları ilə edilən şeylərdir.O, bir neçə cür olur:

---

rəvayətlərdən isnadı ilə qeyd edilməsinə ehtiyac duyduğum şeylərin qeyd edilməsini qəsd etdim.”

[449] əl-Cəmi` lişuabil imən:1/35, Beyhaqi.

Onlardan: Təharət, namaz, zəkat, oruc, həcc, ümrə, Allah yolunda cihad və yerində qeyd edəcəyimiz digər şeylərdir.

Bütün bu şeylər iman və islamdır, habelə Uca Allaha və Peyğəmbərə (salləllahu aleyhi və səlləm) itaətdir.Sadəcə bu, Allaha iman etməkdir, yəni Ona olan ibadətdir.Habelə Peyğəmbərə iman etməkdir, yəni onun qəbul edilməsidir, ona edilən ibadət deyil.Çünki ibadətin yalnız Uca Allaha edilməsi icazəlidir."[450]

*Bu nəql vasitəsilə iki məsələ aydın olur:*

*Birinci*: Beyhaqi Allaha iman gətirmək ilə (الإيمان بالله) Allaha iman etmək (الإيمان لله) arasında fərq qoyur və təsdiqin və dil sözünün Allaha iman olduğunu hesab edir.Qəlb əməli və bədən əməli isə ona görə Allaha iman etməkdir (الإيمان لله).

Beyhaqi və Huleymiyə görə bu cür fərqləndirmənin səmərəsi, küfrün Allaha iman etməyə (الإيمان لله) deyil Allaha iman gətirməyə (الإيمان بالله) müqabil olmasıdır.Hər iki əməlin (qəlb və bədən əməlinin) tərk edilməsi isə küfr deyil.

*İkinci*: O, etiqad sözünü işlədib bununla qəlb əməllərindən kənar adicə qəlb təsdiqini və iqrar və şəhadət adlandırdığı dil sözü olan zahiri təsdiqi qəsd edir.Ona görə küfr, əməlin, qəlb yaxud bədən əməlinin tərk edilməsi deyil bu etiqadın tərk edilməsidir.

Beyhaqi demişdir: (Huleymi dedi):

[450] əl-Cəmi` lişuabil imən:1/36.

Allaha və Peyğəmbərə iman gətirmək əsasdır.Məhz bu, insanı küfrdən çıxardır.

Allaha və Peyğəmbərə (salləllahu aleyhi və səlləm) iman etmək isə şaxədir.İnsanın imanı onun kamil olması ilə kamilləşir, onun nöqsanlı olması ilə nöqsanlı olur.[451]

Bunun mənası: İmanın özəyi hasil olacağı sonra isə əlavə itaət gələcəyi zaman itaətdən öncə olan iman artacaq.Çünki həmin imana, onu tələb edən iman əlavə olmuşdur.

Sonra bu itaətin ardından digər bir itaət gələcəyi zaman özəy və ondan sonra gələn itaət artacaq.Bu, imanın bütün şöbələri kamilləşənə qədər belə davam edəcək.

Dedi: İmanın nöqsanlı olması: Özəyin bəzi şaxələrdən kənar qalması yaxud özəyin və bəzi şaxələrin xitabın və mükəlləfiyyətin şamil etdiyi digər şeylərdən kənar düşməsidir.Çünki nöqsan artmanın əksidir.[452]

İman gətirib namaz qılana: İmanı artdı,-deyildiyi zaman iman gətirib namazı yerinə yetirməli olduğu şəxsə: Naqis imanlı,-deyilməsi gərəkdir.Həmin şəxs imkan olan yerdə onu tərk etməklə günahkar və asikar şəxsə çevrilir.Digər dayağlar həmçinin bu olçüdədir.

İnsanın könüllü yerinə yetirdiyi və ona vacib olmayan ibadətlər isə etiqad və sözün fe`l ilə təsdiq edilməsi mənasında onda mövcuddur və bununla onun imanı artır.

---

[451] Huleymi və Beyhaqiyə görə qəlb əməli bədən əməli kimi imanda kamilliyi ifadə edir və onlar arasında heç bir fərq yoxdur.

[452] Onun sözlərindən anlaşılır ki, ona görə təsdiqə azalma daxil olmur.

Onun tərk edilməməsi ilə müqayisədə onun tərk edilməsini nöqsan adlandırmaq icazəlidir.Lakin bu, onu tərk edən şəxsə üsyankarlığı vacib etmir.Bu, onun sözünün mənasıdır.

Dedi: Biz bütün itaətlərin iman olduğunu vacib etdiyimiz zaman möminlərdən sadir olan günahların küfr olduğunu vacib etmirik.Çünki Allaha yaxud Peyğəmbərə küfr etmək iman gətirməyə müqabil tərəfdədir.Allaha və Peyğəmbərə iman gətirmək: Onu etiraf etmək və isbat etmək vacib olduğu zaman küfr, Onu danmaq, rədd etmək və Onu təkzib etmək olmuşdur.[453]

Əməllər isə Allaha və Peyğəmbərə iman gətirmə hasil olandan sonra Allaha və Peyğəmbərə iman etməkdir.Burada məqsəd, öncə qeyd edilən etiraf şərtilə itaətin yerinə yetirilməsidir.Bunun müqabilində isə küfr deyil müxaliflik və üsyankarlıq durur.

Artıq mən iman kitabında bu cümlənin doğru olduğunu açıqlayan xəbərlər və əsərlər qeyd etmişəm.Habelə mən bu kitabda Allahın istəyilə onun yollarına işarə edirəm."

Daha sonra dedi: "Bölüm: Qəlb təsdiqinin və dil iqrarının imanın özəyi olmasına və acizlik olmayan yerdə onların

---

[453] Bu da nəticə! Küfrün danma, rədd etmə və təkzib etmə çərçivəsinə salınması. Çünki o, küfrü Allaha iman gətirməyə (təsdiq və tələffüzə) müqabil tərəfdə etmiş və bunu Allaha iman etməyə (qəlb əməli və bədən əməlinə) müqabil tərəfdə etməmişdir.Küfrü danma, rədd etmə və təkzib etmə çərçivəsinə salanların sözlərini iman məsələsinə dair dəlil gətirənlərin halı təəccüb doğurmaya bilməz. Onlar isə özləri bu sözü deməkdən uzaq olduqlarını iddia edirlər!

hər ikisinin küfrdən çıxmağa şərt olmasına dair dəlil." Beyhaqinin sözləri bitdi.[454]

### *Buna bir neçə yöndən cavab veriləcək:*

*Birinci*: Beyhaqinin etiqad kitabında dediyi sözlərin qeyri-məqbul olmasına dair biz və müxalif yekdilik.Çünki o, küfrü yalnız iqrar və etiqadın tərk edilməsində etmişdir. Artıq onun etiqad sözü ilə qəlb əməli olmadan qəlb təsdiqini qəsd etməsi bəlli olmuşdur.

Müxalif isə deyir: Qəlb əməlinin tərk edilməsi küfrdür. Bu səbəbdən, Beyhaqinin bu sözlərini rədd edib ona bel bağlalmamaq gərəkdir.

*İkinci*: Beyhaqinin "əl-cəmi` lişuabil imən" kitabında qeyd etdikləri "əl-i`tiqad" kitabında dediklərindən çox da fərqlənmir.Üstəlik həmin kitab onun şərhi, əlavəsi və ətrafli izahıdır.Həmin sözlər Allaha və Peyğəmbərə iman gətirməklə Allaha və Peyğəmbərə iman etmək arasında açıq-aydın fərq qoyur.Birinci: Təsdiq və iqrardır.Məhz o, küfrə müqabil tərəfdədir.İkinci (Allaha və Peyğəmbərə iman etmək): Niyyətlər və məqsədlərdən ibarət qəlb əməli və bədən əməlidir. Bu isə, küfrə deyil müxaliflik və üsyankarlığa müqabil tərəfdədir.

Beyhaqinin "əl-cəmi`" kitabında bunu açıq bəyan etməsinə və qəsdini aşkar etməsinə rağmən bəzilərinin onun sözlərini dəlil gətirdiyini görürük.Üstəlik həmin adamlar onun

---

[454] əl-Cəmi` lişuabil imən:1/36-37, Beyhaqi.

Əhli sunnənin məzhəbinin təməllərini bəyan etdiyini iddia edirlər.

Onlardan biri demişdir: “İmam Beyhaqi “cəmiu şuabil imən” və “əl-i`tiqad” kitablarında Əhli sunnənin məzhəbini çox gözəl şəkildə bəyan etmiş və əşariələr, cəhmilərə, Salihiyə və fəqih murciələrə, habelə kərramilərə rəddiyə vermişdir.Anlamıram, iman mövzusuna dair onun “əşarilər” deyilən şəxslərə müvafiq gəlməsi sözü ona haradan nisbət edilir?!”.

Məgər Əhli sunnə qəlb əməlinin tərk edilməsinin küfrə deyil müxaliflik və üsyankarlığa müqabil olduğunu demişlər?!

Bunu deyən şəxsin nəinki Əhli sunnənin məzhəbini bəyan etmişdir deyilməz, heç onun Əhli sunnəyə müvafiq olması deyilməz.

Onun əşarilərə iman mövzusunda rəddiyə verməsi isə əsassız iddiadır və əşarilərin məzhəbini bilən şəxs bu cür söz dilə gətirməz.Artıq onların cumhurunun imanda artma və azalmanı isbat etdiklərini və qəlb əməllərini imana daxil etdiklərini qeyd etmişəm.Bədən əməlləri isə, onlara görə kamillik şərtidir.Beyhaqi buna heç bir əlavə gətirməmişdir. Üstəlik o, qəlb əməlinin bədən əməli kimi olduğunu açıq bildirmişdir.Onların hər ikisi imanda kamilliyi ifadə edir. Onun dil tələffüzünü təsdiq kimi imanın bir hissəsi etməsi isə yuxarıda qeyd edildiyi kimi əşarilərdən bir toplum insanın dediyi sözdür.

## *On birinci*: Qadı İyadın sözlərindən dəlil gətirdikləri məqam və bunun izahı

Müxalif imam Nəvəvinin Qadı İyaddan nəql etdiyi sözləri dəlil gətirmişdir: "Qadı İyad demişdir: Artıq qeyd edilmişdir ki, imanın ərəb dilində əsas mənası təsdiqdir.Şəriətdə isə qəlb və dil təsdiqidir.Şəriətin zahiri nassları, burada olduğu kimi onu əməllərə şamil edir.Onun ən fəzilətlisi "lə iləhə illəllah" kəlməsi, ən sonuncusu isə yoldan əziyyət verən şeylərin kənarlaşdırılmasıdır.Artıq qeyd etmişik ki, imanın kamilliyi əməllərlə, onun tam olması isə itaətlərlə olur və itaətlərə əməl etmə və bu şöbələrin əlavə edilməsi təsdiqdən və onun dəlillərindəndir.Habelə o, təsdiq əhlinin əxlaqıdır və o, istər dildə gələn istərsə də, şəriətdə gələn iman adından kənar deyil."[455]

Müxalif Qadı İyadın növbəti sözlərini dəlil gətirmişdir: "Sonra onun imanı və islamının tam olması iki hədisdə qeyd etdiyimiz imanın əməllərinin tam olması və onun əsaslarına riayət olunması ilə gerçəkləşir.Abdul-Qays nümayəndə heyətinin hədisində bütün bunlara iman adının verilməsində məqsəd məhz budur.Artıq şəriət sahibi əməllərə iman adını vermişdir.Çünki əməllər ondandır və iman yalnız onunla tamamlanır.Lakin onun gerçəyi, yəni imanın gerçəyi ərəb dilinin qoyuluşunda təsdiqdir.Şəriətin istilahında isə

[455] Şərhu-n-nəvəvi aləl muslim:2/4.

iman, qəlb və dil təsdiqidir.Bu hasil olacağı zaman əbədi cəhənnəmdən xilas edən iman hasil olacaq.Lakin bütövlüklə ora daxil olmaqdan xilas edən imanın kamilliyi İslam xislətlərinin kamilliyi ilə olur."[456]

***Buna bir neçə yöndən cavab veriləcək:***

*Birinci*: Qadı İyad demişdir: "Artıq qeyd etmişik ki, imanın kamilliyi əməllərlə, onun tam olması isə itaətlərlə olur." Bu sözlərdə heç bir anlaşılmazlıq yoxdur.Belə ki, iman əməllər və itaətlərlə kamilləşir.İnsan hər dəfə bir şey etdikdə onun imanı artır.Burada, əməllərin bütövlüklə gedəcəyi zaman imanın qalacağına dair heç bir açıqlama yoxdur.

*İkinci*: O, demişdir: "Şəriətin istilahında isə iman, qəlb və dil təsdiqidir." Bu sözlər, imanın söz və əməl olduğunu deyən Əhli sunnənin icmasına müxalifdir.

Bu sözləri nəql edib, iddia etdiyi kimi sələfin məzhəbini müdafiə etmək istədiyini deyən şəxsin halı təəccüb doğurmaya bilməz.Üstəlik həmin adamlar əşarilərin bu mövzuda sələfin görüşündən yan durduqlarını bildikləri halda bu kimi məsələlərdə əşari etiqadında ola şəxsin[457] sözlərinə etimad etmələri çox təəccüb doğurur.

Qadı İyad burada əşarilərin iman və küfr mövzusuna dair etiqadından çıxmamışdır.Ən uzağı deyilə bilər ki, o, dil

---

[456] Şərhu-n-nəvəvi aləl muslim:2/4.

[457] Bax: Qadı İyad va cuhuduhu fi ilmey əl-hadis rivayətən va dirayətən: Bəşir Əli Həməd ət-Turabi. Orada gəlmişdir"149-cu səh": Əşari etiqadlı idi.Onun halı Məğrib və Əndəlüsdə olan əksər malikilərin halı mislində olmuşdur. O, bütün həyatı boyu bu etiqadda olmuşdur.

sözünü həmçinin imandan etmişdir.Bu isə, qeyd edildiyi kimi onlardan bir toplum insanın dediyi sözdür.Şəriətin zahiri nasslarının əməlləri imandan etməsi haqqında onun dediyi sözü həmçinin digər əşarilər təsdiq edirlər.Onlar deyirlər ki, əməllər imana məcazi şəkildə daxildir.Gerçəkdə isə deyil.Bu səbəbdən, imanın gerçəyinin təsdiq və söz olduğunu vurğulamışdır.Bunun, imanın gerçəyi olduğunu etiqad etməyimizi istəyən bu şəxs görəsən necə sələfidir!

***Üçüncü***: Beyhaqi demişdir: "Şəriətin istilahında isə iman, qəlb və dil təsdiqidir.Bu hasil olacağı zaman əbədi cəhənnəmdən xilas edən iman hasil olacaq.Lakin bütövlüklə ora daxil olmaqdan xilas edən imanın kamilliyi İslam xislətlərinin kamilliyi ilə olur." Bu, Qadı İyadın sözlərində gələn əsl dəlil gətiriləcək məqamdır.Lakin əgər müxalif onun bu sözlərini: "Bu hasil olacağı zaman əbədi cəhənnəmdən xilas edən iman hasil olacaq ",-sözlərini dəlil gətirmiş olsaydı onun istəyini isbat edəcək açıq-aydın söz olardı.Biz ona deyirik: Kaş ki, bütün insanlar sizin çağırdığınız yolun gerçəyini görmələri üçün sən onunla bu sözlərdən öncə qeyd etdiyinə, imanın şəriətin istilahında qəlb və dil təsdiqi olduğuna müvafiq gələrdin! Məgər bu, əməli şər`i imanın gerçəyindən çıxardan açıq-aydın irca deyil?

***Dördüncü***: Qadı İyad digər əşarilər kimi təkfir mövzusunda Bəqilləni və qeyriləri kimi Cəhmin sözlərini müdafiə edən imamlarının sözlərini xəbər verir.O, daha da irəli gedərək demişdir: "Bu, Əhli sunnənin məşhur məzhəbləridir.Digər firqələrin buna dair bir çox qarışıq və dar

düşüncəli sözləri vardır.Bu sözlərin haqqa ən yaxın olanı Cəhm və Muhamməd bin Şəbibin dedikləri kimi Allaha küfrün cəhalət olmasıdır və insanlardan heç kəsin bundan savayı amil səbəbilə kafir olmamasıdır."[458]

Bu sözün haqqa daha yaxın olması yalnız bu sözü "təhqiq və haqq əhlinin imamı" adlandırdığı Qadı Əbu Bəkr əl-Bəqillənidən nəql etməsi səbəbilədir.O, demişdir: Allaha küfr, Onun varlığı haqqında bilgisizlikdir.Allaha iman isə Onun varlığı haqqında bilgidir.Habelə insanlardan heç biri, Allah haqqında biglisizlik olmasa söz və görüş səbəbilə kafir olmur.Əgər insan söz yaxud fe`l səbəbilə Allaha asikar olarsa bu, Allahın və Peyğəmbərin sözünə yaxud müsəlmanların icmasına əsasən yalnız kafirdən sadir olacaq.Yaxud buna digər bir dəlil olacaq və insan kafir olacaq.Bu, onun sözü yaxud fe`li səbəbilə deyil sadəcə buna birləşik digər amil səbəbilə olacaq." Qadı İyad isə bu sözləri heç etiraz etmədən nəql edir.[459]

Onların küfr məsələsinə dair mövqeyi bu cür olduğu halda onlardan bu məsələyə, yəni əməlin tərk edilməsi məsələsinə dair hökm vermələrini tələb etmək nə dərəcədə doğrudur?

Artıq Qadı İyad bu görüşdən daha da uzağa gedərək söyüşün açıq-aydın təkzib etmə olacağı istisna (Allahı, dini v.s) söyməyin yalnız halal sayma ilə birgə küfr olduğunu qeyd etmişdir.Şeyxul-İslam (rahiməhullah) Qadı İyadın sözləri-

---

[458] əş-Şifə:2/506, Qadı İyad.Şərh: Mullə Əli əl-Qari.

[459] Öncəki mənbə:2/528.

ni nəql etdikdən sonra demişdir: "Bu həmçinin onun, söyüş açıq-aydın təkzib etmə olmayacağı zaman insanın onu halal sayması səbəbilə söyüşün küfr olacağını təsdiq etməsidir.

Bu məqamın açıqlanması gərəkdir.Habelə bilmək lazımdır ki, söyüş söyənin həmin məsələdə kafir olması yalnız söyüşün halal olması səbəbilədir sözü; yaramaz səhv və böyük yanlışlıqdır."[460]

Habelə Şeyxul-İslamın bu mövzuda ondan nəql etdiyi sözlərdən biri də budur: "Əgər birini tövbəyə dəvət etmədən öldürərsə onun mürtəd olduğunu hesab etməyəcək.Qətl isə yalnız şər`i cəza olaraq vacib olacaq.Bunu yalnız onda müşahidə olunanı inkar etməsi ilə yaxud etdiyindən əl çəkib tövbə etməsi ilə birgə deyir.Biz onu tövbə edəcəyi zaman zındığ tək qətl edəcəyik.

Dedi: Biz ona kafir hökmünü isbat etsək belə, onun iqrar etməsi və ondan müşahidə olunanı inkar etməsi yaxud etdiyi şeyin yalnız unutqanlıq və günah olaraq etdiyini və bundan əl çəkdiyini və etdiyindən peşman olduğunu iddia etməsi səbəbilə onun bu halına qəti əminlik ifadə etmirik.Dedi: Ancaq əgər biz onun söyüşün halal olduğunu etiqad etdiyini bilsək bununla onun küfründə heç bir şübhə olmayacaq.Habelə əgər onun söyüşü təkzib etmə yaxud təkfir etmə və bu kimi özlüyündə küfr olan şeylər olarsa bu, heç də müəmmalı olmayan məsələ olacaq.Habelə əgər biri tövbəni aşkar etməz və ondan müşahidə olunanı etiraf edib bunun üzərə israrla durarsa həmin şəxs sözü və Allahın yaxud Peyğəmbərin

[460] əs-Sarimul məslul:3/959.

toxunulmazlığına təcavüz etməsi ilə kafir olar.Bu bir daha onun, halal sayılacağı səbəbilə söyüşün küfr olacağını təsdiq etməsidir."[461]

Bir sözlə, Qadı İyad əşarilərin məzhəbi üzərə olub əməli şər`i imanın gerçəyindən çıxarır və küfrü təkzib etmə və halallaşdırma amillərinə bağlayır.Halı bu cür olan şəxsdən isə bu kimi məsələlər alınmaz.

[461] Artıq "əs-sarimul məslul" kitabının təhqiqçiləri (Muhamməd əl-Həlvani və Muhamməd Şudəri) sətir altında bu sözləri Qadı Əbu Yələyə aid etməkdə xətaya yol vermişlər.Bax: əs-Sarim:3/959.Əslində isə bu, Qadı İyadın sözləridir.Buna həmçinin cümlənin məzmunu dəlalət edir.Habelə bu sözlər, Qadı İyadın "əş-şifə" kitabında mövcuddur.Bax: əş-şifə məa-ş-şərh Mullə Əli əl-Qari:2/476.

## *On ikinci*: İbn Salahın sözlərindən dəlil gətirdikləri məqam və bunun izahı

Nəvəvi (rahiməhullah) demişdir: "Şeyx, imam Əbu Ömər bin Salah (rahiməhullah) demişdir: Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "İslam, Allahdan başqa (ibadətə haqqı olan) ilahın olmadığına və Muhammədin Allahın Elçisi olduğuna şahidlik etməyin, namaz qılmağın, zəkat verməyin, Ramazanı oruc tutmağın və imkanın olacağı təqdirdə (Kəbə) evinə həcc etməyindir.İman isə Allaha, Onun mələklərinə, kitablarına, peyğəmbərlərinə, axirət gününə və qədərin xeyiri və şərinə iman gətirməyindir." Dedi: Bu, imanın özəyinin bəyan edilməsidir.O isə, daxili təsdiqdir.Habelə islamın özəyinin bəyan edilməsidir.O isə, zahiri təslimiyyət və boyun əymədir.İslamın zahirdə olan hökmü iki şəhadət ilə sabit olur.Onun buna namazı, zəkatı, həcci və orucu əlavə etməsinə səbəb bu şeylərin İslamın ən üstün və əzəmətli şüarları olmasıdır.Bu işlərin yerinə yetirilməsilə onun təslimiyyəti tamamlanmış olur.Həmin şeylərin tərk edilməsi isə onun tabeçilik bağının açılmasını yaxud pozulmasını hiss etdirir.Habelə iman adı bu hədisdə İslamın izah edildiyi şeyləri və digər itaətləri, imanın özəyi olan daxili təsdiqin səmərəsi, gücləndirici amilləri, tamamlayıcı ünsürləri və onun qoruyucuları olduğu səbəbilə özündə cəm edir.Məhz bu səbəbdən, Peyğəmbər (salləllahu aleyhi və səlləm) Abdul-Qays

nömayəndə heyətinin hədisində imanı, iki şəhadət, namaz, Ramazan orucu və qənimətlərdən beşdə bir hissənin əta edilməsi kimi açıqlamışdır.İslam adı həmçinin imanın özəyi olan şeyləri özündə cəm edir.Bu isə daxili təsdiqdir.Habelə itaətlərin özəyini özündə cəm edir.Bütün bu şeylər təslimiyyətdir.Dedi: Bununla da, bizim qeyd etdiyimiz və tədqiq etdiyimizdən iman və islamın bir arada gəldiyi və fərqli olduğu və hər bir möminin müsəlman olması, hər bir müsəlmanın isə mömin olmaması nəticəsi çıxmışdır.Dedi: Bu, iman və islam mövzusuna dair, bu mövzuda danışanların çoxunun yanlışlıq etmələri davam etdiyi bir əsnada varid olan Quran və sunnənin müxtəlif nassları arasında cəm aparılmasında səmərəli bir tədqiqatdır.Bizim buna dair apardığımız araş-dırma hədis əhlindən olan cumhur alimlərinə və qeyrilərinə müvafiq gəlir.Bu, şeyx Əbu Ömər bin Salahın son söz-ləridir."[462]

***Buna iki yöndən cavab veriləcək:***

*Birinci*: İbn Salahın sözləri, bütövlüklə zahiri əməlin tərk edilməsi ilə birgə İslamın qalacağını və davam edəcəyini ifadə etmir.Onun sözləri haqqında ən uzağı onun dörd dayağı tərk edəni təkfir etmədiyi deyilə bilər.Bu bir məsələdir, bütövlüklə əməli tərk edənə müsəlman hökmü vermək isə digər məsələdir.

*İkinci*: Şeyxul-İslam ibn Salahın bu sözlərini nəql edib onu bir sıra yerlərdə tənqid etmişdir.Şeyxul-İslam

[462] Şərhu-n-nəvəvi aləl muslim:1/148.Şeyxul-İslam bunu "məcmu`əl-fətəva:1/148" nəql edib irəlidə qeyd ediləcəyi kimi həmin sözlərə əlavə etmişdir.

(rahiməhullah) demişdir: "O, dedi: Hədisdə imanın özəyi və islamın özəyi qeyd edilir." Ona irad tutula bilər ki, Peyğəmbər (salləllahu aleyhi və səlləm) iman və islam haqqında hədd və onun çərçivəsində olan cavab növündən olan bir şəkidə cavab vermişdir.Bu üzdən, onun qeyd etdiyi yalnız bu ikisinin özəyinə deyil həmçinin onların öz-özlüyündə hər ikisinə uyğun olur.İman, onun qeyd etdiyi ilə birgə həm zahirən həm də daxilən imandır.Lakin onun imandan qeyd etdikləri islamı şamil etmişdir.Habelə ihsan imanı şamil etmişdir."

Daha sonra Şeyxul-İslam demişdir: "Növbəti sözlərin sahibi demişdir: (Təslimiyyətin özəyi zahiri islamdır.) İslam, zahirdə və daxildə Allaha təslimiyyət və Ona boyun əymədir.Allahın razı qaldığı İslam dini budur.Quran və sunnənin nassları buna dəlalət edir.Daxildə təslimiyyət olmadan yalnız zahirdə İslama girən şəxs zahiri məqbul olan münafiqdir.Çünki insanların qəlblərinin yarılması əmr olunmayan işlərdəndir.Habelə İslam imanın özəyi olan daxili təsdiqi özündə cəm etdiyi zaman hər bir müsəlmanın mömin olması gərəkli olur.Bu isə, cumhurdan nəql edilənə müxalifdir.Lakin İslamda imanın özəyini ortaya gətirəcək təsdiqin olması labüddür.Əks halda insan buna görə savab qazanmayacaq.Belə olan halda insan müsəlman, mömin olur.Habelə mömin olmayan müsəlmanın və onun İslama girməsinin araşdırılması labüd olur."

Daha sonra demişdir: "Növbəti sözlərin sahibi demişdir: "İtaətlər daxili təsdiqin səmərəsidir. Bununla iki şey qəsd edilir.

İtaətlərin daxili təsdiqin zəruri amilləri olması və daxili iman olacağı zaman onun olmasının qəsd edilməsi.Bu, sələf və sunnə əhlinin məzhəbidir.

Habelə bu sözlə daxili imanın bəzi hallarda səbəb olacağının qəsd edilməsi.Bəzən itaətlər olmadığı halda daxili iman tam və kamil olur.Bu, cəhmilər və qeyrilərindən olan murciələrin sözüdür.Artıq biz qeyd etmişik ki, onlar üç yöndən yanlışlığa düşmüşlər."

Nəhayət demişdir: "Sonrakıların bir çoxu sələfin məzhəbi ilə murciə və cəhmilərin sözlərini ayırd edə bilmirlər.Buna səbəb iman məsələsinə dair daxilən cəhmilər və murciələrin görüşündə olan bir çoxlarının sözlərində bir sözü digəri ilə qarışıq salmalarıdır.Həmin şəxs sələfi və hədis əhlini yüksək tutur və düşünür ki, o onların sözlərini bir yerə toplayır yaxud özü kimilərin sözləri ilə sələfin sözləri arasında cəm edir."[463]

Dedim: İbn Salahın sözlərində olan bu məqam iki məsələni şamil edir: Dəqiqliyi ilə seçilməyən ifadələr.Haqqı və batili ehtimal edən sözlər.Bununla onun, itaətlərin daxili təsdiqin səmərəsi olmasına dair sözünü qəsd edirəm.Bu kimi sözdən ötrü sələfin icması necə tərk edilə bilər? Üstəlik

[463] Məcmu`əl-fətəva:7/361-364.

**bu sözlər müxalifə heç bir fayda vermir.Çünki orada onun istəyi açıq bildirilmir.**

## *On üçüncü*: Şeyxul-İslam ibn Teymiyyənin yanlış anladıqları sözləri və bunun izahı

Müxalif Şeyxul-İslamın sözlərindən yanlış anladığı bir neçə məqama etimad edib Şeyxul-İslamın bu məsələyə dair açıq-aydın sözlərini qulaq ardına vurmuşdur.Habelə müxalif etimad etdiyi sözləri qəsd olunmayan məcraya yönəltmişdir.

Artıq üçüncü bölümdə zahiri əməlin tərk edilməsi səəbəbilə təkfir hökmünün çıxarılması və "tələzum" qaydasının və onun çərçivəsinin bəyan edilməsi, zahiri "ləzim" olmayacağı zaman daxili "məlzum"un olmaması və belə olan halda qəlbdə imanın deyil küfr və zındıqlığın qalması haqqında onun bir sıra açıq-aydın sözləri qeyd edilmişdir. Habelə onun, səhabələrin namazı tərk edənin İslamdan çıxaran küfrə düşməsinə dair icmasını xəbər verib bu görüşü seçməsi qeyd olunmuşdur.Belə olan halda, onun bütövlüklə əməli tərk edəni təkfir etməməsini ona nisbət etmək nə dərəcədə doğrudur?

Lakin müxalif mütəşabih sözlərə meyl etməyə, nassları yarımçıq nəql etməyə və sözləri təhrif etməyə düşkündür. Məhz bu səbəbdən o, Şeyxul-İslamdan açıq-aydın və müfəssəl izah edilmiş onlarla yerdə gələn sözlərindən üz çevirib Şeyxul-İslamın onun iddia etdiyi yolda olduğunu

demək üçün ordan-burdan sözlər və hərflər qapmağa girişmişdir.

Heç şübhəsiz ki, bu, Şeyxul-İslamın mənhəci, elmi mirası və onun bu mövzuya dair seçdiyi görüşlərinə edilən böyük cinayətdir.

Şeyx Bəkr bin Abdullah Əbu Zeydin özlərini elmə və onun əhlinə nisbət edən, Şeyxul-İslama sevgi və sayğı nümayiş etdirən və onun sözlərindən istifadə edərək öz batillərini yaymaq istəyən insanların törətdiyi bu cinayət ətrafında çox dəyərli sözləri vardır.Həmin sözlərdən məqama münasib olan hissəni sizə təqdim edirəm.Şeyx demişdir: Əslində həqiqi cinayətkarlar, yaşadığımız əsirdə özlərini hədis və onun əhlinə nisbət etdiklərini nömayiş etdirib sunnə və onun müdafiəsinə səsləyən daha sonra batilin rəvac tapmasına şərait yaradan sətir-səhifə tələbələridir.Onlar insanları azdırmaq üçün Şeyxul-İslamın (rahiməhullah) sözlərini dəlil gətirirlər.Bununla da, onlardan biri, insanları aldadıb Əhli sunnə vəl cəmaatı zəlalətə sürükləmək və Şeyxul-İslamın vurğuladığı haqqdan onları döndərmək istəyir.Bu, zülmət dolu bir fitnə, Əhlu sunnə vəl cəmaatın cərgəsini parçalama, ədavət toxumunun atılması və onlar arasında ixtilaf salmaqdır.Fitnələr məhz belə olur. Allahdan salamatlıq diləyirik!

Onların bu işdə batilləri bir çox üslublarda öz əksini tapır:

1-Mütaşabihdən (mənası müəmmalı və qaranlıq olandan) yapışmaq və möhkəmi (açıq-aydın olanı) tərk etmək.

2-Yığcam yaxud bir neçə ehtimal daşıyan yaxud yanlış fikir yaradan ifadələri qapıb açıq-aydın sözlərdən üz çevirmək.

3-Bəzi ifadələrin mənalarına dair yanlış nəticəyə gəlmək.

4-Dəlil olaraq gətirilən sözün yalnız onunla aydın olan cümlədən çıxarılması.

5-Sözlərin əvvəlini yaxud ortasını yaxud sonunu çıxartmaq.

6-Bir kəlmənin digəri ilə əvəz edilməsi.

7-Nassın qəsd edilməyən mənaya aid edilməsi.

8-Hər hansı bir sözü, cümlənin dəlalət etmədiyi üç mənadan birinə daxil edilməsi: Dilçilik, şəriət və örf.

9-Onun bir yerdə sözləri yığcam olur.Lakin həmin sözlər digər yerdə ətraflı və geniş olur.O isə, ətraflı olanı tərk edib yığcamı götürür.

10-İmamın elan etdiyi və müdafiə etdiyi yeganə haqq olan məzhəbi tərk edib qaranlıq ifadələrə yaxud tərk olunmuş sözlərə meyl etməsi."[464]

Dedim: İrəlidə aydın olacaq ki, müxalif bu mövzuda Şeyxul-İslama cinayət etməkdə böyük pay sahibi olmuş və istəyinə çatmaq üçün bütün yuxarıda göstərilmiş batil üslublardan istifadə etmişdir.

---

[464] əl-Mədxəl ilə əsəri-ş-şeyxil-islam ibn teymiyyə va mə ləhiqahə min ə`məl:76-cı səh.

Məsələnin sirri ondan ibarətdir ki, müxalif Uca Allahın Şeyxul-İslama əta etdiyi böyük məqam və mərtəbə səbəbilə ona müxalifliyi açıq göstərməyə cürət göstərməmişdir.Bu səbəbdən, şübhələrin atılması, sözlərin bir-birinə vurulması və onun sözlərinə yaramaz yozumların verilməsinə çalışması üslubuna əl atmışdır.Müxaliflərdən demək olar ki, heç biri bu məsələdə və namazın tərk edilməsi məsələsində Şeyxul-İslama müxalif olduğunu, habelə haqqın dəlili ilə tanındığını və onun ictihadı sayısində görüş irəli sürdüyünü etiraf etməmişdir.Bu, həmin görüşün Şeyxul-İslamın və qeyrisinin xəbər verdiyi icmaya müxalif olması səbəbilə xəta olsaydı belə o, qəsdən edilən təhrif, azdırma, yalan və Şeyxul-İslamın batil məzhəbə nisbət edilməsindən daha xeyirli olardı.Çünki Şeyxul-İslam bu batil məzhəbi puç etmiş və onu dəfələrlə pisləmişdir.Əgər biri onun "əl-imənul əusat" kitabını oxuyarsa dediyim sözlərin doğru olduğunu anlayar. Çünki həmin kitabın çox hissəsi bu məsələnin qeyd edilməsi və bu məsələyə müxalif olanlara rəddiyə verməsindən ibarətdir.

Habelə müxalif, mütəşabih sözlərin olması fərz ediləcəyi halda belə elm əhlinin sözlərindən, mənası qaranlıq olana münasibətdə haqq olan üslubdan üz çevirmişdir.Həmin üslub, bir alimin sözlərini digər sözləri ilə açıqlamaq, mütləqi muqayyədə, ümumini isə xüsusiyə qaytarmaq, habelə onun ifadələrdə olan adətini və sözlərdə olan istəyini nəzərə almaqdır.Artıq Şeyxul-İslam (rahmətullahi aleyhi) özü bu üsluba diqqət çəkərək demişdir: "Hər hansı sözü dilə gətirən şəxsin sözlərini digər sözləri ilə izah etmək və onun sözlərini bir

neçə yerdən götürmək gərəkdir.Belə olan halda onun, danışdığı zaman ifadələrdə adət etdiyi üslubu və həmin söz ilə nəyi qəsd etdiyi bilinəcək.Habelə digər yerdə məhz həmin mənanı qəsd etməsi bilinən mənalar bilinəcək.Onun məna və ifadələrdə adəti və vərdişi bilinəcəyi zaman bu, həmin şəxsin məqsədini bilmək üçün sanki bir yardımçı olacaq. Ancaq əgər onun sözü onun adət etmədiyi mənada istifadə edilərsə və istifadədə adət etdiyi mənanın istifadəsi tərk edilərsə, üstəlik onun sözlərini ziddiyətli etmək və həmin sözləri ona münasib gələn digər sözlərə aid edilməsini tərk etməklə həmin sözlər, onun qəsdi olması bilinən mənaya zidd olan surətdə yozularsa bu, onun sözlərinin təhrif edilməsi, məqsədinin dəyişdirilməsi və adından deyilən yalan hesab ediləcək."[465]

Burada mən müxalifin Şeyxul-İslamdan bu məsələyə dair nəql etdiyi bir sıra sözləri təqdim edib onun məzhəbinin doğru olmasını, görüşünün açıq-aydın olmasını və sözlərinin qarışıqlıq və ziddiyətdən uzaq olmasını isbatlamaq üçün həmin sözləri cavablandırmağa çalışacam.

*Əsas məqsədə başlamamışdan öncə iki məsələni qeyd edirəm:*

*Birinci məsələ*: Şeyxul-İslam bədən əməlini tərk edənin təkfir ediləcəyinə dair görüşünü müxtəlif ifadələr və çoxsaylı sözlərlə qeyd etmişdir.Bu sözlərdən:

---

[465] əl-Cəvəbu-s-sahih:4/44.Habelə: Məcmu`əl-fətəva:7/36.

“İnsan bütövlüklə əməldən kənar qalacağı zaman mömin olmayacaq.”

“Allah üçün heç bir şey etməyən şəxs Allahın dininə boyun əyməmişdir.Dini olmayan isə kafirdir.”

“Bu məsələnin iki tərəfi vardır: Birinci: Zahiri küfrün isbatına dair.İkinci: Daxili küfrün isbatına dair.

Məsələnin ikinci tərəfi qeyd edildiyi kimi imanın söz və əməl olması məsələsi üzərində qurulur.Bir insanın, Allahın ona namazı, zəkatı, orucu və həcci vacib buyurduğuna dair qəlbində sabit imana sahib olub Allah üçün ömründə bir dəfə olsun səcdə etməməsi və Allahın zəkat və həcc kimi ibadətləri yerinə yetirməməsi ağılasığmazdır.Bu qeyri-mümkündür.Bu, doğru iman ilə deyil, yalnız qəlbdə olan zındığlıq və nifaq ilə baş verir.”

“İnsanın namaz, zəkat, oruc və başqa vaciblərdən olan zahiri vacibləri yerinə yetirməyəcəyi halda dili yaxud dili və qəlbi ilə Allaha və Elçisinə iman gətirməsi qeyri-mümkündür.”

“Lakin insan Muhamməd ə (salləllahu aleyhi və səlləm) xas olan vaciblərdən heç bir şeyi yerinə yetirməzsə, Allaha və Elçisinə iman gətirmiş olmaz.”

“Siz həmin əməllərin qəlb imanının zəruri amili olduğunu qəbul etdiniz.Belə olan halda onun yoxa çıxması qəlbdə imanın qalmayacağını ifadə edir.Məqsəd məhz budur.”

“Zahiri əməl daxili əməlin zəruri amili və ondan ayrılmazdır.Zahirin yoxluğu isə daxilin yoxluğuna dəlalət edir.”

“Əməl qəlbdə imanın olduğunu təsdiq edir.Əməl olmayacağı zaman isə bu, qəlbdə imanın olduğunu təkzib edəcək.Çünki qəlbdə olan zahiri əməli gərəkdirir.”Ləzim”in yoxluğu isə “məlzum”un yoxluğuna dəlalət edir.”

Habelə Şeyxul-İslamın digər açıq-aydın sözləri.Biz bu sözləri artıq araşdırmanın əsnasında qeyd etmişik.[466]

*İkinci məsələ*: Şeyxul-İslam namazı tərk edənin kafir olduğunu hesab edir və buna səhabələrin icmasını dəlil gətirir.Bu isə, Şeyxul-İslamın bütövlüklə bədən əməllərini tərk edəni təkfir etmədiyinə dair iddianın əsaslı olmasında müxalifin bütün səylərini puç edir.Çünki namazı tərk edəni təkfir edən şəxs heç şübhəsiz ki, bütün əməli tərk edənin kafir olacağını demiş olur.Bunu daimə xatırla, çünki bu çox önəmlidir.

## *Beləliklə müxalifin etimad etdiyi məqamlar və bunun ətraflı izahı:*

### <u>Birinci məqam:</u>

Şeyxul-İslam (rahiməhullah) demişdir: “Əgər biri imanın əvvəlinə sahib olarsa bu, ondan sahih olacaq.Çünki onunla birgə Peyğəmbərin vacib etdiyi şeylərin vacibliyinə və haram etdiyi şeylərin haramlığına daxildə iqrar vardır. Səhihliyin səbəbi budur.Onun kamilliyi isə, bununla əlaqəli

[466] Xüsusi olaraq üçüncü bölümün birinci və üçüncü fəsillərinə bax.

olan cənnət müjdəsi, yardım və atəşdən xilas olmadır.Çünki həmin müjdə vədi yalnız əmr olunanı edib qadağalardan çəkinən üçün gəlmişdir.Onun bəzisini edib bəzisini tərk edən şəxs isə etdiyinə görə mükafat, tərk etdiyinə görə isə cəza alacaq. Belə şəxs qınaq və cəzadan kənar qalıb tərif və mədh qazanan mömin adına daxil olmur."[467]

Dedim: Bu yeri bir sıra müxalif şəxslər dəlil olaraq qeyd etmişlər.Əslində isə burada heç bir vəchlə onlar üçün dəlil yoxdur.Bunu iki məsələ vasitəsilə izah edirik:

*Birinci*: Onun bu sözlərində bütövlüklə zahiri əməli tərk etməyin küfr olmaması yaxud bədən əməli olmadan təsdiq və boyun əymənin mümkün olması vurğulanmır.

*İkinci*: Müxalif cümlədən bu sözləri çıxartdığı zaman "يصح منه : ondan sahih olacaq", həmin sözlərdə gələn "şəxs əvəzliyi"ilə nəyin qəsd olunduğunu anlamamışdır.Habelə "səhihliyin səbəbi" sözləri ilə qəsd olunanı anlamamışdır. Nəyin səhihliyi?! Müxalif yanlış fikir yaradaraq qeyd etmişdir ki, burada məqsəd, imanın əvvəlində daxili iqrarın olması ilə imanın səhih olmasıdır.

Müxalifin dəfələrlə elm əhlindən nəql etməkdə etimad etdiyi bu məslək dönüklüyü ilə seçilir.

Əslində isə Şeyxul-İslam (rahiməhullah) kafirin, müsəlman kimi vacibi yerinə yetirmək və haramı tərk etmək xitabına daxil olduğunu qeyd etmişdir.Lakin əgər o, buyurulanı yerinə yetirərsə imana sahib olmadığı üçün bu, ondan səhih

[467] Məcmu`əl-fətəva:7/423.

olmayacaq.Habelə əgər münafiq buyurulanı yerinə yetirərsə daxildə vaciblərin vacib, haramların isə haram olduğunu daxildə iqrar etmədiyi üçün bu, ondan səhih olmaz.Müsəlman isə həm zahirdə həm də, daxildə fərqlidir və bu, yəni vacib ondan səhih olur.Çünki o, zahirdə müsəlman daxildə isə iqrar edən olduğu etibarı ilə səhihlik səbəbinə sahibdir. Ardından bu sözləri gəlmişdir: “Onun kamilliyi isə, bununla əlaqəli olan cənnət müjdəsidir”.Bu sözlərin “səhihliyin səbəbi” sözləri ilə heç bir bağlılığı yoxdur.O, sadəcə öncəki cümlə ilə bitişir.Həmin cümlə: “Onun əsası ilə əmr və qadağa xitabı bağlıdır”.Cümlədə imanın əsası bəyan edilir. Əmr və qadağa, habelə cənnət müjdəsi və zəfərin əlaqəli olduğu imanın kamilliyi imanın əsası ilə əlaqəlidir.Səhihlik məsələsinə gəldikdə isə, Şeyxul-İslam buna mövzudan kənar toxunub, sadəcə kafir və münafiqin vacibi yerinə yetirməsi ilə müsəlmanın vacibi yerinə yetirməsi arasında fərqi bəyan etmişdir.

Şeyxul-İslam (rahiməhullah) demişdir: “Həmçinin imanın əsası və kamilliyi, habelə zahiri və daxili vardır.Belə ki, qanların və malların qorunması, miras və dünyavi cəzalar kimi haqqlar və həddlər olan dünyavi əhkamlar ona birləşəcəyi zaman bu, onun zahiri ilə birləşəcək.Bundan qeyrisi isə mümkün deyil.Çünki bunun daxil ilə birləşdirilməsi qeyri-mümkündür.Əgər bunun baş verməsi fərz edilərsə yenə də bu, elm və qüdrət çərçivəsində mümkünsüz dərəcəsində olacaq.Bu, zahirdə sabit olacaq surətdə bilinmir. Habelə daxildə bu cür olması bilinən şəxsin cəzalandırılması mümkün deyil.”

Daha sonra demişdir: "Onun əsası: Əmr və qadağa xitabı onunla bağlı olur.Uca Allah buyurur: ***"Ey iman gətirənlər!** Namaza durduğunuz zaman..."*[468] Habelə buna bənzər ayələr. Bu, onu aşkar edən hər bir şəxs üçün zahirdə olan əmrdir. Habelə bu, asikar olarsa və daxili və zahiri vacibləri yerinə yetirməzsə belə özünün Peyğəmbəri təsdiq etdiyini bilən hər bir şəxsə daxildə olan bir xitabdır.Belə ki, əgər ***"ey iman gətirənlər"*** sözləri onları şamil edirsə əlavə söz deməyə lüzum yoxdur.Lakin əgər bu xitab onları şamil etmirsə bu, yalnız onların günahları səbəbilədir.Lakin onların günahları onlara yaxşı işlər etmək əmrinə mane olmur.Onlar həmin yaxşı işləri edəcəkləri təqdirdə bu, onların mərhəmət qazanmalarına səbəb olacaq.Onu tərk edəcəkləri təqdirdə isə ona əmr olunmaları və ondan ötrü cəzalanmaları imanın tərk edilməsi üzündən cəza olacaq.

Bu, kafirə həmçinin vacibdir[469] lakin o, iman gətirməyincə bu, ondan səhih olmur.[470] Xalis münafiq həmçinin belədir.O, iman gətirməyincə bu, daxildə ondan səhih olmur.

İmanın əvvəlinə sahib olan şəxsdən isə bu, səhih olur.[471] Çünki həmin şəxs Peyğəmbərin vacib etdiyinin vacib, haram

---

[468] əl-Maidə:6.

[469] Yəni, əmr və qadağada şəriət sahibinin xitabına boyun əymək.Bu məsələ, şəriətin şaxəli məsələlərinə dair kafirlərə ünvanlanan xitabdır.O isə, əsaslara qayıdan məlum bir məsələdir.

[470] Əgər o, misal üçün küfrü üzərində qaldığı halda həcc əmrinə boyun əysəydi bu, ondan səhih olmazdı.

[471] Yəni, məsələn onun həcc etməsi səhihdir.Çünki o, səhihlik səbəbinə sahibdir. Bu isə, onun vaciblərin vacibliyini və haramların haramlığını daxildə iqrar

etdiyinin haram olduğunu daxildə iqrar edir.Səhihliyin səbəbi məhz budur.

Onun kamilliyi isə,[472] bununla əlaqəli olan cənnət müjdəsi, zəfər və atəşdən xilas olmadır.Çünki həmin müjdə vədi yalnız əmr olunanı edib qadağalardan çəkinən üçün gəlmişdir.

Onun bəzisini edib bəzisini tərk edən şəxs isə etdiyinə görə mükafat, tərk etdiyinə görə isə cəza alacaq. Belə şəxs qınaq və cəzadan kənar qalıb tərif və mədh qazanan mömin adına daxil olmur."

Bir sözlə, Şeyxul-İslamın (rahiməhullah) sözlərindən anlaşılır ki, imanın əsası və kamilliyi vardır.

Onun əsası: Şəhadətin dilə gətirilməsidir.Şəhadəti gətirən hər bir şəxsə əmr və qadağa xitabı ünvanlanır.

Onun kamilliyi: Bütün vacib və müstəhəblərin edilməsi və bütün qadağa və məkruhların tərk edilməsidir.Məhz bunun nəticəsində cənnət müjdəsi, zəfər və cəhənnəmdən xilas olma hasil olur.

Əsas ilə kamillik arasında yalnız Allahın bildiyi dərəcələr vardır.Əgər biri bəzi vacibləri edir bəzisini tərk edərsə etdiyinə görə mükafat, tərk etdiyinə görə isə cəza alacaq.

---

etməsi ilə birgə İslama girməsidir.Münafiq isə, daxili iqrara sahib olmadığı üçün həcc edərsə bu, ondan səhih olmayacaq.

[472] Bu sözlər, müxalifin düşündüyü kimi səhihlik məsələsinə bağlı deyil "onun əsası" sözlərinə birləşik gəlmişdir.

Bununla da, aydın olur ki, həmin sözlər çəkişmə mövzusundan kənardır və müxalif üçün burada dəlil olacaq heç bir amil yoxdur.Yanlış fikirin ortaya qoyulması yalnız həmin sözləri yarımçıq nəql etmək və onu cümlənin məzmunundan ayırmaqla mümkün olmuşdur.Vallahul mustəan!

## İkinci məqam:

Şeyxul-İslam (rahiməhullah) demişdir: "İmanın şöbələri bəzən güclü olduğu zaman bir-birinə bağlı olur, zəif olduğu zaman isə bir-birinə bağlı olmur."[473]

Müxalif bu sözlərə əsaslanaraq iddia etmişdir ki, bədən əməlləri "ləzim" olsa da belə onun yoxluğu "məlzum"un yoxluğuna deyil zəifliyinə dəlalət edəcək.Çünki qəlb və bədən əməlləri güclü olduğu zaman bir-birinə bağlı, zəif olduğu zaman isə bir-birinə bağlı olmur.

***Buna bir neçə yöndən cavab veriləcək:***

***Birinci***: Artıq Şeyxul-İslamdan (rahmətullahi aleyhi) bir neçə yerdə onun zahiri əməlin daxili imanın zəruri amili (ləzim) olduğunu və "ləzim"in yoxluğunun "məlzum"un yoxluğuna dəlalət edəcəyini açıq bildirməsi nəql olunmuşdur.Üstəlik o, bunu fəqih murciələrlə, bunu qəbul edəcəkləri təqdirdə ixtilafın ləfzi olmasını demək üçün şərt qoymuşdur.

*İkinci*: Mütləq burada "imanın şöbələri" deyildiyi zaman Şeyxul-İslamın qəsdini bilmək vacibdir.Çünki bu sözləri dəlil gətirən şəxslərin hərəkəti, onun zahir və daxil yaxud dil

[473] Məcmu`əl-fətəva:7/522.

sözü və qəlb sözü və qəlb əməli və bədən əməli haqqında danışdığına dair yanlış fikir yaratmağa yönəlmişdir.

Bunu zənn edən və bunun nəticəsində bədən əməli olmadan qəlb əməlinin zəif olsa belə mövcud olacağını mümkün sayan şəxs açıq-aydın yanlışlığa düşmüşdür.

Bu yanlış fikirə yol açan səbəb müxalifin imamların sözlərini nəql etmə üslubudur.Bunun nəticəsində bəziləri düşünmüşlər ki, Şeyxul-İslam burada imanın dörd hissəsi haqqında danışır.

Əslində isə Şeyxul-İslam burada altmış və bir neçə yaxud yetmiş və bir neçə olan imanın şöbələri haqqında daha geniş və əhatəli mənada söz açır və onun imanın zəif halında bir-birinə bağlı olmadığını, üstəlik bəzən güclü olduğu halda bir-birinə bağlı olmadığını deyir.Bəzən iman söz və əməl olaraq həm zahirdə həm də, daxildə güclü olur.Daha sonra ayaq büdrüyür və yanlışlıq baş verir.Bu, irəlidə qeyd ediləcəyi kimi Hatıb və Sa`d bin Ubadənin başına gəlmişdir.

Onun söhbəti, müxalifin yanlış fikir yaratmaq istədiyi kimi bu dörd şey haqqında olmamışdır: Qəlb sözü, dil sözü, qəlb əməli və bədən əməli.

Bunun ətraflı izahı[474]: Şeyxul-İslam (rahiməhullah), bütün itaətlər imandandır və onun bəzisi gedəcəyi zaman imanın

---

[474] Təfsilata varmağa sövq edən amil, müxalifin imamların sözlərini nəql etmək, onların sözlərini yersiz gətirmək və həmin sözləri cümlədən ayırmaqda olan üslubunu bəyan etməkdir.Bununla da o, gerçəyin tam əksini aşılamaq istəyir. Bəzi insanlar isə digərinə təqlid və tabeçilik olaraq həmin üsluba etimad edir və bu cür tələyə düşürlər.

digər hissəsi həmçinin gedəcək deyən və böyük günah sahibinin imandan heç bir şeyə sahib olmayacağına hökm verən xəvariclər və mötəzililərə rəddiyə verib murciə və cəhmilərin həmçinin bu əsasa etimad etdiklərini bəyan etmişdir[475]: İman bir şeydir.Onun bir qismi gedəcəyi zaman o, bütövlüklə gedəcək.Onlar böyük günaha görə təkfir etməkdən çəkinmək səbəbilə əməli ondan çıxartmışlar.

Şeyxul-İslam onların bütün şübhələrinin növbəti sözlərdə cəmləşdiyini qeyd etmişdir: "Mürəkkəb gerçək bəzi hissələrinin yoxa çıxması ilə yoxa çıxır.On sayı buna misaldır.Belə ki, o, yox olacağı zaman artıq on olaraq qalmayacaq, bal və sirkə turşusu qatqısından düzəlmiş içki kimi mürəkkəb maddələr həmçinin belədir. Onun bir hissəsi yoxa çıxacağı zaman o, həmin içki olması mahiyyətindən çıxacaq."

Daha sonra o, onların şübhəsinə cavabı iki tərəfli etmişdir:

"Birinci tərəf: İmanın şöbələri olmadığı zamanı bir-birinə bağlı olurmu?

İkinci tərəf: Sabit olduğu zaman onlar bir-birinə bağlı olurmu?"

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Birinci: Məsələləri cəm edən gerçəyin, istər o, fərdlərdə yaxud ərəzlərdə olsun həmin məsələlərdən bəzisi yoxa çıxacağı zaman bəzən digər hissəsidə yoxa çıxacaq bəzən isə yoxa çıxmayacaq.Bir arada

[475] Məcmu`əl-fətəva:7/510.

olan məsələlərin, istər onlar mürəkkəb yaxud birləşik yaxud digər bir şey olsun bəzisinin yoxluğu digərinin yoxluğunu gərəkdirmir.Bəzi hissələrin yoxluğu digər hissələrin yoxluğunu gərəkdirmir.

On sayı, habelə bal və sirkə turşusu qatqısından düzəlmiş içkiyə dair gətirdikləri misallar buna uyğun gəlir.Çünki on sayından biri olmayacağı zaman doqquzun yoxa çıxması heç də gərəkli olmayacaq.Çünki bəzən doqquz sayı qalır. Mürəkkəbin bir hissəsi gedəcəyi zaman həmçinin digər hissənin getməsi gərəkli olmayacaq. Lakin onların ən çox dediyi sözlər: Cəm halında olan surət getdiyi zaman cəm halında olan heyət gedəcək.Bu  zaman on sayı və adı çəkilən içki yoxa çıxdığı kimi həmin cəmləşmə və tərkib nəticəsində həmin ada layiq görülən heyət yoxa çıxacaq.

Deyiləcək: Bu, cəm halında olan mürəkkəbin öz tərkibində qalmasına dair ağıl sahibinin ümumiyyətlə çəkişmə aparmadığı məsələdir.Ağıl sahibi iman yaxud namaz yaxud həcc yaxud məsələlərdən ibarət olan digər ibadətlərin bəzisinin olmayacağı zaman həmin cəm halında olan mürəkkəbdən bəzisinin yoxa çıxmamışdan öncə olduğu kimi qalacağını iddia etməz.Habelə heç kəs demir: Ağac yaxud evin bir qismi yoxa çıxacağı zaman o, olduğu kimi dolğun surətdə qalacaq.Həmçinin insan və digər canlının bəzi əzaları itəcəyi zaman dolğun qalacaq.Habelə Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: “Hər uşaq fitrət üzərə doğulur.Daha sonra onun valideynləri onu yəhudiyə yaxud nəsraniyə yaxud məcusiyə çevirirlər.Bir heyvanın övladını

sağlam olaraq düynaya gətirməsi buna bənzərdir.Onun nöqsanlı olduğunu görə bilərsinizmi?".[476] Xilqəti salamat olan nöqsana uğradıqdan sonra artıq salamat qalmır.Lakin bu, onun digər hissələrinin yoxa çıxmasını gərəkdirmir."[477]

Daha sonra demişdir: "Adın getməsinə dair onlara deyiləcək: İmanın hissə və şöbələrdən ibarət olduğu fərz ediləcəyi təqdirdə bu, ilk olaraq ləfzi araşdırma olacaq. Peyğəmbərin səhih hədisdə dediyi kimi: "İman yetmiş və bir neçə şöbədən ibarətdir.Onun ən uca olanı "lə iləhə illəllah" kəlməsi, ən aşağı olanı isə yoldan əziyyət verən şeylərin kənar edilməsidir.Həya həmçinin imandan bir şöbədir." Habelə namaz və həccin hissələri və şöbələri vardır.Həccin və namazın bəzi hissələrinin itməsilə digər hissələrin itməsi gərəkli olmadığı kimi həmçinin onun şöbələrindən birinin getməsi digər hissə və şöbələrin getməsini gərəkdirmir.Belə ki, onların, mürəkkəbin bir qisminin getməsilə digər qismin gedəcəyini iddia etmələri doğru deyil.Biz onun bütövlüklə deyil bir hissəsinin qalacağını və dolğun formanın olduğu kimi qalmayacağını qəbul edirik."

Daha sonra mürəkkəblərin iki şəkildə olduğunu bəyan etmişdir: Birinci: On sayı və bal və sirkə turşusu qatqısından düzəlmiş içki kimi tərkibin, adın istifadəsi üçün şərt olması. İkinci: Bu tərzdə olmayan və dəniz, çay, şəhər, qəsəbə və məscid kimi hissələrinin bir qisminin getməsilə adın sabit

[476] Buxari:1358.Muslim:258.Hədisi Əbu Hureyra (r.a) rəvayət etmişdir.
[477] Məcmu`əl-fətəva:7/514.

qalması.Onun bir çox hissələri azalır ancaq ad sabit olaraq qalır.

Habelə növbəti sözlər: İbadət, itaət, xeyir, yaxşılıq, ihsən, sədəqə, elm, Quran, söz, kəlam, məntiq, canlı və bitkilərin adları.Məsələn ağac sözü onun bütöv surətinə deyilir.Ondan bir hissə qırıldıqda isə ad sabit olaraq qalır.

Nəhayət demişdir: "Mürəkkəb şeylər iki növ olduğu və əsasən bu növ olduğu zaman onların növbəti sözləri doğru olmamışdır: Adın yerdə qalan hissə ilə birgə qalması imkanı olduğu təqdirdə onun bir hissəsi gedəcəyi zaman adın getməsi gərəkli olacaq.Məlumdur ki, iman adı bu qəbildəndir.Çünki Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "İman yetmiş və bir neçə şöbədən ibarətdir.Onun ən uca olanı "lə iləhə illəllah" kəlməsi, ən aşağı olanı isə yoldan əziyyət verən şeylərin kənar edilməsidir.Həya həmçinin imandan bir şöbədir." Məlumdur ki, yoldan əziyyət verən şeylərin kənar edilməsi v.s şeylər olmayacağı zaman iman adı itməyəcək.

Buxari və Muslimdə gələn səhih hədisdə Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Qəlbində buğda dənəsi çəkisində imanı olan cəhənnəmdən çıxacaq."[478] Onun hissələrə bölündüyünü və onun bir qisminin qalacağını və bunun imandan olacağını xəbər vermişdir.Məlum olmuşdur ki, imanın bir qismi itir digər qismi isə qalır.Bu isə onların yaramaz əsaslarını puç edib iman adının Quran, namaz, həcc v.s adlar mislində olduğunu bəyan edir.

[478] Yuxarıda qeyd olunub.

Həcc və ona bənzər şeylərdə hissələr vardır.Onun itməsilə həcc batil olmur və sadəcə vacib kamiliyini itirir.Məsələn daş atma, Minada gecələmə və sayira şeylər.Bu şeylərdə, olmayacağı təqdirdə onun müstəhəb kamilliyini azaldacaq hissələr vardır.Məsələn: Məqama münasib zikr edildiyi zaman səsin yüksəldilməsi, birinci təvafda sürətli yürümə və "əl-idtıbə`: insanın həccdə taxdığı libas tərzi."Namaz həmçinin belədir..."[479]

Bu uzun nəqldən Şeyxul-İslamın əhatəli və geniş anlamda imanın şöbələri haqqında danışdığı və yoxluqda onun bir-birinə bağlı olmadığını bəyan etməsi bəlli olur. Belə ki, yoldan əziyyət verən şeylərin kənar edilməsi hasil olmayacağı zaman iman adı və onun gerçəyi getməyəcək.

Daha sonra Şeyxul-İslam ikinci tərəfə dair söhbətə keçmişdir: İmanın şöbələri sabit olduğu zaman bir-birinə bağlı olurmu, yəni bəzi şöbələrin olması digər şöbələrin olmasını gərəkli edirmi?

Şeyxul-İslam (rahiməhullah) demişdir: "İkinci əsas: İmanın şöbələri bəzən güclü olduğu zaman bir-birinə bağlı, zəif olduğu zaman isə bir-birinə bağlı olmur.Qəlbdə təsdiq, bilgi, Allaha və Elçisinə sevgi kimi amillər güclü olacağı zaman bu, Allahın düşmənlərinə nifrət etməyi vacib edəcək. Uca Allah buyurur: *"Əgər onlar Allaha, Peyğəmbərə və ona nazil olana iman gətirsəydilər, müşrikləri özlərinə dost tutmazdılar."*[480] Habelə buyurur: *"Allaha və axirət gününə*

---

[479] Məcmu`əl-fətəva:7/517.

[480] əl-Maidə:81.

*inanan heç bir tayfanın Allah və Onun Peyğəmbəri əleyhinə çıxanlarla -öz ataları, oğulları, qardaşları, yaxın qohumları olsalar belə -dostluq etdiyini görməzsən. Onlar elə kimsələrdir ki, Allah onların qəlblərinə iman yazmış və Öz dərgahından onlara ruh vermişdir."*[481] Bəzən bir insan qohumluq yaxud ehtiyac səbəbilə onları sevir və bu, onun imanını azaldan günah olur.Lakin insan bununla kafir olmur.Hatıb bin Əbu Bəltəanın başına gələn hadisə məhz bu cür olmuşdur.Belə ki, o, Peyğəmbərin bəzi xəbərlərini müşriklərə yazdığı zaman Uca Allah bu ayələri nazil etmişdir: *"Ey iman gətirənlər! Nə mənim düşmənimi, nə də özünüzün düşmənini dost tutun! Onlar sizə gələn haqqı inkar etdikləri halda, siz onlarla sevgi nümayiş etdirirsiniz."*[482] Habelə Sa`d bin Ubədənin başına gəlmişdir.Belə ki, o, böhtan əhvalatında ibn Ubeyyin tərəfini tutub Sa`d bin Muaza demişdir: Vallahi yalan dedin! Onu öldürməyəcəksən və onu heç öldürə bilməzsən.Aişə dedi: Bundan öncə o, saleh bir kişi idi lakin təəssübkeşlik onu bunu etməyə sürükləmişdir."[483]

Şeyxul-İslam, güclü olduğu halda bədən əməlinin digər dayağlarla birgə mövcud olacağını, zəif olduğu halda isə bəzən üç dayağın mövcud bütövlüklə bədən əməlinin mövcud olmayacağını deməmişdir.

Bu, müxalifin isbat etməyə çalışdığı məsələdir.Əslində isə bu anlayış tərzinin Şeyxul-İslamın sözləri ilə heç bir əlaqəsi yoxdur.

---

[481] əl-Mucadilə:22.
[482] əl-Mumtəhinə:1.
[483] Məcmu`əl-fətəva:7/522.

Onun sözləri haqqında düşün: “Bəzən imanın şöbələri güclü olduğu zaman bir-birinə bağlı olur.”

Əgər söhbət “öncəki dörd dayaq” haqqında olsaydı onun “bəzən” sözü yersiz və mənasız olardı.Çünki güclü olduğu zaman dil sözünün, təsdiqin, qəlb əməlinin və Allahın istədiyi bədən əməllərinin olması labüd olacaq.

Məsələ az öncə açıqladığım tərzdədir.Yəni, Şeyxul-İslam (rahiməhullah) burada yetmiş və bir neçə olan imanın ümumi şöbələri haqqında söhbət edir.

Onun çəkdiyi misal haqqında bir düşün.Belə ki, o, bədən əməlinin, onun bir qismi yaxud bütövlüklə getməsi haqqında, habelə qəlb əməlinin getməsi haqqında danışmır.

O, yalnız zəiflik halında imanın şöbələrinin bir-birinə bağlılığının sabit olmadığını bəyan etmişdir.Habelə bəzən bu, güclü olduğu zaman bir-birinə bağlı olmur.Çünki bəzən Allahın düşmənlərinə nifrətlə birgə təsdiq, Allaha və Peyğəmbərə sevgi olur lakin həmin nifrət, qohumluq yaxud digər səbəbdən ötrü rəğbətlə birləşik gəlib nöqsanlı olur.

*Üçüncü*: Əgər biz onların “imanın şöbələri” sözünə dair anladığını və burada məqsədin dörd dayağ olduğunu qəbul etsək, yenə də onlara deyəcəyik: Görəsən burada xüsusi olaraq bədən əməllərinə qarşı olan həmləyə səbəb nədir?!

Məgər doğru tərəf, növbəti sözləri deyənin mövqeyidir: Zəiflik zamanı bəzən qəlb əməli mövcud olmur və insan təsdiq və dil sözü ilə xilas olur?!

Yoxsa bu sözləri deyənin mövqeyi: Bəzən iman dil sözünü aşkara çıxartmayacaq dərəcədə zəifləyir, ancaq bununla birgə qəlbdə iman qərar tutur?!

Əslində hamının hüccəti: İmanın şöbələrinin bəzən güclü olduğu zaman bir-birinə bağlı olması, zəiflik zamanı isə bir-birinə bağlı olmamasıdır.

*Dördüncü*: Müxalif bu fəsildə zahir ilə daxil arasında olan bağlılıq "tələzum" məsələsini və əməli tərk edənin hökmünü isbat edən açıq-aydın sözləri qulaq ardına vurmuşdur. Bu sözlərdən birində Şeyxul-İslam (rahiməhullah) demişdir: "Qəti iradənin qüdrətlə birgə, baxış yaxud başın hərəkəti yaxud kəlmə yaxud addım yaxud bədənin hərəkəti olarsa belə qüdrət çərçivəsində olanın edilməsi ilə birləşik olması labüddür."[484]

Habelə demişdir: "İmanda iki əsasın olması labüd olur: Haqqın təsdiqi və ona olan sevgi.Biri sözün əsası, digəri isə əməlin əsasıdır.Habelə qüdrətlə birgə tam sevgi zahiri söz və zahiri əməl ilə bədənin hərəkətini zəruri şəkildə gərəkdirir."[485]

Habelə demişdir: "Qəlbdə Onun təsdiqi və Ona olan sevgi yer alacağı zaman zəruri şəkildə bunu gərəkdirən zahiri sözlər və zahiri əməllərdən olan bədən hərəkətinin olması lazım olacaq."[486]

---

[484] Məcmu`əl-fətəva:7/527.
[485] Məcmu`əl-fətəva:7/540.
[486] Öncəki mənbə:7/541.

Sahibinin dəfələrlə vurğuladığı və mənasında yekdillik olan açıq-aydın sözlərin necə tərk olunub daha sonra sətirlər arasından çıxarılan bir qism sözlərə etimad göstərilməsinə və bunun "tələzum" məsələsinə dair dediyi bütün sözlər üçün qayda edilməsinə və qəsd edilən "tələzum"un yalnız güclü olduğu zaman olacaq deyilməsinə bir diqqət yetir! Bu necə üslubdür? Bu cür saxta alimlikdən yalnız hasil olacaq xələl, şər və zərəri gözləmək olar.

Şeyxul-İslam harada demişdir ki, tələzum güclü olduğu zaman olur.Əslində bu, müxalifin sözləri ixtisara salıb təhrif etməsidir.Şeyxin ifadəsi belədir: "Bəzən imanın şöbələri güclü olduğu zaman bir-birinə bağlı olur." Bu isə, əksər hallarda əsasın bir-birinə bağlı olmadığını ifadə edir. Müxalifin təhrifinə əsasən əldə olunan nəticə dörd dayağın zəiflik zamanı, habelə güc zamanı bir-birinə bağlı olmamasıdır.Lakin bəzən o, həmin vaxtda bir-birinə bağlı olur.

## Üçüncü məqam:

Şeyxul-İslam (rahiməhullah) demişdir: "İmanın özəyi qəlbdədir.O, qəlbin sözü və əməlidir.Habelə o, təsdiq, sevgi və tabeçiliklə olan iqrardır.Qəlbdə olanın gərəkli ünsürünün və tələbinin bədən əzalarında aşkara çıxması labüddür.İnsan bunun gərəkli ünsürünə və tələbinə uyğun əməl etməyəcəyi zaman (bu), onun yoxluğuna yaxud zəifliyinə dəlalət edəcək.

Məhz bu səbəbdən, zahiri əməllər qəlb imanının gərəkli ünsürü və tələbi olmuşdur.O, qəlbdə olanın təsdiqi, dəlili və şahidirir.Habelə o, mütləq imanın yığımından bir şöbə və

onun bir qismidir.Lakin qəlbdə olan, bədən əzaları üçün özəydir.Əbu Hureyra (r.a) bu xüsusda demişdir: "Qəlb hökmdar, əzalar isə onun ordusudur.Hökmdan xoş olacağı zaman onun ordusu həmçinin xoş olacaq.Hökmdan narahat olacağı zaman ordu həmçinin narahat olacaq.

Buxari və Muslimdə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) belə deməsi rəvayət edilir: Həqiqətən də, bədəndə bir ət parçası vardır ki, o düzələcəyi zaman bütün bədən düzələcək.Fəsada uğrayacağı zaman isə bütün bədən fəsada uğrayacaq.Agah olun ki, o, qəlbdir!".[487]

Müxalif növbəti sözlərə etimad etmişdir: "İnsan bunun gərəkli ünsürünə və tələbinə uyğun əməl etməyəcəyi zaman (bu), onun yoxluğuna yaxud zəifliyinə dəlalət edəcək." Habelə: "Habelə o, mütləq imanın yığımından bir şöbə və onun bir qismidir." Müxalif həmin sözlərə şərh verib demişdir: "İtaətlər və asiliklər olan zahiri əməllər varlığı və yoxluğu etibarı ilə imanın mütləqi (özəyi) ilə deyil mütləq imanla (kamil imanla) əlaqəlidir.Buna fikir ver!" Habelə demişdir: "İmanın kamilliyi olan mütləq imanın yoxluğu onun özəyi olan imanın mütləqinin yoxluğunu gərəkdirmir.Şeyxul-İslam bunu bir neçə yerdə qeyd etmişdir."

Müxalif demişdir: "Bu, Əhli sunnənin ən önəmli əsasıdır.Bu əsas onları iman məsələsində azmış və haqq yoldan çıxmış murciələrdən ayırmışdır.Habelə bu, söz və əməl olaraq zahir ilə təsdiq və itaət olaraq daxil arasında olan bağlılığın gerçəyidir.Habelə onlar bunların sözlərini həqiqət

---

[487] Məcmu`əl-fətəva:7/644.

və ləfz olaraq kənara atmışlar.Lakin bəzilərinin növləri ilə, habelə güc və zəiflik, varlıq və yoxluq etibarı ilə imanın şöbələri arasında olan "tələzum" qaydasının gerçəyinə dair bilgisizliyi və bunu qavramaması onları bu incə məsələdə qarışıqlıq və çaşqınlığa, habelə dəqiqliyə yaxud onun üzərinə qurulanı bilməyə müvəffəq olmamağa gətirib çıxarmışdır!!".

Habelə demişdir: "Bu, hər bir şaxə və başlığı özünə qaytaran həlledici sözdür.Həmin sözlərə diqqət ayırmaq, dəqiq yanaşmaq və onu anlamaq vacibdir." Bitdi.

***Buna bir neçə yöndən cavab veriləcək:***

***Birinci***: Bu, müxalifin Şeyxul-İslamın açıq-aydın sözlərini tərk edib bu kimi ifadələrdən yapışdığına dair az öncə qeyd etdiyimi təsdiq edir.Üstəlik o, iddia edir ki, "bu, hər bir şaxə və başlığı özünə qaytaran həlledici sözdür." Şeyxul-İslamdan, onun bütün zahiri vacibləri tərk etmənin küfr olduğunu vurğulaması və belə olan halda qəlbdə imanın qalmayacağına əminlik ifadə etməsinə, habelə bunun tərk edilməsinin səhih iman ilə deyil qəlbdə olan nifaq və zındığlıqla olacağına dair yuxarıda nəql olunan açıq-aydın sözlər necə olsun?!

*İkinci*: Müxalifin dəfələrlə bu sözləri dəlil gətirməsinə rəğmən o, Şeyxul-İslamın "yoxluğuna dəlalət edəcək" sözlərinə cavab vermək cəhdi göstərməmişdir.

O, sadəcə: "Habelə o, mütləq imanın yığımından bir şöbə və onun bir qismidir.",-sözlərinə bel bağlayıb qeyd

etmişdir ki, “imanın kamilliyi olan mütləq imanın yoxluğu onun özəyi olan imanın mütləqinin yoxluğunu gərəkdirmir.”

Bu isə, əməlin tərk edilməsinin qəlbdə olan imanın yoxluğuna dəlalət edəcək halın olmayacağını ifadə edir.

Bir bax həmin şəxs necə bu sözləri həlledici edir daha sonra onun bir qisminə iman edib bir qismini buraxır.

*Üçüncü*: Bilmək lazımdır ki, daxili imanın gərəkli ünsürü və tələbi dil sözü və bədən əməlidir. Müxalif isə bunu sezməmişdir.İnsan bu gərəkli ünsürə uyğun əməl etməyəcəyi zaman daxili özəyin yoxluğuna yaxud zəifliyinə dəlalət edəcək.Bunun bir neçə forması vardır:

Birinci: Zahiri söz və zahiri əməlin birlikdə olmaması. Əhli sunnəyə görə bunun küfr olmasında heç bir şübhə yoxdur və bu məsələdə yalnız Cəhm və ona müvafiq gələnlər müxalif olmuşlar.Belə olan halda deyiləcək: Zahiri gərəkliyin yoxluğu daxili imanın olmadığına dəlalət edir.Yəni, bəyan edildiyi kimi qəlb əməlinin və hesaba alınan, faydalı təsdiqin yoxluğuna dəlalət edəcək.

İkinci: Dil sözünün olması ilə birgə bədən əməlinin yoxluğu.Bu, müxalif ilə olan çakişmə mövzusudur.Artıq Əhli sunnənin bu halda imanın yetərli olmayacağına dair icması qeyd edilmişdir.

Şeyxul-İslam (rahiməhullah) bir sıra yerlərdə söz olmayacağı zaman imanın olmayacağını, digər yerlədə isə zahiri əməl və zahiri vaciblər olmayacağı zaman imanın olmaya-

cağını açıq bildirir.O, buna namaz, zəkat və oruc kimi əməlləri misal çəkib qəlbdə yaxud qəlb və dildə imanın yer alması ilə birgə həmin vaciblərin tərk edilməsini qeyri-mümkün bir iş sayır.[488] Zahiri sözün tərk edilməsi küfr olduğu kimi həmçinin bu, açıq-aydın zahiri əməli tərk etməyin küfr olduğunu göstərir.

Üçüncü: Bəzi əməllərdə səhlənkarlığın baş verməsi.Belə bir şəxs haqqında onun imanın gərəkli ünsürü və tələbinə uyğun əməl etmədiyini, yəni kamil və dolğun surətdə əməl etmədiyini demək doğru olardı.Bu zaman, qəlbdə imanın zəif olacağına dəlalət edəcək.

Bu yanaşmanın yekunu olaraq deyiləcək ki, Şeyxul-İslamın sözləri iki halın mövcudluğunu ifadə edir:

1-Qəlb imanı olmayacağı hal.Bu, zahiri söz və zahiri əməlin birlikdə olmayacağı zaman baş verir.Habelə fərdi olaraq bütövlüklə zahiri əməlin yoxluğu zaman baş verir.

2-Qəlb imanı zəif olacağı hal.Bu, bəzi əməllərin tərk edilməsi ilə baş verir.

Əməlin şəninə dair buna bənzər açıqlama gətirən ibnul-Qayyim (rahmətullahi aleyhi) demişdir: "Acizlik yaxud məcburiy-yət və həlak olma qorxusu kimi amillərə görə mümkünsüz olacağı istisna zahirsiz daxil yetərli olmur.Heç bir əngəl olmayacağı zaman zahirdə əməlin yoxluğu daxilin fəsada

---

[488] Əqli sübhələrdən altıncı şübhəyə verilən cavaba bax.

uğramasına və imandan kənar qalmasına dəlildir.Onun naqisli olması naqisliyinə, güclü olması isə gücünə dəlildir."[489]

Dördüncü: Müxalif demişdir: "İtaətlər və asiliklər olan zahiri əməllər varlığı və yoxluğu etibarı ilə imanın mütləqi (özəyi) ilə deyil mütləq imanla (kamil imanla) əlaqəlidir. Buna fikir ver!"

Bu, açıq-aydın yanlışlıqdır.Müxalif bunu Şeyxul-İslamın növbəti sözləri üzərində qurmuşdur: "Habelə o, mütləq imanın yığımından bir şöbə və onun bir qismidir."

Doğrusu müxalif Şeyxul-İslamın sözlərini anlamamışdır.Çünki dil sözü həmçinin mütləq imanın yığımından bir şöbə və onun bir qismidir!! İmanın şöbələrinə dair hədisdə məhz bu cür gəlmişdir.

"Təsdiq" və "qəlb əməli"nə dair həmçinin belə deyiləcək.Onların hər ikisi mütləq imanın şöbələrindəndir.Bunu anla!

Beşinci: Müxalif zahirlə daxil arasında olan bağlılığın Əhli sunnəni murciələrdən ayıran ən önəmli əsas olduğunu demişdir.Habelə demişdir: "Lakin bəzilərinin növləri ilə, habelə güc və zəiflik, varlıq və yoxluq etibarı ilə imanın şöbələri arasında olan "tələzum" qaydasının gerçəyinə dair bilgisizliyi və bunu qavramaması onları bu incə məsələdə qarışıqlıq və çaşqınlığa, habelə dəqiqliyə yaxud onun üzərinə qurulanı bilməyə müvəffəq olmamağa gətirib çıxarmışdır!!".

---

[489] əl-Fəvaid:85.

Doğrudur! Lakin "lə iləhə illəllah" deyib ömür boyu Allaha bir səcdə etməyən, vacib və nafilə ibadətlərdən heç birini yerinə yetirməyənə müsəlman hökmü verən və belə halda təsdiq, boyun əymə və sevginin olmasını təsəvvür edən şəxsin halı onun tələzum qaydasından nə qədər uzaq olduğunu göstərir.Əslində onun sözünün gerçəyi əməlin daxili imanın zəruri amili deyil səmərəsi olmasıdır.Bu isə, murciələrin dediyi sözün məhz özüdür.

## Dördüncü məqam:

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Habelə o, Quranda iki mənada gəlmişdir: Özəy və vacib şaxə.Qəlbdə olan özəy əməldən öndədir.Məhz bu səbəbdən onların arasında fərq qoymuşdur: *"İman gətirib yaxşı işlər görənlər".*[490] Habelə onları birləşdirən *"möminlər yalnız"* və *"iman gətirənlər səndən izn istəməsinlər"* [491], habelə "həya" hədisi və abdul-Qays nümayəndə heyətinin hədisidir.

O, özəydən ibarətdir və o, onsuz tamamlanmır.[492] Habelə vacibdən ibarətdir və o, onun naqis olması ilə azalır və onun sahibi cəzaya layiq olur.Habelə müstəhəbdən ibarətdir və onun əldən çıxması ilə dərəcənin yüksəkliyi əldən verilmiş olur.İnsanlar bu məsələdə üç qismdir: Özünə zülm edən, orta yol tutan və yaxşı işlərdə öndə gedən.Həcc, bədən, məscid və digər fərdlər, əməllər və sifətlər buna misaldır.

---

[490] "əl-Əsr" və bir çox digər surələr.

[491] ət-Təubə:44.

[492] Burada "tamamlıq" səhihlik mənasında işlənir.Bu, Şeyxul-İslamın əksər sözlərində olan adətidir.Müxalif isə bu yeri dəlil gətirir lakin buna diqqət yetirmir.

Əgər onun hissələrindən bir qismi itərsə daha kamil olan-dan naqis olar.Onlardan bəzisi isə kamilliyi itirməklə aza-lır.Bu isə, vaciblərin tərk edilməsi yaxud haramların işlədilməsidir. Ondan bəzisi isə dayağın nöqsanıdır.Bu isə, murciə və cəhmilərin onun sadəcə anlam olduğunu iddia etdikləri etiqadın və sözün tərk edilməsidir.Bununla da, firqələrin şübhələri aradan qalxır.Onun özəyi qəlb, kamilliyi isə zahiri əməldir.İslam isə fərqlidir.Çünki onun özəyi zahir, kamilliyi isə qəlbdir."[493]

***Buna üç yöndən cavab veriləcək:***

***Birinci***: Zahiri əməlin şaxə adlandırılıb, qəlbdə olanın özəy edilməsi müəmmalı məsələ deyil.Çünki qeyd edildiyi kimi o, olmayacağı təqdirdə daxili imanı heçə endirən zəruri bir şaxədir.Şeyxul-İslam bu yerdə dil sözünə toxunmur və onun özəydən yaxud şaxədən olduğunu söyləmir.O, sadəcə deyir: "Habelə o, Quranda iki mənada gəlmişdir: Özəy və vacib şaxə.Qəlbdə olan özəy əməlin önündədir." Üstün görüş, Şeyxul-İslamın dil sözünü şaxə etməsidir.Belə ki, bu onun bir çox yerlərdə olan adətidir.Baxmayaraq ki, irəlidə qeyd ediləcəyi kimi Şeyxul-İslam sözünün sonunda onu dayaq adlandırır.

*İkinci*: Şeyxul-İslam imanı üç hissə etmişdir:

**Daha kamil olana nisbətdə naqis olan hissə.Burada müstəhəblər qəsd edilir.**

---

[493] Məcmu`əl-fətəva:7/637.Bu yer isə, nə "əl-imənul kəbir" nə də ki, "əl-imənul əusat" kitabında deyil.O, sadəcə bu iki kitaba əlavə olan kiçik bir risalədədir.

Kamil olana nisbətdə naqis olan hissə.Bu, vabirlərin tərk edilməsi və haramların işlədilməsidir.

Dayağın naqis olması ilə nəticələnən hissə.Bu, etiqad və sözün tərk edilməsidir.

Əgər müxalif sonuncu cümləni, etiqad və sözün dayaq adlandırılmasını dəlil gətirərsə, ona deyəcəyik:Burada heç bir müəmmalı tərəf yoxdur.Çünki Şeyxul-İslam bütün sözlərində zahiri əməli şaxə edir, sözü həmçinin əsasən şaxə edir.Lakin bu ikisi, izah edildiyi kimi zəruri şaxələrdir.

Əgər müxalif Şeyxul-İslamın (vaciblərin tərk edilməsi) yaxud (haramların işlədilməsi) sözünü dəlil gətirib bunun nəticəsində küfrün deyil sadəcə vacib kamillikdə nöqsanın hasil olacağını deyərsə, cavab olaraq deyiləcək: Bu ifadə "vaciblərin tərk edilməsi" heç də hər zaman bütün vaciblərin tərk edilməsini ifadə etmir.Çünki bu sözlər həm bütün əməllərin tərk edilməsinə həm də, bəzi əməllərin tərk edilməsinə şamil edilir.

Ən uzağı deyiləcək ki, Şeyxul-İslam vaciblərin tərk edilməsi nəticəsində imanın azalacağını demişdir.Bu isə, onun və qeyrilərinin sözlərində çox rast gəlinir.Habelə bu, növbəti ayənin təfsirində məşhur sözdür: *"Onlardan kimisi özünə zülm edər".*[494] Həmin şəxs vacibləri tərk edib haramları işlədən şəxsdir.Bu səbəbdən, iki məsələyə əsasən burada həmin sözləri bütün deyil bəzi vaciblərin tərk edilməsinə aid etmək vacibdir:

[494] Fatir:32.

Birinci: Şeyxul-İslam namazı tərk edənin kafir olduğunu hesab edir və buna Quran, sunnə və səhabələrin icmasını dəlil gətirir.Bu üzdən ona bütün vaciblərin tərkinin küfr olmadığını nisbət etmək heç cür mümkün deyil.Çünki bu, Şeyxul-İslamın düşməyəcəyi açıq-aydın ziddiyətdir.

İkinci: Şeyxul-İslam bütün vaciblərin tərk edilməsi ilə birgə insanın Allaha və Peyğəmbərə iman gətirmiş olmayacağını açıq bildirmişdir.Habelə o, insan bütövlüklə əməldən kənar qalacağı təqdirdə onun kafir olacağını açıq bildirmişdir.

Şeyxul-İslam demişdir: "Artıq bəlli olmuşdur ki, dində söz və əməlin olması labüddür və insanın namaz, zəkat, oruc və başqa vaciblərdən olan zahiri vacibləri yerinə yetirməyəcəyi halda dili yaxud dili və qəlbi ilə Allaha və Elçisinə iman gətirməsi qeyri-mümkündür. Əgər fərz edilərsə ki, insan əmanəti əda etmək, doğru danışmaq, bölgü və qərarlarda ədalətli olmaq kimi vacibləri Allahın bunu vacib buyurduğu səbəbilə deyil və Allaha və Elçisinə iman gətirmədən edərsə bununla küfrdən çıxmış olmayacaq. Çünki müşriklər və kitab əhli bu işlərin vacib olduğunu hesab edirlər.Lakin insan Muhamməda (salləllahu aleyhi və səlləm) xas olan vaciblərdən heç bir şeyi yerinə yetirməzsə, Allaha və Elçisinə iman gətirmiş olmaz."

Onun bu sözləri bütün vacibləri tərk etməyə dair açıq-aydındır: "namaz, zəkat, oruc və başqa vaciblərdən olan zahiri vacibləri yerinə yetirməyəcəyi halda".

Habelə zahiri əməlin yoxluğunu və zahiri əməlin getməsini vurğuladığı digər açıq-aydın yerlər.

*Üçüncü*: Əgər müxalif növbəti sözləri dəlil gətirərsə "Onun özəyi qəlb, kamilliyi isə zahiri əməldir.İslam isə fərqlidir.Çünki onun özəyi zahir, kamilliyi isə qəlbdir.",-buna bir neçə yöndən cavab veriləcək:

*Birinci*: Artıq qeyd edilmişdir ki, əməlin yaxud sözün kamillik olaraq vəsf edilməsi özlüyündə doğrudur.Təhlükə isə yalnız bunun üzərinə onu tərk edənin kafir olmayacağına dair hökmün çıxarılmasıdır.Artıq mən buna dair imam Şafiinin (rahiməhullah) dediklərini sübut gətirmişəm: Əgər insan iman gətirib Peyğəmbərə iman gətirməzsə, bununla birgə Peyğəmbərə iman gətirməyincə ona heç vaxt imanın kamillik adı şamil olunmayacaq." Əməlin şəninə dair buna bənzər ibn Mandəhin (rahiməhullah) namazı tərk edəni təkfir etməsilə birgə bu sözləri deməsidir."

Zahiri əməl şaxə və özəyi təkmilləşdirən amildir.İnsanın imanı onsuz kamil olmur.Lakib bu, bütövlüklə onu tərk edənin kafir olmayacağını ifadə etmir.Habelə dil sözü şaxə və özəyi təkmilləşdirən amildir.Qeyd edildiyi kimi bu məsələdə heç bir anlaşılmazlıq yoxdur.

*İkinci*: Müxalifə deyiləcək: İmanın özəyi qəlb, onun kamilliyi isə zahiri əməl olduğu zaman, bu bölgüdə dil sözünün yeri haradadır görəsən? Ələxsus bəzi müxaliflər Şəbəbə bin Suvarın tutduğu yolu gedib dil sözünün sələfin "iman, söz və əməldir",-sözündə qəsd etdiyi əməlin olduğu-

nu demişlər.Belə olan halda o, dil sözünün imanın kamilliyindən olmasını gərək ki, açıq bildirsin!

Şəbəbənin məzhəbini seçməyənlərdən isə biz cavab gözləyirik.Əgər biri: Şeyxul-İslam burada qeyd etməsə belə dil sözü özəyə əlavə edilir,-deyərsə, biz ona deyəcəyik: Artıq Şeyxul-İslam namazı özəyə əlavə etmiş lakin onu burada qeyd etməmişdir.Bu, bir yanaşmadır.

*Üçüncü*: Şeyxul-İslam namazın tərk edilməsinə görə təkfir edir və bunu dinin və imanın əsası edir.Bu görüşdə olan şəxs üçün bütün bədən əzaları ilə edilən əməllərin kamillik olması ağılasığmaz bir işdir.Bu səbəbdən, onun sözlərini onun məzhəbinə zidd gələməyən şəkildə anlamaq üçün görüşünü yenidən nəzərdən keçirtmək gərəkdir.

Artıq Şeyxul-İslam burada dediyini digər yerdə qeyd etmişdir.O, demişdir: "Elm və hal olaraq imandan qəlbdə yer alan din özəydir.Zahiri əməllər isə şaxələrdir və o, imanın kamilliyidir."[495] Təbii ki, ilk öncə dinin özəyi qoyulur daha sonra o, şaxələri ilə kamilləşir.Uca Allah Məkkədə tövhid, əqli müqayisələr olan məsəlləri, öncəki ümmətlərin əhvalatlarını, müjdə və təhdid kimi əsasları nazil etmiş daha sonra bu əsaslar gücləndiyi zaman Mədinədə cümə, camaat namazı, əzan, iqamə, cihad, oruc, şərabın haramlığı, zina, meysir və digər vacib və haramlar kimi zahiri şaxələrini endirmişdir.

[495] Bu, müxalifin bir neçə sətirdən sonra Şeyxul-İslamdan gələn sözlərə diqqət yetirmədən dəlil olaraq gətirdiyi yerlərdən biridir.

Belə ki, şaxələr özəydən əsas götürür və onu sabit edir. Şaxələr özəyi kamilləşdirir və onu qoruyur.Orada zahiri nöqsan baş verəcəyi zaman bu, yalnız və ilk olaraq onun şaxələri yönündən baş verəcək.Bu səbəbdən, Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Dininizdən ilk itirəcəyiniz şey əmanət olacaq.Dininizdən sonuncu itirəcəyiniz şey isə namaz olacaq."[496] Habelə onun belə deməsi rəvayət edilir: "İlk qaldırılacaq şey əmanətlə hökm olacaq". "Hökm"[497], rəhbərlərin və əmr sahiblərinin əməlidir.Uca Allah buyurur: *"Həqiqətən, Allah sizə əmanətləri sahiblərinə qaytarmanızı və insanlar arasında hökm verərkən ədalətlə hökm verməniz əmr edir."*[498]

Namaz isə ilk fərzdir.O, şəhadətlə birləşik olan dinin və imanın əsaslarından biridir.O isə, yalnız axırda gedəcək."[499]

Şeyxul-İslam bu yerdə iki məsələni bəyan etmişdir:

Birinci: Kamillik sözündə gələn məqsəd, dinin ilk öncə əsaslar üzərində qurulması daha sonra şaxələrlə kamilləşməsidir.Bununla da, əhkamların istifadəsi və qoyuluşunda pillələik hasil olur.

---

[496] "Məkərimul əxləq", əl-Xaraiti.Şeyx Albani "əs-silsilətu-s-sahiha:4/319_1739-cu rəqəm" demişdir: "Hər bir halda hədis səhihdir.Çünki həmin hədisi gücləndirən bir sıra hədislər vardır.Həmin hədislərin bəzisi "ər-raudu-n-nadır" kitabında qeyd olunub."

[497] Hədisin bu cür ləfzinə rast gəlmədim.

[498] ən-Nisə:58.

[499] Məcmu`əl-fətəva:10/355.Şeyxul-İslam namazı tərk edənin təkfir ediləcəyinə dair hədisləri kiçik küfrə aid edənlərə rəddiyəsində demişdir: "Altıncı: Peyğəmbər (salləllahu aleyhi və səlləm) onun dinin axırı olduğunu bəyan etmişdir.Onun axırı gedəcəyi zaman isə o, bütövlüklə gedəcək."

İkinci: Kamillik deyildikdə onun tərk edilməsinin küfr olmayacağı qəsd edilmir.Buna dəlil, onun ardından namazın şənini, onun dinin və imanın əsaslarından biri olmasını qeyd etməsidir.Bu səbəbdən, əməllərdən biri olan namaz əsaslara əlavə olacağı zaman onun tərki Şeyxul-İslama görə küfr olacaq.Buradan, bütün zahiri əməllərin tərk edilməsinin öna görə küfr olmadığına dair sözün batilliyi bəlli olur.

Habelə o, burada dilin sözünü qeyd etməmişdir.Məlumdur ki, o, qəbin deyil zahirin işlərindəndir.Əgər müxalifin burada kamilliyə dair anlama tərzi götürülsəydi onun (dil sözünün) tərk edilməsi səbəbilə küfrün hasil olması gərəkli olmayacaqdı. Bu isə, qəti olaraq batildir.Müxalifə ona dair verilən cavab bədən əməllərinə dair verdiyimiz cavabın özüdür.

*Dürdüncü*: Şeyxul-İslam qəlb imanını islamın kamiliyi etmişdir.O, demişdir: “Onun özəyi qəlb, kamilliyi isə zahiri əməldir.İslam isə fərqlidir.Çünki onun özəyi zahir, kamilliyi isə qəlbdir.” Məlumdur ki, daxili imana birləşik olmayan islam dəyərsizdir.Bununla da, kamillik vəsfinə əsasən küfrün hasil olmayacağı nəticəsinə gəlməyin yanlış olması bəlli olmuşdur.

Əslində bu, müxalif üçün qaçılmaz olan bir gərəkdirmədir.Çünki əgər müxalif: Zahiri əməlin tərk edilməsi nəticəsində imanın getməsi gərəkli deyil.Çünki o, kamillik adlanır,-deyərsə, ona deyiləcək: Qəlb imanının tərk edilməsi

nəticəsində islamın getməsi gərəkli deyil.Çünki o, həmçinin kamillik adlanır!

Bəziləri bu gərəkdirməyə növbəti sözlərlə cavab vermişlər: “Məgər islam hökmü zahirə uyğun verilmir?! Belə olan halda münafiqin hökmü nədir?! Necə olacaq?! Onun gerçəyi nədir?!”

Gördüyün kimi bu, ümumiyyətlə cavab deyil.Çünki əgər burada yalnız zahirə uyğun hökm verilən islam qəsd edilsəydi burada, istər kamillik istərsə də, başqa cür adlansın qəlb imanının qeyd edilməsi yersiz olardı.

Əksinə burada söhbət həm mömini həm də, münafiqi şamil edən zahiri deyil həqiqi və insanı qurtaracaq islamdan gedir.Həqiqi və məqbul islamın daxili imana sahib olması labüddür.Artıq Şeyxul-İslam onu “kamillik” adlandırmışdır. Heç şübhəsiz ki, o, təkmilləşdirən, tamamlayan və səhih edəndir.Anlaşılmazlıq kamillik ifadəsində deyil.Anlaşılmazlıq yalnız bundan, onun tərk edilməsi səbəbilə təkfir hökmünün çıxarılmayacağını anlamaqdır.

*Beşinci*: Şeyxul-İslamın növbəti sözləri: “Onun özəyi qəlb, kamilliyi isə zahiri əməldir.İslam isə fərqlidir.Çünki onun özəyi zahir, kamilliyi isə qəlbdir.” Onun bu sözləri iman və islam arasında olan bağlılığa, onların birləşik gəldikləri zaman fərqli mənalarda olacaqlarına, hər bir möminin zahiri islama sahib olmasının, hər bir müsəlmanın isə daxili imana sahib olmasının gərəkli olduğuna dair onun seçdiyi görüş işığında anlaşılmalıdır.Kamillik ifadəsi yanlış

fikir yaratsa belə əməl imana nisbətdə kamillik olduğu kimi habelə daxili iman islama nisbətdə kamillikdir.Çünki daxili iman olmadan islam səhih və məqbul olmur.Habelə zahiri söz və zahiri əməl olmadan iman səhih və məqbul olmur. Lakin Şeyxul-İslam bir sıra yerlərdə bu məsələni, onun sözlərini oxuyan heç kəsə gizli qılmayacaq surətdə izah etmiş və imamların sözlərini nəql etməkdə elmi üslub seçmişdir.

Şeyxul-İslam imanla islam arasında bağlılıq məsələsinə dair demişdir: "İman islamla bir arada gələcəyi zaman iman qəlbdə olanı islam isə zahirdə olanı ifadə edəcək. Peyğəmbərdən (salləllahu aleyhi və salləm) gələn hədisdə deyilir: "İslam aşkar olan, iman isə qəlbdədir.İman Allaha, Onun mələklərinə, kitablarına, peyğəmbərlərinə, ölümdən sonra dirilişə və qədərin xeyiri və şərinə iman etməkdir." İnsan bu imana sahib olacağı vaxt zəruri olaraq şəhadət, namaz, zəkat, oruc və həcc olan islama sahib olacaq.Çünki onun Allaha, Onun mələklərinə, kitablarına və peyğəmbərlərinə imanı Allaha təslimiyyəti və Ona boyun əyməsini tələb edir.Çünki insanın daxildə iqrar, sevgi və itaətə sahib olub imkan olan yerdə buna zahirdə sahib olmaması qeyri-mümkündür.Eyni cür imkan olacağı təqdirdə məqsədin yolxuğu qəti iradənin varlığını qeyri-mümkün edir."[500]

Habelə demişdir: "Əgər iman və islam bir arada qeyd edilərsə islamın anlamı, imanın zəruri amili olsa belə ondan xaric olacaq.Buna misal Cəbrayılın hədisidir."[501]

---

[500] Məcmu`əl-fətəva:7/553.
[501] Öncəki mənbə:7/555.

Habelə Əbu Talib əl-Məkkidən bu sözləri nəql edib demişdir: "Habelə müsəlmanın, onun islamını səhih edəcək imana sahib olmaması mümkünsüzdür.Habelə möminin, onun imanını gerçəkləşdirəcək islama sahib olmaması mümkünsüzdür.Çünki Uca Allah saleh əməllər üçün imanı, iman üçün isə saleh əməlləri şərt qoymuşdur."

Habelə Şeyxul-İslam iman və islam üçün ruh və bədən məsəlini çəkib demişdir: "Bizim ruhumuz yalnız bədənlə birgə mövcuddur.Hər bir diri bədən yalnız ruh ilə mövcud olur.Onlardan biri isə digəri deyil.

İman ruh kimidir.O, ruhda mövcud olub bədənlə bağlı olur.İslam isə bədən kimidir.Diri bədən isə yalnız ruh ilə olur.Yəni, onlar bir-birinə sıx bağlıdırlar.Onlardan birinin anlamı isə digərinin anlamı deyil".[502]

Bir sözlə, Şeyxul-İslamın sözlərindən alınan bu məqam bütövlüklə zahiri əməli tərk edənin müsəlman olacağını hesab edən şəxs üçün istinad nöqtəsi olaraq yararsızdır.Habelə onun buradaki sözləri bir çox yerdə əməli tərk edənin küfrünə, zahir ilə daxil arasında olan bağlılığa və namazı tərk edənin təkfir edilməsinə dair seçdiyi görüşlərilə ziddiyət təşkil etmir.

## Beşinci məqam:

Şeyxul-İslamın (rahiməhullah) ibn Murahhəl ilə elmi münaqişəsində gəlmişdir:

[502] Birinci hissədə iman ilə islam arasında olan bağlılığa dair araşdırmaya bax.

"Şükr etməyin əksi olan küfr, Allaha küfr deyil yalnız nemətə qarşı olan küfrdür.Şükr yox olacağı zaman onun ardınca Allaha küfr deyil nemətə qarşı küfr gələcək.

Dedim: Buna əsasən, əgər o, Allaha olan küfrün əksi olsaydı qəlbi və dili ilə şükr edib əməlləri tərk edən şəxs şükrün bir qismini və özəyini yerinə yetirmiş olardı.Kürf yalnız şükr bütövlüklə olmayacağı zaman sabit olur.Əhli sunnənin dediyi kimi: Əgər biri imanın şaxələrini tərk edərsə imanın özəyi olan etiqadı tərk etməyincə kafir olmaz.Şöbə və hissələrdən ibarət olan gerçəyin şaxələrinin getməsi ilə, insanın əli kəsiləcəyi yaxud ağacın bəzi şaxələri kəsiləcəyi zaman olduğu kimi adın getməsi gərəkli olmur."[503]

## *Buna iki yöndən cavab veriləcək:*

***Birinci***: O, demişdir: "Əhli sunnənin dediyi kimi: Əgər biri imanın şaxələrini tərk edərsə imanın özəyi olan etiqadı tərk etməyincə kafir olmaz." Əgər burada etiqad deyildikdə, Şeyxul-İslamın bu cür istifadədə tutduğu məzhəbi olan qəlbin sözü və əməli qəsd edilərsə bədən əməli olmadan qəlb əməlinin olması qeyri-mümkün olacaq.Üstəlik bütövlüklə bədən əməlinin yoxluğu qəlb əməlinin yoxluğunu ifadə edəcək və bu, labüddür.Şeyxul-İslam bunu bir sıra yerlərdə qeyd etmişdir.Bu üzdən, əgər biri bütün zahiri

---

[503] Məcmu`əl-fətəva:11/137.əl-Uqudu-d-durriyyə, ibn Abdul-Hədi:95-116-cı səh, təhqiq: Muhamməd Hamid əl-Fəqi. İbn Murahhəl: Sadruddin ibn əl-Vakil Muhamməd bin Ömər bin Məkki bin Abdu-s-Saməd.Zamanında şafiilərin şeyxi olmuşdur.Vəfatı: 717-ci hic.Onun tərcümeyi halı "tabəqatu-ş-şəfiiyyətil kubra:9/253" və "əl-bidəyə va-n-nihəyə: 14/492" kitablarında vardır.

əməli tərk edərsə bu, qəlbdən imanın özəyinin gedəcəyinə dəlil olacaq və həmin şəxs murciələrdən fərqli olaraq Əhli sunnəyə görə kafir olacaq.Bunu izah edən amillər:

*İkinci*: Onun "imanın şaxələri" sözlərinin bir neçə məsələ səbəbilə bütün deyil bəzi əməllərə aid edilməsi vacib olur:

Birinci: Bədən əməllərini tərk edənin müsəlman olacağına dair sözün Əhli sunnəyə nisbət edilməsi aşkar yanlışlıqdır.Ələxsus Şeyxul-İslamın görüşünə əsasən səhabələr namazı tərk edənin kafir olacağına dair icma etmişlər. Artıq o, bunu əksər sələfdən xəbər verib demişdir: "Bu, səhabə və tabiinlərdən olan sələfin cumhurundan məşhur və gəlib çatmış sözdür."[504]

Belə olan halda Əhli sunnənin bütün bədən əməllərini tərk etməyi küfr hesab etmədiklərini demək nə dərəcədə doğrudur?

İkinci: Şeyxul-İslam namazı tərk edəni təkfir edib namazı şəhadətə birləşik olan dinin və imanın əsaslarından edir.Habelə bütün vacibləri tərk edənin mömin deyil kafir olacağına dair əminlik ifadə edir.Bu səbəbdən, onun "imanın şaxələri" sözlərini, onun sözlərində ziddiyət və qarışıqlığın ortaya gəlməsini dəf etməkdən ötrü namazdan savayı bəzi əməllərə aid etmək vacib olur.

*Üçüncü*: Onun sözlərinin bütün zahiri əmələ aid edilməsi, Şeyxul-İslamın bədən əməli olmadan qəlbdə imanın

[504] Şərhul umdə:2/75. Məcmu`əl-fətəva:20/97, 28/308,360.

olacağını təsəvvür etməsi anlamına gələcək.Bu sözün, Şeyxul-İslama nisbət edilməsi isə haqsızlıq və zülmdür.Çünki bu, Şeyxul-İslamın kitablarının müxtəlif yerlərində inkar etdiyi məsələdir.Üstəlik mən Şeyxul-İslam kimi zahir ilə daxil arasında olan bağlılıq qaydasına və bunu inkar edənlərə rəddiyə verməyə dair kiminsə bu cür geniş danışdığını bilmirəm.

Dördüncü: Demişdir: "İnsanın əli kəsiləcəyi yaxud ağacın bəzi şaxələri kəsiləcəyi zaman".Burada onun bütün deyil bəzi əməllərin tərk edilməsini qəsd etməsinə işarə vardır.

## Altıncı məqam:

Şeyxul-İslam (rahiməhullah) demişdir: "İslam, imandan heç bir şeyə sahib olmayıb islamı aşkara çıxaran şəxsi şamil edir. Beləsi xalis münafiqdir.Habelə daxildə yığcam təsdiqlə birgə islamı aşkara çıxaran şəxsi şamil edir.Lakin həmin şəxs istər biri istərsə də, digər olsun bütün vacibi etmiş olmur. Belə şəxslər nifaqdan bir şöbəsi olan fasiqlərdir.Habelə (islam) vacib islamı və vacib imanı tamamlamasa belə imandan lazım olanı yerinə yetirməyi şamil edir.Belə şəxslər zahiri fərzi tərk etmiş və zahiri haramı işlətmiş fasiqlər deyillər.Lakin onlar qəlbdə elm və əməl olaraq, imanın vacib həqiqətlərindən bir qismini tərk etmiş və bunun nəticəsində onları yaramaz hala salan bəzi bədən əzaları buna tabe olmuşdur.Sələfin öz canları üçün qorxduğu nifaq məhz

budur.Çünki buna sahib olan şəxsdə bəzən nifaqdan bir şöbə olur."[505]

Müxalif dəfələrlə bu sözləri dəlil gətirib Şeyxul-İslamın: "Lakin həmin şəxs istər biri istərsə də, digəri olsun bütün vacibi etmiş olmur.",- sözlərinə bel bağlamışdır.

***Buna iki yöndən cavab veriləcək:***

*Birinci*: Müxalifin bu yeri dəlil gətirməsi onun imamların sözlərini anlamadığına dəlalət edir.Həmin şəxs bu kimi məsələlərdə araşdırma aparmaq gücündə deyil.Belə ki, Şeyxul-İslamın sözləri açıq-aydındır.Şeyx burada üç sinif insanı qeyd edir:

Birinci: Söz və əməl olaraq islamı aşkar edib daxili imanı gerçəkləşdirməyən şəxs.Bu, xalis münafiqdir.

İkinci: Zahiri islama və daxili imana sahib olan və bu iki işdə səhlənkar olub bütün daxili vacibi yerinə yetirmədiyi kimi həmçinin bütün zahiri vacibi yerinə yetirməyən şəxs. Bu, onun növbəti sözlərinin mənasıdır: "Lakin həmin şəxs istər biri istərsə də, digəri olsun bütün vacibi etmiş olmur." Yəni, istər zahirən istərsə də, daxilən.

Müxalif onun: "istər biri istərsə də, digəri",- sözlərində qəsd ediləni anlamamışdır.Əgər o, bunu anlasaydı həmin yeri dəlil olaraq qeyd etməzdi.Müxalif zənn edir ki, burada gələn sözlər: Vacibdən heç bir şey etməmişdir, yəni bütün əməli tərk etmişdir,-mənasını ifadə edir.Müxalif bunu,

[505] Məcmu`əl-fətəva:7/427.

bütün bədən əməllərinin tərk edilməsinə aid edir.Ancaq müxalifin anlama tərzinə əsasən bu sinif insanların habelə daxili imandan heç bir şey etmədikləri gərəkli olur.

Doğru olan görüş: “bütün vacibi etmiş olmur.”,- sözlərinin, bütün zahiri və daxili vacibləri yerinə yetirmədi və yalnız bəzisini etdi, mənasında gəlməsidir.Bu, fasiqin vəsfidir.

Üçüncü: Zahiri islamı, yəni zahiri vacib əməlləri yerinə yetirib lakin daxili imanında nöqsanlı olan şəxs qəlbdə elm və əməl olaraq imanın vacib həqiqətlərindən bir qismini tərk etmiş olur.

*İkinci*: Müxalif daxildə imanın olub bunun ardınca heç bir bədən əməlinin gəlməyəcəyini isbat etmək ətrafında çabalayır.O, bunu zənn edir və təsəvvürünə gətirir və bunu Şeyxul-İslama nisbət edir.Müxalifin sözünün gerçəyi: İsbat etdiyini iddia etsə belə zahir ilə daxil arasında bağlılığı rədd etməkdir.[506]

## Yeddinci məqam:

Şeyxul-İslam (rahiməhullah) demişdir: “İkinci: İman özündə təsdiqi ehtiva etsə belə o, adicə təsdiq deyil.O, yalnız iqrar və xətircəmlikdir.Buna səbəb təsdiqin yalnız xəbərə ərz edil-

[506] Bu yerə, Şeyxul-İslamın imanın artma yönlərinə dair sözləri “7/233” çox bənzəyir: “Bunlar, onlara vacib olanı bilib bunu qəbul edən və iqrar edən lakin bütün bunlara əməl etməyən şəxslərdir.” Onlardan biri bu sözləri dəlil gətirmişdir.Əslində isə onlar üçün bu sözlərdə heç bir vəchlə dəlil yoxdur.Çünki bu sözlərin mənası: Əgər biri bütün əməlləri etməz və sadəcə bəzisini yerinə yetirərsə.” Sözlər aydın olduğu üçün onun sözlərini dolğun şəkildə qeyd eyməyə lüzum görmədim.İstəyən onun sözlərinə müraciət edə bilər.

məsidir.Əmrdə isə əmr olması etibarı ilə təsdiq yoxdur.Allahın kəlamı isə xəbər və əmrdir.Xəbər xəbər verənin təsdiq edilməsini, əmr isə ona tabeçiliyi və təslimçiliyi vacib edir.O isə, əmr olunanı etməsə belə əmrə boyun əymə və tabeçiliyi cəm edən qəlb əməlidir.Xəbər təsdiqlə, əmr isə tabeçiliklə qəbul ediləcəyi zaman qəlbdə imanın özəyi hasil olacaq.O isə, xətircəmlik və iqrardır.Çünki o, qərar tutma və xətircəmlik olan "əmn" sözündən düzəlmişdir.Bu, yalnız qəlbdə təsdiq və tabeçilik qərar tutacağı zaman hasil olacaq."[507]

## *Buna bir neçə yöndən cavab veriləcək:*

*Birinci*: Təsdiq və tabeçiliyin imanın özəyi edilməsi, dəfələrlə izah olunduğu kimi müəmmalı məsələ deyil.

*İkinci*: Qəlbdə imanın özəyinin hasil olması onun zəruri amilləri olan söz və əməl tərk ediləcəyi təqdirdə imanın səhih olacağını ifadə etmir.Şeyxul-İslam (rahiməhullah) bir sıra yerdə zahiri əməlin daxili imanın zəruri amili və ondan ayrılmaz olduğunu, habelə "ləzim"in yoxluğunun "məlzum"un yoxluğuna dəlalət edəcəyini bəyan etmişdir.Bu, bütövlüklə əmələ yaxud itaətin əsasına baxıldıqda belə olur. Namazdan savayı ayrı-ayrı əməllərin yoxluğu, həmin əməllərin vacibliyi iqrar ediləcəyi, habelə hökmə tabeçilik və təslimçilik olacağı zaman imanı kökündən pozmur.Bu, onun həmin yerdə qəsd etdiyidir.Bu səbəbdən demişdir: "Xəbər təsdiqlə, əmr isə tabeçiliklə qəbul ediləcəyi zaman qəlbdə imanın özəyi hasil olacaq."

[507] əs-Sarimul məslul:3/967.

Önəmli olan, Şeyxul-İslamın sözləri, dil sözünün tərk edilməsi məsələsi kimi bütövlüklə əməlin tərk edilməsi məsələsi haqqında bəhs etmir.Çünki burada gələn sözlər bu məsələni vurğulamaq üçün gəlməmişdir.Onun sözləri təhqir etmə, alçaltma və aşağılamanın tabeçiliyə zidd gəldiyini bəyan etmək üçün gəlmişdir.Hətta əgər qəlbdə təsdiq olarsa həmin təsdiq faydasız olacaq və onun varlığı yoxluğu kimi olacaq.

*Üçüncü*: Müxalif bədən əməllərindən heç bir şey gəlmədən qəlbdə tabeçiliyin isbat edilməsi ətrafında çabalayır və bu sözləri Şeyxul-İslamın ayağına yazmağa çalışır.Bu səbəbdən Şeyxul-İslamın: "əmr olunanı etməsə belə",-sözlərini bütün əmr olunanın tərk edilməsinə aid edir.Heç şübhəsiz ki bu, batil və Şeyxul-İslamın ilk öncə namazı tərk edənin təkfir ediləcəyinə sonra isə bütün zahiri vacibləri tərk edənin təkfir ediləcəyinə dair məzhəbinə müxalifdir.Artıq bu iki məsələyə dair açıq-aydın nəqllər gəlmişdir.

Əgər biri zahirdə bütün əmr olunanın tərk edilməsi ilə birgə qəlbdə tabeçiliyin varlığını hesab edərsə həmin şəxs dili ilə iddia etsə belə gerçəkdə zahir ilə daxil arasında olan bağlılığı inkar etmiş olacaq.

## Səkkizinci məqam:

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Burada cəhmilərə ünvalanan Əbul Həsənin "əl-mucəz" kitabında qeyd etdiyi sual vardır.Həmin sual: Quran bunlardan imanı inkar etmişdir.Uca Allah buyurur: *"Möminlər yalnız o kəslərdir ki, Allah*

*adı çəkiləndə ürəkləri qorxudan titrəyər".*[508] O, deməmişdir: Bu əməllər imandandır.Onlar dedilər: Biz deyirik: Əgər biri bu əməlləri etməzsə mömin olmaz.Çünki onun yoxluğu qəlbdə olan elmin yoxluğuna dəlalət edir.Buna bir neçə yöndər cavab veriləcək:

Birinci: Siz həmin əməllərin imanın zəruri amili olduğunu qəbul etdiniz.O, olmayacağı zaman qəlbdə iman qalmayacaq.Məqsəd məhz budur.Bundan sonra onun zəruri amil yaxud hissə olması ləfzi çəkişmədir.

İkinci: Nasslar onun hissə olduğunu açıq bildirir.Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "İman altmış və bir neçə yaxud yetmiş və bir neçə şöbədən ibrətdir."

Üçüncü: "Əgər siz, bu işlərin bir şəxsdən inkar ediləcəyi zaman onun imansız kafir olacağını desəniz sizin sözünüz xəvariclərin sözü tək olacaq.Ancaq siz bir tərəfdə xəvariclər isə digər tərəfdədirlər. Elə isə necə olur ki, siz onlara müvafiq olursunuz. Bu işlərdən: Namaz qılmaz, zəkat vermək, Ramazanda oruc tutmaq, həcc, cihad, Allahın və Peyğəmbərin hökmünü qəbul etmək və tərk edəni təkfir etmədiyiniz digər şeylərdir. Əgər siz onu təkfir etsəniz sizin sözünüz xəvariclərin sözü olacaq."[509]

Müxalif bu sözləri gətirib Şeyxul-İslamın ziddiyətli sözlərə sahib olduğunu iddia etmişdir.Bir yerdə o, namazı tərk edənin öldürülmyəcəyini yaxud müsəlman olaraq öldürüləcəyini deyən sözü murciələrin şübhəsinə tutulanla-

---

[508] əl-Ənfəl:2.

[509] Məcmu`əl-fətəva:7/202.

rın sözü edir, burada isə namazı tərk edənin təkfir ediləcəyinə dair sözü xəvariclərin sözü edir.

Müxaliflərdən biri bunu növbəti başlıq altında olan məqalədə qeyd etmişdir: "Məgər Allahın hüccəti qulların üzərindən yalnız Şeyxul-İslam vasitəsilə qalxır? Düşünmək çağırışı!"[510]

## *Buna bir neçə yöndən cavab veriləcək:*

***Birinci***: Müxalif Şeyxul-İslamın sözlərini anlamamış və avam insanlara bu dəyərsiz sualı qoymaqda yaramazlıq etmişdir.Əgər o, Şeyxul-İslamın kəlamına diqqət yetirsəydi dediyi sözləri dilə gətirməzdi.

*İkinci*: Şeyxul-İslam demişdir: "Əgər siz, bu işlərin bir şəxsdən inkar ediləcəyi zaman onun imansız kafir olacağını desəniz sizin sözünüz xəvariclərin sözü tək olacaq.Ancaq siz bir tərəfdə xəvariclər isə digər tərəfdədirlər.Elə isə necə olur ki, siz onlara müvafiq olursunuz." Bu sözlər açıq-aydındır və orada heç bir anlaşılmazlıq yoxdur.Əhli sunnədən heç kim bir insandan iman inkar ediləcəyi zaman mütləq onun kafir olacağını deməmişdir.Çünki iman vacibi tərk edən şəxsdən həmçinin inkar edilir.Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: " Əmanəti olmayanın imanı, əhdi olmayanın isə dini yoxdur." Habelə Şeyxul-İslamın imana dair sözlərinin əvvəlində qeyd etdiyi digər dəlillər.

Ayə, imanın əməlləri sırasında qeyd edilmişdir: Uca Alah anıldığı zaman qəbin qorxu ilə titrəməsi, ayələrin oxunuşu

[510] Kitabın müqəddiməsinə bax.

anda imanın artması, Uca Allaha təvəkkül etmək, namaz qılmaq və Allahın verdiyi ruzidən xərcələmək.Cəhmilər ayədə gələn "yalnız" sözünün çərçivəliyə dəlalət etməsi səbəbilə tərk edəndən imanın inkar edilməsinə əsaslanaraq bunun tərk edilməsinin küfr olduğunu dedikləri zaman onların sözü iki səbəbdən xəvariclərin sözü olmuşdur:

Birinci: Əhli sunnə, namaz istisna olmaqla bu işləri tərk edəni təkfir etmirlər.İxtilaf zəkat və digər dayağlardadır.

İkinci: Əhli sunnə bu cür hüccətə, yəni tərk edəndən imanın inkar ediləcəyinə etimad edərək namazı tərk edəni təkfir etmirlər.Çünki bu, xəvariclərin hüccətidir.Bu hüccətə əsasən, Allahın imana aid olan əməllərdən və möminlərin sifətlərindən etdiyi hər bir vacibi tərk edən şəxs kafir olur.

Artıq namazı tərk edənin hökmünə dair ixtilafın Əhli sunnə arasında mötəbər ixtilaf olduğu vurğulanmışdır.Bununla belə biz onu tərk edənin təkfir ediləcəyinə dair səhabələrin icmasını və namazı tərk edəni təkfir etməyənin murciələrdən sayılmayacağını qeyd etmişik.Ancaq əgər biri: Mən onu təkfir etmirəm.Çünki küfr yalnız danma və halal sayma ilə olur yaxud çünki küfr bədən əməli deyil qəlb əməlidir,-deyərsə və digər murciələrin əsaslarını gətirərsə fərqli olacaq.

Bu, tamamilə digər tərəf üçün deyiləcək.Yəni, namazı tərk edənin təkfir edilməsi.Əgər biri Quranın və sunnənin nasslarına və səhabələrin icmasına etimad edərək bunu deyərsə bu işdə heç bir anaşılmazlıq olmayacaq.Çünki bu,

Muhamməd bin Nəsr, Şeyxul-İslam və qeyrisinin nəql etdiyi kimi sələf və hədis əhlinin cumhurunun sözüdür.Ancaq əgər biri imanın bir hissəsinin gedəcəyi zaman bütövlüklə gedəcəyinə yaxud Allahın namazı möminlərin sifəti etdiyinə və bu səbəbdən onu qılmayanın kafirlərdən olacağına yaxud Allahın bunu edəndən imanı inkar edəcəyinə və həmin şəxsin vacibi yerinə yetirməyən digər şəxslər kimi olacağına etimad edərək namazı tərk edəni təkfir edərsə heç şübhəsiz ki, xəvariclərin sözünü demiş olacaq.Burada qəsd edilən məhz budur.Xəvariclərə müvafiqlik namazı tərk edənin kafir olacağına dair söz nəticəsində deyil yalnız bu yaramaz əsaslandırma nəticəsində gəlmişdir.

Bu səbəbdən, Şeyxul-İslam "əl-Ənfəl" surəsində gələn ayədəki oruc, həcc və cihad kimi işləri bizim işarə etdiyimizə uyğun qeyd etmişdir.Bütün bu işlər imanın vaciblərindən və möminlərin xislətlərindəndir.Bu səbəbdən, əgər biri cəhmilərin hüccətinə etimad edərsə bunun tərk edilməsi və hər bir vacibin tərk edilməsi səbəbilə təkfir etməsi gərəkli olacaq. Bu isə, xəvariclərin sözüdür yaxud daha sərt sözdür.

*Üçüncü*: Şeyxul-İslam namazı tərk edənin təkfir ediləcəyi görüşünü seçib buna dair səhabələrin icmasını hekayət edir və bunu sələfin və hədis əhlinin cumhuruna nisbət edir.Habelə o, Əhli sunnənin: Halal saymayınca biz günah səbəbilə heç kəsi təkfir etmirik,-sözündən istisna olaraq dörd dayağı tərk edənin təkfir ediləcəyinə dair ixtilafı Əhli sunnə arasında olan ixtilaf edir.Bu, onun iman kitabındadır.Elə isə onun, namazı tərk edənin təkfir ediləcəyinə dair sözü xəva-

riclərə nisbət etdiyini düşünmək nə dərəcədə doğrudur? Məgər bunu söz qavrayan və dərk edən şəxs deyə bilər?!

Şeyxul-İslam (rahiməhullah) demişdir: "Müsəlmanlar şəhadəti dilə gərirməyənin kafir olacağına dair yekdil olmuşlar. Lakin onlar dörd əməli tərk edənin təkfir ediləcəyinə dair ixtilaf etmişlər.Biz hər hansı bir şəxsin günah səbəbilə kafir olmayacağına dair Əhli sunnənin yekdil olduğunu dediyimiz zaman yalnız zina və şərab içmək kimi günahları qəsd edirik.Bu dayağları tərk edənin təkfir ediləcəyinə dair isə məşhur ixtilaf vardır.Əhməddən buna dair ixtilaf vardır. Rəvayətlərin birində o, bu şeylərdən birini tərk edəni təkfir edir.Habelə bu, Əbu Bəkrin, həmçinin ibn Həbib kimi Malikin əshabından bir toplum insanın seçdiyi görüşdür. Habelə o, digər rəvayətdə yalnız namazı və zəkatı tərk edəni təkfir edir.Ondan gələn üçüncü rəvayətdə o, yalnız namazı və imam ondan ötrü savaşacağı zaman zəkatı tərk edəni təkfir edir.Ondan gələn dördüncü rəvayətdə o, yalnız namazı tərk edəni təkfir edir.Beşinci rəvayətdə isə o, ondan hər hansı bir şeyi tərk edəni təkfir etmir.Bu sözlər, sələfə görə məlum olmuşdur."[511]

Dördüncü: Müxalif Şeyxul-İslamın növbəti sözlərini qulaq ardına vurmuşdur: "Siz həmin əməllərin imanın zəruri amili olduğunu qəbul etdiniz.O, olmayacağı zaman qəlbdə iman qalmayacaq.Məqsəd məhz budur.Bundan sonra onun zəruri amil yaxud hissə olması ləfzi çəkişmədir."Bu sözlər, imanın əməlləri gedəcəyi zaman qəlbdə imanın qal-

---

[511] Məcmu`əl-fətəva:7/302.

mayacağına dair açıq-aydındır.Müxalifdən tələb olunan bunu qəbul etməsidir.

Şeyxul-İslam bu hissədə, əməllərin olmayacağı yaxud irəlidə qeyd ediləcəyi kimi bütün vaciblərin olmayacağı zaman imanın olmayacağı məsələsində cəhmilərə müvafiq gəlmişdir.Lakin o, qəlbdən inkar edilən imanın elm və təsdiq olması məsələsində onlara müxalif olub inkar edilənin qəlb əməli olduğunu bəyan etmişdir.

## *Tamamlama:*

Cəhmiyyə və onlara müvafiq gələnlərin "əl-Ənfəl" surəsində gələn ayələri dəlil gətirmələri təəccüblü görünür. Bunu bəyan etmək üçün deyirəm:

Cəhmilər: Şəriət sahibi yalnız qəlbdən elm və təsdiqin getməsi səbəbilə təkfir edir,-sözlərinə dəlil gətirmək istədikdə bəzi əməllər olmayacağı zaman "əl-Ənfəl" surəsində olduğu kimi imanın inkar ediləcəyinə dair gələn ayəni dəlil gətirmişlər.Məsələn Uca Allah buyurur: *"Allaha və axirət gününə inanan heç bir tayfanın Allah və Onun Peyğəmbəri əleyhinə çıxanlarla -öz ataları, oğulları, qardaşları, yaxın qohumları olsalar belə -dostluq etdiyini görməzsən."*.Onlar demişlər: Ayələrdən çıxan anlam: Əgər biri əməllər etməzsə onun qəlbindən iman gedər.Bu isə təsdiqin yoxa çıxması deməkdir.Biz, şəriətin təkfir etdiyi hər bir şəxsin qəlbindən təsdiqin gedəcəyinə hökm verəcəyik.

Şeyxul-İslam bu şübhəni "iman" kitabının iki yerində gətirmişdir.Biri müxalifin qeyd etdiyidir, digəri isə ondan öncə gəlmişdir.İrəlidə bu sözlər gələcək.

Cəhmilərin bu sözləri haqq və batildən ibarətdir.Onun haqq olan tərəfi: Bütün əməllərin tərk edilməsi yaxud bütün vaciblərin yoxluğu qəlbdə imanın olmadığına dəlalət edir. Şeyxul-İslamın iki yerdə onlara müvafiq olduğu məqam məhz budur.

Batil tərəfi isə iki məsələdir:

Bəzi vaciblərin tərk ediləcəyi zaman imanın olmayacağına hökm vermək və inkar edilən imanın təsdiq olduğunu iddia etməkdir.Şeyxul-İslamın batil olduğunu bəyan etdiyi məqam budur.

Bu, elmdə möhkəm olanların şənidir.Şeyxul-İslam onların bütün sözlərini rədd etməmiş, üstəlik haqq olan sözdə onlara müvafiq gəlmişdir.O, bu haqqın, yəni vaciblərin tərk edilməsi zamanı imanın olmayacağı və bu zaman iddia etdikləri kimi inkar edilənin təsdiq deyil qəlb əməli olacağı məsələsinin sələfin məzhəbi olduğunu bəyan etmişdir.

Şeyxul-İslam (rahiməhullah) demişdir: Bu məzhəbdə Əbul Həsən, Qadı və onlardan öncə Cəhmin ardıcıllarından olanlar kimi ən səriştəli şəxslər bunun təməli pozan ziddiyət olduğunu bilmişlər.Onlar demişlər: İnsan yalnız qəlbində olan təsdiq gedəcəyi zaman kafir olur.Onlar şəriətin kafir hökmü çıxardığı hər bir şəxsin qəlbində Allahı və

Peyğəmbəri tanımadığını əsas olaraq tutmuşlar.Bu səbəbdən bir çox dərrakəli insan onların bu sözünə irad tutaraq demişlər: Bu, inadcıllıq və boşboğazlıqdır.

Onlar dedikləri sözə növbəti ayələri dəlil gətirmişlər: "*Allaha və axirət gününə inanan heç bir tayfanın Allah və Onun Peyğəmbəri əleyhinə çıxanlarla -öz ataları, oğulları, qardaşları, yaxın qohumları olsalar belə -dostluq etdiyini görməzsən.*" Onlar demişlər: Buradan çıxan anlam: Əgər biri onun tələbinə uyğun əməl etməzsə onun qəlbində iman sabit olmaz.Dedilər: Əgər deyilərsə ki: Bunun mənası, onlar yetərli və hesaba alınan surətdə iman gətirməzlər yaxud imanın haqqlarını yerinə yetirməz və onun tələbinə uyğun əməl etməzlər, biz deyəcəyik: Bu yalnız dəlil ilə xüsusiləşdirilə biləcək ümumi dəlildir.

Onlara deyiləcək: Bu ayədə Allaha və Peyğəmbərə düşmən kəsilənlərə rəğbət bəsləyənlərdən iman inkar edilir. Habelə orada, Allaha və Peyğəmbərə düşmən kəsilənlərə rəğbət bəsləməyənlərin qəblərinə imanın vacib ediləcəyi və onların ruh ilə güclənəcəyi gəlir.Bu isə imanda, Allahı və Peyğəmbəri qəlbən sevməyin və Allaha və Peyğəmbərə düşmən kəsilənlərə nifrət etməyin labüdlüyünə dair sələfin məzhəbinə dəlalət edir.Habelə həmin ayə Muhammədin Allahın Elçisi olduğuna dair qəlblərdə olan elmin heç bir şey qalmayana qədər yoxa çıxacağına dəlalət etmir.Qəlbə vacib edilmiş iman adicə elm və təsdiqdən ibarət deyil. O, həmçinin qəlb təsdiqi və qəlb əməlidir.

Bu ayə, kafirləri sevəcək möminin olmayacağına dəlalət edir. Məlumdur ki, insanlardan bir çoxu özlərindən bilirlər ki, qəlbdə olan təsdiq Peyğəmbəri təkzib etmir. Lakin bununla bərabər o, bəzi kafirləri sevir. Sələf deyirlər: Zahiri vaciblərin tərk edilməsi qəlbdən vacib imanın getməsinə dəlildir. Lakin bəzən bu, Allahı və Peyğəmbəri sevmək, Allahdan qorxmaq və.s kimi qəlb əməlinin yoxa çıxması ilə olur. Bu isə, qəlbdə heç bir təsdiqin olmadığını gərəkdirmir. Bunlara görə isə, əgər şəriət birindən imanı inkar edərsə bu, onun qəlbində ümumiyyətlə təsdiqdən heç bir şeyin olmadığına dəlalət edəcək. Bir çox dərrakəli insanlara görə bu, boşboğazlıqdır."[512]

Dedim: Artıq qeyd edilmişdir ki, burada vacib iman deyildikdə imanın özəyi qəsd edilir.

[512] Məcmu`əl-fətəva:7/146-148.

## *On dördüncü*: İbnul-Qayyimin sözlərindən dəlil gətirdikləri məqam və bunun izahı

Müxalif, ibnul-Qayimin imanın iki yarıdan, səbr və şükrdən ibarət olma səbəblərinə dair yanaşmaları bəyan etdiyi əsnadaki sözləri dəlil gətirmişdir: "Üçüncü yanaşma: İman, söz və əməldir.Söz, qəlb və dil sözüdür.Əməl isə qəlb və bədən əməlidir.Bunun izahı: Əgər biri qəlbi ilə Allahı tanıyıb dili ilə iqrar etməzsə mömin olmaz.Uca Allah fironun tayfası haqqında buyurur: *"Daxilən möhkəm əmin olduqları halda, haqsız yerə və təkəbbür üzündən onları dandılar."*[513] Habelə buyurur: *"Biz Adı və Səmudu da məhv etdik.Onların başlarına nələr gətirdiyimiz onların məskənlərindən sizə bəllidir. Şeytan (çirkin) əməllərini onlara gözəl göstərib gözləri görə-görə onları haqq yoldan çıxartdı."*[514] Habelə Musa firona demişdir: *"Sən bunların məhz göylərin və yerin Rəbbi tərəfindən açıq-aşkar möcüzə olaraq endirildiyini, sözsüz ki, bilirsən."*[515]

Bunlar bilgi və elm olan qəlb sözünə sahib olmuşlar.Lakin onlar bununla mömin olmamışlar.Habelə qəlbində olmayanı dili ilə deyən şəxs bununla mömin olmamışdır.Üstəlik həmin şəxs münafiqlərdən olmuşdur.Habelə qəlbi ilə bilib dili ilə iqrar edən şəxs sevgi, nifrət, dostluq və düşmənçilik, Allahı və Peyğəmbəri sevmək, Allahın dostlarını dost bilmək, Onun düşmənlərinə düşmən kəsilmək,

---

[513] ən-Nəml:14.
[514] əl-Ənkəbut:38.
[515] əl-İsra:102.

qəlb ilə tək olan Allaha təslim olmaq, Peyğəmbərə tabe olub ona itaət etmək, habelə zahirdə və daxildə onun şəriətini yaşamaq kimi qəlb əməlinə sahib olmayınca adicə qeyd edilənlərlə mömin olmaz.Bunu edəcəyi zaman ona əmr olunanı etməyənə qədər bu, onun imanının kamil olması üçün kifayət etməyəcək.Bu dörd dayaq, üzərində qurulduğu imanın dayağlarıdır."[516]

## Buna iki yöndən cavab veriləcək:

*Birinci*: Biz bunu qəbul edir və deyirik: İnsanın imanı yalnız ona əmr olunanı etməsi ilə kamilləşir.Ancaq bu, bütün əmr olunan əməllərin tərk edilməsinin küfr olmayacağını yaxud daxildə səhih imanla birgə onun tərk edilməsini ifadə etmir.Müxalifin iddia etdiyi sözlər yalnız (məfhum: anlama tərzi) cəhətindən alına bilər.O isə, bu məqamda mötəbər deyil.Çünki burada ona zidd olan açıq-aydın (məntuq: açıq ifadə) vardır.Həmin məntuq ibnul-Qayyimdən nəql olunmuş növbəti sözlərdir: "Heç bir maneə olmadan zahirdə əməlin yoxluğu daxilin fəsada uğramasına və imandan kənar düşməsinə dəlildir.Onun naqısliyi isə imanın naqisliyinə dəlildir."

Habelə demişdir: "Bu, təsdiqin yalnız əməl ilə səhih olacağına dair açıq-aydındır."

Habelə demişdir: "İnsanın qəlbində, itaətlərin yerinə yetirilməsini və günahların tərk edilməsini tələb etməyən qəti imanın yerləşməsi ən ağılasığmaz işlərdən biridir."

Müxalif isə ona bu ağılasığmaz sözü nisbət etmək istəyir!

---

[516] Uddətu-s-sabirin:89-cu səh.

Müxalif həmin yerdə Şeyxul-İslamın növbəti sözlərini diqqətdən qaçırmışdır: "Peyğəmbərə tabe olub ona itaət etmək, habelə zahirdə və daxildə onun şəriətinə riayət etmək".Məgər bu, bütün əməllərin yolxuğu ilə mövcud olur?!

Bəli! Bu, zahir ilə daxil arasında olan bağlılığı isbat etməyən murciələrin firqlələri üçün mövcud və təsəvvür olunandır.

*İkinci*: Sələf və imamlar "kamillik" ifadəsini məqamında vurğulayır və Peyğəmbərə (salləllahu aleyhi və səlləm) imanın Allaha imanı kamilləşdirən edirlər.Habelə qəlb əməlini təsdiq və dil ilə tələffüzü kamilləşdirən edirlər.Bu səbəbdən, adicə kamillik vəsfi, vəsf olunanı tərk etməyin küfr olmadığına dair hökm verməyə kifayət etmir.Buna bənzər imam Şafiinin sözləridir: "Əgər insan Ona iman gətirib Peyğəmbərə iman gətirməzsə o, bununla birgə Peyğəmbərə (salləllahu aleyhi və səlləm) iman gətirməyincə imanın kamilliyi adı ona heç vaxt şamil olunmayacaq."[517]

---

[517] Əhkəmul quran:1/27, əş-Şəfii.

## *On beşinci*: İmam ibn Əbul İzz əl-Hənəfinin sözlərindən dəlil gətirdikləri məqam və bunun izahı

Müxalif ibn Əbul İzzin "şərhu-t-tahaviyyə" kitabındaki sözlərini dəlil gətirmişdir: "Artıq icma etmişlər ki, əgər biri qəlbi ilə təsdiq edib dili ilə iqrar edər lakin bədən əzaları ilə əməl etməkdən imtina edərsə həmin şəxs Allaha və Peyğəmbərə asikar olub cəzaya layiq olar."[518]

Müxalif ibn Əbul İzzin əməli tərk edənin kafir olmayacağına Əhli sunnədən icma hekayət etdiyinə dair yanlış fikir yaratmaq istəmişdir.

Əslində isə ibn Əbul İzzin sözlərində bütövlüklə bədən əməlini tərk edənin qurtulacağına dair sözə güc qatan heç bir amil yoxdur.Bunun bəyanı bir neçə yöndən gəlir:

***Birinci***: İbn Əbul İzz demişdir: "Həmin şəxs Allaha və Peyğəmbərə asikar olub cəzaya layiq olar".Bu sözlər onun kafir olması hökmünə zidd gəlmir.Kafir, müşrik və münafiqdən hər biri Allaha və Peyğəmbərə asikar olub cəzaya layiq olmuşlar.

*İkinci*: Əgər onun "asikar" sözü həmin şəxsin kafir olmayacağı və bunların anladığı kimi bütövlüklə bədən əməlinin tərk edilməsi haqqında sözə aid edilməsi kimi izah

[518] Şərhu-t-tahaviyyə:2/509.

edilərsə, belə olan halda həmin icma batil olar.Çünki namazı tərk edənin təkfirinə dair fəqihlərin ixtilafını və dörd dayağı tərk edənin təkfir ediləcəyinə dair sələfin ixtilafını bilən şəxs bunun batilliyində şübhə etmir.

Onların izahına əsaslansaq, Əhli sunnənin namazı tərk edənin təkfir edilməyəcəyinə və dörd dayağı tərk edənin təkfir edilməyəcəyinə icma etdikləri deyilməlidir.

Bu məsələlərə cüzi nəzər yetirən şəxs üçün bunun batil olması heç də gizli deyil.Üstəlik namazı tərk edənin təkfir ediləcəyi görüşü sələf və hədis əhlinin cumhurunun sözü-dür.

Bir sözlə, burada "tahaviyyə"nin şərhçisi yanlış və xətalı, habelə məlum və məşhur olan sözə nisbət edilir. Müxalifin öz anlama tərzini qınaması daha münasib olardı. Habelə gərək o, "asikar" sözünün küfr hökmü ilə heç bir ziddiyət təşkil etmədiyini dərk etsin.

*Üçüncü*: İbn Əbul İzz (rahiməhullah) bu sözləri Əbu Hanifə ilə cumhur arasında baş vermiş ixtilafın formal ixtilaf olmasını vurğulamaq üçün demişdir.O, demişdir: "Artıq icma etdilər".Yəni, hənəfilər digər Əhli sunnə ilə əməli tərk edənin Allaha və Peyğəmbərə asikar olacağına və cəzaya layiq olacağına dair icma etmişlər.Bununla da, o, hənəfilərin aşırıya varmış murciələrin sözlərini demələri haqqında yanlış fikiri dəf etmək istəmişdir.Çünki onların əməli imanın anlamından çıxardığına və iman əhlinin onun özəyində bərabər olduqlarına dair sözü görən şəxs onlar haqqında

onların imanla birgə günahın zərər verməyəcəyini və asikarların cəzaya məruz qalmayacaqlarını demələrini düşünə bilər.Bu səbəbdən, onların əməlin məqamına qiymət vermələri, onu tərk edənin günahkar olması və cəzaya məruz qalması məsələlərində Əhli sunnə ilə birgə olduqlarını bəyan etmişdir.

Habelə bundan öncə o, zahir ilə daxil arasında olan bağlılığı isbat edəcəkləri halda onlarla olan ixtilafın formal olacağını bəyan etmişdir.

İbn Əbul İzz (rahiməhullah) demişdir: "Əbu Hanifə ilə Əhli sunnənin digər imamları arasında olan ixtilaf formal ixtilafdır.Çünki böyük günah sahibinin imandan çıxmayacağı və Allahın məşiəti altında olacağı, -istəsə onu əzaba düçar edər istəsə bağışlayar- məsələsində yekdil olmaları ilə birgə bədən əməllərinin qəlb imanının zəruri amili yaxud imandan bir hissə olması etiqadın fəsada uğraması ilə nəticələnməyən ləfzi çəkişmədir.Namazı tərk edənin kafir olacağını deyənlər bu əsasa digər dəlilləri əlavə etmişlər. Peyğəmbər (salləllahu aleyhi və səlləm) isə zinakar, oğru, şərab içən və qarətçidən imanı inkar etmişdir.Ancaq bu, yekdilliklə bütövlüklə onlardan iman adının getməsini vacib etməmişdir.Uca Allahın qullarından söz və əməli istəməsinə dair Əhli sunnə arasında ixtilaf yoxdur.Söz deyildikdə qəlb ilə təsdiq və dil ilə iqrar qəsd edilir.Onlar iman söz və əməldir dedikləri zaman məhz bu qəsd edilir.

Lakin insanlardan tələb olunan bu məsələ iman adını şamil edirmi?

Yoxsa iman onlardan biri, yəni tək sözdür.Əməl isə ondan ayrıdır və fərdi şəkildə qeyd edildiyi zaman iman adı onu şamil etmir.Birlikdə qeyd edildiyi zaman isə məcazi şəkildə daxil edilir? Çəkişmə mövzusu məhz budur.

Artıq icma etmişlər ki, əgər biri qəlbi ilə təsdiq edib dili ilə iqrar edər...v.s".[519] Artıq yuxarıda qeyd edilmişdir.

Bu sözlərdə murciələr və xəvariclərə rəddiyə vardır. Belə ki, Əhli sunnə ilə çəkişməsi həqiqi olan murciələr bədən əməlini qəlb imanının bir hissəsi və zəruri amili hesab etmir və sadəcə qeyd edildiyi kimi onun imanın səmərəsi olduğunu hesab edirlər.Səmərədən fərqli olaraq "ləzim"in yoxluğu "məlzum"un yoxluğunu gərəkdirir.

Heç şübhə yoxdur ki, bütün bədən əməlləri olmayacağı zaman iman olmayacaq.Bu, Əhli sunnənin icma etdiyi və qeyd edilən "təlazum" qaydasının tələb etdiyi məsələdir. Lakin əməllərin hissə yaxud zəruri amil olmasından ayrı-ayrı əməllərin tərk edilməsi səbəbilə təkfir hökmünün çıxarılması hesab edilə bilər.Bu səbəbdən, şərhçi böyük günah sahibinin hökmünü və onun məşiət altında olduğuna və onun, xəvariclərin dediyinə əks olaraq kafir olmadığına diqqət çəkmişdir.Daha sonra o, ayrı-ayrı əməllərin təkfir edilməsindən olacağı halda belə namazı tərk edənin təkfir ediləcəyinə toxunub bunun, xəvariclərin etiqad etdiyi kimi imanın bir qismi gedəcəyi zaman imanın bütövlüklə gedəcəyinə dair sözdən fərqli olaraq digər dəlillər üzərində qurulduğunu bəyan etmişdir. Müəllif (rahiməhullah) bu dəyərli

[519] Şərhu-t-tahaviyyə:2/508.

sözlərdə müxtəsər ifadələr işlədərək bir sıra məsələlərə işarə etmişdir.

Əhli sunnə ilə, zahiri əməlin daxili imanın bir hissəsi deyil zəruri amil olduğunu deyən hənəfilərlə olan ixtilafın çoxunun yaxud bütövlüklə formal olduğuna qəti əminlik ifadə edənlərdən biri də, bir sıra yerdə bunu qeyd edən Şeyxul-İslam ibn Teymiyyədir.Habelə bu, ibn Əbul İzzin burada seçdiyi görüşdür.Yerdə qalan, bu bidət sözü inkar etmək vacibliyidir.Çünki "məhz Quran və sunnəyə uyğun gələn ləfz doğrudur.Heç bir şəxs Allahın və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) sözünə zidd söz danışmalı deyil. Xüsusən qeyd edilməlidir ki, artıq bu, murciələr və qeyrilərindən olan kəlam əhlinin bidətlərinə və günahların çoxalmasına yol açmışdır.Ləfzdə olan bu yüngül xəta etiqad və əməllərdə olan böyük xətaya səbəb olur.Bu üzdən irca fikrinə böyük iradlar tutulmuşdur. Hətta İbrahim ən-Nəxai (rahiməhullah) belə demişdir: Onların, yəni murciələrin bu ümmətə olan fitnəsi Əzariqanın fitnəsindən daha qorxuludur."[520]

*Dördüncü*: Şərhçinin "təlazum" məsələsinin isbatına dair çox gözəl sözləri vardır.İbn Əbul İzz (rahiməhullah) demişdir: "Heç şübhəsiz ki, bədən əzalarının itaətsizliyi qəlb itaətsizliyini gərəkdirir.Çünki əgər qəlb itaət edib tabe olsaydı bədən əzaları həmçinin itaət edib tabe olardı.Qəlbin itaətsizliyi və tabe olmaması itaəti gərəkdirən təsdiqin yoxluğunu gərəkli edir.Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir:

[520] Məcmu`əl-fətəva:7/394.

“Ağah olun ki, bədəndə bir ət parçası vardır ki, o, düzələcəyi zaman bütün bədən düzəlir, o, pozulacağı zaman isə bütün bədən pozulur.Agah olun ki o, qəlbdir.”[521] Bu səbəbdən qəti deyiləcək ki, əgər birinin qəlbi düzələrsə bədəni həmçinin düzələcək.Əksi isə fəqlidir.”[522]

Habelə demişdir: “Çünki qəlbdə yer alan tam təsdiq qəlb və bədən əməllərindən vacib olanı gərəkdirir.Çünki bu, tam imanın zəruri amilləridir.”Ləzim”in yoxluğu isə “məlzum”un yolxuğuna dəlildir.

Biz deyirik: Bu zəruri amillər bəzən ləfzin anlamına daxil olur bəzən isə ondan xaric olur.Yaxud ləfz (ərəb) dilində mənasında qalmış lakin şəriət sahibi ona əhkamlar əlavə etmişdir.Yaxud şəriət sahibi onu məcazi mənada istifadə etmişdir.Belə olan halda o, şər`i həqiqət, dil baxımından məcazdır.Yaxud şəriət sahibi onu dəyişmişdir.Bütün bu sözlər, düz yolda olanların sözləridir.”[523]

Bu məqam “tam iman”ın “səhih iman” mənasında istifadə edildiyinə dair öncə qeyd etdiklərimi təsdiq edir.Çünki “tam” sözünün burada “kamil” kimi izah edilməsi doğru deyil.Çünki belə olan halda qəlb və bədən əməlinin yoxluğu ilə birgə təsdiqin qalması və səhih olması gərəkli olur.Buna diqqət yetir!

---

[521] Yuxarıda qeyd olunub.
[522] Şərhu-t-tahaviyyə:2/521.
[523] Öncəki mənbə:2/518.

## *On altıncı*: İbn Rəcəb əl-Hənbəlinin sözlərindən dəlil gətirdikləri məqam və bunun izahı

İbn Rəcəb (rahiməhullah) demişdir: "Məlumdur ki, cənnətə daxil olmağa yalnız dil şəhadəti ilə birgə qəlbi ilə təsdiq edən şəxs layiq olur. Məhz bu ikisi ilə atəşdən çıxanlar çıxıb cənnətə girəcəklər."[524]

Habelə şəfaət hədisini qeyd etdikdən sonra demişdir: "Burada gələn: "heç vaxt xeyir etmədilər" sözü, tövhidin özəyinə sahib olsalar belə bədən əməllərinə aid edilir. Bu səbəbdən ölümündən sonra öz yaxınlarına yandırılmasını vəsiyyət edən şəxsin hədisində gəlmişdir: "Tövhiddən savayı heç vaxt xeyir etməmişdir." Buna, Ənəsin (r.a) hədisində Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) şəfaət haqqında gələn rəvayət şahildik edir: Mən deyəcəm: Ey Rəbbim! "Lə iləhə illəllah" demiş insanlardan ötrü mənə izn ver. O, deyəcək: İzzətimə, Cəlalıma, Təkəbbürlüyümə və Əzəmətimə and olsun ki, Mən "lə iləhə illəllah" deyənləri oradan çıxardacam". Hədisi Buxari və Muslim rəvayət etmişlər. Muslimin ləfzi: "Bu sənə aid deyil yaxud bu sənin işin deyil,-deyəcək". Bu isə, hər hansı bir məxluqun şəfaəiti ilə deyil məhz Allahın rəhməti ilə oradan çıxanların heç vaxt bədən əzaları

[524] Fəthul bəri:1/121, ibn Rəcəb.

ilə xeyir etməmiş tövhid kəlməsinə sahib olan şəxslər olduğunu göstərir."[525]

***Buna bir neçə yöndən cavab veriləcək:***

***Birinci***: Artıq mən "heç vaxt xeyir etmədilər" hədisinə dair cavabda qeyd etmişəm ki, elm əhlindən bəzisi bu hədisin, imanın söz və əməl olduğuna dair açıq-aşkar nasslara və saleh sələfin icmasına uyğun gələn xüsusi bir hala aid edildiyini hesab etmişlər.Bu halda hədis, tərk edilməsini qaçılmaz edən hər hansı bir üzr yaxud səbəb üzündən heç vaxt xeyir etməyən şəxslərin cəhənnəmdən çıxacağına dəlalət edəcək.Bu, irca firkinə dair müfəssəl fətvasında daimi komitənin seçdiyi görüş olmuşdur."21436-cı saylı fətva, tarix: 8/4/1421 hic. Həmin fətvada gəlmişdir: "Hədisdə heç vaxt xeyir etməyən şəxslərin cənnətə girəcəyi haqqında gələn, qadir olduğu halda əməli tərk edən hər bir şəxs üçün ümumi deyil.Bu, yalnız əməl etməyə mane olan üzr səbəbilə yaxud bu mövzuda açıq-aşkar nasslara və saleh sələfin icmasına uyğun gələn digər mənalar səbəbilə (əməli tərk edənə) xas edilir."

Buna rəğmən artıq mən digər yanaşmalarda həmin hədisin və şəfaət hədisinə dair gələn digər rəvayətlərin dəlalət etdiyi kimi qeyd edilən şəxslərin namaz əhlindən olduqlarını isbat etmişəm.Habelə mən, səhih Buxari və digər kitablarda sabit olduğu kimi "cəhənnəmlilər"in Peyğəmbərin (salləllahu aleyhi və səlləm) şəfaəti ilə çıxacaqlarını bəyan etmişəm.

[525] ət-Təxvifu minə-n-nər:285.

Hədisin şərhçilərindən və qeyrilərindən həmin "cəhən-nəmlilər"in bədən əməllərindən heç bir şey etmədiklərini yaxud cəhənnəmdən heç vaxt xeyir etməyən şəxslərin çıxaca-ğını deyənlərin sözləri imkan olan yerdə bütövlüklə həmin əməlin tərk edilməsinin küfr olmadığına dəlil deyil.Çünki onların bunu, bədən əməli olmadan söz və təsdiqin yetərli olmayacağına dair sələfin icma etdiyi məsələdən istisna edil-miş xüsusi bir hala aid etmələri ehtimalı qalır.

Buna şahidlik edən ən gözəl amil, daimi komitədən olan alimlərimizin məsləkidir.Artıq onlar həmin hədisi xüsusi hala, əməl etməyə mane olan üzr səbəbilə onu tərk edənlərə aid etmişlər.Bununla bərabər onlar imanda əməlin labüdlü-yünə qəti əminlik ifadə etmiş və qüdrət və imkan olan halda əməli tərk edənin müsəlman olduğunu deyən söz üzərində qurulan bəzi kitablardan çəkindirmiş və həmin kitabları yaramaz murciəliyə nisbət etmişlər.

Bu səbəbdən, həmin şəxslərin bədən əməllərindən heç bir şey etməyənlər olduğunu deyən ibn Rəcəb yaxud qeyrisi kimi hədis şərhçilərindən bu cür sözlərə rast gələn elm tələbəsi üçün bu sözlər müəmmalı qalmasın.Həmin hədisin adicə bu cür izah edilməsi imkan olan və heç bir maneə olmayan halda bütövlüklə bədən əməlini tərk edən şəxsin müsəlman olduğunu deyən murciələrin məzhəbini mənim-səməsi demək deyil.

Ancaq qayda qoymaq və müxalifin müdafiə etdiyi məz-həbi təsdiq etmək üçün həmin hədisi dəlil gətirən şəxsə yer

üzünün bütün nöqtələrindən ağız dolusu deyiləcək: Artıq sən murciələrin sözünü müdafiə etdin!

*İkinci*: İbn Rəcəb demişdir: “Məlumdur ki, cənnətə daxil olmağa yalnız dil şəhadəti ilə birgə qəlbi ilə təsdiq edən şəxs layiq olur.Məhz bu ikisi ilə atəşdən çıxanlar çıxıb cənnətə girəcəklər.”

Mənim, qəlb əməlini tərk etməyin küfr olduğunu qəbul etməsi ilə birgə bu sözləri dəlil gətirib onu iqrar edən şəxslərin halına təəccübüm tükənmir!

Sən bu şəxslərin əbədi cəhənnəmdən xilas olmaq üçün bədən əməlini şərt qoymayan hər bir nəqlin, hətta əgər həmin nəql qəlb əməlini belə şərt qoymursa arxasınca düşdüyünü görə bilərsən.

Həqiqətən də, bu şəxslərin qəlb əməlinin şərt olduğunu deməléri və bundan tutunmaları bir qədər qəribə görünür. Lakin qorxuram elə bir gün gəlsin ki, növbəti sözləri deyən şəxsləri görək: Əgər biri söz və təsdiqə sahib olarsa o, məşiət altında olan və qurtulmuş müsəlmandır.

Bu, heç şübhəsiz ki, onların məzhəbinin zəruri nəticəsidir.Çünki bədən əməli olmadan qəlb əməlinin varlığı qeyri-mümkündür.

Habelə onların dəlil gətirdikləri nassların heç birində qəlb əməli qeyd edilmir.

İbn Rəcəbin sözlərində isə müxalifin qeyd etmədiyi əlavə vardır.O, orada deyir: "Öncə qeyd edildiyi kimi məhz bu ikisi ilə atəşdən çıxanlar çıxıb cənnətə girəcəklər."

Öncə qeyd edilən sözlər isə bunlardır: "Tövhid kəlməsi və qəlb imanı zülm səbəbilə haqq sahiblərinin bölüşdürməyəcəyi təsdiqdir.Üstəlik o, sahibinə qalacaq.Çünki əgər haqq sahibləri onu öz aralarında bölüşdürsəydilər tövhid əhlindən bəziləri cəhənnəmdə əbədi qalar və qəlbində olan təsdiqdən və dili ilə dediyi şəhadətdən məhrum edilərdilər. Tövhid əhlindən olan asikarlar yalnız bu iki şeylə cəhənnəmdən çıxacaqlar."[526]

Tövhid əhlinin cəhənnəmdən dil şəhadəti və qəlb təsdiqi ilə çıxacaqlarına dair onun sözləri həmin şəxslərin Uca Allahın hüzuruna əməlsiz gələcəklərini ifadə etmir!

O, yalnız haqq sahiblərinin onun əməllərini bölüşdürəcəyini və həmin şəxsə təsdiq və sözün qalacağını qəsd etmişdir.Çünki əgər onlar təsdiq və sözü həmçinin aralarında bölüşdürsəydilər həmin şəxs həlak olardı.

Qəlində cüzi, cüzi zərrə qədər imanı olan şəxsin cəhənnəmdən çıxacağı kimi nasslarda gələni dəlil gətirən şəxsə həmcinin bunun mislində olanı deyiləcək.Bu, heç şübhəsiz ki, haqqdır.Habelə bu, həmin şəxslərin haqq sahibləri tərəfindən aralarında bölüşdürəcəkləri əzəmlətli əməllərə sahib olmalarını inkar etmir.Habelə onların namaz əhlindən olmalarını inkar etmir.Habelə müxalifin iqrar

[526] Fəthul bəri:1/95, ibn Rəcəb.

etdiyi kimi bu, onların sevgi, tabeçilik, qorxu, ümid və digər zəruri qəlb əməllərinə sahib olmalarını inkar etmir.Bu səbəbdən ibnul-Qayyim demişdir: "Bu hədisdə gələn xeyir, Allaha və peyğəmbərlərə imandır.Digər ləfzdə gəldiyi kimi: "İmandan cüzi, cüzi, cüzi zərrə qədər." O isə, peyğəmbərləri təsdiq etmək, habelə qəlb və bədən əzaları ilə onlara tabe olmaqdır."[527]

Məhz bu səbəbdən, namazı tərk edənin küfrünü deyən sələfin cumhuruna bu hədislər müəmmalı qalmamışdır.Artıq yuxarıda bunun ətraflı izahı qeyd edilmişdir.

*Üçüncü*: İbn Rəcəbin sözlərindən zahir olan, onun namazı tərk edənin kafir olduğunu deməsidir.Bu isə, birbaşa həmin məsələdə müxalifin etimad etdiyi məqamı puç edir və "cəhənnəmlilər"in bədən əməllərindən heç bir şey etmədikləri haqqında hökmün qayda edilməyəcəyinə və bununla bəzən xüsusi bir halın qəsd ediləcəyinə dair qeyd etdiklərimi təsdiq edir.

İbn Rəcəb (rahiməhullah) demişdir: "Əsas məqsəd İslamı binaya bənzətməkdir.Həmin binanın dayağları isə bu beşdir.Bina isə yalnız onunla sabit olur.İslamın digər xislətləri isə sanki onu tamamlayan şeylərdir.Onlardan bir şey itəcəyi zaman bina nöqsanlı olub duruş gətirəcək və həmin şeylərin azalması ilə nöqsana uğramayacaq.Həmin beş dayaq isə fərqlidir.İslam, heç şübhəsiz ki, bütövlüklə onun yoxa çıxması ilə yoxa çıxır.Habelə şəhadətin olmaması ilə

---

[527] Şifəul alil:2/714.

yoxa çıxır. Şəhadət deyildikdə isə, Allaha və Peyğəmbərə iman qəsd edilir.

Namazın qılınması məsələsinə gəldikdə isə onu tərk edənin İslamdan çıxacağına dəlalət edən çoxsaylı hədislər varid olmuşdur. Səhih Muslimdə Cabirdən (r.a) rəvayət edilir ki, Peyğəmbər (salləllahu aleyhi və salləm) demişdir: "Kişi ilə küfr və şirk arasında namazın tərki durur." Habelə buna bənzər Bureydə, Səubən, Ənəs və qeyrilərinin rəvayətləri gəlmişdir.

Muhamməd bin Nəsr əl-Mərvəzi Ubadə bin Samitin (r.a) hədisindən Peyğəmbərin (salləllahu aleyhi və salləm) belə dediyini rəvayət edir: "Namazı qəsdən tərk etmə! Həqiqətən də, əgər biri namazı qəsdən tərk edərsə İslamdan çıxar." Habelə Muazın (r.a) hədisində Peyğəmbər (salləllahu aleyhi və salləm) demişdir: "İşin başı İslamdır.Onun dirəyi isə namazdır." O, namazı sanki yalnız onunla duruş gətirəcək və onunla sabit olacaq çadırın dirəyi etmişdir.Əgər dirək çökərsə çadır həmçinin çökəcək və onsuz sabit qalmayacaq."

Daha sonra Ömər, Sa`d və Əlidən, habelə Abdullah bin Şəqiq və Əyyub Səxtəyanidən gələn əsərləri qeyd etdi.

Ardından demişdir: "Bu görüşü sələf və xələfdən bir camaat seçmişdir.Habelə bu, ibn Mubarək, Əhməd və İshaqın sözüdür.İshaq buna dair elm əhlinin icmasını hekayət etmişdir.Muhamməd bin Nəsr əl-Mərvəzi demişdir: O, hədis əhlindən olan cumhurun sözüdür."[528]

---

[528] Cəmiul ulum val hikəm:44-cü səh.Üçüncü hədisin şərhi.

İbn Rəcəb yuxarıda keçən sözləri nəql etdikdən sonra isə buna müxalif olan görüşə və onların dəlillərinə toxunmamışdır.[529]

Həmçinin: İbn Rəcəb (rahiməhullah) Huzeyfənin (r.a) bir kişini rukü və səcdəni tamamlamadığını gördüyü zaman: "Namaz qılmadın.Əgər belə ölərsənsə Allahın Peyğəmbərə (salləllahu aleyhi və səlləm) əta etdiyi fitrət üzərində ölməyəcəksən.",-sözlərini şərh edərkən demişdir: "Doğru olan, bunun Huzeyfənin sözü olmasıdır.Lakin həmin sözlər, Muhammədin (salləllahu aleyhi və səlləm) fitrəti qeyd edildiyi üçün mərfu` hökmündədir."

Habelə demişdir: "Artıq hədislər namazda rukü və səcdəni tamamlamağın vacib olduğuna və onu tərk etməyin haram olduğuna dəlalət etmişdir.Əgər belə olmasaydı onu tərk edən dindən çıxmış olmazdı.Üstəlik bu, onu tərk edənin namazı tərk etdiyinə dəlalət edir.Çünki insan namazı tərk etmədən dindən çıxmır.Peyğəmbərin (salləllahu aleyhi və səlləm) hədisində gəlmişdir: "Kişi ilə küfr arasında namazın tərk edilməsi durur." Digər rəvayətdə: "Əgər biri onu tərk edərsə kafir olar."[530]

Bu sözlər onun namazı tərk edəni təkfir etdiyini açıq göstərir.

---

[529] Mənhəcul hafiz ibn Rəcəb fil aqidə:387.

[530] Fəthul bəri:5/50,52, ibn Rəcəb.

## *On yeddinci*: Hafiz ibn Həcər əl-Asqələninin sözlərindən dəlil gətirdikləri məqam və bunun izahı

Hafiz "əl-fəth" əsərində demişdir:

"Buradaki sözlər iki məqam ətrafındadır: Birinci: Onun söz və əməl olmasıdır.İkinci: Onun artıb azalmasıdır.

Söz deyildikdə iki şəhadətin dilə gətirilməsi qəsd edilir. Əməl deyildikdə isə etiqad və ibadətlərin daxil olması üçün qəlb və bədən əməllərindən daha ümumi olanı qəsd edilir.

Bunu imanın tərifinə daxil edən və onu inkar edən şəxslərin qəsdi yalnız Uca Allah qatında olana nəzər yetirmək etibarı ilə olur.

Sələf demişlər: O, qəlb ilə etiqad, dil ilə söz və bədən əzaları ilə əməldir.Onlar bununla əməllərin onun kamilliyi üçün şərt olduğunu qəsd etmişlər.Məhz buradan qeyd ediləcəyi kimi onların artma və azalmaya dair sözləri ortaya gəlmişdir.

Murciələr demişlər: O, yalnız etiqad və tələffüzdür.

Kərramilər demişlər: O, yalnız tələffüzdür.

Mötəzililər demişlər: O, əməl, tələffüz və etiqaddır.Onlarla sələf arasında olan fərqləndirici cəhət isə onların əməl-

ləri səhihlik şərti etmələridir.Sələf isə onu kamillik şərti etmişlər."[531]

Müxalif bunun Əhli sunnənin məzhəbi olduğunu iddia etmiş və buna dəlil olaraq şeyx ibn Bəzin "fəthul bəri" kitabına verdiyi izahda bunu iqrar edib buna irad tutmadığını göstərmişdir.

***Buna bir neçə yöndən cavab veriləcək:***

*Birinci*: Bu sözlərin sələfə nisbət edilməsi doğru deyil. Onlardan heç birindən onun əməli kamillik şərti etməsi bilinmir.Əslində bu, qeyd edildiyi kimi əşarilərin etiqadıdır.

*İkinci*: Artıq bədən əməli olmadan söz və təsdiqin yetərli olmayacağına dair icma qeyd edilmişdir.Bu icmaya müxalif olanın sözləri isə dəyərini itirir.

*Üçüncü*: Hafizin sözlərini Əhli sunnənin bu mövzuda qeyd etdikləri ilə ziddiyət təşkil etməyəcək gözəl yanaşmaya aid etmək mümkündür.Belə ki, şeyx Abdullah bin İbrahim əz-Zahim (hafizahullah) demişdir: "Burada mən, Hafiz ibn Həcərin (rahiməhullah) imanın tərifinə dair Əhli sunnənin sözü ilə mötəzililərin sözü arasında fərq qoymaq istədiyi zaman işlətdityi ifadəyə diqqət çəkmək istərdim.O, demişdir... Çünki bəzi möhtərəm insanlar bütün saleh əməllərin sələfə görə kamillik şərti olduğunu anlaya bilər.Bu isə, bu mövzuda sələfin sözlərini ayırd etmək gücündə olmayan bir çox elm tələblələrinin düşdüyü xətalı fikirdir.Çünki sələfə görə həmin ifadə ilə əməllərin cinsi, yəni bütün saleh

[531] Fəthul bəri:1/61, ibn Həcər.

əməllərin onlara görə imanın kamillik şərti olması deyil yalnız ayrı-ayrı əməllər qəsd edilir. Mötəzililər isə fərqlidir. Onlar hər bir əməlin imanın səhihlik şərti olduğunu hesab edirlər. Çünki sələfə görə iman itaətlə artır və asiliklə azalır. Onlar əməllərin cinsinin imanın kamillik şərti olduğunu qəsd etməmişlər. Çünki bu, əməlsiz imanın səhih olacağını tələb edir. Bu isə, Əhli sunnənin sözü deyil, murciələrin sözünün zəruri amilidir."[532]

*Dördüncü*: Şeyx ibn Bəz (rahiməhullah) Hafizin dediyi bu sözlərə irad tutmuş və onun Əhli sunnəyə nisbət etdiyi həmin sözlərin əslində murciələrin sözü olduğunu bəyan etmişdir. O, bu sözləri "əl-mişkət" jurnalına verdiyi müsahibədə demişdir. Orada gəlmişdir: "Xeyir, xeyir! O, kamillik şərti deyil. O, hissədir, imanın bir hissəsidir. Bu, murciələrin sözüdür. Murciələr imanın yalnız söz və təsdiq olduğunu hesab edirlər. Digərləri isə deyirlər ki, iman, bilgidir. Bəziləri isə deyirlər: İman, təsdiqdir. Bütün bu sözlər, yanlışdır."[533]

*Beşinci*: Habelə şeyx ibn Bəz (rahiməhullah) şeyx Əli bin Abdul-Əziz əş-Şiblin Hafizin sözlərinə düzəlişini iqrar etmişdir. Orada gəlmişdir: "Doğru olan, saleh sələfə görə əməllərin bəzən imanın səhihliyi üçün şərt olmasıdır, yəni əməllər imanın gerçəyinə daxildir. Bəzən namaz kimi əməllərin yoxluğu zaman iman yoxa çıxır. Bəzən isə əməllər imanın vacib kamilliyi üçün şərt olur və tərk edilməsi küfr

---

[532] Şeyxin «ət-tibyən lialəqatil aməl bimüsəmməl imən" adlı kitaba təqdimatına bax.

[533] Bu araşdırmaya bax. Şeyxin orada Hafizin sözlərinə izah gətirmədiyi üçün üzürlü olması bəyan edilir.

deyil günah və asilik olan digər əməllərdə olduğu kimi həmin əməllərin yoxluğu imanı zəiflədir.Sələfin sözünü anlamaq və onların sözünü "vaidiyyə"nin sözü ilə qarışıq salmamaq üçün bu təfsilatın olması labüddür.Bununla bərabər Əhli sunnə vəl cəmaata görə əməl imanın üç dayağından biridir: Söz, əməl və etiqad. Xəvaric və mötəzililərə əks olaraq onlara görə iman, artır və azalır. Müvəffəq edən Allahdır."[534]

Diqqət çəkən məqam, həmin yerin "fəthul-bəri" kitabında etiqadı müxaliflik olan yerlərdən biri və əməlin imanın dayağlarından biri olmasına dəlil hesab edilməsidir.

*Altıncı*: Şeyx ibn Həcərin sözlərinin tənqid edilməsi və Əhli sunnənin etiqadının bəyan edilməsi məsələsində bundan daha qabarıq və aşkar sözləri iqrar etmişdir.Belə ki, şeyx ibn Bəz şeyx Ulvi bin Abdul-Qadir əs-Səqqafın yazdığı kitaba müsbət rəy bildirmişdir.Müəllif həmin kitabda Hafizin sözlərini nəql edib onun sözünü izah etmişdir.O, sətir altında onun sözlərinə açıqlama gətirərək demişdir: "Onun bu sözlərinə bir sıra iradlar vardır.İradların ən önəmlisi, sələfə görə əməllərin imanın kamillik şərti olmasıdır. Onun istifadəsinə uyğun olaraq bu, doğru deyil.Həmin məsələdə təfsilat vardır: Əməlin cinsi yaxud şəhadət yaxud namazın tərk edilməsi kimi tərk etmə ilə əlaqəli olsun yaxud bütə səcdə etmək yaxud Allahdan qeyrisinə qurban kəsmək kimi icra etmə ilə əlaqəli olsun, insanı kafirə çevirən əməllər

[534] ət-Tənbih aləl muxaləfətil aqadiyyə fi fəthil bəri:28-ci səh.

imanın səhihliyi üçün şərtdir.Küfrdən aşağı olan günahlar isə kamillik şərtidir."[535]

*Yeddinci*: Şeyx Abdur-Rahmən əl-Bərrak (hafizahullah) Hafizin sözünü tənqid edib onun qeyd etdiyi sözlərin sələfə və mötəzililərə nisbət edilməsinin səhih olmadığını bəyan etmişdir.

Şeyx (hafizahullah) demişdir: "O, demişdir: Onlarla sələf arasında fərqləndirici xüsusiyyət...v.s".Mötəzililər ilə sələf arasında olan bu fərq, istər səhihlik şərti yaxud kamillik şərti ilə əməlin cinsi yaxud əməlin vacib növləri yaxud vaciblər və müstəhəblər qəsd edilsin düzgün deyil.Müstəhəb əməllər müstəhəb imanın kamilliyindəndir.Bu səbəbdən, o, imanın səhihlik şərti və onun vacib kamilliyi ola bilməz.

Vacib əməllərin hamısı isə bütün Əhli sunnəyə görə imanın səhihlik şərti deyil.Çünki Əhli sunnədən bəzilərinə görə namaz kimi əməllər imanın səhihlik şərtidir.

Mötəzililərin, habelə xəvariclərin məşhur məzhəbinə əsasən isə tərk edilməsi böyük günah olan hər bir şey imanın səhihlik şərtidir.Bu üzdən belə demək doğru olmazdı: Onlara görə əməlin cinsi imanın səhihlik şərtidir.Çünki bu, onlara görə imandan çıxmağı gərəkdirən amilin bütün əməllərin tərk edilməsi olduğunu tələb edir.Əslində isə belə deyil.Üstəlik onlarda sabit olan qaydaya görə insan hər hansı bir böyük günah işlətməklə imandan çıxır.

---

[535] ət-Təvəssut val iqtisad fi ənnəl kufra yəkunu bil qaul əvil fi`l əvil i`tiqad:71-ci səh.

Sələfə görə isə bədən əməli qəlb əməlinə tabedir.Qəlb əməlinin cinsi imanın səhihliyi üçün şərtdir.Bədən əməlinin cinsi qəlb əməlinə tabedir yaxud onun zəruri amilidir.” Ləzim”in yoxluğu “məlzum”un yoxluğunu gərəkli edir. Çünki bütün əməllərdən üz çevirmə qəlb tabeçiliyinin yoxluğuna dəlalət edir.

Belə ki, mən sələf imamlarından kiminsə əməllərin şərt olduğuna yaxud imanın səhihlik yaxud kamillik şərti olmadığına dair bir söz demələrini bilmirəm.Onlardan nəql olunan məşhur söz onların belə deməlləridir: İman, söz və əməldir yaxud söz, əməl və niyyətdir.Bununla onlar əməlləri iman anlamından çıxaran və imanı təsdiq yaxud təsdiq və dil ilə iqrarla xüsusiləşdirən murciələrə rəddiyə vermək istəmişlər.

Bununla da, mötəzililərə görə əməllərin imanın səhihlik şərti olmasına, sələfə görə isə kamillik şərti olmasına dair Hafizin qeyd etdiyi sözlərin doğru olmadığı bəlli olmuşdur.”[536]

*Səkkizinci*: Hafiz ibn Həcər əl-Asqaləninin əqidəyə dair mənhəcini araşdıran tədqiqatçı Muhamməd İshaq Kəndu qardaş onun bu sözlərini rədd etmişdir.O, demişdir: “Lakin orada, əməlin iman anlamına daxil olması ilə sələfin nəyi qəsd etdiklərinə dair Hafizin qeyd etdiyi sözlərdə bir mülahizəyə işarə etmək qalır.O, demişdir: “Onlar bunu dedikdə əməllərin onun kamilliyi üçün şərt olduğunu qəsd etmişlər.” Bu söz, doğru deyil.Çünki sələfdən hər hansı birinin bunu

[536] Fəthul bəri, tə`liqatu-ş-şeyx Abdur-Rahmən əl-Bərrak:1/94.

deməsi bəlli deyil.Sələf imana verdiyi tərifdə əməli qeyd etməklə yalnız əməlin ondan bir hissə olduğunu qəsd etmişlər.Habelə bu, Quranın dilində imanın gerçəyidir."[537]

*Doqquzuncu*: Qədimdən elm əhli Hafizin bu məsələyə dair sözlərinin Əhli sunnənin mövqeyinə müxalif olduğunu bəyan etmişlər.Şeyx Abdur-Rəhmən bin Həsən şeyx Muhamməd bin Abdul-Vahhəbin elm tələb etməkdə çalışqanlığını və ondan ötrü olan səfərlərini bəyan edərkən (rahiməhullah) demişdir: "Habelə şeyximiz (rahiməhullah) Bəsrəyə səfərdən və Nəcd və orada əldə etdiyindən sonra İhsaya yollanmışdır.Orada isə nəhəng alimlər var idi.Onlardan biri: Abdullah bin Firuz Əbu Muhamməd əl-Kəfifdir.Şeyx onun Şeyxul-İslam ibn Teymiyyə və ibnul-Qayyimin müəllifi olduqları kitabları məxfi saxladığına rast gəlir.Nəhayət şeyx həmin Abdullahı imam Əhmədin əqidəsini bildiyi üçün təriflәmişdir.

Habelə o, İhsanın şeyxlərinin dərslərində iştirak etmişdir.Onların ən böyüyü Abdullah bin Abdul-Lətif əl-Qadı adlı şəxsdir.Həmin şeyx ondan səhih Buxariyə şərh olan "fəthul-bəri" kitabının ilk hələqəsində iştirak etməyi və Hafizin iman məsələsinə dair yanlış görüşlərini bəyan etməyi istəmişdir.Şeyx isə öz növbəsində əşarilərin Buxarinin öz kitabında ilk olaraq qeyd etdiyi hədislər və əsərlərin izahında müxalif olduqlarını bəyan etmişdir."[538]

---

[537] Mənhəcul Hafiz ibn Həcər əl-Asqaləni fil aqidə min xiləli kitəbihi fəthul bəri: 3/1141.

[538] əd-Durrul mənsur fi-r-raddi alə Osman bin Mənsur:52-ci səh.

Belə ki, şeyx Muhamməd bin Abdul-Vahhəb (rahmətullahi aleyhi) Abdullah bin Muhamməd bin Abdul-Lətifə yolladığı məktubda demişdir: "Artıq mən səninlə təxminən iyirmi il öncə bir araya gəlib birlikdə təfsir və hədisə dair müəyyən şeyləri müzakirə etmişik.Sən mənə Buxaridən olan vərəqlər çıxardıb onu yazdın və onun ağ kənarında şərhləri nəql etdin.Habelə sən Buxarinin səhih kitabının əvvəlində qeyd etdiyi iman məsələsinə dair dedin: Bu, Allaha boyun əydiyim haqqın özüdür.Mən isə bu sözlərə təəccübləndim. Çünki o, sizin kəlamçı imamlarınızın məzhəbinə ziddir. Çünki sən hər hansı bir kəlam kitabını və həmin kitabda bunun hər bir şəxsə vacib olduğunu və bunun dinin əsası olduğunu iddia etdiyini mütaliə etsən görəcəksən ki, həmin kitabda başlanğıcdan sonuna qədər bu məsələyə dair Allahın kitabından bir ayə yaxud Allahın Elçisindən bir hədis belə dəlil gətirilmir.Gətirilsə də, həmin dəlil təhrif edilir.Onlar özləri etiraf edirlər ki, onlar öz əsaslarını vəhy-dən deyil ağıldan mənimsəyirlər.Habelə onlar bu məsələdə sələfə müxalif gəldiklərini etiraf edirlər.Məsələn iman məsələsinə dair "fəthul-bəri"də Buxarinin sözləri haqqında qeyd etdiyi sözlər: İman, söz və əməldir, habelə o, artıb azalır.O, buna dair sələfin icmasını, habelə Şafiinin buna dair icma nəql etdiyini, habelə Buxarinin buna dair icma nəql etdiyini qeyd etdikdən sonra kəlam əhlinin sözlərini hekayət edib bunu rədd etməmişdir."[539]

## *Əlavə*:

---

[539] Müəlləfətu-ş-şeyx Muhamməd bin Abdul-Vahhəb (rahiməhullah). ər-Rasəilu-ş-şəxsıyyə:262-ci səh.

Bu, müxalifin həmin məsələyə dair dəlil olaraq gətirdiyi əksər nəqllərdir.Artıq, Beyhaqi, ibn Hazm kimi etiqad mövzularında Əhli sunnəyə müxalif olan şəxslərdən nəql olunan sözlər müstəsna bu sözlərdə onlar üçün heç bir dəlilin olmaması bəlli olmuşdur.Adı çəkilənlərin isə iman mövzusunda Əhli sunnəyə müxalif olmaları bəlli olmuşdur. Həqiqətən də, sələfin icma etdiyi və nassların dəlalət etdiyi sözlərin filankəsin sözündən ötrü tərk edilməsi çox böyük bəladır.Bundan daha böyük bəla isə sunnəyə müxalif olan sözləri gətirib ona şəriət libası geydirmək və bunu sələfin mənhəcinə nisbət etməkdir.Bu, müsəlmanları aldatmaq və onların gənclərini çaşqınlığa sürükləməkdən başqa bir şey deyil.

Şeyx Bəkr bin Abdullah Əbu Zeyd (rahiməhullah) demişdir: "Heç şübhəsiz ki, əks reaksiyalar və mübahisə doğuran çəkişmələr nəticəsində azmış firqələrin sözlərini daxil edib onlara şəriət libasını geyindirmək və bunu Əhli sunnənin məzhəbinə aid etmək açıq-aydın zəlalət, müsəlmanları aldatmaq və gəncləri çaşqın vəziyyətdə qoymaqdır. Belə ki, rafizilərə qarşı mübarizədə nəvasıblərin bidətlərindən, həmçinin cəbriyyəyə qarşı mübarizədə qadəriyyənin bidətlərindən, həmçinin xəvariclərə qarşı mübarizədə murciələrin bidətlərindən heç bir şeyə meyl edilməməlidir yaxud bu işdə tamamilə əksi edilməməlidir.Batili özü kimi batil ilə və digər bir zəlalət ilə rədd edən həmçinin zəlalətdədir.Bu, əməlləri baxımından ən çox ziyana uğrayanların yoludur."[540]

---

[540] Dər`ul fitnə an əhli-s-sunnə:10-cu səh.

# Son sözlər

Bu araşdırmanın sonunda Uca Allahın mənə bu araşdırmanı tamamlamağı müyəssər etdiyi üçün Ona həmd edir və Uca Allahdan bu əməlimi xalis Onun vəchi üçün etməsini və bunu təlif edən və oxuyan üçün faydalı etməsini diləyirəm!

Son olaraq mən burada gəldiyim ən önəmli nəticələri qeyd etmək istərdim.Həmin nəticələr aşağıdaki kimidir:

1-İmanın ərəb dilində "təsdiq" olduğuna dair iddia olunan icmanın səhih olmamasıdır.Əslində isə dilçilərdən bəzisi onu "etibar", "qəbul" və "itaətin aşkar edilməsi" kimi açıqlamışlar.

2-Dilçilik baxımından imana dair verilən haqqa daha yaxın olan açıqlama, Şeyxul-İslamın bəyan etdiyi kimi onun qəlb təsdiqini və tabeçiliyini şamil edən "iqrar" olmasıdır.

3-Əhli sunnə şər`i imanın zahiri və daxili dil və sözdən ibarət olan mürəkkəb gerçək olduğuna dair icma etmişlər. Bu icmaya isə Quran və sunnənin nassları dəlalət edir.Habelə bu mövzuda zəlalətə düşənlərin çoxu yalnız Allahın və Peyğəmbərin (səlləllahu aleyhi və səlləm) sözlərini bilməkdən üz çevirdikləri və özlərinin ixtira etdikləri yollar və müddəalara etimad etdikləri səbəbilə zəlalətə düşmülər. Quran və sunnədə isə ərəb dilində sözlərin düzəlmə for-

malarını, onun istifadə qaydalarını və digər şeyləri dəlil gətirməyi lüzumsuz edən imanın gerçəyi bəyan edilir.

4-İmanın özəyi və şaxəsi vardır.Onun özəyi qəlbdə şaxəsi isə bədəndə aşkar olandır.Özəy ilə şaxə arasında “təlazum” bağlılıq vardır və qəlb imanı olacağı zaman bunun nəticəsi olaraq bədənin zəruri şəkildə zahiri söz və əməllər ilə hərəkətə gəlməsi vacib olacaq.

5-İman artır və azalır.Buna Quran, sunnə və icma dəlalət edir.Onun artması və azalması elm əhlinin bəyan etdiyi bir çox yöndən hasil olur.

6-İmanda istisnanın iki hal etibarı ilə tərk edilməsi və edilməsi icazəlidir.Sələfin imanda istisna etmələri isə beş yanaşma üzərində qurulmuşdur.

7-Əhli sunnənin cumhuru islam ilə iman arasında fərq qoymuşlar.Onlara görə iman islamdan daha uca dərəcədədir.

8-Dəlillər imanın islama sıx bağlı olduğuna və imanı olmayanın müsəlman islamı olmayanın isə imansız olduğuğuna dəlalət etmişdir.Çünki hər bir müsəlman onun islamını səhih edən imana sahib olur, habelə hər bir mömin onun imanını gerçəkləşdirən islama sahib olur.

9-Əhli sunnəyə görə iman söz, əməl və etiqad olduğu kimi küfr həmçinin, söz, əməl, etiqad və tərk etmə ilə olur.

10-Tərk etmənin küfr olan formalarından bütövlüklə zahiri əməlin tərk edilməsidir.

11-Küfr iki qismə bölünür: Böyük və kiçik küfr.Böyük küfrün, ona sövq edən amillərə nisbətdə bir neçə növü vardır.

12-Kiçik küfrün tərifi: Nass yaxud icma ilə onu edəcək şəxsin İslamda sabit qalacağı ilə birgə şəriətin küfr adlandırdığı hər bir günahdır.

13-Məsələnin əsası küfr və şirk ifadələrinin Quran və sunədə onun mütləq gerçəyinə və mütləq anlamına aid edilməsidir.Onun anlamı isə hər hansı bir maneə olmayacağı təqdirdə onun İslamdan çıxaran olmasıdır.

14-Hər hansı bir səbəbdən üzürlü ola biləcək müəyyən şəxsə hökm çıxartmaqda tələskənliyə yol verməməyin və ehtiyatlı olmağın vacibliyi.

15-Küfrün qəsd edilməsini şərt qoymaq kimi dünya tamahı və istəyinin təkfirin maneələrindən biri edilməsi doğru deyil.Bunun Quran, sunnə və icma ilə batil söz olması bəlli məsələdir.

16-Sözlü və əməli küfr amillərdən ötrü təkfir etmək üçün etiqadı şərt qoyanlar murciələrdir.

17-Əhli sunnənin əsaslarından, onlar xəvariclər kimi insanı asiliklər və böyük günah səbəbilə təkfir etmir və mötəzililələr kimi onun atəşdə əbədi qalacağını demirlər.Onlar onun işini Allaha həvalə edirlər.Allah istəsə onu əzablandırar istəsə bağışlayar.

18-Zinakar və digərlərindən qalxan iman, təsdiq və qəlb əməlinin qalması ilə birgə nur, qorxu və mütilikdir.

19-Nasslarda inkar edilən imanda əsas, onun mərtəbələrdən olmasıdır.Onun birincisi səhihliyin inkar edilməsidir. Əgər hər hansı bir əngəl olarsa vacib kamillik inkar ediləcək.

20-Xəvaric və mötəzililərin bidəti Quran, sunnə və ümmətin sələfinin yoluna müxalif olan məşhur bidətlərdəndir.

21-Cəhm və ona müvafiq gələnlər imanın bilgi, küfrün isə bilgisizlik olduğunu, habelə dil sözü, qəlb və bədən əməlinin imandan olmadığını və imanın fərqlənməyən və istisna qəbul etməyən bir şey olduğunu demişlər.

22-Küfrün qəlb çərçivəsinə salınması bir çox murciələrin seçdiyi görüşdür.Lakin onlardan bəzisi onu təkzib və cəhalət amilləri ilə məhdudlaşdırmayaraq ona qəlb əməlinə zidd olan düşmənçilik və alçaltma kimi amilləri əlavə etmişlər.

23-Sonrakilərdən bir çoxu sələfin məzhəbi ilə murciə və cəhmiyyənin sözlərini ayırd edə bilmirlər.Buna səbəb onlardan bir çoxunun bir sözü digər söz ilə qarışıq salmalalarıdır.

24-Kərramilər imanın yalnız dil sözü olduğunu, onun artıb azalmayan və istisna qəbul etməyən bir şey olduğunu demişlər.Lakin onlar bilgi və təsdiqin vacibliyi və münafiqin əbədi cəhənnəmdə qalacağı məsələsində çəkişmə apar-

mamışlar.Onların Əhli sunnə ilə bu məsələyə dair ixtilafı hökmdə deyil adda olan ixtilafdır.

25-Əbul Həsən əl-Əşari sözlərin birində Cəhmin və Salihinin sözünü müdafiə etmişdir.Digər sözündə isə Əhli sunnənin sözünü müdafiə etmişdir.

26-Əşarilərdən bir tayfa iman anlamında sələfə müvafiq olmuşlar.

27-Sonraki əşarilərin etimad etdikləri məzhəb: İman, qəlb təsdiqidir.Dil sözü isə dünya əhkamlarının icrası üçün şərtdir.Bədən əməlləri isə imanın kamillik şərtidir, habelə iman artır və azalır.

28-Onlardan "muvafət" etibarı ilə imanda istisna etməyi icazəli görənlər bununla imanın, insanın öləcəyi və Rəbbi ilə qarşılaşacağı zaman sahib olacağı şey olmasını qəsd edirlər. Bu isə, insana qeyri-məlumdur.Bu səbəbdən onda istisna edilir.Habelə insanın Allah qatında mömin yaxud kafir olması yalnız "muvafət" və Allahın əzəli elmində bir şeyin olacağı haqqında bilgi etibarı ilə olur.Bundan öncə olanın isə heç bir dəyəri yoxdur.

29-Onların "muvafət" haqqında sözləri, Uca Allahın ixtiyarı fellərinin mövcudluğunu inkar etmək üzərində qurulmuş bidət sözdür.

30-Sonraki əşarilər təslimçilik, tabeçilik, qəbul etmə, habelə inadkarlıq və təkəbbürlüyün tərk edilməsi kimi qəlb əməlini isbat edir və bunu təsdiqə daxil edirlər.Habelə onlar onunla Cəhmin dediyi bilgi arasında fərq qoyurlar.

31-Əşarilərə görə küfr Uca Allahı təkzib etmə yaxud Onun haqqında bilgisizlikdir.Habelə bütə səcdə etmək və göy cisimlərinə ibadət etmək kimi icma ilə küfr olan işlər özlüyündə küfr deyil və sadəcə küfrə bir əlamətdir.Bunu edən şəxsin isə daxildə mömin olması mümkündür. Onlardan bəzisi deyir: Şəriət bu işləri təkzib etməyə əlamət etmişdir.Bu səbəbdən, onu edən şəxsin qəlbində təkzibin olmasına və təsdiqin olmamasına hökm veriləcək.

32-Məturudilər imanın təsdiq olduğunu, onun artıb azalmadığını və onda istisnanın edilmədiyini hesab edir və dil sözünü yalnız dünya əhkamlarının icrası üçün şərt edirlər.Onlardan bəzisi artma və azalmanı isbat edir.

33-Fəqih murciələrin etiqadı: İman, qəlb təsdiqi və dil sözüdür.Habelə o, artıb azalmır və onda istisna edilmir.Bədən əməlləri isə imandan deyil.Gəldiyim nəticəyə əsasən qəlb əməlləri həmçinin onlara görə imandan deyil.Şeyxul-İslamın bu yerdə gələn sözləri tərəddüd doğurur.

34-Əhli sunnə ilə həmin murciələr arasında olan ixtilaf bəzi elm əhlinə görə həqiqi bəzilərinə görə isə ləfzi ixtilafdır.Bu məqama dair Şeyxul-İslamın (rahiməhullah) sözlərində təfsilat vardır.Belə ki, ona görə ixtilaf yalnız zahir ilə daxil arasında olan bağlılığı isbat edən və "ləzim" olmayacağı zaman "məlzum"un olmayacağını qəbul edən şəxslə ləfzi olacaq.Onun bu zaman əməli iman anlamından çıxartması bidəti etiqadı bidətlərdən deyil sadəcə sözlü və fe`li bidətlərdən olacaq.

35-Bir çox sonrakilər iman ilə birgə günah zərər verməz deyə ifadə olunan və murciələrə nisbət edilən söz ilə qürrələnmişlər.

36-Sələfin: Əgər biri iman, söz və əməldir və o, artıb azalır deyərsə ircadan uzaqlaşmış olar,-dediyi söz haqq və doğrudur.Lakin həmin söz onu deyənin anlayış tərzinə uyğun doğrudur.Çünki murciələrdən imanda artma və azalmanı isbat edənlər olmuşdur.Üstəlik bu sözü deyənlər tapılmışdır: İman, söz və əməldir.

37-İmanın söz və əməl sözü ilə iki şeyin isbat edilməsi qəsd edilir və bu işdə Əhli sunnə ixtilaf etməmişlər.

Birinci: Əməlsiz söz yetərli və səhih olmur.Sələfin imamları bunu açıq bildirmişlər.Habelə onlar buna icma etmişlər.Artıq mən bu mövzuya dair üçüncü bölümdə geniş danışmışam.

İkinci: Küfr etiqad və tərk etmə ilə olduğu kimi həmçinin söz və əməl ilə olur.

38-Murciələrin bu zamanlarda yayılan sözləri bəzən bir qism insanlara gizli qalır.Bəzən onlar həmin sözləri sələfin sözləri ilə cəm edirlər.Artıq mən buna dair on altı söz qeyd etmişəm.

39-İrcalığa nifrət etməsi və murciələri pisləməsi ilə birgə bu mövzuda yanlışlığa düşən şəxsin mütləq şəkildə murciə olması deyilməz.Ona sadəcə deyiləcək: Bu məsələdə murciələrə müvafiq gəlmişdir yaxud o, murciələrin şübhəsinə düçar olmuşdur.

40-Zahir ilə daxil arasında olan bağlılığa Quran və sunnədən gələn dəlillər dəlalət edir.Murcilər məhz bunu qəbul etmək istəmirlər.Bu məsələdə yanlışlığa düşənlər həmin qaydanı anlamadıqları səbəbilə yanlışlığa düşmüşlər.Artıq mən buna dair müstəqil bir fəsil açıb onun haqqında söhbət etmişəm və onun dəlillərini, murciələrin ona olan mövqeyini və onun üz çevirmə küfrü ilə olan əlaqəsini bəyan etmişəm.

41-Əhli sunnə bədən əməli olmadan imanın yetərsiz, faydasız və qeyri-məqbul olacağına dair icma etmişlər.

42-Bütövlüklə zahiri əməlin tərk edilməsi İslamdan çıxaran küfrdür.Bunun dəlilləri dörddür:

Birinci: Zahiri əməl daxili imanın zəruri amilidir. ”Ləzim”in (zahiri əməlin) yolxuğu isə “məlzum”un (daxili imanın) yoxluğuna dəlildir.

İkinci: Əhli sunnə imanın söz və əməl olduğuna, habelə əməlsiz sözün yetərsiz olacağına icma etmişlər.Onlardan bir qismi əməli tərk edənin küfrünü açıq bildirmişdir.Artıq bu icmanı elm əhlindən olan on bir imamdan nəql etmişəm.

Üçüncü: Səhabələrin namazı tərk edənin təkfir ediləcəyinə dair icması.Bütün əməli tərk edən şəxs isə bura birbaşa daxildir.Artıq mən bu icmanı elm əhlindən olan on iki imamdan nəql etmişəm.

Dördüncü: Bir sıra alimlərin üz çevirmə küfrünün gerçəyinə dair qeyd etdikləri və onun formalından: Allahın dinindən üz çevirib onu öyrənməməyin və ona əməl

etməməyin olmasıdır. Bu isə “tələzum” məsələsinə qayıdan amildir.

43-Artıq mən bu məsələyə dair səhabələr, tabiinlər bə günümüzəcən olan imamlardan açıq-aydın, sələfi sözlər nəql edib buna dair müstəqil fəsil açmışam.Orada əlli alimdən təxminən yüz iyirmi söz nəql olunmuşdur.Həmin sözlərdən müasir alimlərin bu əzəmətli məsələdə ixtilaf içində olmadıqları bəlli olmuşdur.Allaha həmd olsun!

44-Müxalif Əhli sunnənin icmasından üz çevirib Əhli sunnənin dəlil gətirmə üslubuna uyğun istifadə edilməsi yaxşı olmayan bəzi dəlillərdən yapışmışdır.Artıq mən onun “vərəq”, “cəhənnəmlilər”, “İslamın yoxa çıxması”, “tövhiddən savayı heç vaxt xeyir etməyən kişi” və “Muazın Yəmənə göndərilməsi” hədislərini dəlil gətirməsinə cavablar verimişəm.

45-Müxalif imanın səhih olması üçün əməlin labüdlüyünə dair Əhli sunnənin icmasını şübhə altına salmaq məqsədilə bir sıra əqli şübhələr gətirmişdir.Artıq mən həmin şübhələri gətirib bir-bir onların batillliyini bəyan etdim.Həmin şübhələr on iki şübhədən ibarət olmuşdur.

46-Müxalif bəzi elm əhlindən nəql olunan sözlərə etimad edib həmin sözləri yanlış anlamış və onu digər məcraya yönəltmişdir.Artıq mən həmin sözləri araşdırıb həmin sözlərdən Əhli sunnənin yoluna müxalif olanı və onların yoluna müvafiq olanı bəyan etdim.Lakin müxalif həmin sözləri düzgün şəkildə anlamamışdır.

Son olaraq bu məsələdə doğru yoldan çıxmış qardaşlara üz tutub nəsihət olaraq iki şeyi onların nəzərinə çatdırıram:

Birinci: Onlardan təlif və kitab yazmaqla məşqul olanların Uca Allahdan qorxması və nəql etdikləri sözlərdə sunnəyə müxalif olan bidət əhlinin sözlərini gətirməməsi, habelə elm əhlinin sözlərini bir-birinə vurmaması tələb olunur.Dəlil gətirməyin ədəbləri və qaydaları vardır və bu məsələ onlara heç də gizli deyil.

İkinci: Xeyir istəyən və haqqı axtaran bütün tələbələr alimlərin sözlərinə diqqət yetirməli, elmi onlardan almalı, habelə alimin yanlışlığı və hakimin zəlalətindən çəkinməlidirlər.Habelə onlar sələfi mənhəcinin daşıyıcılar, varislər, imamlar və hidayət yolunda olan alimlərdən ibarət olduğunu bilməlidirlər.Heç şübhəsiz ki, məhz onlarla bir cərgədə olanlar qurtuluş və səadətə qovuşan insanlardır!

Uca Allahdan bizə haqqı göstərməsini və bizi haqq əhlindən və ona çağıranlardan etməsini diləyirəm!

Allahın salavatı və salamı Peyğəmbərimiz Muhamədin, onun ailəsinin və əshabının üzərinə olsun.

# Əlavə (1)

## Murad Şukrinin "İhkəmu-t-təqrir fi əhkami-t-təkfir" kitabından çəkindirən hic 7/2/1419-ci il tarixində çıxan (20212) saylı fətvası

Allaha həmd, Peyğəmbərə salavat və salam olsun!

Elmi araşdırmalar və fətvalar üzrə daimi komitə İbrahim əl-Hamdəni adlı şəxs tərəfindən fəzilət sahibi muftiyə gələn və ümumi əmanət olaraq komitənin böyük alimlər qurumuna hicrətin 1/2/1419-cu ilində (942)-cü rəqəm altında keçən sualla tanış olmuşdur.Sualın mətni belədir "Səudiyyə ərəbistanı məmləkətinin baş muftisi Abdul-Əziz bin Abdullah bin Bəzə; "Əs-sələmu aleykum və rahmətullahi və bərəkətuh.Hörmətli şeyx! Biz bu ölkədə, Səudiyyə Ərəbistanı məmləkətində böyük nemət içindəyik.Nemətlərin ən böyüyü isə təbii ki, tövhiddir. Biz təkfir məsələsində xəvariclərin və murciələrin məzhəbini rədd edirik.

Bu günlərdə mənim əlimə İordaniyalı Murad Şukrinin "ihkəmu-t-təqrir fi əhkami-t-təkfir" adlı kitabı keçmişdir.Onun alimlərdən olmadığını bildim və onun ixtisası şəriət elmilə ilə əlaqəli deyil.O, həmin kitabda aşırı ifratçı murciələrin batil məzhəbini yaymış və küfrün yalnız təkzib küfrü olduğunu demişdir.Bu isə bildiyimizə görə doğru deyil və Əhli sunnənin

tutunduğu dəlillərə və mübarək ölkəmizdə imamların yaydığı dəvətə tamamilə ziddir. Çünki bizim alimlərimiz qeyd etmişlər ki, küfr söz, əməl, etiqad və şübhə ilə olur.İordaniyada sələfiliyə nisbət edilən camaatın bu kitabda yazılanlara çağırışlarından heç kəs aldanmasın deyə sizin haqqı izah edəcəyinizə ümid edirik.Allah sizin yardımınız olsun.Əs-sələmu aleykum və rahətullahi və bərakətuh."

Komitə həmin məsələyə dair araşdırma apardıqdan sonra cavab vermişdir:

"Adı çəkilən kitabla tanışlıqdan sonra onun qeyd edildiyi kimi küfrün yalnız danma və təkzib küfrü olması etibarı ilə murciələrin məzhəbini əsaslandırmaq və yaymaqdan, həmin yaramaz məzhəbin sunnə və dəlil adı ilə və bunun sələf alimlərinin sözü olaraq göstərilməsindən ibarət olduğu aşkar edilmişdir.Bütün bunlar haqqı bilməmək və həmin məzhəbin alimlərdən olan ümmətin təhqiqçi sələfin sözü olduğunu göstərərək məlumatsız insanları çaşdırmaq və azdırmaqdır.Bu yalnız: İman ilə birlikdə günah zərər verməz,-deyən murciələrin məzhəbidir.Onlara görə iman: Qəlb ilə təsdiqdir.Onlara görə küfr: Ancaq təkzibdir.Bu, səhlənkarlıqda həddi aşmaqdır.Onun əks tərəfində təkfirdə ifrata varan xəvariclərin batil məzhəbi durur.Məzhəblərin hər ikisi zəlalət məzhəbləri sırasında olan batil və yaramaz məzhəblərdir. Onların qoyduqları qaydalar nəticəsində məlum olan batil gərəkdirici amillər ortaya çıxır. Uca Allah Əhli sunnə vəl cəmaatı haqq sözə, doğru məzhəbə və ifratla səhlənkarlıq arasında olan orta etiqada; müsəlmanın namusunun və dininin qorunması,

təkfirin yalnız haqlı olaraq dəlil üzərində caiz olması və Quran və sunnədə gələn dəlillərə əsasən küfrün söz, əməl, tərk, etiqad və şübhə ilə olması etiqadına müvəffəq etmişdir.

Yuxarıda qeyd edilənlərə əsasən həmin kitabı yaymaq, çap etmək, orada olan batil fikirləri Quran və sunnədən olan dəlillərə nisbət etmək və onun Əhli sunnə vəl cəmaatın məzhəbi olduğunu demək caiz deyil.Onu yazan və yayan şəxslərə isə Allaha edəcəkləri tövbəni elan etmələri gərəkdir. Çünki tövbə günahları ört-bastır edir.Həmçinin şər`i elmlərdə qədəmləri möhkəm olmayan şəxslərə, ümid edilən fayda və islahdan qat-qat çox zərərin və əqidələrin pozulması hasil olmasın deyə bu kimi məsələlər haqqında danışmaması gərəkdir.Müvəffəqiyyət Allahdandır!

Allahın salavatı və salamı Muhamməmədin, onun ailəsinin və əshabının üzərinə olsun.

Elmi araşdırmalar və fətvalar üzrə daimi komitə

Başçı

Abdul-Əziz bin Abdullah bin Bəz

Başçı müavini

Abdul-Əziz bin Abdullah bin Muhamməd Ali-ş-Şeyx

Komitənin üzvü

Abdullah bin Abdur-Rahmən əl-Ğudəyyən

Komitənin üzvü
Bəkr bin Abdullah Əbu Zeyd

Komitənin üzvü
Salih bin Fəuzan əl-Fəuzan

# Əlavə (2)

## “Dabtu-d-davabit” kitabından çəkindirən fətva

Aləmlərin Rəbbi olan Allaha həmd olsun. Peyğəmbərimiz Muhammədin, Onun ailəsinin və bütün əshabının üzərinə Allahın salavatı və salamı olsun.

Elmi araşdırmalar və fətvalar üzrə daimi komitə Əhməd bin Salih əz-Zəhrani adlı şəxsin təlif etdiyi “dabtu-d-davabit fil imən va nəvaqidih” adlı kitabı ilə tanışlışqdan sonra həmin kitabın yaramaz murciələrin məzhəbinə çağırdığına rast gəlmişdir.Çünki həmin kitab zahiri əməllərin imanın gerçəyinə daxil olmadığını hesab edir.

Bu isə Əhli sunnənin üzərində olduqları yola tamamilə müxalifdir.

Onlar imanın dil ilə söz, qəlb ilə etiqad və bədən əzaları ilə əməl olduğunu və onun itaətlə artıb günahla azaldığını deyirlər.Buna əsasən:

Bu kitabın nəşr edilib yayılması qadağandır və bu kitabın müəllifinə və onu yayan şəxslərə Allaha tövbə etməsi gərəkdir.Biz, müsəlmanların əqidəsini qorumaq və onların dinini mühafizə etmək məqsədilə həmin kitabın çağırdığı batil məzhəbdən onları çəkindiririk.Habelə biz alimlərin düşə biləcəkləri yanlışlıqlara tabe olmaqdan çəkindirik, o ki

qadlı bunlar elmi etibarlı əsaslardan almayan kiçik tələbələr olsun.Uca Allah hamını faydalı elmə və saleh əmələ müvəffəq etsin.

Allahın salavatı və salamı Peyğəmbərimiz Muhamməddin, onun ailəsinin və əshabının üzərinə olsun!

Elmi araşdırmalar və fətvalar üzrə daimi komitə

Başçı

Abdul-Əziz bin Abdullah bin Bəz

Başçı müavini

Abdul-Əziz bin Abdullah bin Muhamməd Ali-ş-Şeyx

Komitənin üzvü

Abdullah bin Abdur-Rahmən əl-Ğudəyyən

Komitənin üzvü
Bəkr bin Abdullah Əbu Zeyd

Komitənin üzvü
Salih bin Fəuzan əl-Fəuzan

# Əlavə (3)

## “Haqiqatul imən beynə ğuluvvil xəvaric va təfritil murciə” adlı kitabdan çəkindirən hic 8/4/1421-ci il tarixində çıxan (21435) saylı fətva

Aləmlərin Rəbbi olan Allaha həmd, Muhamməd Peyğəmbərə Allahın salavatı və salamı olsun.

Elmi araşdırmalar və fətvalar üzrə daimi komitə Küveytdə yerləşən “cəmiyyətu-ş-şəria” adlı təşkilatın çap etdiyi və Adnan Abdul-Qadir adlı şəxsin müəllifi olduğu “haqiqətul imən beynə ğuluvvil xəvaric va təfritil murciə” adlı kitaba dair komitəyə varid olan sualları nəzərdən keçirtmişdir.

Daimi komitə araşdırma apardıqdan sonra həmin kitabın əməli imanın anlamı və onun gerçəyindən çıxaran və onu kamillik şərti edən murciələrin məzhəbini müdafiə etdiyinə dair fətva vermişdir.Müəllif həmin kitabda bu batil məzhəbi müdafiə etmək üçün elm əhlinin yarımçıq və natamam sözlərini nəql etmiş, onların sözlərini yersiz istifadə etmiş və nəql olunan sözləri sahiblərinə aid etməkdə yanlışlıqlar etmişdir. Misal olaraq o, 9-cu səhifədə Əbu Cəfər əl-Baqirin sözlərini imam Əhmədin adına yazmışdır.Habelə o, nəql etdiyi sözlərlə uyğun gəlməyən başlıqlar qoymuşdur. Misal olaraq o, 9-cu səhifədə demişdir: “İmanın özəyi yalnız

qəlbdədir.Əgər biri onu pozarsa kafir olar." Daha sonra Şeyxul-İslam ibn Teymiyyədən qeyd etdiyi sözlərə uyğun gəlməyən sözlər nəql etmişdir.Onun yarımçıq nəql etdiyi sözlərdən, onun 9-cu səhifədə bin Teymiyyənin "əl-fətəva:7/644, 7/377" kitabında gələn sözlərini, habelə 17-ci səhifədə ibnul-Qayyimin "uddətu-s-sabirin" kitabında gələn sözlərini yarımçıq nəql edib sahib olduğu irca məzhəbinə zidd gələni çıxartması olmuşdur.Habelə o, 59-cu və 64-cü səhifələrdə ibn Teymiyyənin "əs-sarimul məslul:3/971" kitabında sözlərini natamam nəql etmişdir.Habelə həmin kitabda yer alan və murciəlik məzhəbinin müdafiəsinə və insanları Əhli sunnə vəl cəmaat adı altında haqq yoldan çıxartmağa yönələn digər azdırıcı fikirlər.Məhz bu səbəbdən bu kitabın insanlar arasında yayılmasının qarşısını almaq gərəkdir.

Müəllifə isə özünə diqqət yetirib Allahdan qorxmağını və zəlalət yollarından uzaq durub haqqa qayımasını tövsiyə edirik.Müvəffəq edən Allahdır.Peyğəmbərimiz Muhamməddin, onun ailəsinin və bütün əshabının üzərinə Allahın salavatı və salamı olsun.

Elmi araşdırmalar və fətvalar üzrə daimi komitə

Başçı

Abdul-Əziz bin Abdullah bin Muhamməd Ali-ş-Şeyx

Komitənin üzvü

Abdullah bin Abdur-Rahmən əl-Ğudəyyən

Komitənin üzvü
Bəkr bin Abdullah Əbu Zeyd

Komitənin üzvü
Salih bin Fəuzan əl-Fəuzan

# Əlavə (4)

## “ət-təhzir min fitnəti-t-təkfir” və “sayhətu nəzir” kitablarından çəkindirən hic 14/6/1421-ci il tarixində çıxan (21517) saylı fətva

Allaha həmd olsun.Peyğəmbərə Allahın salavat və salam olsun!

Elmi araşdırmalar və fətvalar üzrə daimi komitə hicrətin 12/5/1421-ci il tarixində “2928” rəqəm altında və hicrətin 13/5/1421-ci il tarixində “2929” rəqəm altında möhtərəm baş muftiyə bəzi qardaşlar tərəfindən Əli bin Həsən əl-Hələbinin təlif etdiyi “ət-təhzir min fitnəti-t-təkfir” və “sayhətu nəzir” kitabları ilə əlaqədar və həmin kitabların əməlin imanda səhihlik şərti olmadığı eitibarı ilə irca məzhəbinə çağırması və bunun Əhli sunnəyə aid edilməsi və bu iki kitabın Şeyxul-İslam ibn Teymiyyə, hafiz ibn Kəsir və digərlərindən təhrif olunmuş nəqllərə əsaslandığına dair varid olan məsələlərlə tanış olaraq fətva çıxartmışdır.

Komitə adı çəkilən iki kitabı araşdırıb həmin kitablarla tanış olduqdan sonra komitəyə bəlli olmuşdur ki, Əli bin Həsən əl-Hələbi topladığı “ət-təhzir min fitnəti-t-təkfir” kitabında ön söz və haşiyələrdə alimlərin sözlərinə nisbət etdiyi sözlər aşağıdaki kimidir:

1-Kitabın müəllifi öz təlifini küfrü danma, təkzib etmə və qəlb halallaşdırması küfrü çərçivəsinə salan batil və bidət murciələrin məzhəbi əsasında qurmuşdur.Bunu 6-cı səhifə-

nin 2-ci haşiyəsində və 22-ci səhifədə görmək olar.Bu isə küfrün etiqad, söz, əməl və şübhə ilə olduğunu deyən Əhli sunnə vəl cəmaatın məzhəbinə ziddir.

2-İbn Kəsirdən "əl-bidəyə və-n-nihəyə:13/118" kitabında gələn nəqli təhrif etməsi.O, bunu 15-ci səhifənin haşiyəsində ibn Kəsirdən nəql edərək, Çingizxanın "yəsiq" kitabının Allah dərgahından olduğunu iddia etdiyini və bu səbəbdən kafir olduğunu qeyd etmişdir.Adı çəkilən yerə müraciət edildiyi zaman ibn Kəsirə nisbət olunan sözə rast gəlinməmişdir.

3-Onun Şeyxul-İslamın adından 17-18-ci səhifələrdə yalan danışmasıdır. Belə ki, həmin kitabı toplayan əvəzlənmiş hökmün Şeyxul-İslama görə yalnız bilik, etiqad və halallaşdırma olacağı zaman küfr olacağını nisbət etmişdir. Bu isə Şeyxul-İslamın adından açıq-aydın yalandır.Şeyxul-İslam sələfin, Əhli sunnənin məzhəbini yayan şəxs olmuşdur.Bu isə yalnız murciələrin məzhəbidir.

4-Onun şeyx Muhamməd bin İbrahımın "təhkimul qavəninil vad`iyyə" risaləsində qəsdini təhrif etməsidir.Adı çəkilən kitabın müəllifi iddia etmişdir ki, şeyx qəlb halallaşdırmasını şərt görür, baxmayaraq ki, şeyxin adı çəkilən risalədə keçən sözləri günəş kimi aydın və Əhli sunnənin yoluna müvafiqdir.

5-Elm əhlindən qeyd etdiyi şəxslərin sözlərinə əlavələr verib onların sözlərini digər məcraya yönəltməsidir.Bunu 108-ci səhifənin 1-ci haşiyəsində, 109-cu səhifənin 21-ci haşiyəsində və 110-cu səhifənin 2-ci haşiyəsində görmək olar.

